Tərtib edənlər: **Tacir Səmimi**
Filologiya üzrə fəlsəfə doktoru.
**Xurşud Məmmədli**
Pedoqogika üzrə fəlsəfə doktoru, dosent.
**Əbülfət Heydər**

Elmi redaktoru: **Xurşud Məmmədli.**
Pedoqogika üzrə fəlsəfə doktoru, dosent.

Rəyçilər: **Mahmud Allahmanlı**
Filologiya elmlər doktoru, professor.
**İsrafil Məmmədov**
Tarix üzrə fəlsəfə doktoru

Baş məsləhətçi: **Yusif Heydərov.**

Məsləhətçilər: **Rəcəb Rəcəbov.**
**Çətin Koşucu.**
**İsrafil Heydərov.**

Kitab Yusif Rəhim oğlu Heydərovun maddi və mənəvi dəstəyi əsasında təkrar nəşrə hazırlanmışdır.

**AŞIQ HEYDƏR (Əsərləri, dastan – rəvayətlər, xatirələr...)**
**Bakı - 2014, 460 səh.**

Bu kitab qədim Oğuz eli Qərbi Azərbaycanın (indiki Ermənistanın) Ağbaba mahalının mərd və cəsur övladı, Qars, Ağbaba və Çıldır ozan – aşıq sənətinin inkişafinda böyük xidmətləri olan və həmçinin 1918 - 1920 – ci illər tarixində Ağbaba süvarı alayının baş ozanı kimi fəaliyyət göstərən Aşıq Heydərin (1867 – 1949) xatirəsinə ithaf olunub.

Kitabda ustadın şerləri; (bayatılar, nəğmələr, gəraylılar, qoşmalar, təcnislər, ustadnamələr, divanilər, müxəmməslər, qıfılbəndlər, deyişmələr, aşıq rəvayətləri və.s) həmçinin, ustadın "Gümrü qızı" adı ilə məhşur olan bir dastanı toplanmışdır. Burada verilən şerlərin əksər hissəsi, o cümlədən "Gümrü qızı" dastanı ilk dəfədir ki, işıq üzü görür.

Kitabda Aşıq Heydərin yaşadığı dövrün və yerləşdiyi sosial-siyasi-mədəni mühitin geniş xarakteristikası verilmiş, yurd yerlərimiz haqqında maraqlı tarixi faktlar və xatirələr göstərilmiş, onun çoxçalarlı, xalqla bağlı peziyasında etnoqrafik cizgilərin qoyuluşu öz əksini tapmışdır.

Kitab "Bu yan Ağbabadı, o yan Çıldır, Qars" (Bakı, 2007) nəşri əsasında təkminləşdirilərək təkrar nəşrə hazırlanmışdır.

Kitab geniş oxucu auditoriyası üçün nəzərdə tutulmuşdur.

4702000000
S **--------------**
N-098-2014





# KİTABIN İÇƏRİSİNDƏKİLƏR

# ÖN SÖZ

Ağbaba bölgəsi gözdən-könüldən uzaq dağlıq ərazidə, üstəlik də sərhəddə, yəni keçmiş Sovetlər Birliyi ilə Türkiyə sərhəddində yerləşdiyindən onun tarixi, folkloru, etnoqrafiyası öyrənilməmiş, buraya tədqiqatçı ayağı dəyməmişdir. Bu da bir həqiqətdir ki, bölgə ərazisində təhsilə, elmə böyük maraq və həvəs olsa da, nədənsə humanitar elmlər sahəsi zəif inkişaf etmişdi. Bu bölgədə dəqiq elmlər kifayət qədər inkişaf etdiyindən riyaziyyar, kimya və digər elm sahələrinin görkəmli nümayəndələri (akademik Abel Məhərrəmov, professor Qəmbər Namazov, professor Mirzə Allahverdiyev, kimya elmlər doktoru Nazim Səmədov və.b) istər Azərbaycanda, istərsə də, xarici ölkələrdə kifayət qədər taninmışlar. Təkcə onu demək kifayətdir ki, riyaziyyatçılar arasında dosent Qasım Mustafayev olduqca nadir istedad sahibi olan pedaqoq kimi bu gün də xatirlanmaqdadır. Bizə elə gəli ki, dəqiq elmlərə marağı bölgənin təcrübəli müəllimləri yaratmışlar. Təsadüfi deyil ki, Ağbabanın kəndlərində bu sahəyə maraq və diqqət çox olmuşdur.

Bir sözlə Ağbaba bölgəsinin folkloru müxtəlif səbəblərə görə vaxtında toplanıb yazıya alınmamış, bölgənin el sənətkarlarının ədəbi irsinin çox hissəsi itib-batmışdır.

Təxminən yeddi-səkkiz il öncə biz Aşıq Heydərin ilk kitabını ("Bu yan Ağbabadı, o yan Çıldır-Qars") çapa hazırladıq. Aşıq Heydərin yaradıcılığından ilk örnəkləri isə 1999-cu ildə "Tükənməz sözüm, Ağbaba" kitabında vermişik. Bu böyük sənətkarla bağlı Azərbaycan Milli Elmlər Akademiyası Folklor İnstitunun "Elmı axtarışlar" kitabının Bakı 2007-ci il XXXI cildində (səh 139-142) geniş bir məqalə də işıq üzü görmüşdür.

Təbi ki, Aşıq Heydərin adını çəkdiyimiz kitabında onun yaradıcılığının bir hissəsi toplanmışdır. Bu folklor örnəkləri Aşıq Heydər yaradıcılığını qəlbində yaşadan yaşlı nəslin nümayəndələri ilə bərabər İskəndər baba və Yusif Heydərovdan toplanıb yazıya alınıb.



Nəhayət, aradan xeyli keçəndən sonra biz Əbülfət Heydər və hörmətli Xurşud müəllimlə birgə Aşıq Heydərin yeni kitabını hazırlamaq qərarına gəldik. Daha doğrusu, əlimizdə kifayət qədər materiallar toplandığından bu işi yubatmadıq. Bu işdə bizə daha çox yaxından kömək edən Aşıq Heydərin kötücəsi Heydərin əməyini xüsusi dəyərləndirmək istəyirik. Çünki o,Türkiyədə yaşayan həm-yerlimiz Çətin Koşucunun köməkliyi ilə Ağbaba haqqında, bu bölgədə baş verən tarixi olaylar barəsində və s. maraqlı faktlar toplayıb bizə təqdim etdi. Maraqlıdır ki, bu materiallar Ağbabanın tarixi ilə həm sıx bağlıdır, həm də Aşıq Heydərin yaşadığı dövrə təsadüf edir, onun mənsub olduğu tayfanın tanınmış adamlarını (Məşədi Rəcəb, Məhəmməd və b.) əhatə edir. Buna görə də, biz bu materialları burada, yəni bu kitabda verməyi qərara aldıq. Çünki Ağbaba tarixi, istər Düzkənd üçün xüsusi maraq doğuran cəhətləri ilə fərqlənir. Zənnimizcə, qeyd olunanan tarıxı faktlar gələcəkdə mənbə rolunu oynaya bilər.

Kitabın işlənməsində əslən Ağbabanın Ördəkli kəndindən olan, hal- hazırda Türkiyənin İzmir şəhərində yaşayan Çətin Koşucuya da minnətdarlığımızı bildiririk.

Bu kitabdakı materialları dörd yerə bölmək olar. Aşıq Heydərin ədəbi irsi, Ağbaba və Düzkənd kəndi haqqında maraqlı məlumatlar, Ağbaba Süvari Alayı barəsində maraqlı məlumatlar, faktlar, olaylar və xatirələr. Qeyd edək ki, bu materialların yazıya alınıb işlənməsində Yusif Heydərova minnətdarıq. Yusif babanın qeyri-adi yaddaşı sayəsində olduqca dəqiq məlumat və tarixi faktlar meydana çıxdı. Məsələn 1918 – 1921- ci illər ərəfəsində Ağbaba Milli Süvari Alayı barəsində zəngin materiallar, Düzkənddə Sovet quruculuğundan 1988-ci ilədək işləyən vəzifəli adamların soy adı, adı, atasının adı da göstərilməklə, xronoloji ardıcıllıq, 1937-ci ildə Sovet hökuməti tərəfindən cəzalandırılan şəxslər haqqında dəqiq məlumatlar və s. bu kitabda kifayət qədərdir.

Kitabın xatirələr bölməsində Yusif babanın yadından-yaddaşından yazıya alınanlar xüsusi maraq doğurur. Kitabın sonunda Yusif Heydərovun, Əbülfət Heydərin və Xurşud

Məmmədlinin şeirlərinin verilməsi təsadüfi deyil. Çünki, Aşıq Heydər ocağı sönməmiş, onun ardıcılları bu ocağın varlığını yaşadırlar. Xurşud Məmmədli də soykökdən Aşıq Heydərin mənsub olduğu Rəhimli tayfası ilə qohumdur. Buna görə də Xurşud Məmmədlinin bu kitabda bir neçə şeirinin verilməsi təbiidir.

Ağbaba-Çıldır aşıq mühiti Azərbaycan aşıq sənətinin lokal – regional spesfikasiyası ilə xüsusi seçilən, lokal çevrədə özünəməxsus sənət elementlərinə malik zəngin ocaqlardan biridir.

Ağbabada elə böyük el sənətkarları, elə el şairləri olmuşdur ki, yüz illər keçsə də, bircə əsəri yazıya alınmasa da, yaddaşlarda yaşaya-yaşaya, söz-söhbəti baba-nənədən, nəvə-nəticədən keçə - keçə bu günlərimizə qədər gəlib çatmışdır.

Belə böyük ozanlardan, ustad aşıqlardan biri də Ağbaba-Çıldır aşıq sənətinin yaradıcılarından olan Aşıq Heydərdir.

Aşıq Heydər təxminən 1867- ci ildə Ağbaba mahalının Düzkənd kəndində anadan olmuşdur. Heydər üç yaşında olanda atası vəfat etmiş, anası isə öz dayısı molla Əhmədin təkidi ilə başqasına ərə getmişdi. Heydər əmisi Məşədi Rəcəbin himayəsində yaşamış, yetkinlik yaşına çatanda, yəni hardasa iyirmi beş yaşlarında ona yatdığı yerdə İstanbulun yaxınlığında yerləşən Dəyirman kəndində Süleyman bəyin qızı Bəyaz xanıma buta verilməsi məlum olmuşdur. Aşıq Heydər Bəyaz xanıma qovuşa bilməmişdir. Ancaq onun sözləri dillərdə dastan olmuş və bu günümüzə kimi gəlib çatmışdır.

Aşıq Heydərin dediyinə görə, onu bu sənətin zirvələrinə qaldıran, yəni ustadı yuxuda bir ağ donlu qadın olduğunu söyləmişdir. Aşıq Heydərin otuz yaşı olanda ana babası molla Əhməd onun əlini Qurana basmışdır və saz çalmağı tərgitdirməyə çalışmışdır.

Yaşlıların dediyinə görə, Aşıq Heydər məclislər aparan zaman saz əvəzi əlinə bir şey (taxta parçası, dəyənək və yaxud silah) almasa danışa bilmirdi. Müasirlərinin dediyinə görə, bu görkəmli sənətkar 40 ədəd iynəni dodağına alıb Məmmədbağrı havasında dodaqdəyməz deyərmiş.

Aşıq Heydər Aşıq Şenlik, Aşıq Nəsib və Aşıq Çorlu Məhəmmədlə yaxın dost olmuşdur.

Aşıq Heydər el şairi olmaqla bərabər kirkirə, dibək-salğar, cəhrə, yun darağı düzəldər, ağacdan qaşıq, qəlyan, müştük yonub hazırlardı.

Aşıq Heydər 1949-cu ilin mart ayının 19 – cu günü Novruz bayramında öz sevimli nəvəsi Yusif Rəhim oğlu Heydərova "Məni axtarın" qoşmasını deyərək, Düzkənd kəndində gözlərini əbədi olaraq yummuşdur.

Sovet hakimiyyətinə tərif demədiyinə, ona rəğbət bəslədiyinə görə mətbuat aşığın üzünə bağlanmış, irsi vaxtında toplanmadığından itib- batmışdır.

Yaddaşlardan toplanmış bu folklor materialları böyük sənətkarın irsindən bir damladır.

Bu kitabda Aşıq Heydərin bayatıları, qoşmaları, gəraylıları, ustadnamələri, qıfılbəndləri, deyişmələri və bir dastanı ( Gümrü qızı ) ilk dəfədir ki, işıq üzü görür.

Ağbaba mahalında xalq arasında sinədəftər "tırınqı", "nanay" söyləyən və bayatıları ilə məhşur olan Aşıq Heydərin yaradıcılığında vətən həsrəti və yurd niskili olduqca qüvvətli verilmişdir:

Yaram azdı,
Kim deyər yaram azdı.
Fələk məni budadı,
Qorxudan yaram azdı!

Eşmə çox,
Çay yanında çeşmə çox.
Qəm dağları var məndə,
Təbib, yaram eşmə çox!

Yaramı duz yandırdı,
Göynətdi, buz yandırdı,
Heydəri eşq oduna,
Bir nazlı qız yandırdı.

Gəraylılardan biri ( Bilmirəm ) siyasi motivli olub əsasən Sovet hakimiyyətinin ilk illərində yazılmışdır. Aşıq Heydər haqsızlıqla barışa bilmır, ermənilərin " kefinin duru " olduğunu görüb çox məyus olur və haqlı olaraq deyir:

" Böyükdü " gədə - güdələr!
Bicdən , şeytandan ötələr!
İstərlər məni didələr,
Gəzib – dolaşa bilmirəm!

Aşıq Heydər qoşmalarının birində (Qaldım) uşaqlıq çağlarını, qəmli vaxtlarını, ata – anadan yetim qaldığını böyük üzüntü ilə belə xatırlayır:

Ürəyim nəzilib, qəlbim əzilib,
Atadan – anadan aralı qaldım.
Elə nalə çəkdim, göylər ağladı,
O ərşi - əlaya bir səda saldım!

Maraqlıdır ki, bu kitabda verilən şeirlərin çoxu vətən həsrəti, yurd niskili ilə doludur.

Aşıq Heydər dərd – qəmin , didərginliyin təsirindən dünyanın boş olduğunu, müxənnətlərin at oynatdığını göstərir:

Gəzdim, dolaşdım mən bu boş dünyanı,
Nə çoxdu boş lafı, vədi, hədyanı.
Müxənnət artıbdı, bilinmir sanı,
Göylərə yüksələn amana bax – bax!

Bu şeirlərin içində iki eyni adlı (Dağların) qoşmaları xüsusilə adamın diqqətini çəkir.

Indi bu şerlərdən birincisinə baxaq.

Duman - çiskin basıb, görünməz olub,
Görünmür yaxası, başı dağların.
Mətahdı, qızıldı, gövhərdi, ləldi,
Torpağı, qayası, daşı dağların!

Burada dağların duman – çiskindən görünməməsi təsvir olunsa da, onun torpaq - daşının çox qiymətli olduğu göstərilir. Müəllif bu dərd - bəlanın nə ilə bağlı olduğunu, özünün niyə bu qədər qəmli ovqatda olduğunu möhürbənddə bir misra ilə belə göstərir. "Oraya uzanan yollar bağlıdır".

Maraqlıdır ki,"Dağların" adlı ikinci qoşmanın birinci misrasında ("Çəkilmir başından dumanı, çəni ") işlənən ifadə ilk baxışda adama bunun bir növ təkrar olunduğu qənaətini doğurur. Amma şeiri diqqətlə oxuduqdan sonra bu qoşmanın həm orijinallığı, həm də bədii təsvir gücü müəyyən olunur. Dediklərimizi daha da dəqiqləşdirmək üçün şerin özünə müraciət edək:

Sökülüb binəsi, köç edib ellər,
Başlayıb əsməyə boranlar, yellər,
Çağlamır bulaqlar, kükrəmir sellər,
Çəkilib heyvanı, malı dağların.

Heydər qan ağlayır, yurddan gen düşüb,
Qəzanın qədəri "Xoya" yön düşüb,
Dərdə ac – yalavac, ləlöyün düşüb,
De hanı motalı, balı dağların?

Şeirdən də göründüyü kimi, müəllif burada didərginliyi, bununla bağlı ellərin ağır durumunu təsvir edilməklə bərabər, Güney Azərbaycana, o cümlədən Xoya, Mərəndə pənah aparması, özünəməxsus bir dillə göstərmişdir.

Şeirlərin biri siyasi motivli olub, Şura hökumətinin gəlişi ilə türklərə, müsəlmanlara bəla – dərd gəldiyini, bundan ermənilərin faydalandığını deyir.

El eldən ayrıldı, könül könüldən,
Doğmalıq, yaxınlıq tez çıxdı əldən.
Sovet çox sevindi bu bəd əməldən,
Erməni də pullu – paralı düşdü.

Ustad sənətkara yetkinlik vaxtında buta (vergi) verilməsi bizə məlumdur.

Lakin bu haqda sənətkarın yaradıçılığında müraciət etmək yerinə düşərdi:

İstədim ki bağban olam bir gülə,
Eşq atəşi vurdu döndüm bülbülə.
Sevda vücuduma saldı vəlvələ,
Bu sevdaya düşən günü ölmüşəm!

Hiçran yeksanıyam, qəm tarümarı,
Yıxıb vicudumu kül etmə barı!
Dizimin tutarı, gözümün nuru,
Bu sevdaya düşən günü ölmüşəm!

Şerdən belə bəlli olur ki, Heydərə buta verilməsinə baxmayaraq, o öz məhəbbətinə qovuşa bilməmişdir.

Ay ağa adlı təcnisə nəzər salsaq görərik ki, ustad öz məhəbbətinə qovuşa bilməməsini necə qələmə almışdı:

Xumarlanıb sərxoş baxma bu yana,
Sərkərdən gəzirəm mən yana - yana.
Biçarə Heydərı az danla, yana,
Salma məni nəzərindən, ay ağa!

Aşıq Heydər Ağbabanın təbiətini ilə bağlı "Görən harda belə gözəl məkan var", "Ağbaba dağları", "Yaşılbaş sonalar göllərə gəlir" və.s qoşmaları xüsusilə maraq doğurur.

Göy buludlar arasından süzülüb,
Qatar - qatar nizamlanıb düzülüb,
Bir cərgəsi qatarından üzülüb,
Yaşılbaş sonalar göllərə gəlir.

Sellər - sular aşır – daşır,  sellənir,
Buz bulaqlar məcrasında göllənir,
Bülbül cıxıb yuvasından dillənir,
Yaşılbaş sonalar göllərə gəlir.

Ustad sənətkar ömrünün son günlərinə kimi, oruc tutub - namaz qılmışdır. Oxumaq - yazmaq bilməyən bu böyük sənətkar "Müqəddəs Qurani - Kərimi" dərindən öyrənmiş və İslam dininə olan məhəbbətini belə qələmə almışdır:

O dünyada stirükafir əkildi,
Misqal - misqal badyalara töküldü,
Qoxusundan suvalçılar çəkildi,
Onda dedim: La İlahə İlləllah!

Yeridim yetişdim bir güllü bağa,
Gülün dərdim, düşdüm bir ağ otağa,
Ənkir- Münkür dayanmışdı çomağa,
Onda dedim: La İlahə İlləllah!

Şerdən belə məlum olur ki, el sənətkarı La İlahə İləllah deməklə, İslama olan məhəbbətini həyata qədəm qoyduğu gündən axirət evinə kimi sevmiş, öyrənmiş və buna sadiq olmuşdur.

Aşıq Heydərin yaradıcılığında mövcud quruluşun tənqidi əsas yer tutur. Elə buna görə də Sovet dövründə mətbuat aşığın üzünə bağlanmış, irsi vaxtında toplanmadığından itib-batmışdır:

Əsdi yollarıma boranlar, yellər,
Bizə düşmən oldu danışan dillər.
Bizdən nə anlasın gələn nəsillər,
Görən bu tutuşla hara gedirik?

Mən nə deyim, kor taleyə, kor baxta,
Gədalar ağa olub çıxıblar taxta.
Yurtda qan qusuruq biz laxta - laxta,
Görən bu tutuşla hara gedirik?

1937 - ci il tarixindən etibarən Qərbi Azərbaycanın Ağbaba mahalında ermənilərin yüksək vəzifələrə təyin olunması ilə əlaqədar olaraq, Azəri türklərinin qətliamlara və represiyalara məruz qalmasını müəllif belə qələmə almışdı:

Türk deyənin dilçəyini kəsdilər,
Haq deyəni tapdalayıb əzdilər,
Millətimi dərd yoluna düzdülər,
Bu ellərin bir büsatı qalmadı.

Vicudü cismimi alıbdi vərəm,
Təpədən dırnağa kədərəm, qəməm.
"Öldü qoç Koroğlu,öldü xan Kərəm",
Igidlərin bir qiymatı qalmadı.

Aşıq Heydər Axırkələk, Axısqa və Əsmincə ellərinin 1944 - cü ildə Stalinin fərmanı ilə Sibirə və Orta Asiyaya deportasiya edilməsini ürək arğısı ilə belə qarşılamışdır:

De, bu nə fərmandı, bu nə əmirdi!?
Ya Rəbbim! canımız daşdı, dəmirdi!
Gəlmələr yurdumu yıxdı, yemirdi,
Getdi şan - şöhrətim, daha nə deyim!?

Köç karvanı Ağbabadan yan gedir!
Yaralarım göz- göz olub, qan gedir!
Aşıq Heydər, sənnən şöhrət - şan gedir!
Getdi şan - şöhrətim, daha nə deyim!?

Aşıq Heydər 1917 – 1920 - ci illərdə Ağbaba süvari alayının 1 – ci qrupunun baş komutanı, Ağbaba Milli Şurasının üzvü, Hacı Abbas oğlu Mahmud ağanın yaxın dostu olmaqla bərabər, Ağbaba Süvari Alayının baş aşığı kimi döyüş meydanlarında gənclərimizin milli ruhda tərbiyə almasında böyük xidməti olmuşdur.

Ustadıın yaradıcılığına nəzər salsaq görərik ki, yuxarıda deyilənlər açıq - aydın şəkildə öz təsdiqini tapmış olur:

Qara zurna çalır döyüş cəngini,
İgidlər oynayır millət səngini,
Əzin igidlərim, düşmən əngini,
Başsız qalan kafir baş oynatmasın.

Aşıq Heydər vətənini öz canından artıq istəyirdi. Böyük sənətkar Ağbaba Süvari Alayının 1 – ci qrupunun baş komutanı (1919) Ağbaba Milli Şurasının üzvü Hacı Abbas oğlu Mahmud ağanın məktubuna cavabında, vətən həsrətini və öz millətinə olan məhəbbətini belə göstərmişdir:

Aldım məktubunu, bil Mahmud ağa,
Layiq deyil səni tutam qınağa.
Canım olsun millətimə sadağa,
Millət qurban desə, siz məni kəsin.

Mən hicran qəhrində, qəm taptağıyam,
Mehri-məhəbbətdən ev tustağıyam.
Cəmi Ağbabanın qurbanlığıyam,
Millət qurban desə, siz məni kəsin.

Yurdu taptaladı düşmən atları,
Tutdu tellərimdən qəm cəlladları,
"Ağbaba Alayının" mərd ovladları,
Millət qurban desə, siz məni kəsin.

El-oba aşığı sevmış, mənəvi və maddi cəhətdən ona köməkliklər göstərmiş, əsərlərini əzbərləyərək, yaddaşlarda mühafizə edib bu günümüzə kimi gətirmişdir.

Aşıq Heydər el-obaya, yurda nə qədər bağlı olsa da həmişə özündən narazı olub.

Bu barədə ustadıın "Mənəm" müxəmməsinə nəzər salsaq yerinə düşər:

Dindirməyin məni, ellər,
Yaram sağalmaz yaradı.
Danışmağa halım yoxdu,
Hər yerim para - paradı.
Desələr ki, Aşıq Heydər,
Bir topdağıtmaz qaladı.
Qızıldan taxtım olsa da,
Yeksanda qərq olan mənəm.

Bu kitabda Aşıq Heydərin **"Gümrü qızı"** adı ilə bağlı bir dastanı verilmişdir. Bu dastan "Sona və Sərdar" adı ilə tanınmışdır*****. Dastandakı hadisələr Ağbaba, Gümrü, İrəvan, Çıldır – Qars ərazisində baş vermişdir. Burada siyasi hadisələr qeyd olunsa da, əsərin qəhrəmanı Sona xanımla Sərdar paşadır. Onların başına gələn macəralar dastanın əsasını təşkil edir. Maraqlıdır ki, burada verilən surətlərin bəziləri müəllifin həyatı və vətəni ilə six bağlıdır. Məsələn, Kərim atasının, Zeynəb isə anasının adıdır. Çox güman ki, bu əhvalatlardakı qəm – qüssə bununla bağlıdır.

Dastanda varislik ənənəsi ( şahzadəlik, sərdarlıq məqamı) atadan oğula keçməsi ustalıqla göstərilmişdir.

Yetim Kərim xüsusilə bacarığına, sərkərdəlik qabiliyyətinə görə böyük hörmət, izzət qazanır. Buna görə də Ağbaba mahalının ixtiyarı ona verilir. O, düşmənlərə qarşı döyüşlərin birində qəhrəmancasına həlak olur.

Onun oğlu Sərdar sonralar Gümrünün sərdarı təyin olunur. Bu şəhərdə Sərdar Sona adlı bir qızla tanış olur.

Böyük sənətkar aşiq və məşuqin ilk görüşünü belə qələmə almışdır:

Yaralı könlümə yaraşmaz ziynət,
Sanki bir mələksən ey sərvi – qamət.
Səni sevən aşiq istəməz cənnət,
Cənnəti - Rizvannan gözəlsən, gözəl.

Qəm üstə yatmağı etmişdim peşə,
Mövlam nişan verdi, gəldim görüşə.
Pərişan bülbüləm, sən tər bənövşə,
Sərvi - Xuramannan gözəlsən, gözəl.

Dastanda adamı tərpədən, həyəcanlandıran dramatik epizodlar az deyil. Məsələn, Molla Dursun Bəkir ağaya deyir:

- Dul qadının şəriətlə dul qalması günah sayılır. Odur ki, Kərimin bir kimsəsi olmadığına görə gərək Zeynəb mənim bacım oğlu Söyünə ərə getsin. Bu barədə bacım oğlu ilə danışmışam.

Mollanın sözləri sillə kimi Bəkir ağanın üzünə dəyir.
Dastanda Sona xanıma buta verilməsi öz dili ilə belə göstərilir:

Yatmışdım, yuxumda mən səni gördüm,
Sən bülbülsən, bu da güldü, dedilər.
Gəlmişdi üstümə badə verənlər,
Qızım, bəxtin üzə güldü, dedilər.

Dastanda Sona xanımın bir neçə il övladı olmadığından, dolayı dərd çəkməsi adamın diqqətini çəkir. Əslində müəllif Sərdar paşa və Sona xanım sürətlərinin müsbət cəhətlərini nisbətən qabarıq vermək, onların dərdə qayım olduğunu göstərmək üçün bunu iştəmişdir.

Sərdarın əkiz övladları doğulduqdan sonra adama elə gəlir ki, hər şey xeyirliyə doğru davam edəcəkdir. Amma əsərə diqqət yetirəndən sonra bunun nisbi olduğu məlum olur. Siyasi hadisələr hər şeyi pozur. Qəza, qəzanın dalınca gəlir. Qaçaqaçda Sona xanım oğlanlarını, ərini itirir. Burada gərginliyin artmasında siyasi hadisələr (yadların və namərd qonşuların müdaxilələri) mühüm rol oynayır. Gümrü şəhəri bu hadisələr nəticəsində xarabalığa çevrilir, nəhayət düşmən məğlub olur. Gümrü şəhəri yenidən canlanır, abadlaşır.

Siyasi hadisələr fonunda Sərdar paşa məqamından düşür və uzaq bir vilayətə (Mosula) yola düşür, amma yenə tale onun üzünə gülür, Mosul sərdarı olur. Onun əvvəlki mövqeyi təmin olunsa da, arvadı və övladları haqqında heç nə bilmədiyindən narahatçılıq onun yaxasını əldən buraxmır.

Bu dastanda məhəbbətin sirli bir qüvvə olamsını aşıq Heydər belə qələmə almışdır:

Şamu – səhər yalan oldu,
Əsam döndü ilan oldu,
Könül evim talan oldu,
Eşq məni boyadı qana.

Çıldırdan səslə məni,
Ağbabadan istə məni,

Bir gözəlin üstə məni,
Eşq məni boyadı qana.

Sərdarın Gümrüyə göndərdiyi adamların heç biri onun yaxınları haqqında məlumat gətirə bilmr. O, özü dərviş - libas olub Gümrüyə yollanır. Sərdar paşa Nağdəli bəyin evini, bağını axtarıb tapır. Tədricən gərginliklər nisbətən azalır, Gümrü şəhəri düşmənlərdən təmizlənir. Nəhayət, Sərdar öz ailəsinə qovuşur.

Dastanda Sərdar paşanın dərviş qiyafəsində Yetim Tapdıqla deyişməsi xüsusilə maraqlıdır. Bu deyişmə onun mənəvi aləmi, dini - urfani görüşləri haqqında fikir söyləməyə imkan yaradır.

Əvvəlcə Sərdar paşanın yaralanıb naməlum şəraitdə yoxa çıxması, daha sonra onun oğlanlarının birini qurd, o birini isə çay aparması oxucuda vahimə yaradır. Adama elə gəlir ki hər şey faciə ilə nəticələnəcək. Amma gözəgörünməz bir qüvvə onları, bir ailənin üzvlərini qoruyur, mühafizə edir. Çünki əsərin əsas qəhrəmanlarından biri Sərdar paşadır, o buta almış haqq aşıqidir. Elə buna görə də onun övladlarının ölümü əsərdə öz əksini tapmamışdır.

Qayıdaq söhbətimizin əvvəlinə. Bəs Sərdar paşa və onun övladlarını qoruyanlar kimlərdi? Əlbəttə, onları Sərdar paşanın ağası "Böyük Gözə Görünməz Allah" qoruyur. Hadisələrin gedişi bunu təsdiqləyir.

Dastanın sonuna yaxın əsərin əsas qəhrəmanları uzun-uzadı ayrılıqdan sonra qucaqlaşanda yerə yıxılıb huşsuz qalırlar. Elə bu vaxt meydanda Dəli Dərviş görünür. O, buraya nəyə gəldiyini adamlara belə anladır:

"Mən xanəmdə yatmışdım, məni oyatdilar və buraya göndərdilər. Dedilər, get orada ölənlər var, çal, oxu və onları dirilt".

Bəli, Dəli Dərviş çalıb oxumağa başlayır. Bundan az keçməmiş Sərdar paşa, sonra isə Sona xanım özlərinə gəlir.

Bu hadisə əslində Ağbabanın regional dastanlarında rast gəlinən ənənəvi hadisə olub, ölüb - dirilmə motivinin mahiyyətini özündə əks etdirir.

Bu kitabda sinədəftər adamların el-oba söhbətlərini, adət-ənənələrini qəlbində yaşadan, Aşıq Heydəri görənlər, onun müasirləri, yaşlı nəslin nümayəndələri, el ağsaqqalları, tanınmış ziyalılarımız maddi və mənəvi sərvətimiz ilə bağlı zəngin bir mənbə rolunu oynaya biləcək toplu yaradıblar.

Bəli, folklor mədəniyyətin təzahürü olub, xalqın elmi baxışlar sistemi və çoxsaylı elmi çarpazlaşmalar mənbəyidir. Ayrı-ayrı hadisələr və şəxsiyyətlər haqqında rəvayətlər tarixçilər üçün, yer-yurd adları haqqında rəvayətlər coğrafiyaçılar üçün əvəzsiz mənbədir.

Əlbəttə, Aşıq Heydər yaradıcılığı zəngin bir xəzinədir.

Aşıq Heydər yaradıcılığında Sovet hökumətinə təriflər olmadığına görə, Ağbaba mahalında Azəri Türklərinə qarşı erməni daşnaqlarının törətdikləri qanlı cinayətlər aydın göstərildiyi üçün, Aşıq Heydər yaradıcılığı uzun illər açılmamışdır. Aşıq Heydərin özü və yaxın qohumları hədə-qorxulara məruz qalmışdır. 1937-1940-cı illər Aşıq Heydər üçün ağrılı-acılı illər olmuş, özünün deriyi kimi erməni daşnaqları tərəfindən Amasiya rayonunda yaradılan üçlüklər vastəsilə 70 yaşlı aşığın Sibrə sürgün olunma məsələsinin ortaya atılması və yaxın qohumlarının isə öldürülməsi ilə (Məşədi Rəcəbin üç nəvəsi) nəticələnmişdir.

Sadəcə biz bu kitabda Aşıq Heydər yaradıcılığından imkanımız daxilində söz açdıq.

**Tacir Səmimi.**
**Filologiya üzrə fəlsəfə doktoru.**

---

**Gümrü**:- 1804-çü ilə qədər Qərbi Azərbaycanın (indiki Ermənistanın) Şörəgəl mahalının mərkəzi şəhəri olub.

# AĞBABALI USTAD AŞIQ HEYDƏR FENOMENİ

Aşıq Heydər Qərbi Azərbaycanın, Azərbaycan torpaqları hesabına yaradılmış indiki Ermənistanın Ağbaba mahalının 1867-1949-cu illərdə yaşayıb-yaratmış ustad sənətkarlarından biri olmuşdur. Aşıq Heydər Göyçə mahalının məhşur yaradıcı aşıqları olan Aşıq Ələsgər (1821-1926), Aşıq Alı kimi, Çıldır, Qars, Ağbaba mahalının Aşıq Şenlik (1853-1912), Aşıq Nəsib, Çorlu Məhəmməd kimi çox bənzəri olmayan görkəmli sənətkarlarından biridir. Onun bədii irsi öyrənilməmiş, toplanmamış, az qala xatirələrdən silinmişdir.

Xoşbəxtlikdən bu zəngin irsin bir qismi əslən Ağbabalı olan, indi Azərbaycan MEA – Folklor İnstitunun baş elmi işçisi Tacir Səmimi, Aşıq Heydərin nəvəsi Yusif Heydərovun və nəticəsi Əbülfət Heydərin təşəbbüsü ilə toplanıb çap edilmişdir.

Kitabda Aşıq Heydərin irsindən 48 qoşması, 11 gəraylısı, 7 divanisi, 1 ustadnaməsi, 1 təcnisi, 1 qıfılbəndı, 1 bənzətməsi, 6 deyişməsi, 8 rəvayəti və 1 dastanı toplanmışdır. Aşıq Heydər çox böyük sənətkar olmuş, Ağbaba, Qars, Çıldır, Gümrü, Şörəgəl, Borçalı, Axırkələk, Axısqa, Əsmincə bölgələrində el şənliklərində saz çalıb oxumuş, məclisləri yola salmışdır. Bu şeirlər göstərir ki, aşığın irsi Ağbabanın tarixi, etnoqrafiyası, adət - ənənələrinin zəngin ensklopediyasıdır.

"Bax" rədifli şerinə diqqət yetirək:

Dayan ağam, dayan bəyim, dayan, dur!
Ayaq saxla! Burda yatanlara bax!
Bu meydana diqqət eylə, bəri gəl!
Dağların damənin tutanlara bax!

Qanla yazılbdır hər bir baş daşı!
Bunların olubdu on - on beş yaşı!
Bunlardı vətənin bir üzük qaşı!
Qəhrəman qızlara, oğlanlara bax!

Yağı gəlib Qaraxaçda dayandı!
Zağlı toplar yuvasından oyandı!
Əlvan qanım daşlar üstə boyandı!
Düşmənin bağrına batanlara bax!

Arpaçay yanında savaş quruldu!
AlMərdan düzündə əsgər qırıldı!
Axan qanlar sular üstə duruldu!
Özlərin sellərə atanlara bax!

Qara gəldi yetmiş yeddinin yazı!
Urus paşa oldu, qaxtağan qazı!
Heydərın əlində ağlayır sazı!
Üz tutub cənnətə çatanlara bax!

Şeirdə 1878-ci il rus-türk müharıbəsi hadisələri əks olunmuşdur. Şair göstərir ki, rus – erməni birləşmələrinin Ağbabanın Düzkənd – Təpəköy – Göllü arasında AlMərdanın[1] çayırında hər iki ordu böyük tələfatlar verdi. Ağbaba ilə Gürcüstanı ayıran Qaraxac dağından (güney) Türkiyə səhrəddinəcən ərazidə (quzey) Arpaçayın sol sahilində döyüşdə həlak olanların həddi – hüdudu olmayıb. Ağbabadan, Qarsdan, Çıldırdan və iç Anadoludan olan döyüşçülərin cəsur, qəhrəmancasına döyüşü nəticəsində Arpaçay qan gölünə çevrilir. Türk qoşunları toplu – tüfəngli mənhus düşmənin qarşısında məğlub olur. Ağbabalıların, Axırkələk, Əsmincə, Axısqa türklərinin taleyi sual altında qaldı. Ağbaba, Axısqa və Əsmincənin kafirlərin əlinə düşməsi bütün orada yaşayan xalqların, o cümlədən böyük el ağsaqqalları olan aşıqların dərdinə çevrildi.

Qeyd: Düzkənd kəndinin varlı və alicənab ağalarından biri olan Qərib babanın 1940–ci ildə danışdığı cox dəyərli məlumatdan belə məlum olur ki, rus-türk müharibəsi (1878) zamanı, Mərdanın çayiri deyilən bu bölgədə, rus və türk həbi birləşmələri arasında şiddətli və amansız döyüşlər aparılıb. Mərdanın çayırında torpaq al qana boyandığından sonralar el arasında bu yer, AlMərdanın çayırı adlandırılıb. Qərib babanın dediklərindən: - Mən uşaq olanda bu yerlər insan sümükləri ilə dolu idi. İnsan sümüklərindən bu yerləri biçmək mümkün deyildi. (Y.H)

Aşıq Nəsib o vaxt yazırdı:

Dərd əlindən şan – şan oldu ürəyim!
Yeri, könül, yeri, Qarsa gedəlim!
Ağbabadan üz çevirib o yana,
Bu yaxına bəri, Qarsa gedəlim! (4.s)

Aşıq Heydər 1918-20-ci illərdə ermənilərin Ağbabaya həmlələrini Marzmanov adlı daşnaq erməni qulduruna yazdığı "Gəlir" rədifli qoşmasında ıfşa etdirmişdir:

Aldıq məktubunu qanlı Mazmanov,
Bilirik üstümüzə yaramaz gəlir.
Başına yığıbsan beş, on dığanı,
Gündə sizdən bizə bir avaz gəlir.

Kişi deyil bu işləri boşduya,
Bir namədə yazıb saldıx poştuya.
İstəmirdik qanlı savaş başdıya,
Döyüş meydanına yüz min laz gəlir.

Şura hökümətinin Ağbabada, eləcə də bütün tutulan türk (Azərbaycan) yurdlarında törətdiyi repressiya, zülm, işgəncə Aşıq Heydər yaradıcılığında çox görünən xətlə əks olunmuşdur:

Xan yurdunda tülkü - çaqqal ulayır!
Xoruz kürkə yatır, toyuq banlayır!
Mən yazığı gədə - güdə danlayır,
Görən niyə mən irəldən ölmədim!?

1919-cu ildə Qars, Çıldır, Gümrü, Şörəgel və Ağbabada rus hərbi birləşmələrinin daimi köməyinə arxalanan qaxtağan ermənilərin törətdikləri milli ixtilaf və bununla əlaqədar aşığın Cənubi Azərbaycanın Mərənd şəhərinə pənah aparması "Var" rədifli qoşmasında aydın göstərilmişdir. Aşıq Heydər Cənubi Azərbaycanın

Mərənd şəhərində olan zaman, Təbriz mənim atam, Ağbaba isə anamdır demişdi.

Bu böyük naseh Təbrizi Azərbaycan xalqının "Piri" arlandırmışdır:

Ucaltmışam hər bir yerdə səsimi,
Tanıyırlar soykökümü, nəslimi.
Qaxtağanlar dana bilməz əslimi,
Türk oğluyam, burda mənim yerim var!

Qul Heydərə aranlı de, dağlı de,
Bu vətənə, bu mahala bağlı de.
Hər vaxt mənə bu torpağın oğlu de,
Çünki burda "Təbriz" adlı pirim var.

Aşıq Şura hökümətinin bölgədə yaratdığı repressiyanı, insanlara edilən zülmü, istismarı öz seirlərində mərdliklə ifşa edirdi. "Kimə deyim" rədifli gəraylısı bu cəhətdən ibrətamiz məzmuna malikdir:

Daha eşitdiyim budur:
«Davariş»lə xaraşodu.
Dilimə almışam odu
Mən dərdimi kimə deyim?!

Namərd görmüşəm Soveti,
Nədi – gədə hökuməti,
Mərdin qalmadı qiyməti,
Mən dərdimi kimə deyim?!

Şair Qarsın yollarının bağlanmasından, türk deyilən dillərin dağlanmasından, həqiqətin xalqdan gizli saxlanmasından fəryad edir!

Aşıq Heydər el – obasını böyük məhəbbətlə sevən, Ağbaba, Şörəgəl, Gümrünün bənzərsiz gözəlliklərini tərənnüm edən, doğma yurdunu sevə - sevə, ovlad kimi oxşayan şairdir. Bu cəhətdən onun "Dünyaya səs salıb Ağbaba dağı" adlı altılıq şeiri çox önəmlidir.

Bilinmir tarixi, bilinmir yaşı,
Ləlü cəvahirdi torpağı, daşı,
Duman - çiskin basıb, görünmür başı,
Burda mərəz tapmaz insanın sağı,
Dünyaya səs salıb Ağbaba dağı.

Yamac – yalı, gül - çiçəkdən seçilmir,
Qonaqları bulaqlardan çəkilmir,
Motalından, qaymağından keçilmir,
Ədalət meydanı, abdal ocağı,
Dünyaya səs salıb Ağbaba dağı.

Tarixlərdən gəlir səsi - sorağı,
İgidlər məskəni, ərlər yaylağı,
Adı dil əzbəri, cənnət qırağı,
Heydər der: Var olsun, vətən torpağı,
Dünyaya səs salıb Ağbaba dağı.

Bəli, Aşıq Heydər sorağı tarixlərdən gələn, "igidlər məskəni", "şirlər yuvası", adı dillər əzbəri, "cənnət məkanı" olan Ağbabanın Şişdağını, Taya Qayanı, Qaraxaç dağını özünün doğma ana qucağı kimi tərənnüm edir! Belə gözəl diyarın namərd, xəyanətkar qaxtağan gavurların əlinə keçməsi onun ürəyini dağlayır! Belə ağır dərdə dözmək, dözə bilmək, tab gətirmək aşıq üçün çox çətin olur:

Əs ey səba yeli, dolan dağları,
Vətəndi kiridən mən tək ağları.
Ömür bostanının solur tağları,
Qəza tutub, mən ağlımı atıram.

Aşıq Heydərin Aşıq Ələsgər, Aşıq Alı, Aşıq Şenlik səviyyəli yüksək sənətkar aşıq – şair olduğunu göstərmək üçün bir gəraylısına müraciət edək:

Mələşir qoyun-quzular,
Gələn yazın havasından.
Bilinir ki, «Dübeyti»dir
Telli sazın havasından.

Daylaqlar oynar, qapışar,
İnsan torpaqla tapışar.
Cütün maçından yapışar,
Cütçü çıxıb yuvasından.

Dəlilənən sellər, sular,
Bulanıq axar, durular.
Heydər ellərdən sorular,
Ağbabadan - obasından (1.s.168).

Bu şeirdə Ağbabaya bahar fəslinin gəlişi özünəməxsus təsvir vasitələri ilə canlandırılıb: qoyun - quzuların axşamçağı kəndə qayıdarkən mələşməsi, daylaqların oynaşıb – qarpışması, insanların oyanan torpağa tapınması, o zamanki əkin vasitəsi olan cütün maçından yapışıb əkin – tikin işlərinə başlaması, bahar sularının qarı əriyib dəlinənən sellər yaratması təsvir olunur. Ancaq çox ürəyə yatımlı bir tərzdə lap Aşıq Heydər sazından süzülüb gələn "dubeyti" havası kimi! Aşıq "vədəsidi" rədifli gəraylısında yamac – yala "xal" düşməsini, danaqıran, mollabaşı çiçəklərinin qarın altından baş qaldırmasını, buzları sınmış Arpagöldə, Arpaçayda ördəklərin, qazların, leyləklərin bir-biri ilə səsləşməsini Ağbabanın əvəzi olmayan nağıllı dünyası kimi tərənnüm edir!

Nə gözəldi dağın döşü,
Danaqıran, mollabaşı.
Deyir yola saldıq qışı,
Qızların naz vədəsidi.

Heydər, əsir dağın yeli,
İş-güc tərpədir bu eli.
Çayın, gölün, suyun, selin
Ördəklə qaz vədəsidi.

Di gəl ki, aşıq çox dərdlidir! Misralardan başdan-başa qəm, göz yaşları süzülür! Tökülübdü yola ellər! "Qan ağlayır şirin dillər" "Ağbaba düşübdü bəndə"! "Belə betər talan yoxdur" "Yazıq Heydərdə yoldadır" "Bir betər yaman haldadır!.."

Aşığa, onun elinə olan zülm heç kəsin başına gəlməsin!

On doqquz- iyirmi yaşında ikən İstambul yaxınlığındakı Dəyirman kəndindəki bəyin qızı üçün ona yuxuda "buta" verilir. Bu hadisədən sonra o sinədən şeir demiş, saz əlində el arasında "Aşıq Heydər" adını qazanmışdı. Adının eldən-elə, dildən-dilə düşməsi anası Zeynəbi, babasını çox narahat etmiş, onun əlini "Qurana" basdırıb İstambul yaxınlığındakı Dəyirman kəndinə getməyi qadağan etmişlər. Gənc Heydər bundan sonra çox təsirlənmiş, böyük faciəli həyat yaşamış, "Ana" və "Gedirəm" seirlərində bu "sövdanı" yaşadığı həqiqi qaçılmaz facià kimi qiymətləndirmişdir:

Mənim başımı əydirmə,
Görən gözümüm oydurma.
Məni qəm ilə doydurma,
Yollarımı tutma, ana.

Yazı yazan yazıb bunu,
Tanrıya tutsan bir yönü.
Bu eşqin görünmür sonu,
Günaha gəl batma, ana.

Yaxud "Gedirəm" şeirində bu ağrılı məqamları necə verir:

Halal eylə, icazə ver,
Yuxarıda Allahı gör.
Gəl bu uçuq qəlbimi hör,
Gedirəm, ana, gedirəm.

Haqdan içmişəm badəni,
Sinəm gövhərin mədəni.
Gedim görüm gülbədən,
Gedirəm, ana, gedirəm.

Bu bölgənin bütün aşıqları – Aşıq Nəsib, Aşıq Şenlik, Çorru Məhəmməd, Aşıq İskəndər Ağbabalı öz yaradıcılıq məhsullarında məhz 1877-1878, 1918-20, 1930-40 və 1988-ci il hadisələrin doğurduğu qəm-kədər, sızıltı motivləri ilə doludur. Çünki aşıqlar məhz el ağsaqqalları, elin dərd-sərini və sevincini ürəklərində gəzdirən mərd insanlar, böyük şəxsiyyətlərdir.

Nəhayət, bu yazımızda bir məsələyə də toxunmağı çox vacib hesab edirik. Aşıq Heydərin irsi bütün əslən Ağbabadan, Düzkənddən olan, hazırda respublikamızın bütün bölgələrində yaşayan, aşığı görmüş, şairi tanıyan, şeirlərini, nəğmələrini eşitmiş, onu bilavasitə və dolayısı ilə tanıyan adamlardan öyrənilib toplanmalı, Aşıq Heydərin nəvəsi Yusif Rəhim oğlu Heydərovu da bu işə qoşmaqla bu iş məhz AMEA Folklor İnstitunun baş elmi işçisi Tacir Səmimi tərəfindən həyata keçirilməlidir. Toplanmış, əldə olan materialları təkmilləşdirmək, orijinal varianta qaytarmaq üçün onlara yenidən baxmaq çox vacib diqqət tələb edir.

Sonda ancaq onu deyə bilərik ki, Ağbaba-Şörəgəl əsrlərdən bəri formalaşmış bir türk eli idi. Zəngin adət-ənənələri, folkloru, böyük şəxsiyyətləri olan bənzərsiz bir el idi! Sovet quruluşunun Krım tatarlarına, Əsmincə-Axırkələk ellərinə etdiyi repressiya, deportasiya Ağbaba elinə qarşı da həyata keçirildi. Bu tarixi haqsızlıq təxminən 10 min kvadrat km ərazidə törədilmişdir. Xalqımız Dağlıq Qarabağ ərazisinin Azərbaycana qaytarılması tələb etdiyi kimi, Ağbaba eli də tarixi torpaqlarına qayıdıb, öz taleyinin ağası olmaq, öz xoşbəxtliyinə qovuşmaq məqamını daima gözləyir!

İstifadə edilmiş ədəbiyyat

1.T.Səmimi, Ə.Yusifoğlu. Unutsaq-unudularıq. B., 2009.-530 s.

2.Aşıq İskəndər Ağbabalı. Ayırdılar Ağbabadan. B., "Ozan" 1998.-184 s.

3.Aşıq Paşa Göydağlı. Ağbabadan köç gədi.B., "Ozan", 1998.-160 s.

4.Q.Əliyev. Çıldırlı Aşıq Şenlik. B., "Azərnəşr", 2011.,-180 s

5.Meqrelidze.Ş.B. Zakavkaziya v russkoy voyne. 1877-78.q. Tbilisi,1972

**Xurşud Məmmədli**

**Pedoqogika üzrə fəlsəfə doktoru. SDU –nin dosenti.**



# TƏRTİBATÇIDAN

Ozan-aşıq sənəti Azərbaycan el ədəbiyyatının ən zəngin qolunu təşkil edir. Bu yaradıcılıq aləmi geniş, çoxşaxəli olduğu qədər də qədimdir, öz rişələrini xalqın bədii təfəkküründən alıb əsrlər boyu ona yoldaşlıq etmiş, uzun inkişaf prosesində təkminləşib püxtələşmiş, zəmanəmizə qədər gəlmişdir.

Öz mənbəyini, kökünü ozan yaradıcılığından başlayan, bu irs üzərində pərvəriş tapan aşıq bu gün də böyük coşqunluqla yaradıb-yaşadan, çalıb-çağıran, müasir həyatımızı müasir, misilsiz qələbə və nailiyyətlərimizi qopuz dünyasının yadigarı telli sazın dili ilə tərənnüm edən bir sənətkar kimi fəaliyyət göstərməkdədir. Bu fəaliyyət dairəsi, sənət sinkretizmə görə aşıq, heç şübhəsiz ki, öz keçmişinə, sələfi ozana borcludur.

Yaradan xalqımıza zəhmətkeşlik, istedad, qonaqsevərlik kimi gözəl keyfiyyətlər, dünyanın 11 iqlim qurşağından 9-nu özündə saxlayan, yeraltı və yerüstü sərvətlərlə dolu bir vətən verdiyi kimi, insanlıqdan, mərhəmətdən, haqq və ədalətdən, abır- həyadan uzaq olan bir qövm ilə qonşu olmağa da məhkum etmişdir.

Bəlkə bu böyük yaradanın bir sınağıdır? Nə bilmək olar? Amma bu bir həqiqətdir ki, hələlik biz o yerləri- doğma yurdu, əlimizlə tikib -abadlaşdırdığımız kəndləri, onların hər bir daşını, bulağını, babalarımızın uyuduqları torpaqları həsrətlə yad etməyə məcburuq. Bu da Allahın əmridir. Yoxsa iki cüt, bir tək dığanın əlində acizmi qalacaqdıq!

**Ağbaba** ağız ədəbiyyatı açılmamış bir xəzinədir. Çox heyflər olsun ki, bu xəzinə öyrənilməmiş, toplanmamış, diqqət və qayğıdan kənarda qalmış, neçə - neçə söz sərrafının yaratdığı incilər itib batmışdır. Ağbaba folkloru öz zənginliyinə görə diqqəti cəlb etsə də, daha çox Anadolu folkloruna bənzəyir. Ba da təbiidir. Çünki Ağbaba ərazisi tarixən Şərqı Anadolu sayılır. Bu bölgədəki miflər, mifoloji rəvayətlər, əfsanələr, rəvayətlər xüsusilə maraqlıdır və daha çox diqqəti çəlb edir.

Ağbaba ağız ədəbiyyatının toplanmasına son illərdə başlanmışdır. Ağbaba folklorunun toplanmasında toplayıcılar içərisində **Tacir Səmiminin** xüsusi yeri vardır.

Bəşəriyyətin bədii təfəkkür tarixində elə dahilər yetişmişdir ki, onlar mənsub olduqları xalqın şan-şöhrətini artırmış, öz istedad və dühasını hamıya təsdiq etmiş, Böyük Türk Xalqının yaradıcılıq qüdrətini dünyaya bəyan etmişlər. Bu cür dahilər son dərəcə milli və orjinal sənətkarlar olmaqla bərabər, milli çərçivəyə və müəyyən dövr çərçivəsinə sığa bilməmişlər. Onlar milli zəmində inkişaf edərək milli mənlikləri ilə bütün qabaqcıl bəşəriyyətin ən yaxşı düşüncə və arzularını, maddi və mənəvi mədəniyyətlərini, ailə məişətini, adət- ənənələrini, həyat mübarizəsini öz əsərlərində tərənnüm etmişlər. Ona görə də belə dahilər dünyanın bütün xalqları içərisində böyük hörmət və məhəbbət qazanmışlar.

Ağbabalı Şirəkli Həsən, Aşıq Qərib Hasan, Sofu Baba, Dədə Dərbədəri, Sofu Dədə, Qoca Alı, Şahverdi Qarapapaqoğlu, Aşıq Nəsib, Aşıq Heydər, Çorlu Məhəmməd, Aşıq Məhəmməd, Yetim Tapdıq, Yetim Əsgər, Xəstə Zərnişan, Gülbahar, Aşıq İsgəndər Ağbabalı, Aşıq Paşa Göydağlı kimi el sənətkarları Ağbabanın sazını – sözünü eldən – elə, dildən – dilə salıb yaşatmışdırlar.

Belə dahilərdən biri də hələ sağlığında ikən Qərbi Azərbaycanın (indiki Ermənistanın) Ağbaba mahalının aşıq peziyasının incisinə çevrilən, səksən illik ömrünün əlli ilindən coxunu şeirə, sənətə və öz xalqına həsr edən, ictimayi fəaliyyətində xalqımızın mədəniyyətini daimi zənginləşdirən aşıq Heydərdir.

**Aşıq Heydər** Ağbabada aşıq sənətinin inkişafında çox böyük xidməti olan dahi sənətkarlardan biridir.

Aşıq Heydərin əsərlərinin ciddi redaktə olunmasına, onları ilkin yazılış məqamına uygunlaşdırılmasına ciddi ehtiyac vardı. Çünki bu şerlər dildən-dilə gəzərək təhriflərə uğramışdır.

Belə bir mövqeyi bərpa edib əvvəlki vəziyyətinə qaytarılmasını bizə qan eyniliyimiz bəxş edib.

Aşıq Heydərin çap olunmayan, yaddaşlarda yaşayan əsərlərini toplamaqda bundan sonrada bizə yardımçı olacaq hər bir kəsə əvvəlcədən təşəkkürümüzü bildiririk.

Onu da qeyd edək ki, indiyə kimi Aşıq Heydərlə bağlı üç kitab nəşr olunub. Aşıq Heydərlə bağlı rəvayətlərin toplanmasında həmyerlimiz filologiya üzrə fəlsəfə doktoru Tacir Səmiminin böyük əməyi olmuşdur. Ona bir daha can sağlığı və belə xeyriyyəçilik, xeyirxahlıq işlərində uğurlar arzulayıq.

**Məmmədov Heydər Kərim oğlu** 1867 – ci ildə Ağbaba bölgəsinin Düzkənd kəndində dünyaya gəlmişdir. Bu böyük sənətkarın Qars-Çıldır-Ağbaba türk dünyasının ustad aşıqları;- Aşıq Şenlik, Aşıq Nəsib, Aşıq Çorlu Məhəmməd, Gümrülü Yetim Tapdıq, Axırkələkli Yetim Ləvənd, Aşıq Qərib Hasan baba və.s-nin dostluq əlaqələri olmuşdur.

Aşıq Heydərin yaşadığı dövr, rus-erməni daşnaq hərbi birləşmələri tərəfindən Qafqaz və iç Anadoluda ana vətən torpaqlarımızın işğalı dövrünə təsadüf edir. Buna görə də onun əsərlərində toplanmış materiallar Azərbaycan xalqının keçmişi ilə müasir həyatı arasında körpü rolunu oynayır.

Aşıq Heydər Ağbabada erməni daşnaqlarına qarşı təşkil olunmuş 1918-1921-ci illərdə Ağbaba Süvarı Alayının baş aşığı kimi fəaliyyət göstərməsi, həmçinin Ağbaba 1-ci Süvari Alayının yüzbaşısı Hacı Abbas oğlu Mahmud ağanın yaxın dostu olmuşdur.

**Ağbaba Milli Şurasının Sədri Hacı Abbas oğlu Məhəmməd ağa Aşıq Heydəri Ağbaba Süvari Alayının incisi adlandirmışdır.**

Bu baxımdan Aşıq Heydərin ədəbi - bədii irsinə etnoqrafik mənbə kimi müraciət etməyimiz təsadüfi hadisə kimi deyil, tamamilə aktual və normal hal kimi qəbul edilməlidir.

Aşıq Heydər 1949-cu ildə 82 yaşında Qərbi Azərbaycanın Ağbaba mahalının Düzkənd kəndində vəfat etmişdir. Sovet hökumətinə tərif demədiyinə, yaradılan zülm və istismara, haqsızlıqlara və s. görə mətbuat aşığın üzünə bağlanmış, irsi vax-

tında toplanmadığından itib - batmışdır. Hafizələrdən qələmə alınan folklor materialları böyük sənətkarın irsindən bir damladır.

Ulu ustad Ağbabada bu müqəddəs sənətin zirvəsini fəth etmişdir desək, bəlkə də səhv etmərik. Xalqımız aşığı sevmış, əzizləmiş və əsərlərini əzbərləyərək, yaddaşlarda mühafizə etmişdir. Təkcə onu demək kifayətdir ki, böyük nəğməkarın şeirlərinin hamısı ancaq hafizələrdən yazıya alınıb toplanmışdır. 82-il ömür eyləyən Aşıq Heydər əlli ilə qədər öz sözü ilə döyüş meydanlarını və şənlik məclislərimizi ziynətləndirmiş, xalqımıza ləyaqətlə xidmət etmişdir.

Aşıq Heydərin düzüb – qoşduğu dastanlar vaxtında toplanmadığından çoxu itib – batmış, yüzlərlə şeirlərinin az hisəsi isə yazıya alınmışdır.

Kitabda ustadın "Gümrü Qizi" dastanına geniş yer verilib. Əlbəttə "Gümrü Qızı" dastanına sırf tarixi hadisə kimi baxmaq mümkün deyil, amma bu dastanda tarixin müəyyən dönəmi, dövrü qismən öz əksini tapır. Dastanın böyük əhəmiyyəti ondan ibarətdir ki, vətənə olan məhəbbət bu dastanda qabarıq şəkildə ustad tərəfindən olduqca səmimi şəkildə və gözəl məharətlə qələmə alınmışdır.

Bu kitabı tərtib edəndə ağsaqqal adamların dediklərinə, onların hafizələrində yaşatdıqları faktlara, məlumatlara, əhvalatlara, tarixi hadisələrə əsaslanmış bütün toplanmış materialları saf – çürük edəndən, arayıb - darayandan sonra Aşıq Heydərin yaradıcılığına həsr olumuş bu kitabı araya - ərsəyə gətirmişik.

Ümid edirik ki, ictimayətin və geniş oxucu auditoriyasının mühakiməsinə verdiyimiz bu əsər Aşıq Heydərin irsini sevənlər və dəyərləndirənlər tərəfindən lazımınca qiymətləndiriləcək.

Bütün irad, təklif və qeydlər üçün isə əvəlcədən təşəkkürümüzü bildiririk.

Faydalı məsləhətlərinə görə aşığın yaxın qohumu, Ağbabanın mərd və cəsur övladı, pedaqogika üzrə fəlsəfə doktoru, Xurşud Məmmədliyə və aşığın nəvəsi Yusif Rəhim oğlu Heydərova təşəkkür edirik.

**Əbülfət Heydər (Yusifoğlu Heydərov)**



# RƏHİMLİ TAYFASI

Yaşlıların dediklərinə görə, bu tayfanın adı dəqiq deyil. Bəlli olanı budur ki, tayfanın Məşədi Rəcəb, aşıq Heydər, Məhəmməd, Baxşəli, Rəhim kimi tanınmış adamları olub. Bu kişilərin ulu babaları Rəhimdir.

Rəhim kişi Naxçıvanın Şərur mahalında məhşur maral ovçusu olub. Deyilənə görə, Rəhim kişinin yaşı ilə əlaqədar gözləri tutulubmuş. Lakin Rəhim kişi gözlərinin tutulmasına baxmayaraq deyərmiş; Məni aparın maral yatağına, mən maralların iyisini alib güllə atacam, əgər mənim atdığım güllə boşa çıxsa, mənə ovçu deməyin.

Yaşlıların dediklərinə görə, bu tayfanın adamları əslən Təbrizdən gəliblər. Onların Naxçıvana gəlişi XVI yüzilliyin sonuna təsadüf edir. Çox güman ki, onlar cəsur və məğrur qızılbaşlardan I Şah İsmayıl Səfəvinin igid döyüşçülərindən olmuşlar. Bu tayfanın adamlarının Naxçıvana gəlişi I Şah Abbasın farspərəst siyasəti ilə ilgilidir (Seyid Həsən baba, 110 yaşlı, Qaraçanta kəndi, Cəlil baba, 101 yaşlı, Qaraçanta kəndi; İsgəndər baba, 80 yaşlı, Göllü kəndi; Təzəgül nənə, 75 yaşlı, Güllü kəndi). Rəhimli tayfasından bir nəfər XIX yüzillikdə Ağbabaya pənah gətirib. Bu şəxsin adı Məmməddir.

Məmməd 1818–ci ildə Şərurda anadan olub. Birinci rus-türk müharıbəsinin iştirakçısı olub, Qars sancağında türklər tərəfindən təşkil olunmuş atlı alayının onbaşı vəsivəsində çalışıb, deyilənə görə 1877–ci ildə rus – türk müharibəsində Ağbabada Al Mərdanın çayırı (Arpa çayının sağ sahili) deyilən yerdə ruslar tərəfindən qətlə yetirilib, İlanlı kəndində 59 yaşında vəfat etmişdir. Onun dörd övladı- Məşədi Rəcəb, Kərim, Molla Hüseyn və Xeyrənsə adlı bir qızı olub.

Aşıq Heydərdən alınmış bilgilərə görə Məşədi Rəcəb tez- tez Şərurdakı qohumlarına baş çəkərmiş, hətta Şərurda təşkil olunmuş cıdır meydanlarında da ad-san da çıxarıbmış. Lakin Ermənistanda sovet hökumətinin qurulması ilə əlaqədar olaraq bu gediş-gəliş sonralar dayandırılmışdı.

# AŞIQ HEYDƏRİN SOY KÖTÜYÜ



| Ulularımızın adı | Harada anadan olub | Doğulduğu il | Harada dəfn olunub | Ölüm tarixi | Yaşı | |
|---|---|---|---|---|---|---|
| Rəhim | Naxçıvan (Şəril) Şərur | – | (Şəril) Şərur | – | – | |
| Oğlu **Məmməd**<br>H. yoldaşı **Gözəl** (İlanlı kəndi Abdüləli müəllimin babası Orucun bibisi) | Şərur<br><br>"İlanlı" kəndi | 1818<br><br>– | Ağbaba, "İlanlı» kəndi<br><br>"İlanlı" kəndi. | 1877<br><br>– | 59<br><br>– | |
| | | | | | | |
| **MƏMMƏDİN ÖVLADLARI VƏ HƏYAT YOLDAŞLARI BARƏDƏ** | | | | | | ÖVLADLARI |
| **Məşədi Rəcəb, Mədinə İsaq qızı (Kalbayəli tayfası)** | «İlanlı» kəndi<br><br>«Daşkörpü» kəndi | 1844<br><br>– | "Düzkənd"<br><br>"Düzkənd" kəndi | 1922<br><br>1923 | 78<br><br>– | 1.Nərgiz<br>2.Məhəmməd<br>3. Bəsdi<br>4. Gülsüm<br>5. Şərəf |
| **Kərim,**<br><br>**Zeynəb (Molla Əhməd qızı)** | «İlanlı» kəndi<br><br>«Düzkənd» | 1846<br><br>– | «İlanlı»<br><br>«Göllü» | 1870<br><br>– | 24<br><br>– | 1. Heydər<br>2.Gülsənəm |
| **Molla Hüseyn Fatmanisə (Mədinənin qohumu)** | «İlanlı» kəndi<br><br>«Daşkörpü» | 1859<br><br>– | «Düzkənd<br><br>Daşkörpü | 1907<br><br>– | 48<br><br>– | 1Məhəmmədəli<br>2. Qənbər<br>3. Qızı |

# MƏMMƏDOV HEYDƏR KƏRİM OĞLUNUN (AŞIQ HEYDƏRİN) ÖVLADLARI BARƏSİNDƏ QISA MƏLUMAT

| Övladları | Harada anadan olub | Doğ ul-duğu il | Harada dəfn olunub | Ölüm tarixi | Yaşı | Nəvələr |
|---|---|---|---|---|---|---|
| **Kərimov Kərim Heydər oğlu**<br><br>**İbrahimova Bəsti Mamoy qızı** | «Düzkənd» kəndi<br><br>(Ağüzüm) Türkiyə | 1890<br><br>1892 | "Düzkənd" kəndi<br><br>"Gənçə" | 1946 avqust<br><br>1975 | 56<br><br>82 | 1. İdris<br>2.Rəsul<br>3.Lalə (Ağca)<br>4.Mirzəli |
| **Kərimov Rəhim Heydər oğlu**<br><br>**İsmayılova Gülsəfa Söyun qızı** | «Düzkənd<br><br>«Göllü» | 1896<br><br>1907 | Düzkənd<br><br>Sumqayıt | 1968<br><br>4 fevral 1997 | 72<br><br>90 | 1. Sara<br>2.Yusif<br>3.Gülşən (Asya)<br>4.İsrafil<br>5.Dilşad<br>6.Kəlik |
| **Kərimova Həcər Heydər qızı** | Düzkənd | 1886 | Düzkənd | 1901 | 15 | – |
| **Kərimova Sefiyyə Heydər qızı** | Düzkənd | 1888 | Düzkənd | 1890 | 2 | – |

Aşıq Heydərin soykötüyü haqqında bu dəyərli məlumatı vaxtı ilə Məmmədov Heydər Kərim oğlu (1867–1949), Məmmədov Məhəmməd Rəcəb oğlu, Rəcəbov Baxşəli Məhəmməd oğlu və Kərimov Rəhim Heydər oğlu ( 1896 – 1968) tərəfindən deyilmiş və Heydərov Yusif Rəhim oğlu (Sumqayıt şəhəri, 82 yaş) tərəfindən qələmə alınmışdır.

**Toplayıb tərtib edən; Əbülfət Heydər.**

# MƏMMƏDOV HEYDƏR KƏRİM OĞLUNUN (AŞIQ HEYDƏRİN) ÖGEY QARDAŞ VƏ BACILARI BARƏSİNDƏ QISA MƏLUMAT




Qeyd: Səkinə Kərbəlayı İsmayıl qızı hədindən artıq gözəl bir qadın olub. Səkinə xanım 16 yaşında Düzkənd sakini Qara Məhərrəmə (Qəssab Məhərrəm) ərə gedib və Muxtər adlı bir oğlu olub. Muxtər 1935-ci ildə Düzkənd kolxozunun baş hesabdarı vəzivəsində işləmişdir. Qara Məhərrəm rəhmətə gedib, Səkinə nənəmiz İlanlı kəndində Qocaya (Ədilxanın babası) ərə gedib və onun Kazım adlı bir oğlu olub. Səkinə nənənin axırıncı həyat yoldaşı Qaranamaz kəndində yaşayan Əsəd olub.Yeniyol (Oaranamaz) kəndinin sakini Faiqin həyat yoldaşı Ziveydə Səkinənin qiz nəvəsidir.

**Toplanılıb yazıya alınıb: Yusif Heydərovdan**

# AŞIQ HEYDƏR

## (MƏMMƏDOV HEYDƏR KƏRİM OĞLU)

1867–ci ildə Qərbi Azərbaycanın (indiki Ermənistanın) Ağbaba bölgəsinin Düzkənd kəndində dünyaya gəlmişdi. Heydər üç yaşında ikən atası Kərim vəfat etmişdi. Atadan yetim qalan Heydərlə bir yaşlı bacısı Gülsənəmi Kərimin böyük qardaşı Məşədi Rəcəb öz himayəsinə götürmüş, bu kiçik yaşlı uşaqlara Mədinə (Məşədi Rəcəbin arvadı) öz uşaqları kimi baxmışdı. Heydər bir gün əkin vaxtı 19 - 20 yaşlarında əkinçilərlə kölgəlikdə dincələndə yuxuda ona buta verildiyindən bundan sonra sinədən deməyə başlamış, el arasında Aşıq Heydər adını qazanmışdı. O, butasının dalınca getmək istəsə də, anası Zeynəb ona halallıq vermədiyindən İstanbulun yaxınlığındakı Dəyirman kəndinə gedə bilməmişdi. Aşıq Heydərin saz əlində eldən–elə, dildən–dilə düşməsi ana babası Molla Əhmədi narahat etdiyinə görə bir gün nəhayət yanına çağırtdırmış, onun əlini Qurana basdırıb bir daha saz çalmayacağına and içdirsə də, Aşıq Heydər babasının bu hərəkətindən məmnun olmadığı üçün narazılığını belə bildirmişdi:

– Baba, sən nəyə görə saz çalıb, söz oxumağı günah hesab edirsən? Haqq aşığı haqqın tərəfi deyilmi?! Məni nahaq yerə Qurana əl basdırdın. Söz deməyi Haqq özü mənə verib! Sən onu məndən ala bilməzsən.

Bu əhvalatdan sonra Aşıq Heydər əlinə saz almasa da, ağır–ağır yığnaqlar keçirmiş, el sənətkarı kimi nəinki Ağbabada, bütün Cıdır vilayətində, Gümrüdə böyük şöhrət qazanmışdı.

Aşıq Heydərin Aşıq Nəsiblə, Aşıq Şenliklə, Aşıq Əbdüllə, Aşıq İsmayıl Aralıqlı ilə, Çoban Əli ilə, Aşıq Qənbərlə, Mərəndli Məşədi Muxtarla, Şikəstə Pəri xanım və b. aşıqlar və el şairləri ilə deyişmələri məlumdur.

Aşıq Heydər el şairi olmaqla bərabər, həm də mahir usta idi. O, kikrə, cəhrə, daraq (yun darağı) düzəldirdi. Aşıq Heydər ağac işləməni çox yaxşı bilirdi. O, qaşıq, qəlyan, müştük hazırlayırdı. Hazırladığı əşyanın üstünə naxış vurmağı çox sevirdi. Usta ağacları müxtəlif ölçüdə, dərinlikdə yonmaq, kəsmək üçün müxtəlif ölçülü əyrilər düzəltmişdi. Bu əyrilərin tiyəsi kərəntidən, dəstəyi acağdan

hazırlanırdı. Aşıq Heydər kərəntidən bıçaq, ülgüc də düzəldirdi. Usta kikrə hazırlamaq üçün xüsusi daş seçirdi. Alt daşın ortasını deşib lom (dəmir) salır, üst daşın ortasını deşib üstünə ağac dəstək bərkidəndən sonra alt daşa dəmir həlqə (çənbər) keçirirdi.

Aşıq Heydər dibək, salğar da düzəldirdi. Salğar dəstəyi qol uzunluğunda olan ağac çəkicdi. Hər iki başı yarımdairə şəklində idi. Salğarın hər iki başına bir–birindən xeyli aralı xırda tənəkələr (1 sm. qalınlığında dəmir təbəqə) vurardı ki, salğarın başı dibəkdə əzilməsin. Salğarla dibəkdə bulğur döyürdülər.

Aşıq Heydər uzun müddət (50 ildən artıq) el sənətkarı kimi yığıncaqlar aparmışdır. Aşıq Heydərin gözəl səsi, şirin nağıl danışmağı Mahmud ağanın xoşuna gəldiyindən o, uzun müddət ağanın məclislərini aparmağa başlamışdır. O həm də Kərbəlayi Məhəmməd bəyin, Gümrülü ağalarının (Məmməd Qasım ağa, Sadıq ağa, Şaban kətta, Əliqulu ağa və b.), Mərəndli Məşədi Muxtarın yaxın dostu olmuşdur. Aşıq Heydər qırx dastanı sinədən bilirdi. Onun özünün də maraqlı dastanları («Heydərnən Bəyaz», «Dədə Məhəmməd», «Gümrü qızı», «Beymuraz» və b.) vardır. Bunlardan «Dədə Məhəmməd», «Gümrü qızı», «Beymuraz» dastanları Gümrü ilə bağlı dastanlardır (bu məlumatı Aşıq Qənbərdən aldıq). Aşıq Qənbərin dediyinə görə, Aşıq Heydərin geniş yayılmış dastanların hər birinə öz əlavəsi, öz «cığırı» varmış. Bu, dastanların regional xarakterini göstərir. Aşıq Qənbər deyirdi ki, mən ilk dəfə Aşıq Heydərlə tanış olandan sonra ustad məni sözə, saza həvəsləndirdi. Dedi: «Bir «Beymuraz» mən yaratmışam, birini də sən yarat. Elə elə ki, hər nağılda öz sözün olsun, öz nağılın olsun». Mən də ondan sonra bundan faydalandım.

Aşıq Heydərin düzüb–qoşduqları vaxtında toplanmadığından çoxu itib–batmış, şeirlərinin çox az hissəsi yazıya alınmışdır. O, 1949-cu ildə 82 yaşında Düzkənddə vəfat etmişdir.

# El ŞAİRLƏRİ

## AŞIQ HEYDƏR ( AĞBABALI )

### BAYATILAR

**I**

Yaram azdı,
Kim deyər yaram azdı.
Fələk məni budadı,
Qorxudan yaram azdı.

Ağlaram ağlar kimi,
Dərdim var dağlar kimi.
Yüz yerdən yaralıyam,
Gəzirəm sağlar kimi.

Gedirəm bir deyən yox,
Kabab oldum, yeyən yox.
Ayrılıq köynəyini
Məndən başqa geyən yox.

Oy Mərəndə, Mərəndə,
Sözüm var Xoy, Mərəndə,
Kül tökülür başıma,
Gül əkib vay dərəndə.

Xan Arazım, Arazım,
Can Arazım, Arazım,
Neçə canlara qıydın,
Yan, Arazım, Arazım.



Yağıdı haylar mənə,
İl oldu aylar mənə.
Susadım su istədim,
Su verməz çaylar mənə.

Gül açıb oymadərən,
Yaramı oyma dərin,
Heydər «yurd» deyib ağlar,
Elə bir xəbər verin.

## II

Gün keçər, zaman ağlar,
Yay çəkər, kaman ağlar.
Vətəndən ayrilanın
Gözləri yaman ağlar.

Qar yağır, qar üstünə,
Cismin yanır istimə.
Yaxşı baxın, a, ellər,
Vətən batıb tüstümə.

Aranım ooy, dağım ooy?
Bostanım ooy, bağım ooy?!
Yadlara qismət olan,
Daşım ooy, torpağım ooy?!

Qəlbi daşlar,
Qayalar, qəlbi daşlar.
Hərə bir daş götürüb,
Belə bu qəlbi daşlar!

Dağım var,
Aranım var, dağım var.
Açma könül düyməsin,
Sinəm üstə dağım var.

Belə bağlar,
Kəmərin  belə bağlar.
Burda bir qərib ölüb,
Ğöy kişnər, bulud ağlar.

Hey dara,
Qara zülfün hey dara.
Fələk bir irəm atdı,
Gəldi dəydi Heydara.

Ana, az ağla məni,
Qarsı gəz, ağla məni.
Mən hicran tustağıyam,
Gələn yaz ağla məni.

Yaralar məni,
Tapdı  yaralar məni.
Fələk  cəllada dönüb,
Tez – tez  yaralar məni.

Burdan bir atlı keçdi,
Yarama baxdı keçdi.
Təbib, mənə toxunma,
Yaramın vaxtı keçdi.

Qar yağar alçaqlara,
Sovrular saçaqlara,
Fələk mənə qəm verib,
Sığmayır qucaqlara.

Qovun çox,
Bu bostanda qovun çox.
Qoşmuşam qəm kotanı,
Qul Heydəri qovun çox.

## III

Nə bağışlar,
Dost, dosta nə bağışlar.
Başım çəllad əlində,
Nə kəsər, nə bağışlar.

Haraylar,
Çoban dağda haraylar.
Yaxam fələk əlində,
Gözüm yarı haraylar.

Qəmər qaç,
Bulud oynar, qəmər qaç.
Sinəmnən oxlanmışam,
Üstünə qan damar qaç.

Əzizim bu da məni,
Bəyənmir bu da məni.
Fələyin əlindən al,
O ki var, buda məni.

Əziziməm birgülə,
Bağban oldum bir gülə.
Mənəm eşqin ümmanı,
İşim düşüb müşgülə.

Bir səni,
Yada sallam bir səni.
Şəmsdən üstün billəm,
Bir qəməri, bir səni.

Sarı gəlin,
Köynəyi sarı gəlin.
Eşq məni qana saldı,
Yaramı sarı, gəlin.

Qəlbi dağlar,
Təpələr, qəlbi dağlar.
Fələk gündə yüz dəfə,
Belə bu qəlbi dağlar.

Əzizim, nələr keçər,
Quzular mələr keçər.
Heydər qəm tapdağıdı,
Yad baxıb, gülər keçər.

**IV**

Belə gəlsin,
Kəmərin belə gəlsin.
Qəriblər məhləsinə,
Gələnlər belə gəlsin.

Ay gözəl,
Günəş gözəl, ay gözəl.
Şəmsdən üstün billəm,
Bircə səni ay gözəl.

Əzizinəm Gülənaz,
Bülbül eylər gülə naz.
Düşdüm qəm dəryasına,
Ağlayan çox, gülən az.

Qarşıda almalıqlar,
Suda oynar balıqlar.
Nə belə sevda gördüm,
Nə belə ayrılıqlar.

Çay içində tökmə daş,
Könlüm qəmli, gözüm yaş.
Ağlımı başdan aldı,
Uzun boylu, qələm qaş.

Qaşların mildir, yarım,
Dilin bülbüldür, yarım.
Al əlinə könlümü,
Bircə an güldür, yarım.

Bülbüllər düyün eylər,
Bilməm ki, nə gün eylər,
Mən fələyə neylədim,
Mənə bildiyin eylər.

Bu dağın dudu məndən,
Getməz eşq odu məndən,
Gördü yaram sağalmaz,
Təbib əl yudu məndən.

Bu dağın qarı mənəm,
Gün vursa ərimərəm.
Qırx il torpaqda yatsam,
Aşığam çürümərəm.

Su gələr bəndi döyər,
Göyər, bostanım, göyər.
Həm kasıbam, həm yetim,
Hər gələn məni döyər.

Bülbülü xar ağladar,
Aşiqi yar ağladar.
Mən fələyə neylədim,
Məni vurar ağladır.

Ağlar ağladı məni,
Çarpaz dağladı məni.
Dəmir zəncir kar etməz,
Zülfün bağladı məni.

Yaramı duz yandırdı,
Göynətdi buz yandırdi.
Heydəri eşq oduna,
Bir nazlı qız yandırdı.

**V**

Bu gələn naxırdımı,
Saralan taxıldımı?
Deyirlər, yarım gəlir,
Mənzili yaxındımı.

Əzizim Bəndivana,
Yol gedir Bəndivana.
Gedək dərdli yanına,
Sən aqil, bən divana.

Əzizim belə olmaz,
Kəmərin belə olmaz.
İlqarı boş, vəfasız,
Sevənlər belə olmaz.

Əzizimən Tərsinə,
Büllur buxaq, tər sinə.
Sinəm qəm meydanıdı,
İşim düşüb tərsinə.

Əzizim bu ilməni,
Ilmələ bu ilməni.
Eşq məni yeksan eylədi,
Qəm oydu bu il məni.

Yandım qaşı qaradan,
Ölməm mən bu yaradan.

Bir kimsəm yox, arxam yox,
Mənim arxam yaradan.

Bülbüləm, nəva bilməm,
Dərdliyəm, dəva bilməm.
Məni bir sevda tutb,
Başımdan qova bilməm.

Arabaya daş qoydum,
Yar yolunda baş qoydum.
Bir gözəlin əlindən,
Adımı sərxoş qoydum.

Ocaq başında qaldım,
Qəmnən xəyala daldım.
Qapılar açılarkən,
Bəlkə gəlirsən sandım.

Eşmə çox,
Çay yanında çemə çox.
Qəm dağları var məndə,
Təbib yaram eşmə çox.

Arabanın təkəri,
Yüklə gəlsin şəkəri.
Mənimki belə gəlmiş,
Mənəm eşqin nökəri.

Yara dəydi,
Sulandı yara dəydi.
Dilim-ağzım qurusun,
Nə dedim yara dəydi.

Ağbabanın yazı var,
Göldə ördək-qazı var.

Bu zalımın qızının,
Yaman işvə - nazı var.

Qəm - kədər tutdu məni,
Tutdu, qurutdu məni.
Gedin deyin o yara,
Nə tez unutdu məni.

Qarı Bəyaz,
Dağların qarı Bəyaz.
Gözəl sənə ar olsun,
Evdə qal, qarı Bəyaz.

Üzmə çox,
Qul Heydəri üzmə çox.
Düşdüm qəm dəryasına,
Bu dəryada üzmə çox.

# NƏĞMƏLƏR

## ZEYNƏBİM

Zeynəbə yapdırdım altundan sini,
Üstünə yazdırdım Zeynəb ismini,
Zeynəbim, Zeynəbim, allı Zeynəbim,
Gözəllər içində bəlli Zeynəbim.

Zeynəbə yapdırdım atlazdan yorğan,
Üstünə yazdırdım «can sənə qurban»,
Qız, yaman gözlərdən iraq ol, qorğan,
Zeynəbim, Zeynəbim, allı Zeynəbim,
Gözəllər içində bəlli Zeynəbim.

Zeynəbə yapdırdım bir altun küpə,
Haqıxı, muncuğu düzdürdüm sapa,
Bu sınıq könlünü, söylə, kim yapa,
Zeynəbim, Zeynəbim, allı Zeynəbim,
Gözəllər içində bəlli Zeynəbim.

İstanbul yolunda əkdirdim darı,
Darının yarpağı heyvadan sarı,
Zeynəbdən soruşdum: qızsanmı, qarı,
Zeynəbim, Zeynəbim, allı Zeynəbim,
Gözəllər içində bəlli Zeynəbim.

İstanbıldan çıxıdm yan basa-basa,
Endim Çanaqalya qan quca-quca,
Cavankən əlimə götürdüm əsa,
Zeynəbim, Zeynəbim, allı Zeynəbim,
Gözəllər içində bəlli Zeynəbim.

İstanbul yanında çəkdim çox ahı,
Dedim yaradandı islam pənahı,
Yardıma çağırdım o bir allahı,
Zeynəbim, Zeynəbim, allı Zeynəbim,
Gözəllər içində bəlli Zeynəbim.

# G Ə R A Y L I L A R

## VƏDƏSİDİ

Xal düşüb yamaca, yala,
Qar gedir, yaz vədəsidi.
Sevənlərə xəbər olsun,
Gözəl avaz vədəsidi.

Nə gözəldi dağın döşü!
Danaqıran, mollabaşı!
Deyir, yola saldıq qışı,
Qızların naz vədəsidi.

Heydər, əsir dağın yeli,
İş-güc tərpədir bu bu eli.
Çayın, gölün, suyun, selin
Ördəklə qaz vədəsidi.

## YAZ HAVASI

Mələşir qoyun-quzular,
Gələn yazın havasından.
Bilinir ki, «Dübeyti»dir
Telli sazın havasından.

Daylaqlar oynar, qapışar,
İnsan torpaqla tapışar.
Cütün macından yapışar,
Cütçü çıxıb yuvasından .

Dəlilənir sellər, sular,
Bulanıq axar, durular.
Heydər ellərdən sorular,
Ağbabadan, obasından.

# KIMƏ DEYİM

Bu zəmanə betər gəlib.
Mən dərdimi kimə deyim?!
Qananlara kədər gəlib,
Mən dərdimi kimə deyim?!

Daha eşitdiyim budu:
«Davariş»lə xaraşodu.
Dilimə almışam odu
Mən dərdimi kimə deyim?!

Namərd görmüşəm Soveti,
Nədi - gədə hökuməti!
Mərdin qalmadı qiyməti,
Mən dərdimi kimə deyim?!

Tuthatutda mərd qalmadı,
Bircə abad yurd qalmadı.
Ermənidə dərd qalmadı,
Mən dərdimi kimə deyim?!

Qarsın yolları bağlandı
«Türk» deyən dillər dağlandı.
Həqiqət pünhan saxlandı,
Mən dərdimi kimə deyim?!

Bəlli mənim ərzi-halım,
Tanrı, sənə qurban olum,
Günlərimi yola salım,
Mən dərdimi kimə deyim?!

Danışıb dinə bilmirəm,
Yanıram, sönə bilmirəm,
Heydərəm, dönə bilmirəm,
Mən dərdimi kimə deyim?!



## BİLMİRƏM

Dili bağlı necə durum,
Dinib - danışa bilmirəm.
Bir çayam, suyum quruyub,
Qaynayıb- daşa bilmirəm.

Kimsə anlamaz dərdimi,
Qana bilmirəm mərdimi.
Sovet biləcək qədrimi?
Çıxaram başa - bilmirəm.

Kefi duru ermənimin,
Halı yaxşı ölməlinin.
Vaxtıdı gicin,dəlinin,
Olublar paşa, bilmirəm.

"Böyükdü" gədə - güdələr,
Bicdən, şeytandan ötələr.
Istərlər məni didələr,
Dəyib - dolaşa bilmirəm.

Aşıq idim, adım qalıb,
Ocaq idim, odum qalıb,
Təndir idim, badım qalıb,
Deyim sirdaşa, bilmirəm.

Boğaza keçən çatıdı,
Şura kasıb dövlətidi?!
Türkə düşməndi, qatıdı,
Buna baş qoşa bilmirəm.

Çuğulluq peşə olubdu,
Boş başlar huşla dolubdu.
Heyrərdən Allah alıbdı,
Çalım, çalışa bilmirəm.



# ANA

Haqq işinə qarşı getmə,
Məni oda atma, ana.
Bu sevda haqdan gəlibdi,
Ayıq olnan, yatma, ana!

Mənim başımı əydirmə,
Görən gözümüm oydurma.
Məni qəm ilə doydurma,
Yollarımı tutma, ana!

Bu sövdadan dönmək olmaz,
Sal qayadan enmək olmaz.
Eşq yolunda sönmək olmaz,
Qollarımı çatma, ana!

Yazı yazan yazıb bunu,
Tanrıya tutsan bir yönü.
Bu eşqin görünmür sonu,
Günaha gəl batma, ana!

Oğlun Heydər aşiq olub,
Gül irəngi saralıb solub!
Qəlbim ağlar, gözüm dolub,
Gəl başımı qatma, ana!

# GEDİRƏM

Məni salma yanar oda,
Gedirəm, ana, gedirəm.
Neylər mənə qəza-qada,
Gedirəm, ana, gedirəm!

Yolum gedir, İstanbula,
Haqq köməkdi qara qula.
Yar gərək yarını bula,
Gedirəm, ana, gedirəm!

Halal eylə, icazə ver,
Yuxarıda Allahı gör.
Gəl bu uçuq qəlbimi hör,
Gedirəm, ana, gedirəm!

Haqdan içmişəm badəni,
Sinəm gövhərin mədəni.
Gedim görüm gülbədəni,
Gedirəm, ana, gedirəm.

İstəyirəm görəm yarı,
Alma əldən ixtiyarı.
Sənsən Heydərin tutarı,
Gedirəm, ana, gedirəm!

# OLSA DA

Ülgücə ülgüc deyərlər
Kəsəri lap çox olsa da.
Mərdin dərdi böyük olar,
Gözü-könlü tox olsa da.

Mən nərəm deyən bərbər də,
Əsib-goşur xəlbət yerdə.
Arada saxlamaz pərdə,
Edər pisdik yox olsa da.

Heydər deyər, gədə pisdi,
Əlimdəki cam da misdi.
Bilməz soyuq, bilməz isti,
Sözü acı ox olsa da.

# MƏRD SAĞ OLSUN

Fələyin qəhri az deyil,
Xeyri ya baxta baxtadı.
Nə bilirsən nə olacaq,
Xeyirnən şər qabaxdadı.

Kasıb könlü geniş olar,
Yolu yoxuş-eniş olar.
Dəmə də bir dönüş olar,
Tək çörəyi tabaxdadı.

Heydər deyər mərd sağ olsun,
Biri min bir budaq olsun.
Kefi yaxşı, üzü ağ olsun,
Onun gözü qabaxdadı.

## YARALAMA

Durma, macdan yaxşı yapış,
Xərək qoyub qaralama.
Ək ürəklə, həvəsiynən,
Gəl torpağı yaralama.

Haqosa bax, diqqət elə,
İşlə, çalış, gülə-gülə,
Bu obadan sən naz ilə,
Gəl özünü aralama.

Niyə oldu halın xarab?
Peşən olsun özünə bab.
Heydər deyər başqa iş tap,
Yeri-yurdu qaralama.

# KİRVƏ, MƏNİ QONAQ EYLƏ

Salam Əleyküm, Məşədi,
Məşədi bir ağa kişidi.
Kişi, əl- ayağım üşüdü,
Kirvə, məni qonaq eylə.

Gəlirdim Güllübulaqdan,
Boran da qaxdı qabaqdan.
Utan bizim kirvalıqdan,
Kirvə, məni qonaq eylə.

Bozqaladan qaxdı duman,
Şalvar altda yoxdu tuman.
Məşədidən qaçır iman,
Kirvə, məni qonaq eylə.

Görüm səni burda tək qal,
Qonaq eylə məndən haqq al.
Boynu yoğun, özü çaqqal,
Kirvə, məni qonaq eylə.

Boran imkan vermir əsir,
Maşqı da amanımı kəsir.
Aşıq Heydər tir- tir əsir,
Kirvə, məni qonaq eylə.

## DEYİLMİ

Mənə qara deyən yarım,
Gözlərin qara deyilmi?
Yaxın gəlib dindirmirsən,
Ürəyim yara deyilmi?

Təzə gülsən, dodağın bal,
Şirin danış, könlümü al.
Haqq quluna yoxdu zaval,
Qaşın aypara deyilmi?

Mən Heydərəm, insaf eylə,
Dərd gəlir, qabağın əylə.
Ürəkdən keçəni söylə,
Edərsən çarə, deyilmi!?

# Q O Ş M A L A R

## AXTARIN MƏNİ.

Siz məni özümdən xəbər almayın,
Gördüyün ellərdə axtarın məni.
Məqribdən məşriqə gedən yollarda,
Çaylarda, sellərdə axtarın məni.

Qadasın aldığım, bəri gəl, bəri,
Silinsin könlümün qalmasın səri.
Açılanda qızıl gülün lənbəri,
Süsən - sünbüllərdə axtarın məni.

Qıpqırmızı olub könlümün sacı,
Üstünə yazılıbdı dərdin əlacı.
Aç yaxam düyməsin başımın tacı,
Bu əsən yellərdə axtarın məni.

Pöhrə verib qızıl gülün toxumu,
Gecələr tapmışam sirin yuxumu.
Şeyda bülbüllərdən alın qoxumu,
O tuti dillərdə axtarın məni.

Hərdən bu dağlarda, hərdən aranda,
Hərdən sis dumanda, hərdən boranda,
Kimsə yada salıb məni soranda,
Laləli çöllərdə axtarın məni.

Eşqin ışığında yazdım yaratdım,
Könlümdə bir gözəl daim yaşatdım.
Axırda sevdamın gölündə batdım.
Gedin o göllərdə axtarın mənı.

Mən Aşıq Heydərəm, gəlmişəm cuşa,
Məndən salam olsun dosta – tanışa.
Adım yazılanda bir cansız daşa,
Mənalı illərdə axtarın məni.

**Ağbaba Süvari Alayının 1-ci qrupunun baş komutanı yüzbaşı Kərbəlayı Hacı Abbas oğlu Mahmud ağanın Aşıq Heydərə ünvanladığı məktub. Ağbaba süvarı alayının qərargahı Taya Qaya 1919-cu il.**

# BAŞ GÖTÜRÜB KİŞİ GETMƏZ VƏTƏNNƏN

Aşıx Heydər baxma uzax sözünə,
Baş götürüb kişi getməz vətənnən.
Təqsirkaram, tutma məni qınağa,
Baş götürüb kişi getməz vətənnən.

Sən getdin burada qalan sənindi,
Qohumundu, qardaşındı, əmindi.
Qeyrətini kim çəkəcək bəs indi?
Baş götürüb kişi getməz vətənnən.

Bu torpaqdan verəmmərik bir tikə,
Düşmən gərək qarşımızda diz çökə.
İgid odur gecə - gündüz dərd çəkə,
Baş götürüb kişi getməz vətənnən.

Kimsə bəlkə ucalmağa dağ istər,
Öz kefini gecə -gündüz çağ istər,
Yurdunu yox, öz başını sağ istər,
Baş götürüb kişi getməz vətənnən.

Yazılıbdır qismətimə duman - çən,
Dərd çəkməkdən saçlarıma düşdü dən,
Təqsirkaram, gəl Mahmudu eşit sən,
Baş götürüb kişi getməz vətənnən.

**Ağbaba Süvari Alayının 1-ci qrupunun baş komutanı yüzbaşı Kərbəlayı Hacı Abbas oğlu Mahmud ağanın məktubuna cavab. Cənubi Azərbaycanın Mərənd şəhəri. 1919- cu il. Aşıq Heydər.**

# MİLLƏT QURBAN DESƏ, SİZ MƏNİ KƏSİN

Aldım məktubunu, bil Mahmud ağa,
Layiq deyil səni tutam qınağa.
Canım olsun millətimə sadağa,
Millət qurban desə, siz məni kəsin.

Doğru sözü yalan mənəm, ay ellər,
Quru yerdə qalan mənəm, ay ellər,
El – obası talan mənəm, ay ellər,
Millət qurban desə, siz məni kəsin.

Mən hicran qəhrində, qəm taptağıyam,
Mehri-məhəbbətdən ev tustağıyam.
Cəmi Ağbabanın qurbanlığıyam,
Millət qurban desə, siz məni kəsin.

Yurdu taptaladı düşmən atları,
Tutdu tellərimdən qəm cəlladları,
"Ağbaba Alayının" mərd ovladları,
Millət qurban desə, siz məni kəsin.

Gecə hicran şahı yəhərlər məni,
Tutar tənələrə səhərlər məni.
Boğur qəmlər məni, qəhərlər məni,
Millət qurban desə, siz məni kəsin.

Zalım yağı, nə durmusan qəsdimə!?
Qəm ləşkəri hücum çəkib üstümə.
Cümlə - cahan batıb mənim tüstümə,
Millət qurban desə, siz məni kəsin.

Hicran yeksanıyam, qəm tarümarı,
Sönübdü ömrümün çıl-çıraqları.
Incitmə Heydəri, incitmə barı,
Millət qurban desə, siz məni kəsin.

**Cənubi Azərbaycanın Mərənd şəhəri. 1919- cu il. Aşıq Heydər.**
**AĞBABANIN GÖZ YAŞLARI əsərindən.**

# VAR

Şanlı vətənimin hər qarışında,
Hər daş altda bir igidim, ərim var.
Savaş meydanında, yetmiş yaşında,
Rəcəb adlı bir yüzbaşı nərim var.

Zirvədəyəm, qorxutmayır çən məni,
Sala bilməz heç kim burdan gen məni.
Oğul kimi bas bağrına sən məni,
Özüm boyda bir sehirli sirrim var.

Ucaltmışam hər bir yerdə səsimi,
Tanıyırlar soykökümü, nəslimi.
Qaxtağanlar dana bilməz əslimi,
Türk oğluyam, burda mənim yerim var!

Qul Heydərə aranlı de, dağlı de,
Bu vətənə, bu mahala bağlı de.
Hər vaxt mənə bu torpağın oğlu de,
Çünki, burda "Təbriz" adlı pirim var.

# AGLASIN

Sallana-sallana gələn gözəlin,
Dördü qahqah çəksin, biri ağlasın.
Bir azca toxdasın, gəlsin özünə,
Verməsin özgəyə siri, ağlasın.

Çıxarsın qaranı, geyməsin qara,
Qara olan salıb onu azara.
Al-yaşıl geyinib çıxsın bazara,
Dərdi olan gəlsin bəri, ağlasın.

Aşıq Heydər deyər, hər vaxt gördüyün,
Kor olsun düz işə salan kor düyün.
Allah qismət etsin barı toy-düyün,
Adını deyirəm Pəri ağlasın.

# BU SEVDAYA DÜŞƏN GÜNÜ ÖLMÜŞƏM

Sevib sevdasına yandığım gözəl,
Bu sevdaya düşən günü ölmüşəm.
Həkim cərrah bilməz dərdimə çarə,
Bu sevdaya düşən günü ölmüşəm.

Istədim ki, bağban olam, bir gülə,
Eşq atəşı vurdu, döndüm bülbülə.
Sevda vücuduma saldı vəlvələ,
Bu sevdaya düşən günü ölmüşəm.

Hicran yeksanıyam , qəm tarümarı,
Yıxıb vicudumu kül etmə barı.
Dizimin taqəti, gözümün nuru,
Bu sevdaya düşən günü ölmüşəm.

Varmı mənim kimi qəmlə talanan,
Sərkərdan - sərkərdan gəzib dolanan.
Bu eşqə neyləsin təbibü loğman,
Bu sevdaya düşən günü ölmüşəm.

Etibardan düşən, etibarlı yar,
Dolandım qürbəti diyarbadiyar.
Pərişan könlümün müşkül halı var,
Bu sevdaya düşən günü ölmüşəm.

Adına nəğmələr qoşduğum dilbər,
Könül sarayımı alıb qəm - kədər.
Üzmə qul Heydərı, üzmə bu qədər.
Bu sevdaya düşən günü ölmüşəm.

# QALDIM

Ürəyim nəzilib, qəlbim əzilib,
Atadan - anadan aralı qaldım.
Elə nalə çəkdim, göylər ağladı,
O ərşü - əlaya bir səda saldım.

İlahi, pənahım bir sənsən, neynim,
Yetiməm, qəribəm, açılmaz eynim.
Gözlərim ağlardı, düyünlü çiynim,
Tale belə gətdi, qəmdən pay aldım.

Heydər, havalanma, qismət bu imiş!
Sənin qara dərdin cana yetirmiş!
Bəxtin hara getdi, ora qurumuş,
Neçə yol kövrəlib xəyala daldım!

# BAX, BAX

Bir küncə qısnayıb sıxırlar məni,
Nə betər gəlibdi zamana, bax - bax!
Ümidsiz, köməksiz ortadayam mən,
Dağları bürüyən dumana bax - bax!

Gəzdim, dolandım mən bu boş dünyanı,
Nə çoxdu boş lafı, vədi, hədyanı.
Müxənnət artıbdı - bilinmir sanı,
Göylərə yüksələn amana bax - bax!

Bizimki gətirmir - belə görmüşəm,
Mal - mülkü vermişəm yelə, görmüşəm.
Göz yaşım dönübdü selə, görmüşəm,
Məndəki xəyala, gumana bax - bax!

Hanı mərd kişilər, meydan boş qalıb?!
Səxavət yox olub, mürvət azalıb.
Bucaqlar boşalıb, ocaq sozalıb,
Kef çəkən namərdə, yamana bax - bax!

Dərd - bəla  azalmır nə qədər desəm,
Fələk durma deyir elə qəm yesəm.
Heydər, mən də axı soylu bir kəsəm,
Gəlmişəm həm dinə, imana bax - bax!

# BAX, BAX

Hanı Ağbabanın uca dağları,
Bir başımdan qalxan dumana bax – bax!
Vətəndi kiridən mən tək ağları,
Sən mənim qəlbimdə gümana bax - bax!

Vətən həsrətindən yanıb gül oldum,
Özüm öz dərdimə qara qul oldum.
Mərənd qucaq açdı, buna gül oldum,
Ürəyimdə qopan amana, bax- bax!

Dar gündə dadıma yetdi yetənlər,
Amma ki, beynimdən çıxmır ötənlər.
Ölən öldü getdi, qaldı itənlər,
Bizləri yandıran zamana bax - bax!

Ürəyim yaralı, sinəmdə od var,
Yurdun qucağında bir ayrı dad var.
İllər ayrısıyıq, qohum var, yad var,
O qaçaqaç salan yamana bax - bax!

Ağbaba deyəndə qəm gəlir gözə,
Vətən həsrətindən gəlmişəm dizə.
Yenə Yetim Heydər güc verir sözə,
Bəlkə gələ bir az imana bax - bax!

## TƏK QALIB

Necə dözüm, necə durub-dincəlim,
Mən ah çəkim, gərək dərddən incəlim,
Axı necə cana gəlim, dirçəlim,
Qoca Aslan yuvasında tək qalıb.

Hər tərəfdən düşmən gəlir üstümə,
Ermənilər durubdular qəsdimə,
Bilirsiniz yağıların qəsdi nə,
Bir mərd kişi obasında tək qalıb.

Aşıq Heydər səhv elədi, qanmadı,
Əmisinə canı-dildən yanmadı,
Tatlar kimi inadından dönmədi,
Ölüm-itim xanasında tək qalıb.

# ÜÇ YAŞINA ÇATIRAM

Tale küsüb, qismət qaçıb, bəxt yatıb,
Kövrəlmişəm, üç yaşına çatıram.
Ağıl başda deyil, ruh da bədəndə,
Xəstə düşüb qürbət eldə yatıram.

Həm Əliyəm, həm Vəliyəm, həm dəli,
Işlərim ah – vayla getmir irəli.
Vətəndi könlümün şeyrü, qəzəli,
Aç mədahın, nə istəsən satıram.

Sol qolu sağ əllə tuta bilmirəm,
Yumulmur kirpiyim, yata bilmirəm,
Qəm mənə yoldaşdı, ata bilmirəm,
Yavaş - yavaş qəm gölündə batıram.

Əs, ey səba yeli, dolan dağları,
Vətəndi kiridən mən tək ağları.
Ömür bostanımın solur tağları,
Qəza tutub, mən ağlımı atıram.

# AĞBABA DAĞI

Bilinmir tarixi, bilinmir yaşı,
Ləlü cəvahirdi torpağı, daşı,
Duman - çiskin basıb, görünmür başı,
Burda mərəz tapmaz insanın sağı,
Dünyaya səs salıb Ağbaba dağı.

Yamac – yalı, gül - çiçəkdən seçilmir,
Qonaqları bulaqlardan çəkilmir,
Motalından, qaymağından keçilmir,
Ədalət meydanı, abdal ocağı,
Dünyaya səs salıb Ağbaba dağı.

Bu yan Taya Qaya, o yan Qaraxaç,
Gülə bələnibdi bütün yal - yamac.
Şən nəğmə oxuyur qırqovul, turac
Ceyranlar oylağı, maral yatağı,
Dünyaya səs salıb Ağbaba dağı.

Payiz vaxtı tökür qarı, boranı,
Bağlayır yolları, kəsir aranı.
Sindırır damlarda atma karanı,
İncidir tənbəli, sevmir qorxağı,
Dünyaya səs salıb Ağbaba dağı.

Tarixlərdən gəlir səsi - sorağı,
İgidlər məskəni, ərlər yaylağı,
Adı dil əzbəri, cənnət qırağı,
Heydər der: Var olsun, vətən torpağı,
Dünyaya səs salıb Ağbaba dağı.

# BAX

Eşmə çox,
Çay yanında çeşmə çox!
Qəm dağları var məndə,
Təbib, yaram eşmə çox!

Dayan ağam, dayan bəyim, dayan, dur!
Ayaq saxla! Burda yatanlara bax!
Bu meydana diqqət eylə, bəri gəl!
Dağların damənin tutanlara bax!

Qanla yazılbdır hər bir baş daşı!
Bunların olubdu on - on beş yaşı!
Bunlardı vətənin bir üzük qaşı!
Qəhrəman qızlara, oğlanlara bax!

Yağı gəlib Qaraxaçda dayandı!
Zağlı toplar yuvasından oyandı!
Əlvan qanım daşlar üstə boyandı!
Düşmənin bağrına batanlara bax!

Arpaçay yanında savaş quruldu!
AlMərdan düzündə əsgər qırıldı!
Axan qanlar sular üstə duruldu!
Özlərin sellərə atanlara bax!

Qara gəldi yetmiş yeddinin yazı!
Urus paşa oldu, qaxtağan qazı!
Heydərın əlində ağlayır sazı!
Üz tutub cənnətə çatanlara bax!



# İNDİ

Bizim ellər pərən düşdü, dağıldı,
Görəsən necədi oralar indi?
Yer – yudruma itin xılı yığıldı,
Neyləyim, xülüsüm daralar indi.

Hər şey əldən çıxıb, qalıb quru can,
Qəlbdə vətən dərdi, üzdə həyəcan.
Nə vaxt başa çatar görən bu hicran?
Peşımlə dolanır qaralar indi.

Aşıq Heydər, danış, görürsən işi,
Əzəllər sən idin bir adlı kişi.
Hünərdi girləsən qürbətdə başı,
Daha qaysaq tutmaz yaralar indi!

# OXUDUM, ÖYRƏNDİM, HEÇ NƏ BİLMƏDİM

*Əzizim, Araz məni,*
*Öldürdü Araz məni,*
*Çıxardın qəbirimdən,*
*Ovudun bir az məni.*

Qarış, - qarış el obanı dolandım,
Oxudum, öyrəndim, heç nə bilmədim.
Qərib kimi düşdüm dildən - dillərə,
Gədalarda insaf – mürvət görmədim.

Duman - çiskin basıb o Güney dağı,
Qan ağlayır Ağbabanın torpağı.
Daha dalğalanmır Türkün bayrağı,
Tutuldu gözlərim, deyib gülmədim.

Xan yurdunda tülkü - çaqqal ulayır,
Xoruz kürkə yatır, toyuq banlayır.
Mən yazığı gədə - güdə danlayır,
Görən niyə mən irəldən ölmədim?

Gədalar ağa olub çıxdılar taxda,
Ulağın başına saldılar noxta.
Bu dövranda hər şey olsa da saxta,
Dar ayaqda, dediyimdən dönmədim.

Heydər der: ağamdan dağ gücü aldım,
Millətin qəlbində daim ucaldım.
Vədə çatdı, vaxt yetişdi, qocaldim,
Oxudum, öyrəndim, heç nə bilmədim.



# DAĞLARIN

Duman - çiskin basıb, görünməz olub,
Görünmür yaxası, başı dağların.
Mətahdı, qızıldı, gövhərdi, ləldi,
Torpağı, qayası, daşı dağların.

Gözündən tökülür qan ilə yaşı,
Özü də başlayıb dərdlə savaşı.
Yenə yada düşür pendir - lavaşı,
Dadlı çəkməcəsi, aşı dağların.

Nə vaxtdı irağam, sinəm dağlıdı,
Oraya uzanan yollar bağlıdı.
Aşıq Heydər naləlidi - ahlıdı,
Bu il betər gəlib qışı dağların.

# DAĞLARIN

Çəkilmir başından duman - çiskini,
Nə betər dəyişib halı dağların.
Qar gəlib yolları - izləri tutub,
Ağarıb yamacı - yalı dağların.

Sökülüb binəsi, köç edib ellər,
Başlayıb əsməyə boranlar, yellər.
Çağlamır bulaqlar, kükrəmir sellər,
Çəkilib heyvanı, malı dağların.

Heydər qan ağlayır, yurddan gen düşüb,
Qəzanın qədəri - "Xoya" yön düşüb.
Dərdə ac - yalavac, ləlöyün düşüb,
De hanı motalı, balı dağların!?

# ONDA DEDİM: LA İLAHƏ İLLƏLLAH

O dünyada stirükafir əkildi,
Misqal- misqal badyalara töküldü,
Qoxusundan suvalçılar çəkildi,
Onda dedim: La İlahə İlləllah!

Yeridim yetişdim bir güllü bağa,
Gülün dərdim, düşdüm bir ağ otağa,
Ənkir- Münkür dayanmışdı çomağa,
Onda dedim: La İlahə İlləllah!

Oxudum, öyrəndim, heç nə bilmədim,
Ağladım, sıtqadım, gah da inlədim,
Könlümün səsini özüm dinlədim,
Onda dedim: La İlahə İlləllah!

Biçarə Heydərin qalmadı tabı,
Bir suala verdim min bir cavabı,
Həkk oldu sinəmdə eşqin kitabı,
Onda dedim: La İlahə İlləllah!

# EYLƏR

Düşmüşük yollara, qismət Allahdan,
Bəxtimizi qara, ya da ağ eylər.
Məsləhət onundu, biz nə çarəyik,
Dərdi sinəmizdə min bir dağ eylər.

Yurtdan ayrı düşmək borandı, qardı,
Zülümdü, bəladı, çətindi, dardı.
Didərgin ha desin mənim də vardı,
Yad gülər, söylənər, ya da lağ eylər.

Əlbət bol olacaq qəmi yurdsuzun,
Bulunmaz sevinci, dəmi yurdsuzun.
Aşıq Heydər kimi cəmi yurdsuzun,
Tanrı üstündədi, canın sağ eylər!

# AY HAYIF, HAYIF

Mehrü məhəbbətin oduna yandım,
Yar məni unutdu, ay hayıf, hayıf!
Məcnun olub səhraları dolandım,
Qara baxtım yatdı, ay hayıf, hayıf!

Ay ellər, Kərəmdən mən betər oldum,
Bu fani dünyada dərbədər oldum.
Qınımda saraldım, gül təki soldum,
Arzularım batdı, ay hayıf, hayıf!

Uşaqkən basdılar əlim "Qurana",
Bircə ümid qaldı göydə durana.
Düşdüm dost yolunda qara - borana,
Dost da məni atdı, ay hayıf, hayıf!

Qaxtağanlar tapdı fası, firəngi,
Namərdlər verdilər əlinə tüfəngi.
Torpaq qana batdı, dəyişdi rəngi,
Gör məni kim satdı, ay hayıf, hayıf!

Heydər yana - yana köçür dünyadan,
Ağlama, sözümü çıxarma yaddan.
Unutma düşməndir qaxtağan nadan,
Ömrüm başa çatdı, ay hayıf, hayıf!

# AĞLAYIR

Dağıldı ellərim, qaldım səhrada,
Bir kimsənəm yoxdu, anam ağlayır.
Titrəyir əllərim, görmür gözlərim,
Dəyişir döranım, zaman ağlayır.

Ayrı düşdüm öz yurdumnan, elimnən,
Qəm şələsi əl çəkməyir belimnən,
Danışanda nalə qopur dilimnən,
Könlümün səsinə kaman ağlayır.

Hələ qurumayıb gözümün yaşı,
Tutur tənələrə hər yetən naşı,
Ələnir üstümə dünyanın daşı,
Dağların başında duman ağlayır.

Heydər, bu yerlərdə yerin bilindi,
Mərənd qucaq açdı, qəlbin isindi.
Fələyin cəbrinə dayan, döz indi!
İndi biz yox, bütün cahan ağlayır!

**Ustadın 21 yaşlı baçısı Gülsənəmin faciəli ölmünə həsr etdiyi şeir.**

Əzizinəm yaş gələr,
Yaş üstünə yaş gələr.
Aşıq Heydər ölüncə,
Didəsindən yaş gələr.

# BACIM

Bu zalım dünyada simsar tapmadım,
Hər yerdə dayağım oldun, ay bacım!
Sərkərdən, sərkərdən gəzib dolandım,
Mən dedikcə dərdlərimi say, bacım!

Bir maral baxışlı, bir bal dodaqlım,
Bir büllur buxaqlı, ayna qabaqlım,
Bir piyalə gözlüm, bir zər yanaqlım,
Bu yerdə tapılmaz sənə tay, bacım!

Allahım yaradıb sanki bir mələk,
Yaxamı tanıdı inadkar fələk.
Əl atdı kəməndə göstərdı kələk,
Nakam getdin bu dünyadan vay, bacım!

Zalım fələk aldı bacım Sənəmi,
Pozdu növrağımı, yıxdı binəmi.
Hicran tapdağıyam, açma sinəmi,
Yetişmiş yarama məlhəm yay, bacım!

Hər yerdə qədrimi bılən sən oldun,
Axan göz yaşımı silən sən oldun,
Heydərlə fəxr edıb gülən sən oldun,
Daha qalmayıbdır məndə hay, bacım!



**1944 - cü ilin noyabr ayında Axırkələk, Axısqa və Əsmincə türklərinin orta Asya və Qazaxıstana sürgün dövrlərindən bəhs edir.**

Yaram azdı,
Kim deyər yaram azdı.
Fələkdən şəfa dilədim,
Qorxudan yaram azdı.

## GETDİ ŞAN-ŞÖHRƏTİM, DAHA NƏ DEYİM

Nəyinə güvənim mən bu dünyanın,
Getdi san - söhrətim, daha nə deyim!?
Sındı qol - qanadım, qaldı göz dağım,
Getdi şan şöhrətim, daha nə deyim!?

Şanlı torpaqlardan üzdüm əlimi,
Dərdü - kədər yağır etdi dilimi .
Hicran qəmi viran qoydu könlümü,
Getdi şan - şöhrətim, daha nə deyim!?

Dağıldı Axısqa, yandı Əsmincə,
Kor olaydım bu dövranı görüncə.
Bu müsibət yaddan çıxmaz ölüncə,
Getdi şan - şöhrətim, daha nə deyim!?

De, bu nə fərmandı, bu nə əmirdi,
Ya Rəbbim! canımız daşdı, dəmirdi.
Gəlmələr yurdumu yıxdı, yemirdi,
Getdi şan - şöhrətim, daha nə deyim!?

Tutur tənələrə gədələr məni,
Sibirə sürgünnən hədələr məni,
Nə olsun tanıyır dədələr məni,
Getdi şan - şöhrətim, daha nə deyim!?



Bu yollar uzanır Qazaxıstana,
Az qalır cismim də od tutub yana.
Xar ol belə dövran, yan ay zamana,
Getdi şan - şöhrətim, daha nə deyim!?

Köç karvanı Ağbabadan yan gedir,
Yaralarım göz- göz olub, qan gedir.
Aşıq Heydər, sənnən şöhrət - şan gedir,
Getdi şan - şöhrətim, daha nə deyim!?

# OLDU

Sevinc dedim, qəm ələndi payıma,
Könül evim alovlandı, kül oldu.
Fələk qəm zəncirin saldı boynuma,
Mənim itirdiyim, ağır el oldu.

Səksən ildə köz közlədim, köz aldım,
Zaman, zaman dərdü - səri tez aldım,
Hər naşıdan tənə, tənə söz aldım,
Tülkü meydan açdı, çaqqal fil oldu.

On beş yaşda baş ağardı, diş düşdü,
Yirmisində gözlərimə yaş düşdü.
Yollarıma dolu yağdı, daş düşdü,
Qarğa bülbül oldu, qanqal gül oldu.

Şura gəldi qıfıl vurdu dilimə,
Zalımın qılıncı dəydi belimə.
Otuzunda qəm iz açdı könlümə,
Dərdü - kədər sinəmdə tel - tel oldu.

Göz önündən o göz dağı getmədi,
Məzarımda dərd göyərdi, bitmədi,
Xəzan oldu, baxçam bara yetmədi,
Axan göz yaşlarım, döndü sel oldu.

Gedən yox, gələn yox, günümüz qara,
Yüz ildi sinəmnən çəkilmir yara.
Ömrü hədər yazdı fələk Heydara,
Getdi şan - şöhrətim, günüm il oldu.

# GÖRƏN BU TUTUŞLA HARA GEDİRİK

Şura gəldi, bəylər çıxdı aradan,
Görən bu tutuşla hara gedirik?
Urus paşa oldu, qaxtağan qazı,
Görən bu tutuşla hara gedirik?

Əsdi yollarıma boranlar, yellər,
Bizə düşmən oldu danışan dillər.
Bizdən nə anlasın gələn nəsillər,
Görən bu tutuşla hara gedirik?

Mən nə deyim, kor taleyə, kor baxta,
Gədalar ağa olub çıxıblar taxta.
Yurtda qan qusuruq biz laxta - laxta,
Görən bu tutuşla hara gedirik?

Yatağımda zarıncıyam, zar mənəm,
Qəfəsdəyəm, el içində ar mənəm.
Ay həzarat, bu dünyada xar mənəm,
Görən bu tutuşla hara gedirik?

Yalan dünya, yalançılar dünyası!
Odlanasan, talançılar dünyası!
Heydər der: gəlib qoçular dünyası,
Görən bu tutuşla hara gedirik?



# MEYDANIMA

Çoxdan ürəyində tutmuşdun məni,
İndi ki gəlmişəm, çıx meydanıma.
Aslansan, pələngsən, filsən, kərkədan,
Betər alov kimi ax meydanıma!

Qəlbini yandırır kinin, küdrətin,
Caduda, pitikdə çoxdu qüdrətin,
Sən bilən deyilsən qədir-qiymətin,
Gurla ildırım tək, çax meydanıma!

Mən Aşıq Heydərəm, sığınnam haqqa,
Şeytansan, olsa da başında cıqqa,
Qapına gəlmişəm, çıxarma hoqqa,
Yaxşı nəzər yetir, bax meydanıma!

# XOFLANMA

Sözün ziyanı yox, sazın ondan çox,
Sənətkar görəndə xoflanma bir də.
Sərraf adamsansa, düz gözümə bax,
Sözümdə gövhər var, inci də, dürr də.

Sənətkar sayılmaz yoldan ötən, bil,
Haqqa biz də quluq, köləyik, sən bil,
Korsan, ya görmürsən, sil, gözünü sil,
Məni azca söylət, dindir bu yerdə.

Sənə qənim olar haqqın sahibi,
Şeytanlıq puluyla doldurma cibi,
Bu Aşıq Heydərin budur tələbi,
Boz üzün göstərmə mərd oğlu mərdə!

# YAŞILBAŞ SONALAR GÖLLƏRƏ GƏLİR

Göy buludlar arasından süzülüb,
Qatar - qatar nizamlanıb düzülüb,
Bir cərgəsi qatarından üzülüb,
Yaşılbaş sonalar göllərə gəlir.

Sellər - sular, aşır – daşır, sellənir,
Buz bulaqlar məcrasında göllənir,
Bülbül cıxıb yuvasından dillənir,
Yaşılbaş sonalar göllərə gəlir.

Ildırımlar guruldayıb çaxışır,
Novruz gəlir, küsülülər barışır.
Arpa göldə ördək qaza qarışır,
Yaşılbaş sonalar göllərə gəlir.

# BU GƏLƏN GÖZƏL

Qarsın yaylasında bir pəri gördüm,
Dilli dilavərdi, bu gələn gözəl.
Əhli - dil olmasın əvvəldən bildim,
Ərşdəki qəmərdi, bu gələn gözəl.

Bəşər tarixinə nəzər yetirdim,
Gözəl Züleyxanı dilə gətirdim.
Üz - üzə gələndə özüm itirdim,
Parlayan əsmərdi, bu gələn gözəl.

Şəffafdı mayası, qaynardı təbi,
Bir ay parçasıdı, yanağı - ləbi.
Heydərə can verdi təbibin həbi,
Bir ləlü gövhərdi, bu gələn gözəl.

# QALMADI

Türk deyənin dilçəyini kəsdilər,
Haq deyəni tapdalayıb əzdilər,
Millətimi dərd yoluna düzdülər,
Bu ellərin bir büsatı qalmadı.

Bu dünyanın malı başa baladı,
Zalım fələk gözümüzü bağladı.
Qaxtağanlar fil yurdunu taladı,
Xan yurdunun varidatı qalmadı.

Zalım oğlu, meyl etmisən şəraba,
Söyüdlü, Mustuqlu[1] qalıb xaraba.
Hanı toy büsatlı o iyirmı oba,
Kitabdan silindi, adı qalmadı.

Vicudü cismimi alıbdi vərəm,
Təpədən dırnağa kədərəm, qəməm.
Öldü qoç Koroğlu,öldü xan Kərəm,
Igidlərin bir qiymatı qalmadı.

Aşıq Heydər lal oldu, üzü gülmədi,
Zər qədrini bizim Şura bilmədi,
Yollar bağlı qaldı, gedən gəlmədi,
Ağbabanın bir baratı qalmadı.

1.Ağbabada kənd adları

# SÖYLƏ HARDASAN

Əcayib sevdaya düşdüm, allahım,
Ölürəm, ilqarım söylə, hardasan?
Bilmirəm dilbərim nədi günahım,
Təbibim, loğmanım, söylə, hardasan?

Bir bağban olmuşam, bağ bar gətirmir,
Əkdiyim gülləri torpaq bitirmir,
Mən çəkən yükü heç fil də götürmür,
Ey nazlı ceyranım söylə, hardasan?

Sevdasız günlərim yadıma düşür,
Cismim də, ruhum da, titrəyir üşür,
Hər dəfə ömrümdən bir yarpaq düşür,
Xınalı maralım, söylə, hardasan?

Axtardım sevdamı günüm il oldu,
Hara qədəm qoydum ora, gül oldu,
Heydər eşq odunda yandı kül oldu,
Mehriban soltanım, söylə, hardasan?

# GƏL EŞİT MƏNİ

Darıxma, darılma, dərdə qayım ol.
Əlbət, tanrı verər sənə da bir yol.
Ucadan ucadı, çox adildi o,
Hər vaxt pənahında saxlayar səni,
Gəl eşit məni.

Sən ki, söz deyəsən, simsar tapılar,
Açılar üzünə bağlı qapılar.
Dərddən sınıq könlün sözlə yapılar,
Qovarsan başından dumanı-çəni,
Gəl dərddən geni.

Aşıq Heydər gördü sənin dərdini,
Həlbət bular el-obanın mərdini.
Qəm eləmə, mən bilirəm qədrini.
Gəl unut burada olub-keçəni,
Haqqa sal yönü.

# O Y N A T M A S I N

Ərəsət günüdür, qoç igidlərim,
Düşmənlər əlində daş oynatmasın.
Mərdin qabağına çıxmasın namərd,
Müxənnət sevinib qaş oynatmasın.

Qara zurna çalır döyüş cəngini,
İgidlər oynayır millət səngini,
Əzin, igidlərim, düşmən əngini,
Başsız qalan kafir baş oynatmasın.

Ey Allah, sən yetiş mərdin dadına,
Qoy xətər gəlməsin Heydər adına.
Onun xatirinə, onun adına,
Gələnlər gözündə yaş oynatmasın.

# DOLANIR

Gətirməz dünyada kəsıbın işi,
Nə olsun hər yanda uzaq dolanar.
Qurumaz hər zaman gözünün yaşı,
Yediyi qarınla pazax dolanar.

Fələyin qanunu yazılıb belə,
Çirkin-pis tuş olar türfə gözələ.
Fağırın könlünü kim alar ələ?
Demək-gülmək ona yasaq, dolanar.

Dünya görən bilir ovandı-tərsi,
Kənd-kənd dolaşmışam Çıldırı-Qarsı.
Pirim pünhan yerdə veribdi dərsi,
Demə Aşıq Heydər qoçaq dolanar.

## MƏNİM

Ağbaba deməsəm dilim lal olar,
Çıxarmı yadımdan Ağbabam mənım?
Necə ağlamayım, necə yanmayım,
Dağılan, talanan el - obam mənim.

Bir tanrı kiridər mən tək ağları
Nə vaxtdı gözlərim görmür dağları.
Öləni çox oldu, hanı sağları,
Uzaqlarda qalan yurd - yuvam mənim.

Heydər, ələ gəlməz o gedən çağlar,
Qız - gəlin yasdadı, qaralar bağlar.
Göyləri titrədir nalələr - ahlar,
Dərdü qəmim mənin, bədduam mənim.

# OY ODA MƏNİ

Mən qürbətin qucağında yatıram,
Bir kimsənəm yoxdu, oyada məni.
Yavaş – yavaş qəm gölündə batıram,
Harda yaxaladı oy, qada məni!?

Tor görür gözlərim, gəzə bilmirəm,
Dərdimi vətənə, yaza bilmirəm,
Arvadın cəbrinə dözə bilmirəm,
Didir, parçalayır, oy, o da məni.

Qul Heydərəm, bir il qürbətdə qalan,
Yurdu talan olan, eli dağılan.
Şamu - səhər bu Mərənddə ağlayan,
Zalım fələk salıb, oy, oda məni.

# YAZDI, YAŞATDI

Bəşər tarixinə yazdı, yaşatdı,
Dünyaya tək gəlib, tək gedənləri.
Hər ocaq yetirib hər ana da doğmaz,
Dünyaya pak gəlib, pak gedənləri.

Mənəm deyənləri fələk haxladı,
Nə dağ silkələndi, nə daş laxladı.
Allah nəzərində əziz saxladı,
O haqqı qəlbinə həkk edənləri.

Heydər der, zəhmətim getmədi bada,
Kimi atlı oldu, kimi piyada.
Ucalan görmədim heç vaxt dünyada,
Haqqın varlığına  şəkk edənləri.



# DÜŞDÜ

Qurudu kökümüz, bu Şura gəldi,
Türk - türkdən ayrıldı, yaralı düşdü.
Yenə baş qaldırdı bic, vələdüzna,
Ağbaba Çıldırdan aralı düşdü.

El eldən ayrıldı, könül - könüldən,
Doğmalıq, yaxınlıq tez çıxdı əldən.
Sovet çox sevindi bu bəd əməldən,
Erməni də pullu - paralı düşdü.

Heydər lalmı olsun deməsin düzü?!
Ağlı - huşu kəsir, həm görür gözü.
Kafir erməninin qalmasın izi,
Urusun qanunu - qaralı düşdü.

# GƏL

Yekə - yekə çox danışma, ay gədə,
Götür sazı, gir meydana, cəngə gəl.
Kəl əvəzi səni də, qoşum kotana,
El içində xar eyləyim, təngə gəl.

Söz- söhbətin çatıb bizim qazıya,
Utan barı, bax yazdığın yazıya.
Səni gördüm əhsən dedim tazıya,
Buynuzunu sürtmə kələ, cöngə, gəl.

Qodom oğlu, çox bilirsən, az danış,
Danışanda səndən qaçır dost- tanış.
Bu millətə nəsib olub aldanış,
Yürü, bala, asta yeri, küncə gəl.

Aşıq Heydər deyər sözün bu başdan,
Döşə   tər kababdan,  təzə lavaşdan.
Canını almamış, sürüş yavaşdan,
Geyin, keçin başında bir dingə gəl.

# GÖSTƏRİM

Ay aşıq, cənbərək meydanına gəl,
Mərifət elmində sirri göstərim.
Noxtalıyım, palan salım belinə,
Sənə bəyəndiyin yeri göstərim.

Saqqalın bulaşıb quymağa - yağa,
Xub yaraşır sənin kimi ulağa.
Əgər yolun düşsə Güllübulağa,
Maral yatağında nəri göstərim.

Tapdadın arada olan hörməti,
Aşiq Heydər verdi sənə qiyməti.
Bağlayım başına güllü heyratı,
Öksüzü gəzdirim, piri göstərim.

## A MOLLA

Nə vardan qorxum yox, nə də ki, puldan,
Mərdlik adətimdi, bilnən, a molla.
Xeyir işdən ötrü tökmə qaş-qabaq,
Bizimlə bir yola gəlnən, a molla!

Nəyi bəyənmirsən, açıq söylə gəl?
Bu, Allah işidir, yoxdu bir əngəl,
Kişisən, kişi ol, mənə qurma təl,
Bir dodağın qaçsın, gülnən, a molla!

Niyə qaradasan, əzizin ölüb?
Sənin qaş-qabağın bizəmi qalıb?
Aşıq Heydər sənin mətləbin bilib,
Ya qızı ver, ya da ölnən, a molla!

## NƏDİ

Boy-buxun, sir-sifət, cavanlıq səndə,
Bulud tək tutulub dolmağın nədi?
Dərd-sərini söylə, bir biz də bilək,
Heyva tək saralıb solmağın nədi?

Qaradan qaradı o baxt dediyin,
Əlbət ki, varlıdı xoşbəxt dediyin.
Yerini alarmı hər vaxt dediyin,
Dərdi sinən üstə almağın nədi?

Aşıq Heydər deyər, bir az tab elə,
Aç sinədəftərin, bir kitab elə.
Səxalı bəylərə bir xitab elə,
Baxtın qarasında olmağın nədi?

## KƏSDİ

Uzaq vilayətə qonaq gedirdim,
Mehrü məhəbbətim yanımı kəsdi.
Yarı yolda dolu döydü təpəmə,
Payızın yağmuru amanımı kəsdi.

Yeridim, yürüdüm, yıxıldım lilə,
Yırtıldı çarığım, gəlmədi ələ.
Yeddi yerdən başım keçdi çəngələ,
Çayırın cil otu dabanımı kəsdi.

Gördüm şalvarımın cibləri yoxdu,
Dedilər, bu yerdə kəsəyən çoxdu.
Dedim: arvad, axı pullar da yoxdu,
Çüllüt Qasım da gümanımı kəsdi.

Şərab gəldi, süfrələrə düzüldü,
Dörd yanımda qədəhlərə süzüldü.
Bu məclisdə əlim haqdan üzüldü,
Çəlləyin qoxusu imanımı kəsdi.

Sözün yeri gəldi, qoy deyim barı,
Di, öl, Aşıq Heydər, ye zəhrimarı.
Yığışdı sürfəyə mozalan, arı.
Aranın milçəyi amanımı kəsdi.

# ZƏMANƏNİN ƏLƏYİNNƏN ƏLƏNDİM

Zəmanənin ələyinnən ələndim,
Can içində cana gəldim,doğuldum.
Bir pərinin xəlbirinnən keçmədim,
Bəli deyib bəlasına vuruldum.

Ağam gəlib sığal verdi telimə,
Nur dolu badəni verdi əlimə,
Qarəsindən nalə endi dilimə,
Bir kövsər göləndə batıb duruldum.

Aşıq Heydər düşüb yorğan - döşəyə,
Arvad qoymur çıxım evdən, eşiyə.
Qurban olum bunu yazan kişiyə,
Qara baxtım yatdı, özüm yoruldum.

# GÖRƏN HARDA BELƏ GÖZƏL MƏKAN VAR

Ağbaba deyilən qalxıb göylərə,
Görən harda belə gözəl məkan var?
Tanrı naxış çəkib bizim yerlərə,
Görən harda belə gözəl məkan var?

Öksüzdən qalxanda bir qatı duman,
Göllü su əlindən çəkir əl - aman.
Düzkəndin dörd yanı yamyaşıl orman,
Görən harda belə gözəl məkan var?

Muğelli deyilən bir dərə dağdır,
İbişin yediyi sarıca yağdır.
Bu cənnət məkanın dörd yanı bağdır,
Görən harda belə gözəl məkan var?

Bu yan Söyütlüdü, o yan Baxçalı,
Güllərdən seçilmir dağların yalı.
Xəstəyə dərmandı Bozqala balı,
Görən harda belə gözəl məkan var?

Balıqlı xoş nişan, Xənçəlli nizə,
Dağda süsən-sünbül çıxıbdı dızə.
Burda Aşıq Heydər güc verir sözə,
Görən harda belə gözəl məkan var?

# SƏNƏM GƏL

Ey nazənin, ərin salam söylədi,
Hayıfsan bisahib qalma, Sənəm, gəl.
Inan sənsən bu ellərin gözəli,
Məcnunu çöllərə salma, Sənəm, gəl.

Bu bir gözəl tərlan kimin yarıdı,
Ağ məmələr Ərzincanın narıdı.
Sinən şəfa verən dağlar qarıdı,
Yazığın canını alma, Sənəm, gəl.

Cimcimədi o Düzkəndin torpağı,
Orda mərəz tapmaz  insanın sağı.
Sənəm sənsən qızılgülün yarpağı,
Bulud tək tutulub dolma, Sənəm, gəl.

Getdiyim bu yollar haqqın yoludu,
Bil ki, aşıq Heydər Kəntər quludu.
Görürəm, cavansan canın suludu,
Tağında saralıb solma, Sənəm, gəl.

## BABA, MƏNİ BİR NADANA VERDİLƏR

Atlaz yorğan, atlaz döşək yumuşaq,
Boynuma almışam bir parça uşaq.
Aşıq Heydər, gəl mərdana danışaq,
Baba, məni bir nadana verdilər!

Səhər olar durar gedər quzuya,
Ağ lavaşı doğrar tökər tazıya.
İgid deyil ağ baldırım qavzıya,
Baba, məni bir nadana verdilər!

Qoyun deyil, qoyunlara qatam mən,
Öküz deyil, cələblərə çatam mən,
Igid deyil sarılam mən, yatam mən,
Baba, məni bir nadana verdilər!

Necə baxım, indi bu ev - eşiyə,
Sınıq – salxaq toz basmış boş beşiyə.
Səhər – səhər durub qaçır meşiyə,
Baba, məni bir nadana verdilər!

Kol - kos yığıb yad ocağını yandırır,
Çöldən gəlib, qab - qacağı sındırır.
Nahaq yerə bu Sənəmi yandirir,
Baba, məni bir nadana verdilər!

# MƏN BİLMİRƏM, KİMƏ DEYİM DƏRDİMİ

Mən yazığın qəm doludu sinəsi,
Mən bilmirəm, kimə deyim dərdimi?
Hicran yeksanıyam, qəm tarümarı,
Mən bilmirəm, kimə deyim dərdimi?

Şura gəlib xoş günümüz vay olub ,
Ağlamaqdan göz yaşlarım çay olub,
İlim bir qərinə, günüm ay olub.
Mən bilmirəm, kimə deyim dərdimi?

Fələk daşım atdı çox uzaqlara,
Çıxıb Ağbabadan gör düşdük hara!?
Arif yoxdu, dərdim çəkəm bazara,
Mən bilmirəm, kimə deyim dərdimi?

Danışmağa sözüm qalmıyıb mənim,
Ağlamağa gözüm qalmıyıb mənim ,
Kül olmuşam, közüm qalmayıb mənim,
Mən bilmirəm, kimə deyim dərdimi?

Şan – şan oluf sizlar sinəmdə dağlar,
Nə cərrah sariyar, nə təbib bağlar.
Bu dərdləri yağı görüb qan ağlar!
Mən bilmirəm, kimə deyim dərdimi?

Əl追ənib saçıma dünyanın qarı,
Qəm üstə köklənib, könlümün tarı.
Tutub tellərimdən qəm cəlladları.
Mən bilmirəm, kimə deyim dərdimi?

Qul Heydərəm, müxənnətə yağıyam,
Hicran şəhərində, ev tustağıyam.
Bu qoca vaxtında qəm tapdağıyam,
Mən bilmirəm, kimə deyim dərdimi?



# U S T A D N A M Ə

## GƏLƏNDƏ

Mərifət gözəldi, anlayib bilsən,
Susarsan əlbət ki, yeri gələndə.
Ağıllı hikmətlə özün qoruyar,
Qəflətən adamın kürü gələndə.

Səbirlə iş görən olmaz peşiman,
Vaxtında dağlardan çəkilər duman.
Müxənnət həmişə olar bədgüman,
Diksinər evinə biri gələndə.

Aşıq Heydər deyər, sən də qan sözü,
O haqqı dananın, kor olar gözü.
Sinənin altına bağlama közü,
Bəxtin qalxıb sənə bəri gələndə.

# T Ə C N İ S

## AY AĞA

Dindirməyin halı müşgül olmuşam,
Fələk məni başdan salıb ayağa.
Sevda sinəm üstə vurub səd yara,
İlim bir qərinə, gün olub ay, ağa.

Hicran dağı çəkib yala hasarı,
Gurum - gurum, yaraları ha sarı.
Görəydim mah camalını ha sarı,
Bircə dəfə üz sürtəydim ayağa.

Xumarlanıb sərxoş baxma bu yana,
Sərkərdən gəzirəm mən yana - yana.
Biçarə Heydəri az danla, yana,
Salma məni nəzərindən, ay ağa!

# D İ V A N İ L Ə R

## MƏNƏM

Dəymə fələk, dəymə mənə,
Ümmanda qərq olan mənəm.
Hicri-qəmin qucağında
Dəryada qərq olan mənəm.
Düşmüşəm qəm dəryasına,
Dinib - danışa bilmirəm.
Gözlərim baxmır sözümə,
Sellərdə qərq olan mənəm.

Qəm mülkünün paşasıyam,
Virandı könlümün mülkü.
Ax, ay zalım, zalım, zaman,
Yıxmısan binəmi bil ki!
Gəlin görün nə haldayam,
Bəyənmir aslanı tülkü.
Sönüb könlümün günəşi,
Tufanda qərq olan mənəm.

Dindirməyin məni, ellər,
Yaram sağalmaz yaradı.
Danışmağa halım yoxdu,
Hər yerim para - paradı.
Desələr ki, Aşıx Heydər,
Bir topdağıtmaz qaladı.
Qızıldan taxtım olsa da,
Yeksanda qərq olan mənəm.

**Aşıq Heydərin Qagızman səfərindən bir parça**

## GƏLMİŞƏM

Yahu,Yahu! deyə - deyə,
Bu meydana gəlmişəm.
Agam mənə yol göstərib,
Yol ərkana gəlmişəm.
Qazandıgım el hörməti
Zəhmətimin bəhridir.
İçib eşqin badəsini,
Şirin cana gəlmişəm.

Təriqətdən dərs almışam,
Şəriətdən halıyam.
Adı dil əzbərim, özü təkdi,
Mən mövlamın quluyam.
Şərurdanam, köküm bəlli,
Məqamım var, uluyam.
Qurana baş endirib,
Din - imana gəlmişəm.

Açmışam sinəm, ay bala,
Əyil bax bu güzgüyə.
Aşıx gərək hər məqamda,
Ədəb - ərkan gözdüyə.
Yüz daşına, yüz düşünə,
Mətləbini düz deyə.
Mən ellərə arxalanıb,
Şöhrət – şana gəlmişəm.

Aşıq odur danışanda,
Ağzından nur süzülə.
Sözləri də nizamında,
Muncuq təki düzülə.



Mərd – mərdana məclis qura,
Pisin canı üzülə.
El içinda gəzə - gəzə,
Ətə - qana gəlmişəm.

İnsan olan, dəli olma,
Yola gəl, haqqı tanı!
Qadir Allah lazım bilib,
Xəlq eləyib insanı.
Alan bir gün alacaqdır,
Verdiyi şirin canı.
Yönüm düşüb dağ – dərəyə,
Biyabana gəlmişəm!

Bu dağların zirvələri,
Buludlara ucalıb.
Aşıq Qurban bu ellərdə,
Yaradandan güc alıb.
Götür qələm, vur kitaba,
Sözləri məndə qalıb.
Köhnə yaram sızıldayır,
Ox - kamana gəlmişəm.

Ümmanlara baş endirmək,
Dəryanın qaydasıdı.
Qəribə paşa demişəm,
Yetimlər atasıdı.
Can istəsən əsirgəməz,
Bu elin qalasıdı.
Həqiqətdən halıyam mən,
Haq divana gəlmişəm.

Bu ellərin çəngavəri,
Mahmud ağa, Mahmud ağa.
Qabağında diz çökübdür,
Yüzlərlə qaxtağan dığa.

İgidlərə bəli dedim,
Canım ona sadağa.
Dastan deyib ərənlərə
Toy - nişana gəlmişəm.

Aşıq Şenlik adı gələndə,
Məclislərə nur yağır.
Nəsib meydana girəndə,
Çoxları olur fağır.
Bura saqi məclisidir,
Məhəmmədi də çağır.
Matahım həmin matahdı,
Sözlü xana gəlmişəm.

Bu mollaya mən nə deyim,
Sınayır öz baxtını.
Sübh namazı qanad çalıb,
Gözləyir yas vaxtını.
Dirilərdən xərac alıb,
Doldurur daş taxtını.
Bu zalımın zülümündən,
Bezif cana gəlmişəm.

İncitmə Aşıq Heydərı,
Qorx cəhənnəm odunnan.
Molla Dursun, sən şeytansan,
Danışma haq adınnan.
Mən atlıyam, piyadasan,
Çıxmasın bu yadınnan.
Süvar olub səmənd ata,
Qağızmana gəlmişəm.

---

Qeyd:- Ustad bu misrada "Aşıq Qurban" deməklə Aşıq Qurbanini nəzərdə tutmuşdur və məşhur sənətkarın Qars şəhərində yaşamasından söhbət açmışdır.

# DÜŞMÜŞƏM

Bir qanmazın ucbatından,
Böyük bəlaya düşmüşəm.
Açılıb yerin göbəyi,
Yanar lavaya düşmüşəm.
Müxənnətin yoxdu zatı,
Çürükdü onların qatı,
Məni satıb keçəl Tatı,
Qarsda qalaya düşmüşəm.

Urus gəlir, millət gedir,
Qaradavoy "malçi" deyir.
Çinovniklər at belində,
Körpə uşaqları döyür.
İblisə oxşayan kafir,
Qaxtağan nadanı öyür.
Bura şeytan məclisidi,
Çaşıb aloya düşmüşəm.

Gedəmmədim ziyarətə,
Gözlərim yolda qaldı!
Neçə illik qazancımı,
Urus əlimdən aldı!
Qəsdi məhv etməkdi məni,
Qarsın qalasına saldı!
Namərd yağının cəngində,
Mən ah – vaya düşmüşəm.

Bir göz qırpımında, ellər,
Müqəddəs yolu getdim!
Öpdüm ziyarət daşını,
Mətləbimə mən yetdim!

Ruhum uçdu Ərəfatdan
Haqq ətəyindən tutdum!
Mövlam yetişdi dadıma,
Ərşü - əlaya düşmüşəm.

Sinəmdə bir tufan qopdu,
Haq nurunda üzürəm!
Bu yollarda, kim deyər ki,
Mən usanıb bezirəm!?
Cənnəti – rizvana girib,
Güllərini üzürəm!
Mən Aşıq Heydər olandan,
Müsəllaya düşmüşəm!

# SƏN

Gözün qızıb, ağlın itib,
Gəlibsən meydana sən,
Dayanəmazsan, a bala,
Burada mərdana sən;
Qol qırılar, əng əzilər,
Sonra peşiman olarsan,
Ataşı salarsan betər,
Əyilən gərdənə sən.

Dana kimi buynuz atıb,
Kələ sürtünmə belə.
Gülünc olub el içində,
Düşərsən dildən-dilə,
Köməyinə çatan olmaz,
İstər yüz ağız mələ.
Tay olarsan gədələrə,
Oxşarsan xortdana sən.

Aşıq Heydər haqqı öyər,
Öyüdünü eşit gəl.
Kolu-kosu tez aparar,
Qopsa əgər qəfil sel.
Kor deyilsən sən, ay gədə,
Gözlərini yaxşı sil;
Doğru söz de, düşün danış,
Uymaynan şeytana sən.

# VAR

Dediyini yaxşı qandım,
Hər yerin pələngi var,
Kiminin yaxşı sifəti,
Kiminin bəd rəngi var;
Yaxşı-pislə qoşa gedər,
Bu dünyada yan-yana
Tula ayrı, köpək ayrı,
Bir də maşqı, şəngi var.

Mərdə tanrı hər şey verib,
Bilirsən bunu sən də,
Sözlərimə sən baxırsan,
Batıb noğula, qəndə;
Mən də sözün aşiqiyəm
Niyə durum ki, gendə
Güləşmirəm, deyişirəm
Sözün də bir səngi var.

**Aşıq Heydərin Axırkələk səfərindən**

## MOLLA QARA

Dillərə salaram səni,
Od tutarsan, molla Qara.
Xəstə olub sürünərsən,
Çox yatarsan, Molla Qara.
Başın dəyər neçə daşa,
Huşun itər, ağlın olmaz,
Düşərsən tozlu yollara,
Dərd satarsan, Molla Qara.

Mollalardan xeyir gəlməz,
Neçə-neçə görmüşəm mən,
Üz-üzə gəlmişəm, neynim,
Paylarını vermişəm mən.
El içində ad-sanım var,
Məclisimi qurmuşam mən.
Mən atlıyam, piyadasan,
Sən çatarsan, Molla Qara.

Cıldır, Ağbaba, Qağızman,
Qarsdan belə gəzən mənəm.
Şirin-şirin söhbətləri,
Nizamlayıb düzən mənəm.
Dərin-dərin dəryalarda,
Qəvvas kimi üzən mənəm.
Üzmə şərin ümmanında,
Tez batarsan, Molla Qara.

# OLUBDU

Baxın, Məhəmmədin işinə,
El içində xar olubdu.
Uyubdu şeytan felinə,
O xənnasa yar olubdu.
El eşidib, özü də bilir,
Sanasan ki, kar olubdu.
Bəyənmir dostu- tanışı,
Bu qurumsaq kor olubdu.

Məşədi iki qoyun verib,
Bu gəda quzuya dönüb.
Saqqalı bulaşıb yala,
Nazilib tazıya dönüb.
Öksüzdə meydan açıbdı,
Deyirlər qazıya dönüb,
Vurulub dünya malına,
İşi tam ah - zar olubdu.

Doğru söz de, düşün danış,
Hədyan demə qul Heydara.
Ağlın qaçıb, huşun itib,
Başın götür vur divara.
Yahu, yahu deyə - deyə,
Əl atmışam Zülfüqara.
Adına dastan demişəm,
Mahallarda car olubdu.

# Q I F I L B Ə N D

## KİMDƏDİ

Nə ucadı, nə alçaqdı,
Bu məqamlar kimdədi?
Gözəl işlər, gözəl peşə,
Böyük namlar kimdədi?
Pul oduna ömür verən
Nə qazanar dünyada?
Haqq ataşı, üzün nuru,
Dolu camlar kimdədi?

Varü-dövlət, qızıl-gümüş,
Ləli-göhhər nə şeydi!
Nədi söylə kişi işi
Bu dünyada nə yeydi?
Qara saçı nə ağartdı?
Əlif qəddi nə əydi?
Ağır məclis, şirin söhbət,
Qara damlar kimdədi?

Mərd dediyin necə kəsdi,
İşi-gücü yoxdumu?
El içində yeri-yurdu,
Varı-yoxu çoxdumu?
Mala-pula meyl eləmir,
Harda qurub taxtını?
Aşıq Heydər sual eylər,
Şirin dəmlər kimdədi?

# B Ə N Z Ə T M Ə
**(Aşıq Qurbaniyə bənzətmə)**

## GƏRƏK

Ey fələk sənlə əlləşməyə,
Bir böyük meydan gərək.
Bir sən olasan, biri mən,
Bir adil divan gərək.
Yetmiş idim mürşüdümə,
Dərdimə dəva qılam.
Mən nə bilim mən gəlincə,
Xakinan yeksan gərək.

Muyi zifin kölgəsində,
Bir zaman yatmaq gərək.
Tabutumun sərv ağacı,
Gül kəfən etmək gərək.
Tez yuyun, tez aparın,
Məqama yetmək gərək.
Umaram ki, bər Xudadan,
Cənnəti məkan gərək.

Heydara derlər ki, ey əzizim,
Yar üçün qəm eyləmə.
----------------------------
-----------------------------
-----------------------------
-----------------------------
Bunu yazan belə yazıb,
Çoxlara nişan gərək.

# D E Y İ Ş M Ə L Ə R

## AŞIQ NƏSİB İLƏ AŞIQ HEYDƏRİN DEYİŞMƏSİ

**-1-**

*Aşıq Nəsib:*

Pul, var-dövlət olan kasıba gəlməz,
Əliqabarlıdan uzaq dolanar.
Bəxt tapar axmağı, ya da sarsağı,
Mərdin də başına sazaq dolanar.

*Aşıq Heydər:*

Gətirməz dünyada kəsıbın işi,
Nə olsun hər yanda uzaq dolanar.
Qurumaz hər zaman gözünün yaşı,
Yediyi qarınla pazax, dolanar.

*Aşıq Nəsib:*

Göyçək gərək verə pislə baş-başa
Yanıb tökülənlər edə tamaşa.
Kişinin hər işi ilişir daşa,
Xoş gün ona olar yasaq, dolanar!

*Aşıq Heydər:*

Fələyin qanunu yazılıb belə,
Çirkin-pis tuş olar türfə gözələ.
Fağırın könlünü kim alar ələ,
Demək-gülmək ona yasaq, dolanar.

*Aşıq Nəsib:*

Qəribə işləri çox gördüm Nəsib,
Fələk çoxlarının nəfəsin kəsib.
Vaxt var boran olub, betər bad əsib,
Kimi dərd içində naçaq dolanar.



*Aşıq Heydər:*

Dünya görən bilir avandı-tərsi
Kənd-kənd dolanmışam Çıldırı-Qarsı.
Pirim pünhan yerdə veribdi dərsi,
Demə Aşıq Heydər qoçaq dolanar.

*-2-*

*Aşıq Heydər:*

Yahu-yahu deyən kəslər ucadadı, ay Nəsib,
Oğru olan, çuğul olan bacadadı, ay Nəsib.
Əyri yollar bizə olmaz, uğraşırıq haqla biz,
Yaxşı mətləb, dürlü sözlər qocadadı, ay Nəsib.

*Aşıq Nəsib:*

Mərd olanlar uca tutar təmiz adı, ay Heydər,
Kökü bəlli, düz əməlli əsli-zatı, ay Heydər.
Oğru, çuğul nə karədir, salma sözü belə sən,
Gəl bu yerdə yaddan çıxart mazarratı, ay Heydər.

*Aşıq Heydər:*

Yaxşı işdən, xoş niyyətdən sözünü tut, söz danış
Ya alış yan, qiybət elə, bu fələkdan yüz danış.
Düz adamsan yolun birdi həqiqəti düz danış,
Sən seçənsən doğru-durust dostu – yadı, ay Nəsib.

*Aşıq Nəsib:*

Yaxşıynan pis qoşa gedir, aramıza cüt çıxır,
Vaxt olur ki, güzranıma salaxana it çıxır.
Adam var ki, var-yox gedir, el içinə lüt çıxır,
Yeri-yurdu viran olub, çaladadı, ay Heydər.

*Aşıq Heydər:*

Tanrı verən paya şükür, azı-çoxu deyəmməm,
İnsanların gözü acdı, çoxu toxdu deyəmməm.

Qismət verən özü bilir həmin vaxtı deyəmməm,
Alan bir gün alacaqdı amanatı, ay Nəsib!

*Aşıq Nəsib:*

Haqq verənə mən qailəm, sən özün də bilirsən,
Hara getsən peşimləsən, sən də ora gəlirsən.
Telli sazla ürəklərdən dərdi-qəmi silirsən,
Mən olmuşam sözdən kənar, onun matı, ay Heydər!

*-3-*

*Aşıq Heydər:*

Bu dünyada dərd görmüşəm,
Ağrıyıb başım mənim.
Odur elə ürəyimə,
Axıb göz yaşım mənim.
Çox gəzmişəm, dolanmışam,
«Haqq» deyə-deyə eldə.
Qazandığım el hörməti,
Dərddi daşbaşım mənim.

*Aşıq Nəsib:*

Sən də mənim bir tayımsan,
Dağılmaz huşum mənim.
Neyləyim ki, Heydər deyir,
Bu könül quşum mənim.
Bizim bu doğma ellərdə,
Yaxşıca gəzmək gərək.
Mən ellərdən güc almışam,
Bişibdi aşım mənim.

*Aşıq Heydər:*

Çox odlara tutuşmuşam
Hələ də sönmür odum;
Qıpqırmızı qızarıbdı
Təndir tək könül badım.

Qızınanlar heç az deyil,
İçində dostum-yadım.
Bəxt deyilən qara gəlib,
Ağırdı daşım mənim.

*Aşıq Nəsib:*

Ey yolunda gəzən aşıq,
Dərdə düşər – qaydadı.
Bərkə-boşa düşmək yəqin,
Haqq quluna faydadı.
Ömrü kəsir – fələyə bax,
Gör bir o nə haydadı.
Sən də çox yaxşı bilirsən,
A qəm yoldaşım mənim!

*Aşıq Heydər:*

Neyləməli, sözdü gəldi,
Biz də dilə gətirdik.
Dərdü-səri qəlbimizdən
Atdıq, ələ gətirdik.
Söz-söhbəti şirin edib,
Eldən-elə gətirdik.
Heydər, amma unutma ki,
Artıbdı yaşım mənim.

*Aşıq Nəsib:*

Söz ki gəldi ortalığa,
Könlümüz güldü burda.
Hər deyilən yeni fikir,
Təzə-tər güldü burda.
Nəsib, qəmdən çox danışdıq,
Belini bükdük burda.
Dərd deyilən, bax, azaldı,
Bir oldu beşim mənim.

# COBAN ƏLİ İLƏ AŞIQ HEYDƏRİN DEYİŞMƏSİ

*COBAN ƏLİ:*

Bir sarı köynəyin yandın oduna,
Düşdün çöldən-çölə divanə kimi.
Oduna bir kimsə su da səpmədi,
Qəlbin yanıb oldu viranə kimi.

*AŞIQ HEYDƏR:*

Haqqı dana bilməm, önündə qulam,
Tez-tez incitsə də dərdü- sər məni.
Çöllərə düşəndən cavan yaşımdan,
Təbim moc verdikcə tərpədər məni.

*ÇOBAN ƏLİ:*

Durub dincəlmədin eşq ataşından,
Bir kömək görmədin yar-yoldaşından.
Qoruna bilmədin qəmin daşından
O yıxıq qəlbini qurana kimi.

*AŞIQ HEYDƏR:*

Kimi uzaq oldu eşq ataşından,
Coxu məğlub çıxdı dərd savaşından,
Yolumu hey saldım bulaq başından,
Qəm də etdi belə dərbədər məni.

*ÇOBAN ƏLİ:*

Çoban Əli deyər, haqqı danma gəl,
Mərdin qabağına çıxar yüz əngəl.
O qara baxtınan olursan mətəl,
İndi dolanırsan pirana kimi.

*AŞIQ HEYDƏR:*

Aşıq Heydər deyər yatdığım yerdə,
Ərərnlər-ərəni üstümdə durdu.
Nur dolu badəni əlimə verdi,
Içdim tutdu odu bir qədər məni.

# AŞIQ HEYDƏR İLƏ AŞIQ QƏNBƏRİN DEYİŞMƏSİ

*Aşıq Qənbər:*

Başım neçə daşa dəyib,
Günüm keçib bu dağlarda.
Yağış yağıb, dolu döyüb,
Günüm keçib bu dağlarda.

*Aşıq Heydər:*

Başa hərdən daş da dəyir,
Gün görmüşük bu dağlarda.
Fələk qanan kəsi döyür,
Gün görmüşük bu dağlarda.

*Aşıq Qənbər:*

Yaxşı günüm çox az olub,
Gümanım sözbət-saz olub.
Boran əsib, ayaz olub,
Günüm keçib bu dağlarda.

*Aşıq Heydər:*

Yaxşı günü tapmaq olmaz,
Doğru yoldan sapmaq olmaz.
Sazdan-sözdən qopmaq olmaz,
Gün görmüşük bu dağlarda.

*Aşıq Qənbər:*

Pis günlərə dözə-dözə,
Gün görürəm təzə-təzə.
Mən qane olmuşam aza,
Günüm keçib bu dağlarda.

*Aşıq Heydər:*

Pis günü mən də görmüşəm,
Duman da, çən də görmüşəm,

Düşəndə bəndə görmüşəm,
Gün görmüşük bu dağlarda.

*Aşıq Qənbər:*

Yetimlikdə böyümüşəm,
Daşa dəyib könül şüşəm.
Qanadı qırıq bir quşam,
Günüm keçib bu dağlarda

*Aşıq Heydər:*

Mənim də könlüm sınıqdı,
Bağrımın başı yanıqdı.
Çırağım yanır, sönükdü?!
Gün görmüşük bu dağlarda

*Aşıq Qənbər:*

Adım Qənbər, özüm fağır,
Dərdim çoxdu, yüküm ağır.
Sən ustadsan, bir çal-çağır,
«Günüm keçib bu dağlarda».

*Aşıq Heydər:*

Könlümü elə vermişəm,
Heydərəm, başda durmuşam.
Ağır məclislər qurmuşam,
Gün görmüşük bu dağlarda.

# MƏŞƏDİ MUXTAR İLƏ AŞIQ HEYDƏRİN DEYİŞMƏSİ

*Aşıq Heydər:*

Hanı Ağbabanın uca dağları?
Bir başımdan qalxan dumana bax - bax!
Vətəndi kiridən mən tək ağları,
Sən mənim qəlbimdə gümana bax – bax!

*Məşədi Muxtar:*

Bir az insaf elə, ağlatdın bizi,
Yenə dərdi qoydun kamana bax- bax!
Yandırdın söz ilə mərdi odlara,
Ah çəkir Məmmədə, Zamana bax- bax!

*Aşıq Heydər:*

Vətən həsrətindən yanıb gül oldum,
Özüm öz dərdimə qara qul oldum.
Mərənd qucaq açdı, buna gül oldum,
Ürəyimdə qopan tufana, bax-bax!

*Məşədi Muxtar:*

Axı səni sevir hər kəs bu yerdə,
Yurdu itirəndən düşmüsən dərdə!
Şükür rast olubsan kişiyə, mərdə,
Bu gözəl dəmlərə, həm ana bax-bax!

*Aşıq Heydər:*

Dar gündə dadıma çatdı yetənlər,
Amma ki, beynimdən çıxmır ötənlər.
Ölən öldü getdi, qaldı itənlər,
Bizləri yandıran zamana bax-bax!



*Məşədi Muxtar:*

Mərənd mərd yurdudu, darıxıb durma!
Ay söz xiridarı, qəmə baş vurma!
Könül sarayını ahla uçurma,
Gözümdən damcı tək damana bax-bax!

*Aşıq Heydər:*

Ürəyim yaralı, sinəmdə od var,
Yurdun qucağında bir ayrı dad var.
İllər ayrısıyıq, qohum var, yad var,
O qaçhaqaç salan yamana bax- bax!

*Məşədi Muxtar:*

Dar gündə dadıma yetənlər oldu,
Mərdin harayına çatanlar oldu!
Özünü odlara atanlar oldu,
Fikirə, xəyala cumana bax- bax!

*Aşıq Heydər:*

Ağbaba deyəndə qəm gəlir gözə,
Vətən həsrətindən gəlmişəm dizə!
Yenə Yetim Heydər güc verir sözə,
Bəlkə gələ bir az imana bax - bax!

*Məşədi Muxtar:*

Muxtarı hər zaman öz yanında gör,
Dərdi gözdən itir, dəmə də yer ver.
Könlü sınaq çoxdu, bizə dayaq dur,
Gətirmə könlümü amana bax-bax!

# AŞIQ HEYDƏR İLƏ ŞİKƏSTƏ PƏRİNİN DEYİŞMƏSİ

Aşıq Heydər:

Bulaq üstə duran qızlar,
Xəbər verin ellərimnən!
Suzuxmuşam su istərəm,
Tər xınalı əllərinnən.

Şikəstə Pəri:

Bizlər su verмərik yada,
İlqar - iman gedər bada.
Gözəlləri salma oda,
Su iç qalma yolunnan.

Aşıq Heydər:

Əslim Türkdü, mən danmaram,
Canım odlara salmaram.
Belə bulaqdan qalmaram,
Xəbər verin ellərimnən.

Şikəstə Pəri:

Babamın ismi Piridi,
Babam bu yerin nəridi.
Ölməyib hələ diridi,
Su iç qalma yolunnan.

Aşıq Heydər:

Nər oğlu, nərin biriyəm,
Ağ sinən üstə çürüyəm,
Baban ölə mən sürüyəm,
Xəbər verin ellərimnən.



Şikəstə Pəri:

Eşqin dərindi dəryası,
Pərin ölüb al qisası.
Az danış, zalım balası,
Su iç qalma yolunnan.

Aşıq Heydər:

Tapmışam qəm – kədəri,
Dağılıb könlüm şəhəri,
İncitmə Aşıq Heydəri,
Xəbər verin ellərimnən.

Qızlar bulaq başından gedəndən sonra Aşıq Heydər qəlyanına siqar doldurub bir-iki qurtum sinəsinə çəkir. Sonra arxası üstə uzanaıb səmaya baxa - baxa deyir:

Bir bulaq başında maralı gördüm,
Ağlımı başımdan apardı getdi.
Sözləri ox oldu, keçdi sinəmdən,
Könlümü sinəmdən qopardı getdi.

Bir sular sonası çıxdı qarşıma,
Bir nəhəng ildırım çaxdı başıma.
Fələk məni çırpdı əhlət daşına,
Gözlərim qaraldı, o vardı getdi.

Gözəllər gözəli Borçalı qızı,
Qövr edən yarama, gəl basma duzu.
Qaranlıq səmanın Zöhrə ulduzu,
Bütün varlığımı o yardı getdi.

# AŞIQ HEYDƏR İLƏ YETİM LƏVƏNDİN DEYİŞMƏSİ

*Aşıq Heydər:*

Nə ucadı, nə alçaqdı,
Bu məqamlar kimdədi?
Gözəl işlər, gözəl peşə,
Böyük namlar kimdədi?
Pul oduna ömür verən
Nə qazanar dünyada?
Haqq ataşı, üzün nuru,
Dolu camlar kimdədi?

*Yetim Ləvənd:*

Mərd ucadı, namərd alçaq,
Uca məqam mərddədi,
Gözəl işlər, gözlə peşə,
Böyük namlar mərddədi,
Pul oduna yanan kəslər
Faniliyi qazanar,
Haqq ataşı, üzün nuru,
Dolu camlar mərddədi.

*Aşıq Heydər:*

Varü-dövlət, qızıl-gümüş,
Ləlü-göhhər nə şeydi?
Nədi söylə kişi işi
Bu dünyada nə yeydi?
Qara saçı nə ağartdı,
Əlif qəddi nə əydi?
Ağır məclis, şirin söhbət,
Qara damlar kimdədi?

*Yetim Ləvənd:*

Varü-dövlət, qızıl-gümüş
Aqillərə nə şeydi,
Kişi işi səxavətdi,
Eylik eləmək yeydi,
Qara saçı, əlif qəddi
Qoca fələk tez əydi;
Ağır məclis, şirin söşbət,
Qara damlar mərddədi!

*Aşıq Heydər:*

Mərd dediyin necə kəsdi,
İşi-gücü yoxdumu?
El içində yeri-yurdu,
Varı-yoxu çoxdumu?
Mala-pula meyl eləmir
Harda qurub taxtını?
Aşıq Heydər sual eylər
Şirin dəmlər kimdədi?

*Yetim Ləvənd:*

Mərd deyilən haqq elçisi,
Yaxşı bilir işini!
Əzəl başdan heç buraxmır
Yaxşılığın peşini;
El içində məclis qurar.
Mərdə verər aşını;
Yetim Ləvənd doğru söylər
Şirin dəmlər mərddədi!

# GÜMRÜ QIZI DASTANI

**Gümrü Qızı dastanı ustadın cavan yaşlarında yaratdığı açılmamış xəzinələrdən biridir. Deyilənə görə, bu tarixi əsər təxminən 1895 - 1900 – ci illərdə Gümrü şəhərində, Gümrünün o vaxtlar tanınmış el ağsaqqalı, hörmət sahibi və şəhərin valisi olan Məmmədqasım ağanın oğlunun toy məclisində Aşıq Heydər tərəfindən üç günə danışılmış böyük həcmli bir dastan olmuşdur.**

**Hətta bu məclisə Gümrü, Qars, Qağızman, Axırkələk, Çıldır, Ağbaba və Sörəgəldən tanınmış el ağsaqqalları dəvət olunmuşdu. Çox təssüf edirik ki, bu böyük həcmli dastanın yalnız kiçik bir hissəsi dövrümüzə qədər gəlib catmışdır.**

Gümrü şəhərinin çiçəklənən dövrləri idi. Ədalətli Gümrü sərdarı ölkədə qayda-qanunu bərpa etmiş və özbaşınalığa son qoyulmuşdu. Daha yolları kəsib xərac almaq, oğurluq, soyğunçuluq, demək olar ki, yaddan çıxmışdı.

Sərdarın ölkəsində ədalət hökm sürdüyündən qeyri millətlər də bu torpaqlara pənah gətirirdi. Burada hamı şən və firavan yaşayıb, həyatlarını davam etdirirdilər.

Günlərin birində sərdar qəflətən dünyasını dəyişdi. Ölkə hələ yasdan çıxmamışdı, sərdarlıq məqamına çatmaq üstündə ağalar və bəylər arasında dava qızışmağa başladı.

Bu vəziyyətdən istifadə edən müxənnət qonşular kəndləri, mahalları talan edib, viran qoyurdular. Hər yerdə qətllər törədilir, günahsız adamların qanı axıdılırdı. Bu bəs etməmiş kimi yağı düşmənlər mahallara öz əskəri ordularını yerləşdirməyə başladılar. Elə bununla da mahallarda yadellilərə qarşı qiyamlar baş qaldırırdı. Amma əli yalın camaat yağıların ordularına heç nə edə bilmirdilər.

Bu özbaşınalığa son qoymaq məqsədilə mərd və igid oğullar, qaçaq dəstələr şəklində dağlara çəkilərək yağılara qan uddurmağa başladılar. Köməyə Urmiyadan, Xoydan və Təbrizdən də gələnlər var idi. Təbrizli Yetim Kərim bu dəstələri birləşdirib bir qoşun

eylədi. Ona kimi onun köməyinə Anadoludan Bəkir paşa gəldi. Onun alayı da Yetim Kərimin qoşunuynan birləşdi.

Yazın əvvəlindən başlayaraq payızın son ayına kimi birləşmış türk süvariləri yağıları Ağbaba mahalına qədər qovaraq darmadağın etdi.

Artıq qış başlamışdı, döyüşlər tam səngimişdi. Qanlı döyüşlərdən çıxan Yetm Kərim Bəkir paşa ilə möhkəm dost oldu.

Qışın oğlan çağıydı, Bəkir paşa yetim Kərimi Qarsa öz evinə qonaq dəvət edti. Kərim isə on nəfər cəngavərlə birlikdə Bəkir paşanın qonağı oldu.

Doğurdan da, atalar yaxşı deyib: "Yazıya pozu yoxdu". Elə həmin gün Qarsda Mahmud ağa adlı bir tutarlı kişinin oğlunun toyuydu. Mahmud ağa eşidəndə ki, Bəkir paşanın hörmətli qonaqları gəlb, o saat Yetim Kərimi toya dəvət etdi. Bəkir paşa və Kərim bu toya gəldilər.Yetim Kərim toyda su pərisinə oxşayan Zeynəb adlı bir xanıma vuruludu. Bu işdən xəbər tutan Bəkir paşa çox sevindi. Kərim bir yetim uşaq olduğundan və kimsəsi olmadığından elçiliyə Bəkir paşanın özü getdi. Allah sizlərə də toy-düyün qismət eləsin, hər iki cavan öz səadətinə qovuşdu. Bəkir paşa Kərimə yeddi gün - yeddi gecə toy eləydi və düyün hədiyyəsi olaraq yağılardan təmizlənmiş Ağbaba mahalını Kərimə hədiyyə verdi.

Dağlar və yaylalar məskəni olan Ağbabada yenidən gözəl həyat başladı. Artıq Ağbabada Kərimin Sərdar adlı bir övladı dünyaya gəlmişdi.

Aradan heç iki il keçməmiş yağılar yenidən Ağbabaya hücuma keçdilər. Arpa çayı ətrafı Almərdan düzündə hər iki tərəfdən qırılanın sayı - hesabı olmadı. Bu döyüşlərdə Yeyim Kərim yaralanaraq dünyasını dəyişdi. Bəkir paşa qırx gün - qırx gecə yas saxladı və Kərimin yoldaşı Zeynəbi, iki yaşlı oğlu Sərdarı öz himayəsinə götürdü.

Sən demə, bu tifillərin ağrılı-acılı günləri qabaqda imiş. Artıq qəmkədər Zeynəbin yavaş-yavaş yaxasını tanımağa başladı.

Günlərin birində Zeynəbin dayısı molla Dursun Bəkir paşanın yanına gəldi və bildirdi ki, dul qadının şəriətlə dul qalması günahdı.

Kərimin heç kimi olmadığından gərək Zeynəb mənim bacım oğlu Söyünə ərə getsin, mən bu haqda Söyünlə danışmışam, o bu xeyir işə razılıq verib.

- Paşam, gəlməyimin məqsədi odur ki, sən də bu işə xeyr-dua verəsən, onu da yaxşı bilirəm ki, sən Kərimi doğma oğlundan da çox sevirdin.

Mollanın sözləri sillə kimi Bəkir paşanın üzünə dəydi. Qəhərdən yaşarmış gözlərini dəsmalnan sildi. Bir təkrar özünü ələ alıb dedi:

- Molla Dursun, deyirsən ki, şəriyət ilə gərək dul qadın ərə getsin, bəs uşaq?

- Mən bu işə heç nə deyə bilmərəm. Əgər Zeynəbin özünün razılığı varsa, qoy sən deyən olsun.

Molla Dursun dilləndi:

- Bəkir paşa, sən Söyünü yaxşı tanıyırsan axı, sənin qoç igidlərindən biri deyilmi, kim istəyərdi belə olsun, bu bir Allah işidir, Allah yağı düşmənlərin evini yıxsın, evimizi yıxdılar.

Bəkir paşa dilləndi:

- Onda mənim sizdən bir təvəqqəm var, qoy Sərdarı mən böyüdüm. Ürəyi istədiyi vaxt da anasının yanına gedib gələ bilər. Mənim oğlum Osman Gümrünün yeni seçılmiş sərdarıdı, istəyim odur ki, Sərdarı oğlum Osmanın yanına göndərəm. Qoy, uşaqlıqdan dövlət işlərini öyrənsin. Elə ki, boyu çıxdı Gümrü şəhrinin gələcək paşası Sərdar olmalıdır. Artıq mənim ölümlü günlərim gəlib, bu vəsiyyətimi oğlum Osmana çatdırmışam.

Bu danışıqlada Zeynəbin taleyi həll olundu. Zeynəb yeni ər evinə, Sərdar isə Gümrü şəhrinə göndərildi.

Aradan heç on il keçməmişdi ki, Bəkir paşa rəhmətə getdi. Sərdar isə Gümrüdə Osmanın himayəsi altında böyüməyə başladı. Doğurdan da, atalar yaxşı deyib:- "Pis günün ömrü az olar" !!!

Hələ uşaq yaşlarından Sərdar Osman paşa ilə birlikdə bir çox məclislərdə, döyüş meydanlarında olmuş, döyüş fəndlərini tam mükəmməl öyrənərək böyük, yaraşıqlı, ağıllı, bacarıqlı bir pəhləvana çevrilmişdi. Elə saz çalırdı ki, heç ustad aşıqlardan geri qalmırdı. Zili-zil, bəmi-bəm yerində idi.

Aradan uzun illər keçmişdi. Sərdar Gümrü şəhrinin sərdarı idi, həm də çox rəhimli bir paşa idi.

Varlı-yoxsul hamı onu sevirdi. Sərdar həmişə mahallara gedib, camaatın güzəranı ilə tanış olur, yoxsullara, əlsizlərə və yetimlərə kömək edərdi. Dağlar qoynunda olan Gümrü şəhri yavaş-yavaş gözəlləşməyə başladı. Müxənnət qonşuların dağıtdıqları binalar məscidlər və məhəllələr əvvəlki vəziyyətindən də yaxşı olmuşdu.

Artıq Sərdar iyirmi beş yaşını haqlamışdı.

Günlərin birində paşa öz dostları Niftalı ağa və Nağdəli bəylə ceyran ovuna çıxdılar. Sərdar ilk həmlədə ceyranın başını bədənindən üzdü və üzünü dostlara tutuaraq dilləndi:

- Dostlar, ovumuz yararlı oldu, gələn il, allah qoysa, yenə bu yerlərə gəlib ov ovluyacağıq, hərəmiz bir ceyran öldürsək, bu allahın heyvanının kökü kəsilər axı!

Bu sözləri eşidən dostlar gülüşdülər. Nağdəli bəy üzünü Sərdara tutaraq dilləndi:

- Paşam, bəlkə mənim qonağım olasınız. Bu gün evimdə xeyir iş var, oğlum müsəlman olacaq. Gümrünün adlı- sanlı aşıqlarını da dəvət etmişəm.

Sərdar dilləndi:

- Əzizim, mən məmuniyyətlə o məclisdə iştirak etməyə hazıram, çünki harada aşıq məclisi varsa, gərək ora bir baş çəkəm, neçə ildi başım şəhərin işlərinə elə qarışıb ki, ozan məclisləri də az qala yadımdan çıxıb. Ancaq Nağdəli bəy, səndən bir ricam var. Bir fayton göndər, gedib Qarsdan anam Zeynəbi də gətirsin. Onun üçün də çox darıxmışam.

Paşanın bir sözü iki ola bilməzdi. Elə belə də oldu.

Məclis qara zurnada, cəngi havası ilə başlandı. Meydandan pəhləvanlar çıxmaq bilmirdi. Sonra məclis saza və sözə verildi.

Zeynəb Söyün ağadan olan yeganə doğma qızı Fatma xanımla hərəsi Sərdar paşanın bir tərəfində əyləşdilər. Buralarda belə bir adət variydı ki, kişilər məclisinə qadınlar gəlmirdi. Ancaq Zeynəb xanımın təkidi ilə nişanlı qiz- gəlinlər məclisə daxil oldular. Sünnət mərasimi başlandı. Dəllək Qəfər müqəddəs "Qurani Kitabı" oxuyub

qurtardıqdan sonra öz işini başa çatdırdı. Sərdar paşa yerindən durub dəllək Qəfərə xələt verdi və beləliklə də məclis qızışmağa başladı. Meydan artıq cavanların idi. Paşa dərin xəyallara qərq olmuşdu, elə bil, şirin yuxu görürdü. Birdən qarşısında dayanan gənc bir qızın səsinə diksindi. Qız utana-utana dilləndi:

- Paşam, görürəm yuxulayırsınız, bir fincan qəhfə için, yuxunuz dağılsın. Sərdar başını qaldırıb qıza baxanda, elə bil Sərdarın başına göydən ildırım çaxdı. Sərdar iyirmi yaşında olanda bu qızı ilk dəfə yuxuda ona Xızır Peyğınbər göstərmişdi.

Qız o qədər gözəl idi ki, yemə- içmə, dur bu qıza tamaşa eylə. Sərdar bir könüldən min könülə qıza aşiq oldu. Həmişə məclislərdən tez durub gedən paşa yerinə mıxlanmışdı. Gözünü də qızdan çəkmək bilmirdi ki, bilmirdi. İşi belə görən Zeynəb xanım dilləndi:

- Bala, hamının gözü səndədi. Sən kimə baxırsan? Olmuya bu qıza aşiq olmusan? Bu qız, sənin dostun Nağdəli bəyin bacısı, Sona xanımdi.

Sərdar paşa dedi:

- Ana, doğrudan da, bu qız elə bil bir su sonadı.

Bu zaman məclisi idarə edən Yetim Tapdıq sazı sinəsinə basıb, aldı ustadlardan görək nə dedi:

Necə söz deyəsən qəm ərbabına,
O da sənin kimi zəri görüfdü.
Dindirəndə haldan olar xəbərdar,
Cəbrə düşüb hər əfkarı görübdü.

Dost dostuna etsə iqrar imanı,
Qiyamətə gedər müddət zamanı.
Könül uman yerdən kəsməz gümanı,
Çün əzəldən etibarı görübdü.

Şenliyin zehnini verməyin zaya,
And verirəm, o yaradan Xudaya.
Bel bağlama dövrü keçən gədaya,
Neçə əyyam ruzigarı görübdü.

Ustadlar ustadnaməni bir deməyib, iki deyib, biz də deyək iki olsun, düşmən qabıq qoysun, soyulsun.

Bivafənin, müxənnəsin, nakəsin
Doğru sözün, düz ilqarın görmədim.
Namərdin dünyada cox çəkdim bəhsin,
Namusun, qeyrətin, arın görmədim.

Yetəni özümə mən dost eylədim,
Yolunda canıma cox qəst eylədim.
Söyüddən bağ saldım, peyvəst eylədim,
Almasın, heyvasın, narın görmədim.

Nəfs aldatdı, hər yetənə xan dedim,
Bihudə kollara gülüstan dedim.
Əbəs yerə bivəfaya can dedim,
Zəhmətin cox çəkdim, karın görmədim.

Huşum çaşdı, düşdüm olmaz oyuna,
Yetmədim gözəlin əsli-soyuna,
Aşıq oldum simasına, boyuna,
Hayıf kı, kamalda dərin görmədim.

Ələsgər, elmində olma nabələnd,
Doğru söylə, sözün çıxmasın qələt.
Şahiddə iman yox, bəydə ədalət,
Qazıların düz bazarın görmədim.

Ustadlar ustadnaməni iki yox, üç deyər, biz də deyək üç olsun, düşmən ömrü puç olsun.

Pələng qocalanda, nər büdrəyəndə
Kəhər at yollarda öləndə, hayıf.
Bir mərdin qılıncı düşəndə əldən,
Namərd gendən baxıb, güləndə hayıf.

Heç kəs ayrılmasın öz balasından,
Didərgin düşməsin yurd-yuvasından.
Maralı hürküdüb öz talasından,
Buraya çaqqallar gələndə hayıf.

Birsi yarayar elin işinə,
Dözər zamanənin hər gərdişinə.
Birisi tikəni çəkər dişinə,
Zəhmətsiz yarıya böləndə hayıf.

Biri toya gedər, sevinib gülməz,
Birsi vaylarda ağlaya bilməz.
Namərd öz qəlbindən heç kini silinməz!
Özünü dost kimi biləndə hayıf.

Birsi yalanı deyər ucadan,
Çəkinməz heç zaman cavan-qocadan.
Birisi dost evinə baxar bacadan,
Açıb bu qapını girəndə hayıf.

Atılıb tullanan körpə beçələr,
Vədəsiz banlayar bəzən gecələr.
Çəpərdən-çəpərə qonan sərçələr,
Bülbülü qəfəsdə görəndə hayıf.

Yetim Tapdıq ustadnaməni sona çatdirib, sazı Sərdara uzadaraq dilləndi:

-Paşam, bəlkə bir-iki kəlmə söz də siz deyəsiniz?

Hə əzizlərim, Sərdar sazı öpüb, döşünə basdı və aldı görək nə dedi:

Ağlımı apardı bir mələkzadə,
Bülbüləm gülümü tapdım bu gecə!
Məhəbbət nə imiş, sevgi nə imiş,
Qəlbimdə bir ocaq yapdım bu gecə!

Can alan gözləri od saldı cana,
Həzrəti Yusif tək düşdüm zindana.
Cözəllər gözəli, ay gözəl ana,
Az qala yolumdan sapdım bu gecə!

Sərdaram, paşalıq yadımnan çıxdı,
Göz yaşımselləndi yaxama axdı.
Mehrü - məhəbbətim, baxdı karıxdı,
Xəyal atlarını çapdım bu gecə!

Sərdar sazı öpüb aşıq Vəliyə uzatdı.

- Ustad, ustad məclisində söz demək mənə yaraşmaz, bizim sizə çox ehtiyacımız var, məclis sizindi.

Artıq gecədən xeyli keçmişdi. Sərdar Nağdəlini yanına çağırtdırıb dedi:

- Bəy, bu gecə anam, bacım və mən sizin qonaqlarınızıq. Əgər icazə versən, qoy mənə bir yer hazırlasınlar, möhkəm yorulmuşam, evə getməyə halım qalmayıb, bir az yatıb dincimi alım.

Nağdəli bəy üzünü doğmalarına tutaraq dilləndi:

- Qızlar, tez paşaya bir yer hazırlayın.

Sərdar asta yerişlərlə xalılar döşənmş böyük bir otağa daxil oldu. Burada təkrar Sona xanımla qarşılaşdı.

Sona xanım gülə-gülə dilləndi:

- Paşam, sizə xoş gecələr arzulayıram, yuxunuz şirin olsun, deyib, zalı tərk etdi. Sərdar güclə özünü ələ aldı, bilmədi qıza nə cavab versin. Sərdar dərhal yerinə uzandı, amma ilan vuran yatdısa, Sərdar yatmadı. Yerində o tərəf bu tərəfinə dönərək, Sona xanımı gözlərinin qabağında gətirdi. Baxçada Sona ilə Fatmanin səsini eşidən Sərdar eyvana çıxdı.

Sona incə bir səslə Fatma xanıma dedi:

-Sənin nə qəşəng, yaraşıqlı və ağıllı qardaşın var? Deyirdilər inammırdım, həqiqətən də həsəd aparılası cavandı.

Fatma:

- Ay qız, olmuya qardaşıma vurulmusan? Vallah, toyunuzda o qədər oynayacam, düz bir həftə gərək yerimdən qalxa bilməyəm.

Sona xanım nə isə demək istəyirdi, birdən onların gözlərinə eyvandan heyran - heyran baxan Sərdar sataşdı.

Sona xanım üzünü Sərdara tutaraq dilləndi:

- Paşam, mən elə bilirdim ki, siz artıq yatmısınız, olmaya sizi narahat elədik, siz allah bizi bağışlayın.

Sərdar dinmədi.

Sona xanım üzünü Fatma xanıma tutaraq dilləndi:- Qardaşın bizə gələnnən dili tutulub.

Sona xanım:

– Ay qız, bəlkə qardaşının dilini açım.

Fatma xanım:

– Pis olmaz.

Bu dəmdə Sona xanım aldı görək nə dedi:

Aşkar deyil, mənim dərdim pünhandı,
Var olsun, yaşasın, eli paşamın.
Görüb gözəlliyi, almır hesaba,
Yaş gedib bükülüb beli paşamın.

Bir tuti dillinin dağıyam, dağı,
Olmazmı mənimlə gəzəsən bağı.
Gedib cavanlığın, qalmayıb çağı.
Görürəm titrəyir, əli paşamın.

Aləm bilir sən Gümrünün gözüsən,
Niyə qoydun sinəm üstə közü sən.
Baxan deyər düz Məcnunun özüsən,
Açılıb çiçəyi - gülü paşamın.

Sona xanım yar yanında sayılsın,
Arif olan bu sevdadan ayılsın.
İxtilat et, şirin cana yayılsın,
Titrəsin ağzında dili paşamın.



Söz tamama yetdi.

Qızlar baxçadan getmək istəyəndə Sərdar dözə bilməyərək dilləndi:

- Sona xanım, insaf eylə bir ayaq saxla, gör mən nə deyirəm.

Aldı görək bu dəmdə Sərdar nə dedi:

Küsmə məndən gözəl mələk,
Buyurub allah, seçmişəm.
Ölçüb, biçib sığal çəkib,
Yer üzündə şah seçmişəm.

Gözəlsən, güldən - laladan,
Tanrı saxlasın baladan.
Səni o ərşi - əladan,
Qəlbimə pənah secmişəm.

Sərdarı sən eşit dayan,
Gəl könlümə olnan həyan.
Sınıq qəlbi yardı duyan,
Səni qəlbə mah seçmişəm.

Söz tamama yetən kimi Sona xanım güldü.

-- Elə bu paşam?! Yenə sözün var yoxsa...

Sona belə deyəndə Sərdar bir daha özünü saxlaya bilməyib, aldı görək nə dedi:

Gözəllər sultanı, mələklər şahı,
Telləri xurmayı, qamət sürahı,
Cəmalın cəzb edir şəms ilə mahı,
On beş günlük aydan gözəlsən, Sona!

Gözlərin dumanlı, bənzər ümmana,
Səni sevən aşiq olub divana,
Yaradan yaradıb salıb cahana,
Sən huri qılmandan gözəlsən, Sona!

Yaralı könlümə yaraşmaz ziynət,
Sanki bir mələksən ey sərvi – qamət!
Səni sevən aşiq istəməz cənnət,
Cənnəti - Rizvandan gözəlsən, Sona!

Qəm üstə yatmağı etmişəm peşə,
Mövlam nişan verdi, gəldim görüşə.
Pərişan bülbüləm, sən tər bənövşə,
Sərvi - Xuramandan gözəlsən, Sona!

Gül açan çəmənə bənzər üzlərin,
Şahın taxt-tacına dəyər gözlərin.
Sərdara dadlıdır sənin sözlərin,
Yusifi Kənandan gözəlsən, Sona!

Söz tamama yetdi. Fatma gülə-gülə dilləndi:

- Ay qız, mən elə bilirdim sən qardaşıma aşıq olmusan. Səndən ötəri qardaşım Məcnun olub ki!?

Qızlar gülüşə- gülüşə bağçanı tərk etdilər. Amma Sərdar səhərə kimi yata bilmədi ki, bilmədi. Eşq ataşı, doğurdan da, onu Məcnun etmişdi.

- Səhərin ala qaranlıqda baxçaya düşən Sərdar o baş - bu başa var gəl etməyə başladı. Bu dəmdə Nağdəli bəy gördü ki, Sərdar baxçada o başa bu başa gedir - gəlir. Bəy sözə başlamadımı.

- Paşam, olmaya ala qaranlıqda durub getmək istəyirsən, yoxsa yerin narahat oldu?

Sərdar:

- Siz narahat olmayın bəy, bu baxça mənim o qədər xoşuma gəlib ki, elə bil cənnətə düşmüşəm, heç yerdə belə gözəllik görməmişəm, olmaya, bəy, sizi narahat elədim, bir fincan da qəhvə olsa, buradan tərpənən deyiləm.

Nağdəli:

- Bu nə sözdü, paşam, bura sənin öz evindi, necə istətəyirsənsə elə də olsun, elə bildim getmək fikrindəsən, az qaldim sizdən inciyəm.

-Əziz dostum, sən get qonaqlarını rahatla, amma qızlara denən ki, mənə bir fincan qəhvə gətirsinlər, mən hələ bu gün də sizin qonağınızam.

Nağdəli:

- Baş üstə, deyib baxçadan aralandı. Amma Nağdəlini fikir aparmışdı, bu işə sirillah qalmışdı. Öz-özünə deyinə - deyinə danışırdı, axı Sərdar hara gedirsə-getsin, orada yalnız bir-iki saat qala bilərdi.

Burada nə isə bir iş var. Əyə bir də nə ola bilər ki, qardaşdan da irəli dostuq, anası və bacısı da bizdədi, daha bundan yaxşı nə ola bilər?

Qulluqçular Sərdara səhər yeməyi aparmaq istəyəndə, Sona xanım dilləndi: - Siz narahat olmayın gedin, məclisi yola verin, mən öz əllərimlə paşaya qəhvə düzətmişəm, özüm aparacam. Sona xanım səhər o başdan qəhvə ilə baxçaya daxil oldu. Sərdar yerindən ildirım kimi duraraq Sona xanıma tərəf gəldi.

Sərdar:

- Mənim üçün çox xoşdur ki, mələklər şahının əli ilə bir fincan qəhvə içim. Xanim, vaxtınız varsa mənimlə bir fincan qəhvə içsəniz lap yerinə düşər.

Hər iki aşiq baxçada süsən- sünbüllər içərisində əyləşdilər. Amma bir - birlərinin üzünə baxa bilmirdilər. Bir xeyli sakitlikdən sonra Sərdar dilləndi:

-Sona xanım, sizi görəndən sonra bu gecə yuxum ərşə çəkildi, hey gözlərimi yumdum, sizin surətiniz gözlərimin önündən getmədi. Mən deyən artıq özümü idarə edə bilmirəm.

Birdən Sərdarın gözləri Sonanin boynundakı altun həmayilə sataşdı.

Sərdar:

- Bu həmayıl sizi olduğunuzdan da gözəl göstərir.

Sona xanım:

- Bu anamin yadigarıdı, qaşı isə müqəddəs "Qurani – Kərimdən" düzəldilib.

Sərdar:

- İcazə versəniz ona yaxşı baxam, bu həmayılı ilk dəfə mənə yuxuda göstərmişdilər.

Sərdar həmayıldakı müqəddəs "Quranı - Kərimi" üç dəfə öpdü, istədi ki geri qaytarsın, Sona xanım dilləndi:

- İcazə verin, mənim özüm götürüm, deyib ayaq üstə qalxaraq şümşəd əlləri ilə həmayili Sərdarın boynuna keçirdi:

- Qoy bu müqəddəs kitab bizə uğurlar gətisin.

Sona xanım:

- Mənim on səkkiz yaşım olanda bir qoca dərviş mənə dedi ki, biz bir cavan oğlanı səninlə buta eləyirik, sən də bu həmayili o oğlana verməlisən.

Dərviş bir də mənə dedi ki, siz öz həyatınızı özünüz secməlisiniz. Çalışın bu seçimdə yanılmayın. Dərviş mənə səni qoca kişi şəklində göstərdi. Mən isə ağlaya -ağlaya dedim, bəs onun cavanlığı necədi?

Həmin dərviş mənə dedi ki, onun özü səni tapacaq, mən yenə ona allaha and verdim ki, bəs bizim ilk görüşümüz necə olacaq? Dərviş mənə dedi ki, sizin bağçada o gəlməmişdən üç gün əvvəl lalələr çiçəkləyəcək, bu ilk əlamətdi, həmin cavan məclisdə sözünü sazla deyəcək, səhərə kimi nə sən, nə dəki o yatmayacaqsınız. Səhər gün çıxmamış siz bağçada görüşəciniz. Ona bir fincan qəhfə aparmalısan. O isə bağçadakı lalələrdan bir dəstə toplayıb sənin qollarının arasına qoyacaq. Bu yerdə sən həmayılı həmin gənc oğlana verməlisən. Əgər dalını bilmək istəsən görəcəksən ki, o qəhvəni içib qurtaran kimi bağçadakı bütün lalələr sönəcək.

Məni vahimə basmışdı. O yerdə oyandım ki, yanımda anamdan başqa bir kimsə yoxdu. Anam isə mənə deyidi:

- Ay qızım, iki gündü ki, sən yatırsan, qız uşağı belə tənbəl olmaz axı!?

Mən bu əhvalatın hamısını anama danışdım. Anam isə Allah bu işin axırını xeyr eləsin deyib, həmin bu həmayılı mənə verdi. Onda mənim on səkkiz yaşım ancaq olardı. Sonra isə Sona xanım titrəyə-titrəyə bir fincan qəhvəni Sərdara verdi. Sərdar isə bağçadakı lalələrdən bir dəstə dərib Sona xanımın qolları arasına qoydu.

Sərdar bir fincan qəhvəni başına çəkən kimi gördü ki, həqiqətən də bağçadakı al qırmızı lalələrdan əsar- əlamət qalmayıb, hamısı sönüb. Bunu görən Sərdar və Sona xanım çox bikef oldular.

Bu yerdə Sərdar paşa özünü saxlaya bilməyib aldı görək nə dedi:

Gözəllər məskəni Gümrü şəhrində,
Gözəllər şahına mayıl olmuşam.
O büllur qaməti, o gül camalı,
Aparıb əqlimi sayıl olmuşam.

Ömrün bahar çağı gəldik üz-üzə,
Kimdi bu ceyrani buraxan düzə?
Qaşları kamandı, kirpiklər nizə,
Oxlayıb könlümü, zayıl olmuşam.

Qırxların əlindən badə içmişəm,
Əzəl başdan bir gözəli seçmişəm.
Məqribdən məşriqə bir yol keçmişəm,
Haq verən paylara qayıl olmuşam.

Söz tamama yetdi. Sərdar paşa Sona xanıma dedi:

- Sona xanım, bu işi belə qoymaq olmaz.

Amma ... indi biz ayrılmalıyıq.

Sona xanım ayrılmaq istəməsə də, deyilənə əməl etdi.

Sona xanım bağçadan gedəndən sonra Sərdar orada Nağdəli bəylə qarşılaşdı.

Nağdəli:

- Ayə qardaş, sənə nə olub, niyə titrəyirsən? Axı mən sənə dedim, səhərlər Gümrünün havası soyuq olur. Düz iki saatdır ki, sən burada oturmusan, deyən sənə soyuq dəyib, tir-tir əsirsən.

Sərdar boğula-boğula dilləndi:

- Məni elə soyuq tutub ki, qançıradan da betər olmuşam.

Sonra üzünü Nağdəliyə tutaraq dilləndi:

- Bəy, sözlərimə yaxşı-yaxşı qulaq as, qonaqların gəlibmı?

Nağdəli:

– Aşıqlar səni gözləyirlər.

Sərdar:

– Onda gedək məclisə baş çəkək. Amma cox otura bilməyəcəm. Soyuq məni haldan salıb, sonra üz vurmayasan ha. Bir xahişim də var, məclis qurtaran kimi anamı hökmən göndər gəlsin bizə.

Sərdar paşa və Nağdəli bəy məclisə daxıl oldular. Sərdar keçib anasının yanında oturdu. Cavan qızlar, gəlinlər meydandan çıxmaq bilmirdilər.

Sərdar üzünü Yetim Taptığa tutaraq dilləndi:

- Ustad, icazə versəniz, sinəmə bir - iki kəlmə söz gəlib, deyim, sonra gedəcəm, çünki Qarsdan Osman paşa və istəkli qonaqlar gəlib, məni gözləyirlər. Tez aşıq Vəli sazı Sərdara uzatdı.

Aldı görək Sərdar bu dəmdə nə dedi:

Bu gün bu məclisə bir can gəlibdi,
Buyursun meydana, nənəm oynasın.
Al yaşıl geyinib çıxsın ortaya,
Gözəllər sultanı anam oynasın.

Başına döndüyüm gül üzlü Pərim,
Əlim qələmimdi, sinəm dəftərim.
Buyursun meydana sərvi sərvərim,
Telləri xurmayi durnam oynasın.

Biçarə Sərdarı salmısan dərdə,
İndi çox gülürsən burdakı mərdə;
Dolaşmaya simlər, vurmaya pərdə,
Adını deyirəm Sonam oynasın.

Xanımlar xanımı Zeynəb xanım ayağa durdu, süzə - süzə öz qızı Fatmanı və Sona xanımı meydana dəvət etdi. Məclıs qızışdı, nə qızışdı.

Bu fürsətdən istifadə edən paşa məclisi tərk etdi.

Sərdar paşa necə dedisə, Nağdəli bəy də elə etdi. Artıq gün batırdı. Nağdəlinin bəzəkli at faytonunda, Zeynəb qızı Fatma

xanımla bərabər Sərdarın evinə gəldilər. Artıq Osman paşa da burada idi.

Osman paşada artıq yaş öz işini görmüşdü, güclə ayaq üstə dururdu. Qulluqcular Osmanın başına fırfıra kimi fırlanırdılar. Sərdarın rəngi ağappaq idi. O başına gələn bu işləri Osmana və anasına danışdı.

Sərdar:

- Osman, mənim ata əvəzim, sən də mənim anam, dərdimə bir çarə qılın.

Osman:

- Ay bala, bizim yeganə carəmiz səni evləndirməkdi, bir də ki beş - on günlük dünyadı, kim bilir, kiminin axrı necə olacaq? İki dünya bir olsa da, mən səni evləndirməliyəm. Çünki atam Bəkirin axırıncı vəsiyyətinin vədəsi gəlib çıxıb. Bundan sonra rahat ölə bilərəm.

Sonra Osman paşa üzünü mehtərlərə tutub möhkəm-möhkəm qışqırdı:

- Ayə, ay mehtərlər, ayə, ay zalım uşağı, ayə, harada qalmısınız, ay Boğos, ay Setrək, səhər o başdan atları çölə buraxmayın. O qıllı Minasa da deyin ki, təcili Qarsa getsin, bütün qohum-əqraba, dost-tanış, kimi tapsa, desin ki, təcili Gümrüyə gəlsinlər. Bir-iki günə kimi Sərdarın toyudur. Osman paşa əlini cibinə saldı. Bir bağlama pul çıxarıb mehtərlərə verdi, bu da mənim sizlərə toy məqəricim. Əyə, zalım uşağı, zalım, sizin nə vaxt əyin-başınız düzələcək, gedin özünüzə pal - paltar alın. Cəld, haydi, gözümə bir də bu qiyafədə görünməyin. Sonra üzünü Sərdara tutaraq dilləndi:

- Ay bala, axı mən sənə demişdim, bunları buralarda çörək verib saxlama. Bunlardan adama xeyir gəlməz. İlanın ağına da nəhlət, qarasın da.

Elə bu dəmdə Zeynəb Osmanın sözünü kəsərək dilləndi!

- Osman qardaş, məni bağışla, sözünü kəsdim, bəlkə uşaqları çağırtdırmayasan. Bu iş məni heç açmır. Sən yaxşı bilirsən ki, mənim başıma nələr gəlib. Olmazmı bir az ölçə, biçəsən? Lalələrin solması məni heç açmır axı!?

Osman sözə başladı:

- Ay bacı, bu yazıdır, bir sevin.

- And olsun, o Allahın birdi-birliyinə, əgər Sərdarın başından bir tük əksik olsa, düzü - dünyanı yıxıb dağıdaram. Sərdarın ürəyinin yumşaqlığından şəhər müxənnətlərlə doludu, hamısı da adamı arxadan vuranlardı. Eşıdıblər ki, mən gəlmişəm siçan deşiyini satın alıblar. Ay bala, bir az sərtlik də lazımdır. Yeri gələndə şallaq da işə düşməlidir.

Daha Zeynəb Osmanın bir sözünü iki eləmədi.

Deməzsənmi, oğlan evində toydu, ancaq qız evinin xəbəri yoxdu.

Səhər Nağdəli bəy öz xanımı Güllüzara dedi:

- Arvad, hazırlaş, gedək Sərdargilə. Zalım oğlu səhərin ala qaranlığında baxçada oturmuşdu, gördüm ki, tir-tir əsir, möhkəm soyuq tutub. Gedək bir paşaya baş çəkək. Güllüzar dinmədi:

- Ay arvad, nə olub sənə!

Güllüzar isteza ilə dilləndi:

-Heç, öz bacından xəbərin yoxdu. Təbiblər əldən-dildən düşüblər, bir bacına baş çəksən! Nağdəli başı alovlu bacısının yanına qalxdı. Üzünü təbiblərə tutaraq:

-Ayə, bu qıza birdən-birə nə oldu? Qocaman Gümrü təbibi Nuru yazıq-yazıq dilləndi:

-Bəy, qız çox halsızdır, amma qorxulu bir şeyi yoxdur. Qoyun bir az dincəlsin.

Nağdəli təbibə pul verib, yola saldı. Sonra üzünü Güllüzara tutaraq dilləndi:

-Ay arvad, bu nə işdi, başımıza gəldi, yaxınlarımın hamısı yatağa düşüblər. Birdən Nağdəlinin gözü Sonanın sinəsinə sataşdı. Həmailin yeri Sonanın sinəsində günəşin işığından iz salmışdı. Güllüzar yenə istehza ilə dilləndi:

-Nə baxırsan, həmin altun həmayılı dostunun boynunda görmədinmi? Elə bil Nağdəlinin başına qaynar su tökdülər: Sözündən belə çıxır ki,... yox – yox, bu ola bilməz, axı onun belə şeylərə ehtiyacı yoxdu. Güllüzar, sən məni lap dəli eliyəcən, ya da ki, mən dəli olmuşam. Bu dəmdə Sona gözlərini açıb dilləndi:

-Qardaş, həmin həmayili mən paşaya səhər o başdan bağçada vermişəm.

Nağdəli pərt halda dilləndi:

- Ay arvad, indi mən başa düşdüm ki, bunların xəstəliyi nədi?!

Güllüzar:

- Bu hələ harasıdı, bağca lalələrlə doludu, bax bu lalələrdən başqa baxçadakı lalələrin hamısı sönüb. Nağdəli iki əllə başını tutdu.

- Ay arvad, həqiqətənmi sən məni dəli yerinə qoymusan, lalə nədi, zad nədi, axı bağçada belə güllərin bitdiyini görməmişəm.

Güllüzar:

- Get, bax. Nağdəli baxçaya düşəndə gördü ki, həqiqətən də hər şey Güllüzarın dediyi kimidi. Bu dəmdə çöldən at səsləri eşidildi.

Nağdəli çölə çıxdı. Elə bil onun həyətinə böyük bir ordu gəlmişdi. Həyət baca yaraqlı - yasaqlı əsgərlərlə doluydu.

Bu dəmdə Osman paşa gər səslə dilləndi:

- Ay ev yiyəsi, ay ev yiyəsi, qonaq qəbul etmək istəmirsinizmi? Nağdəli Osman paşanı yaxşı tanıyırdı, çünki Osman bu böyük mahalın paşası idi.

Nağdəli sakit tərzdə:

- Babam, xoş gəlmisiniz, gözümüz üstə yeriniz var!

Paşa faytondan düşüb ağır yerişlərlə içəri daxıl oldu:

- Ay oğul, mənim gəlnimi mənə göstərin, ölmədim bu günü də gördüm, dedi.

Nağdəli:

- Baba, nə gəlin, sən nə danışırsan, allahım, deyən mən dəli olmuşam. Osman üzünü bu dəfə Güllüzara tutdu:

- Qızım, məni gəlinim Sonanın yanına apar.

Paşanın bir sözü iki ola bilməzdi, kişi həm də sözü təkrar etməyi xoşlamırdı. Güllüzar sakitcə:

- Gəl, baba, deyib, Sonanın yataq otağına qalxdılar.

Sona həmin Sona deyildi. Osmanı görən kimi kişinin əlindən öpdü.

Osman:

- Ay maşallah, bir su pərisini görürəm, deyib, Sona xanımın alnından öpdü.

-Qızım, coxdandı buralarda olmurdum, şəhəri gəzməyə çıxmışdım, yolüstü dedim, sizə bir baş çəkim. Əlindəki iri bağlamani Sona xanıma verərək dilləndi:

- Bu da məndən sənə düyün hədiyyəsi.

- İş bununla bitmir ha, Nağdəli bəy, hazırlaş bir- iki günə kimi sizdə olacağam, nə çətinliyin varca de, çəkinmə, deyib yavaş- yavaş həyətə düşməyə başladı.

Nağdəli:

- Baba, niyə belə tez axı?

-Darıxma, oğul, darıxma, o qədər gəlib gedəcəyəm ki, axırda özünüz əlimdən bezəcəksiniz deyib, Bəkir paşa faytona mindi.

Sona xanım bağlamanı açanda bağlamada bir cüt qızıl bilərzik və bir ədəd üst hissəsi qızıldan hazırlanmış "Müqəddəs Quranı Kərim" kitabını gördü.

Kitabın üst hissəsində bu sözlər həkk olunmuşu: "Qiyamətə qədər qoruyun".

Bilərziklərin hər birinə isə bu sözlər həkk olunmuşdu: Hamza , Hasan.

Artıq Sona xanıma tam məlum oldu ki, bu qoca dərvişin dediyi hədiyyələrdi. Bilərziklər oğlanlarına, Müqəddəs kitab isə qızına çatmalıdı.

Ancaq bu sirri Sona xanım heç kimə açmadı.

Hər iki ailədə toya hazırlıq işləri başlandı. Osman paşanın xüsusi fərmanı ilə Gümrü şəhri başdan - ayağa bayram libasında bəzədildi. Toy yeddi gün davam etməli idi. Toya kim istəsə gələ bilərdi. Belə də oldu. Sevgililər bir- birinə qovuşdu.

Hər kəsin evində allah tala belə xeyir- işlər qismət eləsin.

Bir müddətdən sonra Zeynəb xanım, sonra isə Osman paşa dünyalarını dəyişdilər. Mərd cəsur paşalar- paşası dünyadan köçdü. Gümrü şəhri qırx gün bu kişinin yasını saxladı.

Bu ağır günlərdə Sərdarın imarəti başdan - ayağa qara bəzədilmişdi.

Osmanın ölmü yavaş- yavaş müxənnətlərə ayaq açmağa imkan verdi. Bir tərəfdən də dağlarda qaçaq dəstələri peyda olmağa başladı.

Sərdar paşanın əmri ilə bütün qaçaq dəstələri darmadağın edildi. Bircə "Qanlı Alı" deyilən qaçağı tutmaq mümkün olmadı. Qanlı Alinını ölü və diri gətirən hər bir şəxsə böyük miqdarda pul vəd olunurdu.

Amma Qanlı Alı yenə öz işini görürdü. Yolları kəsib tacirləri talayırdı. Tacırlərin əksəriyyəti Rumlu tacirlər idi.

On il Sərdar paşa ilə Sona xanım xoş, firəvan həyat keçirdilər.

Amma onların uşaqları olmurdu. Sona xanım isə onların iki oğlu və bir qızının olacağını bu vaxta kimi Sərdara deməmişdi.

Bir gün Sərdar səhər namazıı qılan vaxt Sona xanım gördü ki, Sərdar namazı qılıb qurtardıqdan sonra allaha yalvarır:

-Allahım, nə günahlarım varsa, məni bağışla, öz dərgahına günahsız apar, ancaq bu qulunu axirət evinə sonsuz aparma.

Bu vəziyyəti görən Sona xanım boş beşiyin başında ağlaya-ağlaya aldı gürək nə dedi:

Yatmışdım, yuxumda mən səni gördüm,
Sən bülbülsən, bu da güldü, dedilər.
Gəlmişdi üstümə buta verənlər,
Qızım , bəxtin üzə güldü, dedilər.

Cəfan, əziyyətin çoxdu qabaxda,
Sən yolunnan getnən, demə ya baxta.
Qismət Allahdandı, cörək tabaxda,
Dərdin gözdən axan seldi, dedilər.

Vermə bir kimsəyə, pünhanı, sirri,
Yoxla ziyarəti, yada sal Piri.
Hamzaya, Hasana hazırla yeri,
Sona, sənin vədən gəldi, dedilər.

Söz tamama yetdi. Sərdar inciməsin deyə, heç hə olmamış kimi Sona xanım dilləndi:

- Kişi, səbirli ol, verən də o kişidi, alan da o kişidi, əlbət bu yaxınlarda bizim də qapıda bir toy - bayram olar. Bu sözləri eşidən Sərdar paşa dərindən bir ah çəkib heç nə demədi.

Sona xanım aldı dübarə görək nə dedi:

Tanrı qismət verib bir az döz, dayan,
Udduğun kədərdi, qəhərdi, Sərdar.
Fikir ver sözünə, ixtilatına,
Hər sözün sədəfdi, gövhərdi, Sərdar.

Atəşin artdıqca, çıxmasın külün,
Inşallah, açılar o qızıl gülün.
Əlbət çarəsi var hər bir müşkülün,
Ağzın acı dadır, zəhərdi, Sərdar.

Əzəldən qoşadır, ağ ilə qara,
Nə olar, Sonanı salma odlara.
Hicran sinən üstə vurmasın yara,
Gecə adlayıbdı, səhərdi Sərdar.

Söz tamama yetən kimi, Sərdar başladı, nə başladı. Nə dedi, nə söylədi, biz deyək siz qulaq asın:

Mən haqqın quluyam, üstümdə ağam,
Tanrı istəyimi bir gün çin eylər.
Qaranlıq qəlbimdən tamam çəkilər,
Ürək işıq saçar, toy - düyün eylər.

Mən ata olaram, sən də ki, ana,
Can sözü işləyər ilikdən - qana.
Gəl məni incitmə, ay gözəl Sona,
Qara gəlsə silər, mənə gün eylər.

Sərdarın əlindən yapışan sənsən,
Şirin ixtilatla danışan sənsən.
Mənim dərd - sərimə alışan sənsən,
Tanrı xoş günləri birə min eylər.

Söz tamama yetən kimi Sona xanım yüyürüb ərini bərk - bərk qucaqladı.

Bu əhvalatdan xeyli sonra Sona xanım hamilə oldu.

Onların iki əkiz oğlan uşağı dünyaya gəldi. Sona xanım oğlanlarının adını Hamza və Hasan qoydu. Uşaqlar üç yaşına çatanda Sərdar paşa onları şəriətlə müsəlman elətdirdi.

Amma Gümrünün şən - firavan həyatı yavaş – yavaş acılı günlərlə əvəz olunmağa başlayırdı.

Bir yandan qanlı Alının qaçaq dəstələri karvan yollarını bağlayıb tacirləri soyur, bir yandan da yadellilər yavaş – yavaş mahalları talayıb çapırdılar. Sərdar ağanın elə bil bu mahalları idarə eləmək taqəti qalmamışdı. Övladlarının dünyaya gəlməsi ilə dövlət işləri ön plana keçmişdi. Hərdən arvadına deyirdi:

Osmanın oğlu Səlim ağa baş vəzirimdi, hər şeyi ona həvalə etmək fikrim var. Axı mən bir yetim uşaq olmuşam. Məni bu şad günə çatdıran Səlimin babası Bəkir paşaya ölüncə borcluyam. Səlim ağa ilə danışmışam, öz ata yurdum Ağbabada ömrümün qalan günlərini başa vurmaq istəyirəm, amma buna Səlim ağa qətiyyən razı deyil.

- Sona xanım, bu fikir mənim başımdan çıxmır ki, çıxmır.

Vəziyyət detdikcə çətinləşirdi.

Günlərin birində gecə yarısı qan - tər içində yuxudan oyanan Sərdar paşa arvadını yuxudan oyatdı:

- Sona xanım, dur ayağa, mənə bir məsləhət ver. Üç gündü ki, məni gecələr qoymurlar yatam, dilimi çəkib ağzımdan çıxarırlar.

- A kişi, danış görək nə olub axı?

- Ay arvad, mənə üç gündü yatdığım yerdə deyirlər ki, göydən sizlər üçün bəla gəlir, ya indi qəbul edin, ya da kı, sonra, mənim isə dilim - ağzım quruyur, heç nə deyə bilmirəm.

Sona xanım ağıllı və uzaqgörən bir qadın idi.O,gülə -gülə dilləndi:

- A kişi, bəyəm başa düşmürsən ki, bu bir Allahın işidi, verən də, alan da onun özüdür. Göydən zəhrimar da gəlsə biz bunu şərbət bilib qəbul etməliyik. Amma bu bəlanı gərək indi qəbul edək, qocalsaq qorxuram, dözə bilməyək. Kişi əvvəlimiz yaxşı olunca, axırımız yaxşı olsun.

Bu sözləri eşidən Sərdar paşa elə bil qəm dəryasına batdı.

- Yaxşı, arvad, qoy sən deyən olsun. Səhər namazını Gümrüdəki göy məsciddə keçirib, günorta vaxtı şəhəri tərk etməliyik. Həm Ziyzrət dağındaki Ziyarəti, həm də Ağbabada atamın qəbrini bir ziyarət etməliyəm, sonrasına baxarıq. Yolumuz Ağbabayadı.

Səhər-səhər Sərdar paşa faytonçu qıllı Minası yanına çağırtdırdı:

- Minas, faytonu hazırla süb namazından sonra biz Ağbabaya yola düşəcəyik. Bir iki günlük orada işlərim olacaq. Al bu pulları, get iki gün dincəl. Sənin getməyin vacib deyil.

Günorta Gümrüdən yola çıxan Sərdar ağa Ziyarət dağındakı ziyarətgahı ziyarət edib, şər qarışan vaxtı Ağbaba tərəfə hərəkət etməyə başladı.

Bu zaman qarşıdan atışma səsləri eşıdildi. Qabaqlarına bir dəstə ağlaya - ağlaya arvad- uşaq çıxdı.

Səradar:

- A bala, sizə nə olub, niyə ağlaşırsınız?

Bunların içərisindən bir yaşlı kişi dilləndi:

-Ayə, zalım oğlu, hara gedirsən, görmürsən ki, yağılar bütün kəndlərə od vurublar. Bizim qaçaqlarla yağılar arasında möhkəm savaş gedir.

Arvad, uşaq və yaşlılar ağlaşa-ağlaşa gecə qaranlıqda gözdən itdilər. Sərdar faytondan düşüb dərindən bir ah çəkdi.

Hə, Sona xanım, artıq bəla başımın üstünü aldı,- deyıb, sazı sinəsinə basdı.

Görək bu yerdə bu mahalın paşası nə dedi:

Könül, by yerlərə düşdü güzarım,
Bəlaya düşmüşəm haraya varım?

Artıq əldən gedir gözəl diyarım,
Başıma iş gəldi qaçaqaçıynan.

Könül, bu yerlərə həsrətəm necə,
Fəğan eyləyirəm hey gündüz- gecə,
Mahudum bez oldu, məxmərim keçə,
Başıma iş gəldi qaçaqaçıynan.

Könül, bu yerləri arama, bəsdi!
Duz basma, insaf et, yarama, bəsdi!
Yetimsən, səs salıb, zarıma bəsdi!
Başıma iş gəldi qaçaqaçıynan.

Söz tamama yetdi. Atışma səsləri get - gedə yaxınlaşırdı. Birdən yaraqlı-yasaqlı bir atlı peyda oldu. Atlı ağır yaralanmışdı, qanı su kimi axırdı. Atlı gülcə danışmağa başladı.

- Paşam, durma buradan uzaqlaş. Yağı yaxınlaşır. Tez ol, vaxt itirmək olmaz.

- Ay cavan oğlan, sən haradan bilirsən, mən Sərdar paşayam?

- Hə, paşa, on ildi ki, sən məni necə axtarırsansa, mən də səni elə axtarıram. Mənim adamlarım  Gümrüdə sənin faytonçun qıllı Minası izləyirdilər. Şər qarışanda qıllı Minası Öküz dağında yaxaladıq.

Artıq gec idi. Ailən ilə birlikdə Ağbabaya gəlməyini qıllı Minas yağılara ötürmüşdür.

Qıllı Minası cəhənnəmə vasil edib, səni qurtarmağa gəlmişəm, mənlə səninki qalsın sonraya deyib,- atlı huşsuz vəziyyətdə atdan yıxıldı. Tez Sona xanım başındakı kəlağayını açıb, kişinin yaralanan sağ qolunu sarımağa başladı.

Sərdar:

- Ayə, ay bala, üzünü yaxşı görə bilmirəm, de görüm sən kimsən?  Atlı güclə ata sökənərək dilləndi:

- Cəld Arpa çayına tərəf gedin, mənim igidlərimin hamısı yanımdaca qanına qəltan olndu, cəmi beş nəfər qalmışıq, artıq səni qorumağa gücümüz çatmır,  yağı bizdən yüz qat coxdu, çəpik olun.

Sərdar yenə dilləndi:
- Əyə, zalım oğlu, de görüm sən kimsən axı?!
- Paşam, qətlimə fərman verdiyin Qanlı Alı deyilən qaçaq mənəm. Sərdar paşa cəld Qanlı Alının əlindən silahı aldı.
Sərdar:
- Qanlı Alı, indi artıq hər şey mənə məlumdur. Sən elə düz buyurdun, mənimki səninlə qalsın sonraya. Sən yaralanmısan, bu külfəti Arpa çayına kimi sən aparmalısan, mən isə mərd igidlərə köməyə gedirəm. Ancaq onu da unutma ki, mən öz ailəmi sənə əmanət verirəm, qiyam - qiyamatda əmanətimi səndən istiyəcəm. Qanlı Alı coxlu qan itirdiyindən yenidən bihuş vəziyyətidə yerə yıxıldı.
Sərdar qanlı Alını faytonun içərisinə qoyub üstünü öz qalın kürkü ilə örtərək dedi:
- Sona xanım, çərik özünüzü Arpa çayına çatdırın.
Sona:
- Ay kişi bu zülmət qaranlıqda bizi hara qoyub gedirsən?
Sərdar:
- Sona, sən görürsən bu mərd oğullar bizdən ötəri qanlarına qəltan oldular, bəs kişilikdəndimi o oğulları meydanda tək buraxam. Adamları toparlayıb düşmənlərə qarşı vuruşmalıyam. Bu mənim borcumdu.
Sərdar:
- Ax yağı düşmən, məni silahsızmı görüb arxadan vurdunuz deyib, sazı götürüb, aldı görək bu zülmət qaranlıqda nə dedi:

Ağbaba deyəndə dolur gözlərim,
Yenə dilə gəlir qəmli sözlərim,
Yurdu itirirəm tutmur dizlərim,
Tanrı, darda qoyma bu yerdə məni!

Ağbaba deyəndə yada dağ düşür,
Doğma el,doğma yurd,qara-ağ düşür.
Bel dərddən əyilir, saça ağ düşür,
Tanrı, darda qoyma bu yerdə məni!

Ağbaba deyəndə alışır sinəm,
Gərək ki Qəribi üstündə dinəm?
Mənim bu dağlarda dağılır binəm,
Tanrı, darda qoyma bu yerdə məni!

Artıq namərdlərin səsi aydın eşidilirdi..
- Sərdarı öldürməyin, o diri vəziyyətdə bizə lazımdı.

Sərdarın ailəsi gecə qaranlığında gözdən itdi. Sərdar isə yağılara qarşı savaşa girişdi.

Qanli Alının cəmi beş qaçaq igidi qalmışdi. Hər igid bir alaya bəs edirdi. İrəli gələn yağı süvarilərini igidlər sərrast atəşlə yerə sərirdilər.

Səhərin açılmağına az qalırdı. Meydanda bir Sərdar və bir nəfər cavan iğid oğlan qalmışdı. Hər ikisi də döyüşə - döyüşə Ziyarət dağının ətəyindəki qayalığa pənah gətirdilər.

Qayalıqda cavan oğlan qətlə yetrildi. Düşmənlər Sərdarın hər iki ayağını yaraladılar.

Sərdar yaralı vəziyyətdə qayalığın arxasına sürünməyə başladı. Qayalığın arxa tərəfi sərt uçurum idi. Sərdar sərt uçurumdan üzü aşağı diyirlənməyə başladı. Dərənin dibindəki gicitikan kolluqlarının arasına düşdü. Namərdlər qayalığı ələk- vələk etdilər, amma Sərdarı tapa bilməyib geri qayitdılar.

İndi sizə kimdən xəbər verim. Sona xanımdan.

Artıq hava açılmağa başlayırdı. Sona xanım Arpa çayına çatdı. Cəld faytondan yerə düşdü. Qanlı Alı huşsuz vəziyyətdə faytonda uzanıqlı qalmışdı.

Yazın əvvəli idi. Çayın həndəvərində və quzeylərdə qar təzə əriməyə başlayırdı. Sona belə qərara gəldi ki, birinci uşaqları, sonra isə Qanlı Alını çayın o biri tərəfinə keçırsin. Hamza və Hasanı arabadan düşürdü, bir uşaqlara, bir də çaya baxdı. Yaz başı olduğundan Arpa çayı gur axırdı. Odu ki, fikrini dəyişdi və Hasana dedi:

- Bala, sən çayın qırağında gözlə, qorxub eləmə, mən Hamzanı o biri tərəfə keçirib sonra gəlib səni aparacəm.

Sona xanim Hamzanı qucağına alıb özünü çaya vurdu. Suyun tam ortasında birdən Hamza anasına dedi:
- Ana, hələ bir ora bax. Sona cəld geri döndü, nə görsə yaxşıdı. İlahi heç düşmənimə də belə bir müsibəti göstərmə.
Sona xanım gördü ki, körpə Hasanı bir yalquzaq qurd ağzında götürüb qaçır. Bu dəmdə Sonanın qolları boşaldı, Hamza anasının qucağından suya düşdü. Sel də Hamzanı aparıb gözdən itirdi.
Ağlaya-ağlaya kor - peşman geri qayıdan Sona çayın qırağına çatdı. Bu müsibətə dözə bilməyib aldı görək nə dedi:

Mən sənə nə deyim, ey böyük Allah,
Bəlanı bəlanın dalınca verdin.
Kasıba - kusuba cında qıymadın,
Namərdə kürk, papaq, qalınça verdin.

Böyüksən, qadirsən, pənahsan bizə,
Bəs niyə mərdləri gətirdin dizə?
Ellərim dağılıb, kim buna dözə,
Niyə boynumuzu qılınca verdin?

Tufağım dağıldı, mən təkcə qaldım,
İndi sail olub betər dərd aldım.
Əvvəl gül kimiydim, soldum, saraldım,
Bu dərdi Sonaya ölüncə verdin.

Söz tamama yetdi. Sona xanım güclə özünü ələ alıb faytona yaxınlaşdı. Gördü ki lələ köçüb yurdu qalıb. Qanlı Alı da yoxa çıxıb.
Bu dəmdə Sona xanım təkrar aldı görək nə dedi:

Hayana baxıram bir kimsəm yoxdu,
Qaçma mərd qardaşım, ər meydanıdı.
Bizi yaradanın kərəmi çoxdu,
Qaçma mərd qardaşım, ər meydanıdı.

Aranım ooy, dağım ooy?
Bostanım ooy, bağım ooy?
Yadlara qismət olan,
Daşım ooy, torpağım ooy?

Hamzamı əlimdən bu sellər aldı,
Körpə Hasanımı xırxız qurd çaldı,
Gəlmədi Sərdarım, bəs harda qaldı?
Qaçma mərd qardaşım, ər meydanıdı.

Eşmə çox,
Çay yanında çeşmə çox.
Qəm dağları var məndə,
Təbib, yaram eşmə çox.

Zalım fələk atdı məni zindana,
Könül sarayımı etdi virana.
İndi əlim çatmır, dağa, arana,
Qaçma mərd qardaşım, ər meydanıdı.

Yaram azdı,
Kim deyər yaram azdı.
Fələkdən şəfa dilədim,
Qorxudan yaram azdı.

Sən demə qurd Hasanı aparan zaman Qanlı Alı bu vəziyyəti görübmüş. Yaraqsız, yasaqsız qalan Qanlı Alı kolluqlar içində qurdun dalınca çayın qırağına tərəf sürünməyə başladı , artıq iş - işdən keçdiyini görüb, Sonanın səsinə tərəf gəlməyə başladı.

Qanlı Alı:

- Ay xanım, ağlama, Allah kərimdi, mən Hasanı qurdun əlindən ala bilmədim, bəs Hamza hanı, Sərdar gəlib çıxmadımı!

Sona xanım:

- Ay evi yıxılmış, Sərdar gəlmədi, üstəlik də uşağın birini qurd, birini də sel apardı.

Sona xanım ah - şüvən eləməyə başladı. Qanlı Alı o qədər qan itirmişdi ki, rəngi ağappaq olmuşdu.

Qanlı Alı:

- Ağlama ay bacı, Allah kərimdi.

Sona xanım isə dilləndi:

- Artıq mənim bir kimsəm qalmadı. Gedirəm özümü çaya atıb öldürəm.

Bu sözləri eşidən qanlı Alı Sonanın qollarından bərk-bərk yapışdı.

-Səni heç yerə buraxa bilmərəm. Sən mənim qiyam-qiyamata kimi əmanətimsən. O vaxt əlimdən çıxa bilərsən ki, mənim ruhum bədənimdən çıxmış olsun.

Bu zaman Osmanın oğlu Səlim ağa qoç igidlər ilə birlikdə faytonu dövrəyə aldılar. Ancaq nə faydası. Səlim ağa Sona xanıma bildirdi ki, biz bu dəqiqə uşaqları da, Sərdarı da tapıb gətirəcəyik, sən geri, Gümrüyə qayıt.

Səlim ağa:

- Mən gərək yağı düşmənlərə o qədər qılınc çəkəm ki, qan atın üzəngisinə dəysin. Ancaq Sona bununla razılaşmadı. Mənim uşaqlarım tapılmayınca bu çayın başından heç yerə gedən deyiləm. Sonanı birtəhər razı salıb Arpa çayın qırağındaki Qızıl Çaxçax köyünə gətirdilər.

Həmin gün yağılarla qızğın döyüşlərdə Səlim ağa öldürüldü. Onun cənazəsini Qarsa apardılar. Qızıl Çaxçax köyündə Sona xanıma məlum oldu ki, onun Nağdəli bəydən başqa bir kimsəsi qalmayıb.

Deyilənə görə, bu faciəli hadisədən bir həftə keçməmiş Gümrü şəhrində möhkəm zəlzələ oldu. Gümrü şəhri yerlə yeksan oldu. Bu azmış kimi, düşmən qoşunları Gümrü şəhrini tapdaq altında qoydular.

Sonanın aqibəti isə Qızıl Çaxçax kəndində ah-vay ilə keçirdi. Bir yandan da Gümrünün dağılması demək olar ki, onun tamam qol-qanadını sındırmışdı. Bütün dostları, qohumları, tanışlarının hamısı zəlzələdə ölmüşdü. Gümrü şəhəri yerlə yeksan olmuşdu.

Aradan günlər, aylar keçdi nə Sərdardan, nə də ki, uşaqlardan bir xəbər çıxmadı.

İndi görək Sərdar paşanın başına nələr gəldi.

Bu işlərdən xəbərsiz qalan Sərdar qayadan yıxıldıqdan sonra gicitikan kolluqlarının arasında huşsuz vəziyyətdə qalmışdı. Səlimin ordusu ilə düşmən qoşunları arasında qanlı döyüşlər olmuşdu. Hər iki tətəfdən ölən və yaralananların sayı - hesabı yox idi.

Bir həftəyə qədər kolluqda huşsuz vəziyyətində qalan Sərdarı Canbaz yaylasına gedən çobanlar tapdı, və özləri ilə Sərdarı Cambaz yaylasına apardılar. Amma cobanlar bu kişinin Gümrünün paşası olmasını bilmədilər.

Altı aya qədər Sərdarın yarası və sınıxları tam sağaldı.

Canbaz yaylasında Sərdara məlum oldu ki, Gümrü şəhəri zəlzələ nəticəsində yerlə yeksan olub və bu azmış kimi yağı qoşunları bu fürsətdən istifadə edib, Gümrü və ətraf mahalları zəbt ediblər. Gümrünün paşası isə ailəsi ilə birlikdə Ağbaba mahalında yağılar tərəfindən qətlə yetirilib.

Beləliklə, Sərdar çobanlarla sağollaşıb, düşdü yolların ağına. İndi nə qədər yol getdi, bunun burasını bir Allah bilir!

Bəli, bu gəlhagəl ilə gəib şıxdı Mosul şəhərinə.

Vaxtı ilə Gümrünün paşası olan, indi isə sail olub səhraları gəzən Sərdar aldı görək bu yerdə nə dedi:

El içində haqqı zay olan canım,
Fələyin cəbrinə gəl sən döz indi.
Məcnuna, Kərəmə tay olan canım,
Səhralarda məlul - məlul gəz indi.

Bilmirəm mən hara, buralar hara?
Bu fələk zalımdı, mənsə biçara.
Bilirəm, dərdimə bulunmaz çara.
Qan ağlayır dərə, təpə, düz indi.

Anam yoxdu, oğul deyib ağlasın,
Atam yoxdu, yaralarım bağlasın,
Yarım yoxdu, sinə başı dağlasın,
Yetim Sərdar, öz qəbrini qaz indi.

Bütün camaat Mosulun mərkəzi meydanına yığışmışdı. Üst - başı pis vəziyyətdə olan Sərdar camaata qarışdı.

Sərdar: - Ay qardaşlar, burada nə baş verib ki, camaat meydana yığılıb?

Məlum olur ki, bu mahalın sərdarı ölüb, bütün mahal bura sərdar seçməyə yığılıb.

Bu dəmdə üc ağsaqqal kişi Sərdarın başının üstünü aldı. Ağsaqqallardan biri dilləndi:

- Bala üç gündü ki, sənin yolunu gözləməkdən gözümüzün kökü saraldı, bizə ərş - əladan buyruq gəlib ki, bu mahalın sərdarı sən olmalısan.

Sərdar:

- Siz nə danışırsınız? Mən fəqirin, yoxsulun biriyəm, mən hara, sərdarlıq hara, siz kimlərnənsə məni səhv salırsınız.

Sərdar belə danışanda ağsaqqallar bir - birinin üzünə baxdılar, buradan xeyli aralaşıb bir - birinə qaş - göz ilə nə isə qandırdılar.

Amma həmin üç nəfər yenə Sərdara tərəf gəldilər.

Yenə həmin ağsaqqal nurani kişi dilləndi:

- İgid, kasıblıq və fəqirlik insanlar üçün eyib deyil, biz axtardığımız adamın bütün nişanələri sənə uyğun gəlir və həmin adamın sağ əlinin içində aypara şəkildə xalı var, bir sağ əlini aç bizə göstər. Sərdar əlini açanda öz ğözlərinə inana bilmədi. O öz əlinin içində aypara şəkilli xal gördü və qəhərdən udğunmağa başladı. Çünki əvvəllər Sərdarın əlində belə bir xal olmayıb.

Hər üç nurani ağsaqqal Sərdarın qolundan tutaraq, onu bir qədər zor – xoşla meydanın ortasına aparıb carçıya car çəkdirdilər.

Ay camaat, bu gündən Mosulun yeni sərdarı seçildi. Yeni sərdar bu meydanda duran şəxsdir.

Bu sözlər Sərdara yuxu kimi gəldi, amma bu bir həqiqət idi.

Hə, əzizlərim, görək indi Sərdarın övladları, Hamza və Hasanın aqibəti necə oldu?

Səhər tezdən qurd Hasanı götürüb qaçan zaman arandan dağa gələn çobanlara rast oldu. Çobanlar uşağı yalquzaq qurdun ağzından alıb, özləri ilə birlikdə Ota yaylasına apardılar.

Hamzanı isə Arpa çayı gətirib Şərilə qədər çıxartdı. Taxıl dəyirmanını işlədən Qasım kişi Hamzanı Arpa çayında bir parça kötüyün üstündə tapdı. Qasım yaşlı bir sonsuz kişi idi. Ona görə də Hamzanı Allah göndərib, deyib onu öz oğlu kimi böyütməyə başladı.

Sona xanımın başına görünməmiş müsibətlər gəldi.

Sən demə Sona xanım Sərdar paşadan hamilə imiş. Sona xanım Qızıl Çaxçax kəndində bir qız uşağı dünyaya gətirdi və adını Leyla qoydular.

Artıq bir il tamam oldu, nə uşaqlardan, nə də ki Sərdardan bir xəbər çıxmadı. Bir yandan da qohum- əqrabası, dostları, tanışları, onları tanıyanlar və tanımayanlar Gümrü zəlzələsində həyatdan köçmüşdülər. Gümrü şəhri tamam yerlə yeksan olmuşdu.

Hər yerdən əli üzülən Sona xanım qanlı Alının təhkidi ilə İstanbulun yaxınlığındakı Dəyirman köyünə gəlib çıxdı.

Əslən Dəyirman köyündən olan qanlı Alı, Sona xanım və onun bir yaşlı qizi Leylanı öz doğma evinə gətirdi. Özünün və Sona xanımın başına gələn bütün bu müsibətləri arvadı Nazdı xanıma və yaxınlarına danışdı..

Beləliklə, Sona xanım bu mahalda namus və qeyrətlə, "balalarım" deyə - deyə, qəm – kədər içində yaşamağa başladı.

Artiq Mosul şəhərində Sərdar dövlət işlərini mükəmməl bildiyindən ədalətli qanunlar çıxartdı və kim yanına gəlirdisə, ondan razı qayıdırdı. Bu münvalnan Sərdar burada ədalətli bir sərdar oldu.

Lakin aradan aylar, illər keçməsinə baxmayaraq Sərdarın üzü gülmürdü. Beli əyilib, başı dağların qarına dönmüşdü.

Hər yerdə dilinin əzbəri Gümrü şəhəri, Sona xanım və övladları idi.

Bu işlərin belə davam etdiyini görən baş vəzir Sərdarın hüzüruna gəldi və ədəb - ərkanla salam verərək Sərdara bildirdi ki, artıq bu hal belə davam edə bilməz.

Baş vəzir:

- Paşam sağ olsun, siz gündən-günə saralıb solursunuz. Bir qadın nədir ki, ondan ötəri dəli, divanə olmusunuz! Bizim Müqəddəs Kitabda yazılıb ki, hər bir müsəlman, istər qadın olsun, istər kişi, şəriətlə dul qalmamalıdı. Nə coxdu bu mahalda qız, gəlin. Paşam, gəlin daşı ətəyinizdən tökün, bu işə bir xeyir-dua verin.

Sərdar qəmli - qəmli baş vəzirə baxdı və başını bulayaraq əl atdı telli saza.

Görək bu yerdə Böyük Mosul mahalının paşası Sərdar baş vəzirə nə cavab verdi:

İçdim eşqin badəsini,
Eşq məni boyadı qana!
Açdım könül düyməsini,
Eşq məni boyadı qana!

Mən yürüdüm yavaş - yavaş
Eşq mənimlə tutdu savaş.
Dindirməyin məni, qardaş,
Eşq məni boyadı qana!

Şamu – səhər yalan oldu,
Əsam döndü ilan oldu,
Könül evim talan oldu,
Eşq məni boyadı qana!

Sən Çıldırdan səstə məni,
Ağbabadan istə məni,
Bir gözəlin üstə məni,
Eşq məni boyadı qana!

Dil xəstə, könül şikəstə,
Göz yolda,qulağım səstə,
Yarı canda, son nəfəstə,
Eşq məni boyadı qana!



Yağmur yağır narın - narın,
Mən ağlaram zarın - zarın,
Qalmayıb halı Sərdarın,
Eşq məni boyadı qana!

Söz tamama yetər- yetməz baş vəzir başladı nə başladı:

- Paşam, sağ olsun, mən qoşuna göstəriş vermişəm, qoşun döyüşə tam hazırdi. Günü səhərdən mənim başçılığım ilə Gümrü üzərinə hücuma keçirik.

Bu sözləri eşidən Sərdar yerindən qızıl quş təki sıçrayıb üzünü baş vəzirə tutaraq dilləndi:

- Cox sağ ol, baş vəzir, məni sayıb gəlmisən, gözüm üstə yerin var. Amma onu unutma ki, mənim bələyim doyüş meydanlarında qana boyanıb. Mən Mosul xalqı üçün hələ heç nə edə bilməmişəm. Birləşmiş yağı qoşunları bizdən qatbaqat çoxdu. Biz hələ savaşa tam hazır deyilik. Mən gənc aslanlarımı, igid ovladlarımı qirğına verə bilmərəm, hər şeyin vaxtı, vədəsi var, vəzir,tələsmə, Mövlamın səbri böyükdü, səbirli ol vəzir, Allah kərimdi.

Bu sözləri eşidən baş vəzir Sərdardan üzr istəyib paşanın sarayını tərk etdi.

Aradan aylar illər keçdi. Nə Sərdardan, nə dəki uşaqlardan bir xəbər çıxmadı.

Artıq Sona xanımın zərif telləri ağappaq ağarmışdı. Sona xanım əvvəlki Sona xanım deyildi.

Leyla on altı yaşın içidə idi. Leyla o qədər gözəl idi ki, yemə-içmə, dur bircə bu qıza tamaşa eylə.

Leylanın gözəlliyi bir çox cavan oğlanların ağlını başından almışdı. Elçilər qanlı Alının qapısından əl çəkmirdilər, ancaq gələnlərin hamısı əli boş qayıdırdı.

Bu mahalın qoçusu Yahya adlı bir cavan oğlan da Leyla xanıma aşiq olmuşdu. Ancaq Leyla bu qoçuya da "xeyr" cavabı vermişdi.

Leylanın axrıncı cavabı Yahyaya təsir etdi. Odur ki, qoçu Sona xanımı hədələr ilə qorxutmağa başladı.

Yahya:

- Sona, əgər qızı mənə verməsəniz, onu özümlə bərabər dağlara götürüb qaçacam.

Bu işlərdən xəbər tutan Qanlı Alı dəfələrlə Yahyaya xəbardarlıq edib bildirmişdi ki, əgər Leylanın başından bir tük əksik olsa, ozünü ölmüş bil. Ancaq Yahya yenə də Leylandan əl çəkmirdi.

Hətta günlərin birində Yahya qoçunun dəstəsi qanlı Alının qabağını kəsib onu qorxutmaq üçün üstünə silah çəkdilər. Qanlı Alı da kı, Qanlı Alıdı. Onun adı gələndə mənəm- mənəm deyən qoçular sıçan deşiyini satın alırlar. Qanlı Alı məqribdən - məşriqə qədər ad çıxarmışdı, bu mahalda onu tanimayan yoxuydu.

Dəyirman köyündə qanlı Alı ilə Yahyanın qoçuları arasında möhkəm dava düşdü. Qanlı Alı silaha əl atan kimi qoçuların dördünü yerə sərdi. Güllə qoçuların ayağından dəymişdi.

Qanlı Alı silahın lüləsini Yahyanın ağzına soxaraq onu da bu dəqiqə oldürəcəyini deyib gözləri qızarmış vəziyyətdə qışqırırdı.

Sona xanım güclə qoçu Yahyanı qanlı Alının əlindən aldı. Yahya ölümdən qurtardı.

Hər yerdən əli boşa çıxan Yahya axırda molla Şabanın yanına gəldi və ona böyük miqdarda pul verərək dedi;

- Molla Şaban, necə edirsən et, Leylanı yoldan çıxart, qoy mənə arvad olsun.

Günlərin birində Leyla bulaq başında molla Şaban ilə qarşılaşdı. Leylanın xəbəri olmadan molla Şaban Leylanın başından bir tük kəsdi. Bu vəziyyəti görən qanlı Alının qızı Cahan xanım bu hadisəni qanlı Alıya danışdı. Qanlı Alı qızışaraq sılahını götürüb Molla Şabanı öldürəcəyini bildirdi.

Sona xanım qanlı Alının qabağını kəsib, ona yalvararaq dedi:

- Alı qardaş, bir də silaha əl atıb qan töksən, mən bu mahaldan baş götürüb gedəcəm. Səni and verirəm bu əziz "Qurana", bir daha əlinə silah alma, mənim özüm molla Şabanın cavabını verəcəm.

Elə həmin gün Sona xanım molla Şabanın evinə gəldi. Sona xanım molla Şabana bildirdi ki, bu şeytan əməlindən əl çəksin.

Bu sözləri eşıdən molla Şaban əsəbi vəziyyətdə Sona xanıma dedi:

- Qarı, necə gəlibsənsə, eləcə də buradan rədd ol, bir də gözüm səni görməsin.

Bu sözləri eşidən Sona xanım dözə bilməyərək molla Şabana qarğış eylədi. Əzizlərim bizdən demək, sizdən eşıtmək.
Aldı görək Sona xanım molla Şabana nə dedi:

Şaban sənə qarğayıram,
Dərdin-sərin bəlan olsun.
Xudam səni zəlil etsin,
Can sağlığın yalan olsun.

Sürünəsən, əyiləsən,
Dərd əliylə oyulasan,
Soğan kimi soyulasan,
Haqqdan sənə olan olsun.

Özün iblis, sözün saxta,
Çıxmayasan heç vaxt taxta.
Ibadət eyləsən çox da,
Nəsibin bir palan olsun.

Sona, ümman ləpələnsin,
Kor gözünə kül ələnsin,
Qanın çölə səpələnsin,
Könül evin talan olsun.

Bu sözləri eşidən molla Şaban bütün gecəni yata bilmədi.

Molla Şaban səhər o başdan Qanlı Alının evınə gəldi və tutduğu əməlinə görə Sona xanımdan üzr istədi.

Beləliklə, Qanlı Alı müqəddəs Qurana əl basıb bir daha əlinə silah götürmədi.

Hə, əzizlərim beləliklə, Sərdar ağa Mosul mahalında, xanımı Sona xanım və qızı Leyla İstambulun Dəyirman köyündə, oğlu Hamza Şərildə, o birisi oğlu Hasan Ota yaylasında ağrılı - acılı günlərini yaşamağa başladılar.

Gümrü şəhri tamamilə yağıların əlində idi.

Sərdarın göstərişı ilə hər il Mosuldan Gümrü və onun vilayətlərinə Sona xanımı axtarmaq üçün adamlar göndərilirdi. Lakin gələnlərin hamısı Sona xanımım ölüm xəbərini gətimişdi. Aradan on beş il keçməsinə baxmayaraq, Sərdarın gözü yollarda, qulağı səsdə qalmışdı. Yenə də qasıd Sonanın ölüm xəbərini gətirmişdi.
Sərdar qəmli - qəmli qasidə baxaraq aldı görək nə dedi:

Ortalığa dağlar düşdü, söz oldu,
Yaralarım yaşıl, yaşıl göz oldu,
Sinəm üstü kömür oldu, köz oldu,
Axtardılar, tapmadılar Sonamı.

Eşqimizə əhdi - peyman bağladıq,
Biz bir güldük, bir sevinib ağladıq.
Namə yazıb hər yana yolladıq,
Axtardılar, tapmadılar Sonamı.

Nazlı yarım gedər oldu gəlmədi,
Onun yerin fələklər də bilmədi,
Mənim üzüm qürbət eldə gülmədi,
Axtardılar, tapmadılar Sonamı.

İtirdim Gümrünü, ümmana daldım,
Gələnnən, gedənnən xəbərin aldım,
Məcnun olub səhraları dolandım,
Axtardılar, tapmadılar Sonanı.

Duman - çiskin can evimi bürüdü,
Cavan canım qürbət eldə çürüdü.
Mənim yarım gözəllərin biridi.
Axtardılar, tapmadılar Sonamı.

Bu dünyada bezar oldum özümdən,
Ah etdikcə, sel töküldü gözümdən.
Iki əlim qalxmaz oldu dizimdən,
Axtardılar, tapmadılar Sonamı.

Atım yanaşmayır minik daşına,
Əlim yetişməyir yəhər qaşına.
Gəlib çatdım mən də altmış yaşına,
Axtardılar, tapmadılar Sonamı.

Aradan iyrmi il keçmişdi.

Dəmirçilər köyündə belə bir səs – səda yayıldı ki, Mosul hakimi yüz minlik böyük bir qoçunla hücuma keçıb yağıları torpaqlardan qovaraq Gümrü şəhrini azad edib.

Paşanın sərkərdəsi hər tərəfə sərdarın fərmanlarını göndərmişdir.

Fərmanda yazılmışdı.

Gümrü şəhərinin əhalisinin nəzərinə,

Yağılar tərəfindən tutulmuş şəhər və kəndlər azad olumuşdur. Kim istəyirsə, öz doğma el – obasına qayıda bilər. Hər bir kəsə Mosul paşası hər cəhətdən köməkliklər göstərəcək.

Carçıların səsini eşidən Sona xanım qanlı Alının əl-ayağına düşüb yalvarmağa başladı.

- Qardaş mən səndən və sənin ailəndən cox razıyam, zəhmətinizi bizə halal edin, ancaq mənim Gümrüsüz hər günüm bir ilə bərabərdi. Bəyaz gecələrim zülmətə dönüb. Gözlərimi yuman kimi ərim və oğlanlarım gözlərimin qabağına gəlir. Onlarin ya sağ, ya da ölüm xəbərini almalıyam. Artıq mənim ölümlü günüm gəlib catıb. İcazə versəydin, gedib bir daha Gümrünü görüb sonra ölərdim.

Qanlı Alı bir az fikrə getdi və başını bulaya-bulaya dedi:

- Ax zamana, zamana, mərdi nə pis yerdə cəkirsən divana. Mən elə bilirdim ki, bir daha əlimə silah almayacağam, sən demə talehim belə imiş. Yaxşı, Sona xanım, mən də sizinlə gedirəm.

Alının arvadı Nazdı xanım dözə bilməyib sözə başladı:

- Ay kişi, sən hara, biz də ora, onsuz da güclə dolanırıq, mən cəhənnəm, bəs bu yetişmiş qizları kimə əmanət verirsən, heç olmasa, barı bu tifillərə yazığın gəlsin. Axı deyirdiniz, Sərdar Gümrünün paşasıdı, bəlkə kişi gəlib çıxa, biz də bir ağ günə çıxaq!

Qanlı Alı gülə - gülə dilləndi:

- Ay ağ günə çıxdıq ha! Mən Sərdar paşayla düşmənəm, o mənim ölmümə fərman vermişdi. Əgər ölməsəm, mənim onunla düşmənçəliyim qalıb sonraya.

Nazdı yenə dedi:

- Ay kişi, bəs sən deyirdin Sona mənə qiyam - qiyamata kimi əmanətdi, ona baçı gözü ilə baxırdın, ağzındakı yeməyini çıxarıb onlara verirdin, mən sənin danışdığından artıq heç nə başa düşə bilmirəm.

Qanlı Alı:

- Ay Nazdı, burda başa düşməməyə nə var ki? Bu namus və qeyrət məsələsidi, bir də ki, sən mənim oradakı əməllərimi bilməsən daha yaxşıdı.

Sona xanım Nazdının sözünə müdaxilə elədi:

- Ay bacı, Alı qardaşı sən düz başa düşmədin. Gümrüdə Alı o qədər yaxşı əməllər qoyub gəlib ki, onu bir allah, bir mənim ərim, bir də mən bilirəm. Mən düz iyirmi ildi ki, Alı qardaşın çörəyini yeyirəm, olmazmı ki, siz də iki gün Gümrüdə bizim çörəyi yeyəsiniz.

Bu zaman qanlı Alı ciddi bir şəkildə dilləndi: İş ki, belə oldu, onda hamınız şey- süylərinizi yiğın, günü səhərdən Gümrüyə yola düşürük.

Alı öz ailəsi, iki qızı, Sona və Leylanı götürüb Gümrüyə getməkdə olsun, görək Sərdar paşa Mosul mahalında nə işlərlə məşğul olurdu. Artıq Sərdar buranın sevimli paşasına çevrilmişdi. Elə bil həqiqətən də, bolluq - bərəkət Sərdarın ayağında imiş. Camaat o qədər şən, firavən dolanırdı ki, gəl görəsən.

Mosulda Sərdar bir yetim dul Lalə adlı qızı öz qızı kimi himayəsinə götürmüşdü. Lalənin isə iki yetim uşağı var idi. Yetimlərin birinin adı Mustafa, qızın adı isə Ayişə idi.

Aradan iyrmi ildən də çox keçmişdi. Sərdarın başı ağ ağappaq dağların qarına dönmüşdü.

Ayişə vəzirin oğluna ərə getmişdi. İyirmi beş yaşlı gənc Mustafa isə Sərdarın qoşununun baş sərkərdəsi idi.

Sərdar paşanın əmrinə əsasən Mustafa yüz minlik bir ordu ilə Mosuldan çıxıb Gümrüdə dayanmışdı.

Mustafanın işi Gümrü şəhrini abad etməkdən ibarət idi.

Artıq Hamza iyirmi beş yaşında bir cavan oğlan idi. Ata əvəzi olan dəyirmançı Qasım dünyasını dəyişmişdi. Un dəyirmanını Hamza işlədirdi. Onu böyüdüb boya- başa çatdıran Qasımın sözləri hər dəfə qulağında cingildəyirdi.

Qasım kişi:

- Bala, bilmək olmaz bu dünyanın işini, mən qəflətən ölsəm, bu qızıl bilərzik səninkidi. Səni çaydan tapanda o qolunda idi. Artıq mənim ölümlü vaxtım gəlib çıxıb, bir az boya – başa çatdıqdan sonra öz doğmalarını axtarıb taparsan.

Artıq Hamza Qasım kişinin son vəsiyyətini yerinə yetirməli idi.

Hamza öz ata əvəzi Qasımın qəbrini ziyarət etdikdən sonra, Arpa çayı boyunca hərəkət etməyə başladı. Əlı şəhri (Ani) yaxınlığında bir böyük qoşuna rast gəldi. Hamzaya məlum oldu ki bu qoşun torpaqları yağılardan təmizləyə - təmizləyə Gümrü şəhrinə gedir. Kimsəsiz Hamza yaraq- yasaq geyinib orduya qarışdı. Döyüşlərdə böyük şücayət göstərdi. Sərkərdə Mustafanın fərmanı ilə yüzbaşı vəzifəsinə qalxdı.

Hasan isə yaylaqlarda o dağ sənin, bu dağ mənim deyib qoyun - quzu otarırdı. Özü də çobanlar arasında həddindən artıq dəcəl böyümüşdü. Sözə baxmayanda cobanlar onu möhkəm döyürdülər. Hələ bəziləri də deyirdi, gərək qoyaydıq bu yetim köpək oğlunu qurd parçayayıb yeyəydi, hara göndəririksə oranı yarıtmır, dəfələrlə qoyun sürülərimizi qurda- quşa yem eləyib.

Artıq Hasan dağlarda qoyun-quzu otarmaqdan cana- boğaza yığılmışdı. Cobanların əlindən baş götürüb qaçdı. Dərələr dağlar aşır, gəlib Qarsın düzündə qardaşı Hamza kimi könüllü olaraq Mustafanın qoşununa qoşuldu.

Qanlı Alı isə artıq Gümrüdə idi. Bir tərəfdən zəlzələ, bir tərəfdən də yağılar Gümrünü xarabaya çevirmişdilər.

Mustafanın qoşun dəstələri burada döyüşləri dayandırıb abadlıq işlərinə başlamışdı.

Sona xanım da artıq Gümrü şəhərində idi. Şəhəri gəzib, dolandıqdan sonra oz evinin xarabalığını tapdı.

Xarabalıqda elə hündür qanqallar bitmişdi ki adam içərisinə girsə görünməz olardı.

Bu bəlaya dözə bilməyən Sona xanım aldı görək nə dedi.

Ağlaya - ağlaya dönmüşəm quşa,
Baxıram torpağa, baxıram daşa,
Mən həsrət qalmışam qohum - qardaşa,
Elimi, günümü itirən mənəm.

Ağlaya - ağlaya ağlar qalmışam,
Dərdə boyun əyib meyil salmışam,
Vaxtım vədəm keçib çox qocalmışam,
Elimi, günümü itirən mənəm.

Ağlaya - ağlaya göz düşdü nurdan,
Dərdimin dərmanı tapılar hardan,
Tək Tanrı qurtarar, məni bu dardan,
Elimi, günümü itirən mənəm.

Əlləri hər yerdən üzülən Sona xanım axırda öz doğulduğu evi, yəni Nağdəlinin bəyi evinin xarabalığını tapdı.

Bağı kol – kos basmışdı. Bağın içindəki qonaq evi isə yarıuçuq vəziyyətidə idi.

Qanli Alı tez evə əl gəzdirdi. Qızlar isə bağı kol-kosdan təmizlədilər.

Gümrüdən qaçıb canını qurtaranlar yavaş-yavaş şəhərə axışmağa başlamışdılar.

Geri qayıdanların heç biri bilmirdi ki, burada yaşayan bu qadın vaxtı ilə Gümrü şəhrinin paşası olan Sərdarın xanımı Sona xanımdı.

Sona xanım həmin Sona deyildi. Zərif telləri ağappaq ağarmışdı, incə beli bükülmüşdü.

Günlərin birində sərkərdə Mustafanın yolu bu evin yanından düşdü. Mustafanın gözlərinə eyvanda oturan bir su pərisi sataşdı. Bu Leyla xanım idi. Leyla o qədər gözəl idi ki, yemə, içmə, dur bunun büllur camalına tamaşa eylə.

Mustafa tez atdan düşüb dilləndi:

- Ay gözəllər sultanı, mələklər şahı, mən bir fincan su verə bilərsənmi?

Leyla əlində bir fincan suyu Mustafaya uzadaraq dilləndi:- Mən ömrümdə birinci dəfədi ki, belə xoş sözlər eşidirəm.

Mustafa ilk baxışdan Leylaya aşiq oldu.

Artıq Mustafa səhər - axşam yolunu buradan salırdı, ancaq Leyla bu eşqə hər vəchlə razı olmurdu ki olmurdu, hələ üstəlik də Mustafanın əlini Bəkir paşanın Sona xanıma verdiyi qızıldan olan müqəddəs Quranı Kərimə basdı: Gümrü nə vaxt abad olsa, mən də o vaxt sənə arvad olaram, "dedi".

Mustafa qoşun sərkərdəliyini unudub bir Məcnuna cevrildi. Bu xəbər Mosulda Sərdar paşaya çatdı. Sərdar qasidlə namə göndərib Mustafanı təcili Mosula çağırtdırdı.

Mustafa paşanın əmri ilə Mosula gəldi, amma yatağından durub Sərdarın hüzüruna getmədi ki, getmədi. Bu dəmdə Lalə xanım Sərdara bildirdi ki, baba, bilmirəm, oğluma nə olub, iki gündü heç birimizi yanına buraxmır.

Elə bil Sərdarın başına qaynar su tökdülər.

Sərdar:

- Bu dəqiqə mən ona yatmağı göstərərəm deyib, Mustafanın otağına daxil oldu.

Sərdar Mustafaya xoşdəldin eyləyib ədəb - ərkanla salam verdi.

- Bala, gəldiyini desən ki, bir biz də bilək, axı gözümüz yollarda qalıb. Mustafa anasının və Sərdarın əlindən öpüb sakit bir tərzdə dilləndi:

- Bağışlayın, baba, Gümrüdə yaralanmışam, ona görə yerimdən dura bilmədim.

Lalə əl atdı ki, Mustafanın köynəyidəki düymələri açsin, amma Mustafa dilləndi:

- Ana, sən əziyyət çəkmə, özüm açacam, deyib zalım oğlu başladı nə başladı.

Açma könül düyməsini,
Öz əlimlə vurulmuşam.

deyən kimi Lalədən bir şüvən çıxdı ki, gəl görəsən.

Lala:

- Ay oğul, namərd gülləsi harandan dəyib, oy, Allahım bu nə işiydi, bizim başımıza gəldi? Ay baba, oğluma bir kömək elə, qoyma ölsün.

Sərdar bu işlərdən halı olduğu üçün gülə- gülə dilləndi:

- Ay qızım, bir sakit ol, buna başqa güllə dəyib, qoy dərdini söyləsin, biz də bilək. Hə, bala qulağım səndədi, dərdini bir açıq söylə.

Mustafa sazı kökləyib aldı görək nə dedi:

Açma könül düyməsini,
Öz əlimlə vurulmuşam.
İçib eşqin badəsini,
Qızıl gülə vurulmuşam.

Gümrü bir gözəl diyardı,
Dağlarının başı qardı.
Eşq atəşi bağrım yardı,
Qara telə vurulmuşam.

Gümüş kəmər belindədi,
Eşq kitabı əlindədi,
Haq kəlməsi dilindədi,
Tuti dilə vurulmuşam.

Gedin deyin o Leylana,
Yastığım döndüb ilana.

Nə aqiləm nə divana,
Bir gözələ vurulmuşam.

Söz tamama yetər - yetməz Lalə dedi:

- Zalım oğlu, məni də babanı da qorxutdun. Daha denən ki, bir erməni və ya rum qızına vurulmuşam.

Mustafa:

- Ay ana, o qız rum qızı deyil, əsil türk qızıdı, adı Leyladı, əlində qızıldan düzəldilmiş "Müqəddəs Quranı Kərim" var.

Sərdar dilləndi:

- Ay bala, mənə hər şey məlumdu, bircə o müqəddəs kitab məlum deyil axı, qızıldan müqəddəs kitab olmaz.

- Ay baba, öz gözlərimlə görmüşəm. Hətta kitabın üzərində altunla həkk olumuş sözləri özüm öz gözlərimlə oxumuşam. Onu Leylan göz bəbəyi kimi qoruyur, deyir ki, atamın bizlərə qalan yeganə yadigarıdı. Hətta bu günə kimi atasi və anası barədə mənə heç nə deməyib, bircə şərti var ki, Gümrü şəhri nə vaxt abad olsa, mən də sənə o vaxt arvad olacam.

Sərdarın dili topuq vura - vura dilləndi; -Bala, ağrın alım, o müqəddəs kitabın üzərinə nə yazılmışdı, deyə bilərsənmi?

Baba, necə varsa, kəlmə - kəlmə deyirəm.

"Qiyamətə Qədər qoruyun"

Bu sözləri eşıdən Sərdar tir - tap yerə yıxıldı. Şah divanında hamı bir, birinə dəydi. Hər şey yaddan çıxdı, cammat düşdü Sərdarın üstünə. Hannan – hana Sərdar özünə gəldi. Gözlərindən yaş axa-axa dedi:

- Bala, ölmədim, bu günü də gördüm, şad xəbərdən başım hərlənib yıxıldım. Mustafa sən burada qal, mən günü səhərdən Gümrü şəhrinə yola düşəcəyəm. İki dünya bir olsa da, mən Leylanı sənə almalıyam.

Sərdar:

- Ay bala, bu şad xəbəri gələn kimi mənə deyə bilməzdinmi?

Bəli, Sərdar bir sayil qiyafəsində Gümrüyə daxil oldu.

Gümrünün dağılmış məhəllələrini gəzdikcə dərdi birə min artırdı. İyirmi illik ayrılıqdan sonra Sərdar ilk dəfə idi ki, Gümrü şəhərini görürdü.

Sərdar öz yaşadığı mülkü tapdı. Xarabalıqlar üstündə oxuyan bayquşları görüb, sazını köynəkdən çıxardı. Üzünü bayquşlara tutaraq qəmli - qəmli aldı görək nə dedi:

Dəli könül, bayquş görüb ağlama,
Gəl bu yerdə sən sinəmi dağlama,
Bəxtin yatıb ona ümid bağlama,
Başa gələn yaradana bəllidi.

Dəli könül, qanadını qırdı qəm,
Kədər sənin, qədər sənin, yoxdu dəm,
Arvad - uşaq itgin düşüb, yox həmdəm,
Başa dələn yaradana bəllidi.

Dəli könül, Ağbabaya yön çevir,
Pərvaz elə o dağlara bir hovur.
Ürəyimi gizlin - gizlin dərd ovur,
Başa gələn yaradana bəllidi.

Sərdar bütün məhəllələri ələk - vələk elədi, ancaq Mustafanın nişan verdiyi yer öz dostu, həm də qohumu Nağdəlinin evi olduğuna artıq heç bir şübhə qalmadı.

Sərdar gördü ki, bağ həmin bağdı. Bağda bir qadın və iki gözəl qız oturub. Qadın qızın birinin başına tumar çəkir.

Bu qadın qanlı Alının arvadı Nazlı xanım idi. Sığal çəkdiyi qız öz qızı, yanındakı isə Leyla idi.

Sərdar: - Ay ev yiyəsi, qonaq qəbul edə bilərsinizmi? - deyib dilləndi, lakin cavab almadı, bir də Sərdar dilləndi:

- Salam əleyküm, xanım, qapı – qapı gəzib, dilənirəm, mənə bir parça çörək verin, uşaqlarım acından batır.

Yenə qadın dinmədi. Sərdar öz-özünə deyindi, yox, bu Sona ola bilməz, Sona son tikəsini kasıblara paylayan bir qadındı. Bu qadın

lap kafirin qatısıdı ki, ona bir - iki atmacalı söz deyim bəlkə dili açıla.

Aldı görək Sərdar bu qadına nə dedi:

Gözəllər məkanı Gümrü şəhrində,
Saldı sinəm üstə od, Gümrü qızı.
Salam verdim, salamımı almadı,
Baxa-baxa qaldı mat Gümrü qızı.

Eyvanda durmuşdu bir su sonası,
Bağrına basmışdı çeyran balası.
Dedim qonağınam, zalım balası,
Al məni qoynuna, yat Gümrü qızı.

Niyə dillənmirsən, dilin lal olub?
Kim sənə deyər ki, əhli – hal olub.
Demə ki, saildi kəmxəyal olub,
Məni qul eylədin, bat Gümrü qızı.

Bir suyu oxşayır o nazlı yara,
Bilirəm bəxtimi yazıblar qara.
Sözümü deyirəm daşa - divara.
Xoşbəxt ol arzuna çat, Gümrü qızı.

Söz tamama yetdi. Nazlı üzünü Leylaya tutaraq dilləndi:
- Ay Leyla, a bala get evdən kütdən - külədən gətir ver bu dilənçiyə, qoy cəhənnəm olub buradan getsin, yoxsa zəhləmizi tökəcək.
Leyla əlində bir parça çörək dərvişə uzadaraq dilləndi:
- Buyurun baba, elə olub - qopanımız budu, vallah- billah biz də buraladra çörəyi güclə tapırıq.
Sərdar:
- Əstəfurullah, əstəfurullah, mən nə görürəm, bu röyadı, yoxsamı nədi, şükür məsləhətinə Allahım, nə qəşəng, nə gözəl, ay maşallah, elə bil, bir su pərisidi çıxıb qarşıma.

Allah səni xoşbəxt etsin ay qızım, bu çörəyin əvəzini Allah tala sizlərə artıqlığı ilə qaytaracaq, - deyib Sərdar oranı tərk etdi.

Elə bil bu qız Sonanın özüydü, çıxmışdı onun qabağına.

Bu qızı görəndən sonra Sərdarın dərdi birə min artdı. Oradan geri qayıdan zaman dağılmış evinin xarabalıqlarına baxıb Sona xanımı yadına salaraq Sərdar aldı görək nə dedi:

Əcayib sevdaya düşdüm, allahım,
Ölürəm, ilqarım söylə, hardasan?
Bilmirəm dilbərim nədi günahım,
Təbibim, loğmanım söylə, hardasan?

Bir bağban olmuşam, bağ bar gətirmir,
Əkdiyim gülləri torpaq bitirmir,
Mən çəkən yükü heç fil də götürmür,
Ey nazlı ceyranım söylə, hardasan?

Sevdasız günlərim yadıma düşür,
Cismim də, ruhum da, titrəyir üşür,
Hər dəfə ömrümdən bir yarpaq düşür,
Xınalı maralım söylə, hardasan?

Axtardım sevdamı günüm il oldu,
Hara qədəm qoydum ora, gül oldu,
Heydər eşq odunda yandı kül oldu,
Mehriban soltanım, söylə, hardasan?

Sərdar bu qızın kimlərdən olduğunu bilmirdi. İndi ona tam məlum oldu ki Mustafanın dediyi Leylan bu qızdı.

Artıq hava qaralmışdı. Sərdar qərara aldı ki, gedib xanda bir az dincəlsin.

Xanda cəmi on nəfərə qədər adam var idı.

Sərdar adamların icərisindən o dəqiqə yetim Tapdığı tanıdı.

Yetım Tapdıq həzin - həzin tırınqı çalıb oxuyurdu. Sərdar Yetim Tapdığın sözünü kəsərək dilləndi:

- Ayə, ay Yetim Tapdıq, bir əməlli başlı söz desən! Bizi lap qəm dəryasında boğdun axı, bir o telli sazı mənə ver görüm.

Yetim Tapdıq başını qaldırıb dərvişə baxdı.

- Ay zalım oğlu, mən hansı günümüzə yaxşı söz deyim, görürəm, sən buralar adamı deyilsən, bu telli sazım məni qoymur yasdan çıxam. Buyur sazı, kəramətini göstər, dənciyində nəyin varsa, tök ortaya.

Sərdar sazı sinəsinə basıb aldı görək nə dedi:

Ay ərbablar, gəlin sizə söyləyim,
Qərib - qərib dolanıram elləri.
Fələk qəm zənciri salıb boynuma,
Qərib - qərib dolanıram elləri.

Yeridim, yürüdüm qürbətə sarı,
Geriyə boylanıb baxmadım barı.
Ələndi saçıma dünyanın qarı,
Qərib - qərib dolanıram elləri.

Bir quşa dönəydim, uçaydım geri,
Gəzib dolanaydım o doğma yeri.
Qanan da, qanmaz da hökm edir, kiri,
Qərib - qərib dolanıram elləri.

Söz tamama yetdi.

Yetm Tapdıq qəmli-qəmli dilləndi:

- Eh, a dərviş, bu yerlərdə səni kimi çoxlarının günü, ayı qara gəlib, burada hamı qəribdi.

Yetim Tapdığın ağzında sözü yarımçıq qaldı.

Sərdar aldı dübarə görək indi nə dedi:

Yatmışdım yuxuda... ayıldım gecdi,
Karvanın getmişdi, yollarda qaldım.

Yaxşı adım - sanım hörmətim vardı,
Batdı şan – söhrətim, dillərdə qaldım.

Taleyim tərs oyun açdı başıma!
Baxmadı gözümün qanlı yaşına!
Müxənnət fələyin bu gərdişinə
Qərib diyarlarda, çöllərdə qaldım!

Itirdim ağ günü, qohum – qardaşı,
Əydim qamətimi, ağartdım başı.
Gəzirəm tapmıram yarı – yoldaşı,
Doğma evim yoxdu, ellərdə qaldım.

Söz tamama yetən kimi Yetim Tapdıq dərindən bir ah çəkdi.

Ay dərviş, Allah sənə insaf versin, lap tüstümü təpəmnən çıxartdın. Sən mənnən yaxşı söz istəyirdin, bəs nə oldu, mənnən də betər qəmli sözlər deyirsən. Deyəsən, sən elə mənnən də betər dərddəsən.

Sərdar:

- Hələ yenə sözüm var, Yetim Tapdıq, qulaq as gör nə deyirəm.

Yenə Sərdar sözə başladı, nə başladı:

Fələyin qəzası tapandan məni,
Tutdu əllərimdən belə apardı.
Atəşli zənciri saldı boynuma,
Dözülməz dərdlərə, hala apardı.

Yarı aradım, mən qəmə tuş oldum,
Hicran dərdi çəkib, bağrı daş oldum.
Bir qanadı qırıq, yalqız quş oldum,
Gəldi boran vurdu, yola apardı.

Qəribəm, tənhayam, düşmüşəm dara,
Para – para oldu, qövr edən yara.

Dərdimə bir kimsə tapmadı çara,
Əlimdən var – yoxu bəla apardı.

Söz tamama yetən kimi Yetim Tapdıq qəmli - qəmli dilləndi:
- Ay dərviş, sənin adın nədi?
- Mədəd.

Ay zalım oğlu, Mədəd! sənin səsin məni keçmişə apardı. Səsin mənə tanış gəlir, amma səni taniya bilmirəm, üzü qara olsun belə zamanənin! dərd-kədər qoyur ki, qırışığımız açılsın. Ay zalım oğlu, təki sənə gələn mala-pula gəlsin, bu dağılmış yerdə nə qalıb ki, camaat sənə nəsə də versin, camaatın özü indi dilənçi vəziyyətinə düşüb.

Sərdar dilləndi:

- Çarəsizəm aşıq, uşaqlar acından qırılır, gərək o başdan durub dağ kəndlərinə gedəm.

Yetim Tapdıq başını bulaya - bulaya dedi;

- Ay getdin ha, sən saydığını say, gör fələk nə sayır.

Yetim Tapdıq sazı sinəsinə basıb aldı görək nə dedi:

İndi Ağbabada betər zamandı,
Gülənin gözünü oyurlar, Mədəd.
Dinəni göndərib gedər- gəlməzə,
Adını yarıtmaz qoyurlar, Mədəd.

Düşmüşəm səhranın qızmar çağına,
Buradan baxıram Öküz dağına.
Mərdləri çəkirlər şər ayağına,
Çəkib dərisini soyurlar, Mədəd.

Yetim Tapdıq deyər dönüb zamana,
Doğru söz söyləsən, düşərsən qana.
Dağlar betər batıb sisə - dumana,
Cücəni payızda sayırlar, Mədəd.

Söz tamama yetdi. Sərdar birdən dözə bilməyib dilləndi:

-Yetm Tapdıq, deyən sən havalanıbsan nədi, Ağbabanın motalı, qaymağı, balı dillər əzbəridi, bəs aşığa sizlərdə necə hörmət edirlər?

Yetım Tapdıq başını bulaya - bulaya dilləndi:

- Mədəd, görürəm buralar adamı deyilsən, bir sözlərimə yaxşı qulaq as.

Yetim Tapdıq sazını kökləyib, aldı görək dübarə nə dedi:

Ağbaba deyilən bir gözəl eldi,
Hər yanı çəməndi, çiçəkdi, güldü.
Böyüyü - kiçiyi çox əhli dildi,
Indi bu vətənin adı qalıbdı!

Ağbaba deyilən uzaqda qaldı,
Tanrı verdiyini geriyə aldı.
Fələk başımıza qarama saldı,
İndi bu vətənin adı qalıbdı!

Ağbaba deyilən Çıldıra yaxın,
Eli pərən oldu bir yaxşı baxın.
Xeyri nə fəryadın, nalənin, ahın,
İndi bu vətənin adı qalıbdı!

Yetim Tapdıq gözlərinin yaşını silib, dilləndi:

- Mədəd, sən qabağa düş, mən də dalınca gəldim.
Bir az da gözləsəm, bağrım qana dönəcək.

Aldı Mədəd:

Dərd əyib qəddimi, sənə söylədim,
Deyən tanımadın, ay Yetim Tapdıq.
Səni qınamıram, çox qocalmışam,
Olmuşam qocaya tay, Yetim Tapdıq.

Aldı Yetim Tapdıq:

Dərdimi artırdın, birim min oldu,
Açdın ürəyimdə yüz baca, Mədəd.
Amma danışırsan üstü örtülü,
Burda sirri bizlərə kim aça, Mədəd.

Aldı Mədəd:

Bir zaman xan idım bu yerlərdə mən,
Qəlbimi açırdı burda çöl – çəmən,
Mən indi piranam, həm də dərd ərkən,
Toyum dönüb olub vay, Yetim Tapdıq.

Aldı Yetim Tapdıq:

Səsin yanıqlıdı, xoşdu avazın,
Nədən qışın getmir, açılmır yazın?
Taleyin bəd gəlib, qaradır yazın,
Sən ya bəzirgansan, ya xoca, Mədəd!

Aldı Mədəd:

Necə tanıyasan neçə il keçib,
Qəzanın qədəri qəlbimi seçib.
Fələk ağ günümü ot kimi biçib,
Istəsən dərdimi yay, Yetim Tapdıq.

Aldı Yetim Tapdıq:

Tanışlıq vermirsən, mat eləmisən,
Özünü bizə sən yad eləmisən.
Tapdığın canına od ələmisən,
Dərd səni eyləyib bir qoca, Mədəd!

Söz tamama yetsə də, Sərdar yenə söz deməyinnən qalmadı.

Aldı Mədəd:

Pünhan – pünhan çox dolandım,
Sinəm üstü dərdə bax!

Yağı basan, od vurulan
Obaya bax, yurda bax!
Dərdim çoxdu dəymə mənə,
Od alıban yanıram;
Müxənnətin dövranıdı,
Axtar, ara sən mərdə bax!

Aldı Yetim Tapdıq:

Pünhanlarda dolanıbsan,
Çox olubsan girdə bax!
Nə tapıbsan xəlvətlərdə,
Pünhan olan sirdə bax!
Dərdim üstə dərd gətirdin,
Oduma od elədin;
Huş qarışdı, ağıl itdi,
Ataş oldu sərdə, bax!

Aldı Mədəd:

Pərən – pərən olan ellər
Harda pənah eyləyib?
Qan ağlayan arvad – uşaq
Gözündən qan ələyib!
Yada əsr düşməkdənsə
Qəfil ölüm diləyib.
Türk deyilən adlı kişi
Qaldı quru yerdə, bax!

Aldı Yetim Tapdıq:

El – obadan söz salıban
Qəmi çəkdin ortaya.
Müsibəti yada salıb
Dərdi əkdin ortaya.
Açdın hicran bazarını
Mətah tökdün ortaya;
Alıcıyam aldım deyin
Qan ağlayan dərdə, bax!

Aldı Mədəd:

Viran könlüm yaralıdı,
Yarasını qanatma;
Bu bir sirdi, mən nəçiyəm,
Nə çarəyəm, can atma...
Faş olacaq bu da bir gün
Bir səbr eylə, unutma;
Tanımırsan, nəzər eylə
Üz – gözümə bir də bax!

Aldı Yetim Tapdıq:

Yetim Tapdıq yaralıdı,
Bir yara da sən vurdun.
Nə yaman tərs damarın var,
Dediyin üstə durdun.
Daha heyim qalmayıbdı
Lap qanadım qırdın;
Həqiqəti üzümə de,
Çəkmə gözə pərdə, bax!

Söz tamama yetdi. Amma Sərdarın daha səs – səmiri də cıxmadı. Artıq danışmaq yersiz idi. Çirtma vursan Sərdarın qanı tökülərdi, çünki Yetim Tapdıq onu tanımadı. Artıq gecə yarıdan keçmişdi.

Səhərin ala, qaranlığında Sərdar xanı tərk edib, libasını dəyişərək Gümrü şəhrinin qırağında olan qoşun- ləşkərin yanına qayıtdı. Əsgərlər paşanı salamla qarşıladılar.

Yüzbaşı irəli çıxıb paşanın nə əmr verəcəyini soruşdu. Sərdar dilləndi. Yüzbaşı andın nədir?

- Hamza.

Sərdar:

- Hamza oğlum, adına qurban olum. Mustafa gələ bilməyəcək, qoşunu iki günə kimi döyüşə tam hazırla. Məqsəd - məramımız Ağbabadan başlayıb torpaqları yağılardan təmizləməkdir. Mənim isə iki günlük Gümrüdə görüləsi yarımçıq işlərim qalıb.

Hamza:

- Oldu, paşam, baş üstə: "dedi".

Səhər açılan kimi Sərdar yenə libasını dəyişib dərviş formasında Gümrüyə qayıtdı. Şəhərin bu başından vurub o başına, o başından vurub bu başına çıxdı. Ancaq Mustafa dediyi tək bağça birinci gördüyü rəhmətlik Nağdəlinin bağçasından başqa heç nəyi tapmadı. Çarəsiz qalıb bir də bağçaya yaxınlaşdı. Leyla qızıl güllərə su verirdi.

Ədəb-ərkanla Leylaya salam verdi.

Qızım, bir fincan mənə su verərsənmi, ciyərim yanır.

Leyla su gətirəndə gördü ki, dərviş qızıl gülləri iyləyib nə isə öz-özünə danışır. Gözlərindəndə yaş sel kimi gedir.

- Bağça həmin bağça, güllər həmin güllər, fincan həmin fincan, amma qızım sən çox cavansan axı. Adın nədi? Leyla.

- Hə, Mustafa dediyi qız demək sənsən.

- Ay baba, bağrımı yandırma, sən Allah de görüm Mustafaya nə olub?

- Heç nə, qızım, qorxub eləmə. Mustafa Ağbabada yağı düş-mənlərlə qızğın döyüşə girişib, özü də mənə dedi ki, Leylaya deyərsən ki, bir həftəyə kimi onu mütləq görəcəm. Bax bu altun həmayılı da sənə göndərdi.

Leyla:- Sağ ol, ay baba, bu nə gözəl boyunbağıdı. Keçın içəri bir fincan cay için.

Sərdar:

- Sağ ol qızım, su içdim, ürəyimin közü yatdı.

Leyla:

- Baba, mən dərvişləri deyib - gülən görmüsəm, sənin isə iki gündü ki, göz yaşın sel təki axır, axı sənə nə olub?

Sərdar:

- Qızım mən çəkən dərdi allah düşmənimə də qismət eləməsin. Mənim üzüm qiyam, qiyamətda güləcək. Qızım yaralarımı qoparma, qulaq as, gör nə deyirəm.

Aldi görək bu dəmdə Sərdar nə dedi:

Başına dondüyüm gül üzlü Sonam,
Mən yandım, sən yanma, gül, bu yanda dur.
Yanıb viran olub məhəbbət bağım,
Bağıma qar yağıb,gül, bu yanda dur.

Güllü baxçalara küləklər əsir,
Sünbülün bağrını sarmaşıq kəsir.
Mənə dərd verməyə fələk tələsir,
Az qalır lal olsun dil, bu yanda dur.

Taleyim tərs gəlib, bəxtim dönübdü,
Bacam basılıdı, ocaq sönübdü.
Dərvişin bəlası göydən enibdi.
Axir gözlərimdən sel, bu yanda dur!

Söz tamama yetsədə, Leyla dərvişin dediklərindən heç nə başa düşmədi.

Bu dəmdə icəridən Nazdı xanımın səsi gəldi.

- Ay Leyla, o nə səs küydü. Leyla gülə - gülə içəri qaçdı. Ay ana, Mustafadan xoş müjdə gəlib.

Sona xanım dərvişə çörək vermək məqsədi ilə çölə çıxdı, amma heç kimi görmədi. Artıq Sərdar oradan uzaqlaşmışdı. Qayıdıb kor - peşman bağçaya girəndə gördü ki, bağça lalələrlə doludur. Leyla əlindəki altun həmayili anasına göstərərək dedi:

- Ana, bu da Mustafanın mənə hədiyyəsidir, dərviş ilə göndərib.

Altun həmayılı görən Sona xanım huşunu itirib bağçaya yıxıldı. Üç gün üç - gecə huşsuz vəziyyətdə yerindən dura bilmədi. Qanlı Alı Sona xanıma nə oldu deyib, fırfıra kimi fırlanırdı.

Nazdı isə öz-özünə deyinirdi.

- Ay kişi, iki gündür ki bizim evə bir dərviş gəlib gedirdi, özünü də çox pis aparırdı, üstəlik hələ bizə də atmacalı sözlər də dedi. Başı batmış Leyla onu içəri çağırtdırıb, güya gəlib anasına deyib ki, deməzsənmi dərviş Mustafadan müjdə gətirib. Sona o altun həmayılı Leylanın əlində görəndə halı pisləşib yerə yıxılıb.

Sona yatağa düşməkdə olsun, sizə kimdən danışım Sərdar paşadan.
Sərdar Gümrüdən ayrılan kimi qoşunun yanına gəldi və əmr verdi ki, artıq vaxtdır, düşmənlərin üstünə gedirik.

Sərdar:
- Mənim qoç igidlərim, mənim balalarım, biz yağı düşmənlərin üstünə gedirik, gərək bu döyüşlərdən üzü ağ çıxaq.
Mənim aslanlarım, körpələrə, qadınlara, yaşlılara əl qaldırmayın.
Məni yaxşı - yaxşı dinləyin, mənim balalarım, əgər mənim başıma bir iş gəlsə, məni gülə - gülə Gümrüdə dəfn edin, bu mənim sizlərə son vəsiyyətimdi.
Sonra Sərdar sazı başının üstünə qaldıraraq, aldı görək nə dedi.

Ərəsət günüdür, qoç igidlərim,
Düşmənlər əlində daş oynatmasın.
Mərdin qabağına çıxmasın namərd,
Müxənnət sevinib qaş oynatmasın.

Qara zurna çalır döyüş cəngini,
İgidlər oynayır millət səngini,
Əzin, igidlərim, düşmən əngini,
Başsız qalan kafir baş oynatmasın.

Ey Allah, sən yetiş mərdin dadına,
Qoy xətər gəlməsin Sərdar adına.
Onun xatirinə, onun adına,
Gələnlər gözündə yaş oynatmasın.

Yüz minlik bir qoşunun tərpənişi, təbillərin səs küyü, at kişnəməsi bütün Gümrünü ayağa qaldırdı.
Gümrüdən çıxan qosun Ağbabadan başlayaraq düşmənləri qova, qova Çuxur Səd ətrafı düzənlikdə dayandı.

Beləliklə, məqribdən - məşliqə qədər uzanan qədim Türk yurdunun bütün torpaqları yağılardan azad olundu. Qoşun yenə gəlib Gümrünün kənarındakı düzənlikdə dayandı.

Sona xanım üç gündən sonra ayıldı. Qanlı Alının əl ayağına düşüb yalvarmağa başladı:- Alı qardaş, qurbanın olum. Bu altun həmayil mənim ərim Sərdarın yeganə nişanəsidir. Biz evlənəndə mən onu Sərdara vermişdim. Tez ol məni o dərvişin yanına apar.

Qanlı Alı əl altından adamlar göndərib öyrəndi ki, həmin dərviş Gümrüdən qayıdandan sonra gedib Gümrünün kənarındakı əsgərlərə qoşulub gözdən itirmiş.

-Hə əzizlərim, Allah sizləridə xoşbəxt eləsin, ilan yerisin balası da dalınca.

Qanlı Alı Sona xanımıda götürüb qoşunun dayandığı yerə gəldilər.Yüzbaşı Hamza onları qarşılayıb öz cadırina götürdü. Hamzaya aydın oldu ki, qanlı Alının şəxsən paşaynan görüşmək fikri var. Sona xanin çadırda qaldı. Yüzbaşı isə qanlı Alını paşanın hüzuruna gətirdi.

Paşa ədəb - ərkanla qanlı Alını qəbul etdi. Ancaq nə Sərdar nə dəki qanlı Alı bir birini tanımadı. Sərdar Alının nə iş üçün gəldiyini soruşdu. Qanlı Alı yalana əl atıb söhbətini belə başladı:

- Paşam sağ olsun, bizim evi bir dilənçi dərviş talayıb, onu tapmaqda sizin köməyiniz lazımdı.

Sərdar: -Ay kişi, axı dərvişlərdən dilənçi olmur?

Qanlı Alı:

- Paşam sağ olsun, qoy sən deyən olsun, amma məndə belə bir məlumat var ki, bizim evi talayan dərniş bizdən çıxıb, özünü sızın qoşuna vurub.

Sərdar o dəqiqə barmağını dişlədi, deməzsənmi bu namərd kişi mənə böhtan atır. Qabağa yemək gəldi. Ancaq Qanlı Alı durub gedəcəyini bildirdi.

Paşam sağ olsun, mənim əmanətim sizin əsgərlərin yanındadı, qorxuram onu da oğurlayalar.

Elə bil Sərdarın başına qaynar su tökdülər. Sərdar hirslə üzünü yüzbaşıya tutub dedi:

- Yüzbaşı Hamza, özünlə bir cəngavər götür, bu kişinin əmanətini göz bəbəyi kimi qoruyun. Amma buna öz başınla cavab verirsən ha. Di haydi.

Sərdar yenə üzünü qanlı Alıya tutaraq dilləndi:

- Hə, kişi, indi ürəyin yerinə düşdümü? Allah verəndən bir qismət ye, səhər o başdan gəl yanıma, əgər o dediyin dilənçi dərvişi burada tanıyıb tapsan, onun başını şəxsən öz əlimlə vuracağam.

Hamza paşanın qılınc tutanlarından birini, yəni Hasanı götürüb Sona xanım qaldığı cadırı göz bəbəyi kimi qorumağa başladı. Sona xanım içəridə oturub qanlı Alının yolunu gözləyirdi.

Çəngavərlər isə bayırda şirin- şirin söhbət edirdilər. Birdən Hasanın gözü Hamzanın qolundakı bilərziyə sataşdı.

Yüzbaşım, nə gözəl bilərziyiniz var?

Cavan oğlan, bu bilərzik mənim valdeyinlərimin yeganə nişanəsidi. Bircə o yadımdadı ki məni sel apardı, Qasım adlı rəhmətlik bir kişi məni sudan tapıb öz oğlu kimi böyütdü. Allah o kişiyə rəhmət eyləsin. Bundan başqa heç nə yadımda qalmayıb.

Hasan kədərli-kədərli dilləndi:

- Mənə baxanda, sənə min şükür. Yüzbaşım mən də sənin kimi yetim olmuşam. Dağlarda qoyun otarmaqdan bezmişdim, çünki qurdlardan çox qorxurdum. Çobanlar deyirdilər ki, səni qurdun ağzından güclə almışıq. Zalım uşağı mənə yaman əziyyət verirdi.

Bu dəmdə Sona xanım qışqıra - qışqıra çölə çıxdı: - Ay bala, o bilərziyi bir mənə göstər. Hamza tez bilərziyi qolundan çıxarıb Sona xanıma verdi.

Ay bala, artıq gözüm heç nə görmür, o bilərziyin üstündə sonra nə var.

Ana, bilərziyin üstündə "Hamza" sözündən başqa heç nə yoxdu. Bu sözləri eşidən Sona xanım "Hamzam, Hasanım", "oğlanlarım" deyib cəngavərləri qucaqladı.

Hamza qadına nə isə söz demək istəyirdi gördü ki, qadın onların qolları arasında ozündən gedib huşunu itirib.

Hamza gər bir səslə iki nəfər əsgəri yanına çağırdı.

Əskərlər, mən içəri keçirəm, nə badə çadıra bir nəfər buraxasınız,-deyib qadın qucağında Hasan da yanında çadıra girdilər.

Hannan - hana Sona xanım ayıldı və bu dəmdə görək nə dedi.

Qalmışam gözü yollarda,
Halım necə yaman idi.
Yolu- izi seçəmmirdim,
Dağlar betər duman idi.

Ağlamaqdan kor olmuşdum,
Öz – özümə xor olmuşdum.
Eşitmirdim, kar olmuşdum,
Qəlb sızlayan kaman idi.

Ölürdüm, ölə bilmirdim,
Qərara gələ bilmirdim...
Göz yaşım silə bilmirdim,
Zaman betər zaman idi.

Qocalmışam qəm əlində,
Sizin adınız dilimdə.
Gəlib tapmırdı ölüm də,
Dərdim həmən – həmən idi.

Söz tamama yetsə də Sona xanımın sinəsi söznən doluydu. Balalarını duz kimi yalıyannan sonra yenə aldı görək nə dedi.

Adınıza qurban olum,
Ananızam, balalarım!
Hamza, Hasan canım – gözüm,
Ananızam, balalarım!

Neçə ildi dərd çəkmişəm,
Qamət əyilib, çökmüşəm.
Qədərə boyun bükmüşəm,
Ananızam, balalarım!

Saralmışam, çox solmuşam,
Sonayam, qarı olmuşam.
Sərdarın yarı olmuşam,
Ananızam, balalarım!

Söz tamama yetən kimi Sona xanım başına gələn əhvalatları oğlanlarına danışdı. Hər üç həsrətli bir – birinə qovuşdu.

Amma Sona xanım durub dicəlmək bilmirdi. Gözlərinin yaşı sel kimi damırdı. Hamza işi belə görüb dilləndi:

-Ay ana, şükür Allaha səni sağ – salamat gördük. Bəs niyə ağlayırsan.

-Gözlərimə inana bilmirəm, balalarım. İyirmi il ayrılıqdan sovra ovladlarının yolunu gözlədiyi ana həsrətlilərinə qovuşanda sevindiyinnən ağlamazmı?

Bu dəmdə Sona xanım cuşa gəlib, görək oğlanlarına nə dedi:

Sevincdən bilmirəm necə eyləyim,
Barı bir doyunca qoyun ağlayım.
O ötən günləri, gözəl anları,
Mən anım, sizlər də sayın, ağlayım.

Gözü kor etmişəm, qulağımı kar,
Üzülüb ürəyim, canda taqət var?
Yediyim, içdiyim olub zəhrimar,
Mətimi hər yana yayın, ağlayım.

Sonayam dərdimə bulundu çara,
Daha yas tutmaram, geymərəm qara.
Bitişdi, çox şükür, qövr edən yara,
Siz məni ən xoşbəxt sayın, ağlayım.

Söz tamama yetər - yetməz Sona xanım aldı dübarə görək nə dedi:

Hər darda qalanın dadına yetdin,
Sənin kəramınə şükür, Allahım!
O qədər şənəm ki, bu xoş günümə,
Başıma gülləri tökür Allahım!

Darda sığınmışdım sənin kölgənə,
Ümüdüm səndəydi dərd artsa yenə.
Axır qara gündən çıxdım, ağ günə,
Yox oldu dərd – bəla, fikir, Allahım!

Ayrılıq oduna çox yandı canım,
Sona deyir; gülzar oldu yanım.
Gərək başınıza dönüb - dolanım,
Min şükür rəhminə, şükür, Allahım!

Söz tamama yetən kimi Sona xanım təkrar balalarını duz kimi yalamağa başladı.

İndi sizə kimdən danışım, Qanlı Alıdan.

Qanlı Alı paşanın yanından çıxıb Sona xanımın qaldığı çadıra gəldi. Ancaq çadırın qarşısındakı əsgərlər onu içəri buraxmadılar.

O, əsgərlərdən içərdəki qadını soruşdu. Əsgərlərdən biri dilləndi:

- Babam, o qoca qadınımı soruşursan?

- Hə bala.

- Babam o qoca qadını yüzbaşı özü ilə Gümrüyə apardı, vəssalam. Qanlı Alı Gümrüyə qayıtdı. Şəhəri bir az o baş - bu baş gəzəndən sonra, öz evinə gəldi. Üzünü Nazlı xanıma tutub dedi:

- Ay Nazlı, Sona xanıma denən ki, hələlik o dərviş tapılmayıb, mən səhər açılan kimi bir də paşanın yanına gedəcəm, deyən kələfin ucunu tapmışam, narahat olmasın.

Nazlı:

- Ay kişi, sən nə danışırsan, nə Sona, nə zad, o səninlə gedəndi, geri qayıtmayıb axı!

Qanlı Alı başı alovlu evindən çıxıb qoşun olan yerə gəldi. Çadırın qarşısında duran əsgərlərə heç nə demədən birbaşa çadıra daxil oldu.

Nə, görsə yaxşıdı!? Gördü ki, hər iki cavan oğlan hərəsi Sonanın bir tərəfinə uzanıb, başlarını da Sonanın sinəsinə sökəyiblər. Sona da qollarını açıb onları möhkəm – möhkəm qucaqlayıb. Hər üçü elə yatıb ki, dünya yansa, bunların bir xorum otu yanmaz.

Qanlı Alı çadırdan çıxıb qışqıra-qışqıra paşanın çadrına yaxınlaşdı.

Sərdar paşa isə gecə yarıdan keçməsinə baxmayaraq yatmamışdı. Paşa Qanlı Alnı qan-tər içidə görüb dilləndi:

- Nə olub, nə qışqırırsan, dünya yandı, nədı?

Qanlı Alı:

- Allah sənin evini yıxsın, paşa, evimi yıxdın, hələ get bax sənin əsgərlərin mənim əmanətimə xəyanət elədilər.

- Ya, ola, bu kafir nə danışır?

- Haydi əsgərlər, hər üç kafiri cəld bu meydana gətirib və hər üçünün də başını vurun.

Əsgərlər yüzbaşı Hamzanı, Hasanı və Sona xanımı sürütdüyə - sürütdüyə meydana gətirdilər.

Bu vəziyyətə dözə bilməyən Sona xanım ağlaya - ağlaya əsgərlərə yalvarmağa başladı.

-Ay müsəlman qardaşlarım, insafa gəlin, o cavanlar mənim oğlanlarımdı, iyirmi ildi ki, bunların yolunu həsrətlə gözləmişəm. Mən viran qalmış bu xaraba Gümrünün paşası Sərdarın xanımı Sona xanımam.

Bu sözləri eşidən paşa meydana tərəf qaçmağa başladı:

- Əsgərlər, əl saxlayın, əsgərlər əl saxlayın, aman günüdü evimi yıxmayın, o mənim xanımım Sona xanımdı deyib, Sərdar tir - tap meydana yıxıldı. Artıq hər şey yalan oldu, əsgərlər Hamza, Hasan və Sona xanımı buraxıb Sərdarın başına yığışdılar. Ancaq Sərdar bu günmü ölüb, dünənmi olüb, ayılmaq bilmir ki, bilmir.

Qoşunun içərisinə çaxnaşma düşdü, nə düşdü.

- Ayə, deməzsənmi, paşaya kafirlər cadu – piti eləyiblər, paşa ağlını atıb.

Mosul hara, Gümrü hara, Sona xanım hara, axı paşa bu haqda heç kimə heç nə deməyib.

Qanlı Alının qanı damarlarında donmuşdu.

Hannan – hana Sərdar paşa özünə gəldi.

Cəmi həsrətlər bir – birinə qovuşdu.

Qosun ləşgər bu gecə kefdə - damaqda olsun, görək Sərdar paşanın axır sözləri nə oldu.

Sərdar paşa:

- Demək qaranlıq gecədə, Ziyarət dağının yaxın-lığında, ailəmi əmanət verdiyim qanlı Alı sənsən.

-Yüzbaşı Hamza, cəld bu qanlı Alını qollarını qandalla, atın zindana.

Sərdar paşa:

- Axı mən sənə demişdim, mənimki sənlə qalsın sonraya. Axır ki sağ - salamat əlimə keçdin.

Qanlı Alı:

- Paşam, axır ki biz qiyam - qiyamətə qalmadıq, sənin əmanətini döz bəbəyim kimi qoruyub, özünə geri qaytarıram.

Sona xanım ağlaya - ağlaya dilləndi;- Kişi onun əvəzinə mənim qollarımı qandalla.

Sərdar:

- Əzizim, məsələ bununla bitmir axı, bir axırına qulaq as.

Sərdar üzünü carçılara tutaraq dilləndi:

- Carçılar günü səhərdən Gümrü şəhrinin bütün məhəllələrində təbillərlə car çəkilməlidi, mənim fərmanlarım şəhərin bütün məhəllələrinə vurulmalıdı.

Sərdar:

- Qasid, yaz!

- Quldurluq, soyğunçuluq və adam öldürməkdə təqsirli bilinən Qanlı Alı adlı qaçaq Gümrü yaxınlığında otuz ildən sonra ələ keçmişdir. On gün müddətində qanlı Alı edam olunmalıdı.

Sona xanım:

- Kişi, sən nə danışırsan, mən də artıq şübhə yaranır ki, sən mənim Sərdarım deyilsən. Bu mərd kişinin iki yetişmış qızı, arvadı, mənə və qızıma görə öz isti ocaqlarını tərk edib bura gəliblər.

Hamza və Hasan tez irəli çıxıb dilləndilər.

- Ata, qanlı Alının əvəzinə bizləri edam elətdir.

Sərdar:

- Ay Sona, nə qız, sən nə danışırsan?

Sona xanım olub keçənləri Sərdara danışdı. Məlum oldu ki, Leyla Sərdarın qızıdı. Onu da oğulluğa götürdüyü Mustafa istəyir.

Sərdar gözü yaşarmış halda dilləndi:
- Gəldim özümə gəlin alam, öz həsrətlərimi tapdım. Şükür məsləhətinə, Allahım!!!
Bu dəmdə Sərdar sazı sinəsinə basıb, üzünü Sona xanıma tutaraq, aldı görək nə dedi:

Əzəl fələk qəm dəftərin yazanda,
Yazıbmış baxtını qara Sərdarın.
Dörd bir yandan iltimasçı olmadı,
Bağrına çəkdilər yara Sərdarın.

Anam yox,bacım yox, edə iltimas,
Əynimə geymişəm bir qanlı libas.
Dar gündə olaydı babam qul Abbas,
Qılaydı dərdinə çara Sərdarın.

Bahar fəsli qızıl gülü əkdilər,
Cavan idim, dal qəddimi bükdülər.
Sinəm üstə sağalmaz dağ çəkdilər,
Yetmədi bağçası bara Sərdarın.

Əlləndi gözümə dünyanın çəni,
Anşırda bilmədim dostu, düşməni.
Namərdlər arxadan vurdular məni,
Qalmadı halı biçara Sərdarın.

Zirvədəyəm, duman mənəm, çən mənəm,
Sinəsi çarmığa çəkilən mənəm.
Dostuma dost, düşmənimə düşmənəm,
Indi özü dönüb nara Sərdarın.

Söz tamama yetər - yetməz qanlı Alı sözə qarışdı:
- Ayə, zalım oğlu, məni nə ölümlə qorxudursan? Mən ölümdən qorxan deyiləm, bu yazıqlara az əziyyət ver.
Sərdar üzünü Sona xanıma tutaraq dilləndi:

- Əzizim, sən onu yəqin bil ki, bəla bizlərdən qurtarmayıb. Mənə yuxuda dedilər ki, bəla o vaxt sizdən çəkiləcək ki, bir qız uşağı mənim sənə verdiyim düyün hədiyəsi olan müqəddəs kitabı, özümə qaytaracaq və sonra da mənə ata deyib sarılacaq.

Artıq mənə məlumdur ki, bu mənim qızım Leyladı. Mən iki dəfə onula qarşılaımışam, amma bu işlər baş tutmayıb, bu bəlanı mən qəbul etmişəm, mənim nə iş görəcəyimə qarışmayın.

Sonra Sərdar üzünü Qanlı Alıya tutaraq dilləndi:

- Ayə, zalım oğlu, niyə qaçıb öz evində gizlənmisən?

Görmürsən ki, yağılar vurd- yuvamızı parça- parça eləyiblər? Mən başa düşürəm, səndə günah yoxdu. Sən Sonaya söz verib əlini müqəddəs Qurana basmısan ki, bir daha əlinə silah almayasan. Ancaq onu da yaxşı bil ki, müqəddəs Quranda yazılıb ki, sizi öldürənlərə, sizi tapdalıyanlara, haqqı tanımayanlara qarşı mübarızəyə qalxın.. Bəs sən bu şərtlərə niyə əməl etmirsən? Alı, sən Allah naminə, müqəddəs Quranı Kərim naminə, doğma bacı – qardaşların naminə, millət namınə əlinə silah götürməlisən.

Bu gündən bu qoşun-ləşgərin baş sərkərdəsi sənsən. Mənim sizlərə son sözüm budu.

Qanlı Alı sakit tərzdə durub başını aşağı saldı.

Sərdar üzünü iki oğluna və Sona xanıma tutaraq dilləndi:

-Əzizlərim, siz bu dəqiqə Gümrüyə qayıdın.

Alı burada qalmalıdı. Qoy camaat elə bilsin ki, Alı asılacaq. Nə badə bu sirri Alının ailəsi və qızım Leyla bilsin. Aman günüdü, bəla cəkilmək üzrədi, di sizlərə yaxşı yol.

Ancaq otuz illik ayrılığa dözən Sərdar və Sona elə bil bir günlük ayrılığa dözə bilmirdilər. Bir-birindən ayrılmaq istəmirdilər.

Ayrılıq zamanı aldı görək Sona xanım nə dedi:

Qəriblik qəlbimi qırdı da getdi,
Başıma qapazı vurdu da getdi,
Sinəmdə atəşı qurdu da getdi,
Simsarsız, arxasız dolanan mənəm.

Qəriblik qəlbimi sıxır, neyləyim,
Göz yaşım sel kimi axır, neyləyim.
Qanan da, qanmaz da baxır neyləyim,
Simsarsız, arxasız dolanan mənəm.

Qəriblik qəlbimi taxıbdı şişə,
Qəm üstə yatmağı etmişəm peşə.
Tanrı rəhm eyləsin, özü bu işə,
Simsarsız, arxasız dolanan mənəm.

Gecə yarısı Sona evə çatan kimi Nazlı başlamadımı;

- Ay Sona, bəs Alı harada qaldı, gah o səni, gah da, sən onu itirirsən.

Sona:

- A Nazlı, mən Alıdan günorta ayrıldım. Onun başı paşa ilə söhbətə qarışdı, birdən mənim yadıma Qızılçaxçax kəndı düşdü. Bu kənd qulağımızın dibidi. Leyla orada dünyaya gələndə onların mənə zəhmətləri böyük olub, neyləməli, başım söhbətə qarışdı, gecikdim, sonra məni tək buraxmadılar. Bax bu cavanlar da həmin dediyim adamın oğlanlarıdı. Mənim yanıma qatdılar ki, birdən qorxub eləyərəm. Daha Alıdan xəbərım olmadı. Allah kərimdi, Alı harada olsa, özünü bura çatdıracaq. Sən dur yat, mənim hələ yuxum gəlmir.

Artıq səhər açılmışdı. Carçıların səsi bütün Gümrü xalqını ayağa qaldırdı. Qanlı Alının ölüm fərmanı oxunurdu. Nazlının şüvəni bütün məhəlləni bürümüşdü. Sona xanım bir təhər Nazlını dilə tutub sakitləşdirdi.

Bu dəmdə Sərdar dərvış paltarında peyda oldu;

- Ay ev yiyəsi, mənə köməklik edin, uşaqlarım acından ölür.

Sona Sərdara baxan kimi dərvişin ona göstərdiyi Sərdarın qocalığını o dəqiqə anladı. Amma özünü güclə saxladı.

Nazlı qışqıra – qışqıra dilləndi:

- Ay evi yıxılmış, sən yenə haradan peyda oldun,- deyıb yerdən bir daş götürüb, Sərdara atdı. Daş Sərdarın başına dəydi. Qan su kimi axırdı. Bu vəziyyəti görən Sonanın ürəyindən qara qanlar

axmağa başladı. Leyla tez irəli yüyürüb öz kəlağayısı ilə Sərdarın başını sarıdı.

- Ay qızım, bu nə səs - küydü, burda kim ölüb, bağışlayın ünvanı səhv salmışam.

Leylan dedi:

- Baba, ölən yoxdu, amma ölməkdən də pisdi. Zalım paşa mənim dayımı on günə kimi asdırmaq fərmanı verib.

Sərdar dedi:

- Elə demə, qızım, elə demə, mən həmin paşanın dərvişiyəm, yeri gələndə məclislərini yola verirəm. O çox ürəyi yumuşaq adamdı, sənin dayını kimnənsə səhv salıb, mənim bir sözüm onun yanında iki ola bilməz, mən xahiş edərəm, dayını tezliklə buraxarlar. Səhər özü də Gümrüdə xana gələcək, siz də dəlib bir xahiş edin ki, sözümüz üst- üstə düşsün.

Bu sözləri kim eşitdisə, hamı sevindi, bircə Nazlıdan başqa.

Nazlı dedi:

- Bu dərviş peyda olannan bizim işimiz Allaha qalıb.

Leyla dərvişin üzünün qanını siləndə gördü ki, dərvişin göz yaşları qanına qarışıb.

Leylan dedi:

- Baba, mən səni həmişə belə ağlağan görmüşəm, nə olub axı sənə?

Sərdar dedi:

- Məni qəm - qüssə ağladır bala, - deyib getmək istəyən-də Sona xanım ağlaya - ağlaya ona tərəf getməyə başladı.

Hamza və Hasan çəld Sonanın qolundan tutub saxladılar.

Bu dəmdə görək Sona xanım aldı nə dedi:

Qorxuram dünyanın yeli tərs əssin,
Getmə, ciyərparam, getmə, amandı!
Gəldiyin yollara mən qurban olum,
Getmə, ciyərparam, getmə, amandı!

Haraylar,
Çoban dağda haraylar.

Yaxam fələk əlində,
Gözüm yarı haraylar.

Ələnib yoluma dünyanın daşı.
Sellərə dönübdü gözümün yaşı.
Nə tez haqlamısan sən altmış yaşı,
Getmə, ciyərparam, getmə, amandı!

Əzizinəm Gülənaz,
Bülbül eylər, gülə naz.
Düşmdüm qəm dəryasına,
Ağlayan çox, gülən az.

Dağılıb ellərim, qalıb virana,
Xar ol belə dövran, yan, ey zamana.
Dərdindən olmuşam dəli - divana,
Getmə, ciyarparam, getmə, amandı!

Yağıdı haylar mənə,
İl oldu aylar mənə.
Susadım su istədim,
Su verməz çaylar mənə.

Söz tamama yetdi. Dərviş ayaq saxladı. Heç nə olmamış kimi dedi:

- Hə, xanım, görürəm zamana səni nə kökə salıb. Bir qulaq as gör, mən sənə nə deyirəm.

Sərdar sazı köynəkdən çıxarıb sözə başladı:

Bir illik yolları bir aya gəldim,
Ağlama, sultanım, Sonam, ağlama.
Bəyaz gecələrim zülmətə dönüb,
Ağlama, sultanım, Sonam, ağlama.

Qıpqırmızı olub könlümün badı,
Zəhrimara dönüb ağzımın dadı.
Yas tutub Gümrümün qohumu - yadı,
Ağlama, sultanım, Sonam, ağlama.

Qohum – qardaş yoxdu gələ salama,
Gülə - gülə öz yurdunu dolana.
Yuxum gəlmir, yastıq dönüb ilana,
Ağlama, sultanım, Sonam, ağlama.

Söz tamama yetdi, dərviş yıxılıb qalxa - qalxa aradan cıxdı.

Dərviş yalan oldu Nazlı başlamadımı!

- Sən nə vaxtdan belə söz deyən olubsan, ay Sona?

- Ay qız olmaya o dilənçi dərviş sənin ərindi? Nə vaxtdan onun belə xətrini şox istiyən olubsan? Yox, yox Allah eləməsin, dilim qurusun, ay Sona, mən lap ağlımı atmışam, Alı yadıma düşəndə ağlımı atıram.

Leyla dedi:

- Ay Nazlı xala, təki mənim atam sağ olaydı, özü də lap o dərviş olaydı. Bəyəm dərvişlər adam deyil? Mənim ona o qədər qanım qaynayır ki, elə bilirəm öz doğma atamdı!

Sona xanım Leylanın sözünü kəsərək dedi:

-Ay Nazlı, bir az səbirli ol, Allah kərimdi, Alı qardaş gəlib çıxar. Bəs iyirmi ildi mən bu müsibətlərə necə dözürəm?

Sona xanım Sərdarı görüb elə bil quşa dönmüşdü.

Üzünü Nazlıya tutub aldı görək nə dedi:

Bir günlük qürbətə dözməyən Nazlı,
Bu qəmli hicrana, mən necə dözüm.
Ya Rəbbim, canımız daşdı, dəmirdi?
Məşəqqət divana mən necə dözüm?

Qəm - qüssə gecələr mənə yar oldu,
Yediyim, içdiyim zəhrimar oldu.
Yurdum – yuvam tamam tarümar oldu,
Belə bir yeksana mən necə dözüm?

İyirmi də bəla gəldi, götürdüm,
Iyirmi beşdə oğul, əri itirdim.
Dost yolunda süsən - sünbül bitirdim,
Bu ağır dövrana mən necə dözüm?

Bu sözləri eşidən Nazlı bir az yumşalmışdı.
Nazlı dedi:
- Ay Sona, mən bu vaxta kimi bilmirdim, sən lap əməlli, başlı aşıqsan ki, bu otuz ildə bir kəlmə də olsun danışmamısan.
Sona xanım dedi:
- Ay Nazlı, mənə olan zülmü Allah heç düşmənimə də göstərməsin.
Allah üzünüzü xeyirli sabahlara açsın. Səhər açılmışdı.
Birdən bir uşağın çöldən səsi eşidildi.
- Ay ev yiyəsi, ay ev yiyəsi, buralarda bir kimsə yoxdumu? Nazlı irəli çıxıb dilləndi:
- Nədi ay bala, bu səhər- səhər yenə nə olub?
- Xanım, mən dərvişin oğluyam, atam nənə dedi ki, gəlib sizə bildirəm ki, səhər paşa xana gələcək. Gümrünün yağılardan azad olunması ilə camaata köməkliklər olunacaq və sonra bayram mərasimləri keçiriləcək. Bir də atam dedi ki, yalvarıb - yapışaq bəlkə paşa ədalətə gələ, Alını buraxa. Amma gecikməyin,- deyib uçaq gözdən itdi.
Nazlı dedi:
- Ay oğul, dayan, ay bala dayan. Artıq uşaq gözdən itmişdi. Səhər tezdən artıq Gümrüdə bayram şənlikləri başlamışdı. Hər tərəfdə qara zurnadan cəngi sədaları eşidilirdi.
Hamıdan əvvəl xana Nazlı, Sona xanım və uşaqları gəldilər. Aradan bir xeyli keçmişdi Lalə və oğlu cəngavər Mustafa xana daxil oldular. Artıq xanda məclis qızışmışdı. Gümrünün hər yerindən və eləcə də Qars, Çıldır, Ağbabadan bura aşıqlar gəlmişdi. Hələlik nə paşadan, nədə ki, paşanın dərvişindən bir xəbər yox idi. Nazlı elə bil mismar üstündə oturmuşdu.
Aradan bir xeyli keçəndən sora üzünü Sona xanıma tutaraq dilləndi:
- Ay Sona, deyən qoca dərviş bizi aldatdı, başımızın altına yastıq qoydu.

Sona istəyirdi ki dillənsin, cöldən əskərlərin səsi eşidildi. Yol verin, yol verin, qabağa bir kimsəni buraxmayın, paşa gəlir.

Həqiqətən də əsgərlərin müşaiyəti ilə paşaynan dərvişi xana daxil oldular.

Nazlı dözə bilməyib paşanın ayaqlarına yıxıldı;

- Paşam, qurbanın olum balalarıma yazığın gəlsin, mən buralarda qəribəm, Alımı burax, günahsız yerə öldürtdürmə.

Yaraqlı - yasaqlı əskərlər Nazlının qolundan tutub öz yerində oturdular.

Əsgərlər dedilər:

- Paşaya mane olsanız, sizi bayıra atacağıq!

Paşa çıxıb yuxarı başda əyləşdi. Məclis qızışdı nə qızışdı. Məclisi bu mahalın qocaman aşığı yetim Tapdıq aparırdı. Paşaya təriflər deyilirdi.

Sərdar dərvış libasında Sona xanımın yanına gəldi. Hamza ayağa durub öz yerini atasına verdi.

Sərdar dedi:

- Xanım, narahat olmayın, mən paşa ilə danışmışam, Gümrünün azad olunması münasibəti ilə paşa Alını əhv edib. Leyla dərvişin əllərindən öpərək dilləndi;- Baba, çox sağ olun bu yax-şılığnızı heç vaxt unutmayacam, bu müqəddəs "Quranı Kərim" atamın bizlərə ən dəyərli hədiyəsidi, dayımı ölümdən qurtardığına görə bu müqəddəs kitab sizindi. Onu axirətə qədər saxlayın.

Dərviş dedi:

- Qızım, mən bunu qəbul edə bilmərəm, sən nə danışırsan? Bu müqəddəs kitabənin tayı - bərabəri yoxdu, mən bunun əvəzini ölənə kimi sizə ödəyə bilmərəm axı?!

Leyla dedi:

- Baba, mənə heç nə lazım deyil, istərdim ki, bu müqəddəs kitabə sızı kimi layiqli adamların əlində olsun.

Bu zaman qocaman ustad aşıq Vəli dilləndi:

- Camaat, yol verin meydana dəli dərviş gəlir. Bu dəli Dərviş, nə deyirsə haqqdan deyir, ay cammat, sakit olun, onu bura göndərən var. Qoyun o da sözünü desin, inşallah, dalı yaxşı olar.

Dəli Dərviş dedi:
- Ay camaat, mən xanəmdə yatmışdım, bir tərpətdilər,iki tərpətdilər, oyandım, axırda qulağıma bərkdən dedilər:
- Nə yatmısan, dur get filan yerə, orada iki nəfər ölüb, onları dirilt, ona görə də mən burdayam.
Hamza və Hasan ata və anasına baxanda gördülər ki, həqiqətən dərviş libasında olan Sərdar paşa və Sona xanım oturduqları yerdə quru ağaca dönüblər.
İşi belə görən dəli dərviş sazını köynəyindən çıxardı. Zilini zil, bəmini bəm eyləyib sinəsinə basdı.
Meydanı qırx dəfə dolandı, desəm azdı, başladı, nə başladı:

Doqquz on cəmidi, əlliynən qırxın,
Bir ucu altmış olur, aman ağam, hey!
Bu könül sevdası beşıyə uyğun,
Dağları basıbdı duman, ağam, hey!

Dədvişin dediyindən çoxları bir şey başa düşmədi.
Yenə Dəli Dərviş aldı sözünün o biri xanəsini görək nə dedi:

Duman dağa uyğun, can da cəsədə,
Oyat yatmışını bir neçə vədə.
Quşu göydən endir, quru səvətə...
Qoy gəlsin yerinə iman, ağam, hey!

Meydanda tək qoyma Dəli Dərvişi,
Görürsən müşgülə düşübdü işi.
Sənə sığınmışam, ya şahlar şahı,
Səndədi ümidlə, güman, ağam, hey!

Söz tamama yetən kimi Sərdar diksinib ayıldı, Sona xanımın isə əl – qolları tərpəndi.

Dəli Dərviş sazını bağrına basdı, görək bu dəmdə nə dedi:



Qoru min bəladan məni, ya rəbbim!
Əlimdən bərk yapış, gəl, gəl, ağam, gəl!
Buraxma, amandı, sən yarı yolda,
Əlimdən bərk yapış, gəl, gəl, ağam, gəl!

Dərdə dözənnərin sənsən pənahı,
Bunu da yaxşı bilir qadir İlahi.
Ərşin – kürşün sənsən şahənşahı!,
Əlimdən bərk yapış, gəl, gəl, ağam, gəl!

Yahu, Yahu deyən Dəli Dərvişəm,
Qıyma paralana bu könül şüşəm.
Haradaydım, çağırdın...hara gəlmişəm,
Əlimdən bərk yapış, gəl, gəl, ağam, gəl!

Söz tamama yetən kimi Sona xanım da ayıldı. Dəli Dərviş qəfil gəldiyi kimi, qəfildən də yoxa çıxdı.

İşi belə görən yetim Tapdıq üzünü paşaya tutub dedi:

- Paşam icazə verəniz sizin dərvişdə bir, iki söz desin.

Paşa başı ilə öz razılığını bildirdi.

Dərviş libasında olan Sərdar müqəddəs "Quranı Kərimi" öpərək Sona xanıma dedi:

- Sona xanım, bu əmanət sizindi, və axırətə kimi də sizin olmalıdı.

Sona xanım əlləri titrəyə - titrəyə müqəddəs kitabı sınəsinə sıxdı.

Zalım oğlu Sərdar sazı köynəyindən çıxarıb qızıl quş kimi meydana şığıdı. Meydanda o, baş bu baş gedərək, aldı görək nə dedi:

Dinləyin siz məni, səxalı ərlər,
Mehrü məhəbbətin dəryasıyam mən.
Yaralarım göz - göz olub, qan verir,
Sağalmaz dərdlərin şəfasıyam mən!

Hər tərəfdə gurum - gurum yaram var,
Sinəm üstə cahan boyda şıram var,

Burdan başqa gedəcək de, haram var?
Müqəddəs Gümrünün qalasıyam mən!

Könül sarayımı tufan bürüdü,
Hicran şahı məni yıxdı sürüdü,
Cavan canım qürbət eldə çürüdü,
O xan Ağbabanın balasıyam mən!

Bu dəmdə qocaman ustad aşıq Yetim Tapdıq dilləndi:

- Dərviş, səsin mənə tanış gəlir, insaf eylə, qaysaq bağlamış yaralarımı qoparma, de görüm, sən kimlərdənsən?

Sərdar dedi:

- Narahat olma, kimliyimi indi biləcəksən, deyib aldı sözün o biri xanəsini.

Qəm - qüssə mənimlə verib qol - qola,
Kəc baxtım özümlə getməyir yola.
Gedib köç karvanım qalmışam dala,
Qədiri Yeysanın yaylasıyam mən!

Silinmir könlümdən kədərin çatı,
Iz salıb belimdə kəndirin qatı,
Könlüm nəğmə deyir, dilim bayatı,
Cənabı Zeynəbin laylasıyam mən!

Bəxtimə dərd - kədər yazanda fələk,
Gülə - gülə dedi; əhsən, mübarək.
Bəlkə daş - dəmirdi, sizdəki ürək?
Mükərraf Sonanın aynasıyam mən!

---

Deyilənə görə "Qədiri Yeysa" Çıldırın yaxınlığında Dəli Dərvişin qəbri olan ən sınaqlı ziyarətgah və ziyarətgaha gələnlər üçün ən səfalı bir yayladır.

Həm paşayam, həm sailəm, həm ozan,
Alaylar dağıdıb, ordular pozan.
Məhəbbət gölündə yolunu azan,
Kəbil Mustafanın babasıyam mən.

Sərdarın sözünü tutan olmadı,
Pərvanə topunu atan olmadı,
Hünər meydanında batan olmadı,
Mehriban Leylanın atasıyam mən.

Söz tamama yetər-yetməz Leyla xanım "ata" deyib özünü Sərdarın üstünə atdı.

Sərdar, balaların deyib, Leyla xanımı, Hamzanı, Hasanı duz kimi yalamağa başladı.

İyirmi il ayrılıqdan sonra cəmi həsrətlər bir - birinə qovuşdu.

Sərdar titrək bir səslə dilləndi:

- Mənim gözümün ağı, qarası canım, Mustafam, bir yanıma gəl.

Mustafa Sərdarın əllərindən öpərək dilləndi:

- Eşidirəm, baba.

- Mustafa, mənim balam Leylanın əlindən tut. Sizlərə xeyır, duanı mən verirəm, qismətinizi Allah versın, - deyərək gözlərinin yaşını sildi.

Artıq hamıya məlum oldu ki, bu dərviş vaxti ilə Gümrünün, indi isə Mosulun paşası olan Sərdardı.

Nazlı irəli gəlib Sərdarın əl – ayağa düşərək yalvarmağa başladı:

- Paşam, Allah xatirinə, məni bağışlayın, keçin mənim günahımdan.

Sərdar dedi:

- Bacım, sizin heç bir günahınız yoxdu, mənim sizlərin qarşısında elə böyük borcum var kı, onun əvəzini ölənə kimi qaytara bilməyəcəyəm.

Nazlı dedi:

- Paşam bəs mənim Alım gəlib çıxmadı axı?

Sərdar dilləndi:

- Darıxma bacım, darıxma, Alı bu dəqiqə harada olsa gəlib çıxar.

Bu dəmdə padşah libasında yuxarı başda əyləşən Alı ayağa duraraq dilləndi:

- Ay Nazdı! Nə ah, şüvənə qalxmısan, qorxub eləmə, hələ sənin Alın ölməyib.

Hə, əzizlərim, beləliklə cəmi həsrətlər bir, birinə qovuşdu. Qada bala Sərdardan çəkildi. Sona xanım və Sərdar haqq yolunda, millət yolunda belə bir imtahandan üzü ağ çıxdılar.

Mustafa bir ilin içərisində zəlzələdən ziyan çəkən Gümrü şəhərini tam abad elədi və Leyla ilə ailə qurub Sərdarın fərmanı ilə Gümrü şəhərının yeni paşası oldu.

Hamza Alının qızı Güllü ilə evlənib Şərur mahalında ömür – gün sürməyə başladı.

Hasan da Alının o biri qızı Cahan xanımla evlənib Mosula qayıtdı.

Alı birləmiş türk qoşun dəstələrinin baş sərkərdəsi oldu.

Paşalar paşası olan Sərdar paşa "vətənin o başı, bu başı olmaz" deyib, ömrünün qalan günlərini Sona xanım ilə birlikə Mosulda keçirmək qərarına gəldi.

Bu yerdə Gümrü Qizi dastanını yekunlaşdıran böyük sənətkar dübarə aldı görək nə dedi:

Dəymə fələk, dəymə mənə,
Ümmanda qərq olan mənəm.
Hicri-qəmin qucağında
Dəryada qərq olan mənəm.
Düşmüşəm qəm dəryasına,
Dinib - danışa bilmirəm.
Gözlərim baxmır sözümə,
Sellərdə qərq olan mənəm.

Qəm mülkünün paşasıyam,
Virandı könlümün mülkü.
Ax, ay zalım, zalım, zaman,
Yıxmısan binəmi bil ki!
Gəlin görün nə haldayam,

Bəyənmir aslanı tülkü.
Sönüb könlümün günəşi,
Tufanda qərq olan mənəm.

Dindirməyin məni, ellər,
Yaram sağalmaz yaradı.
Danışmağa halım yoxdu,
Hər yerim para - paradı.
Desələr ki, Aşıq Heydər,
Bir topdağıtmaz qaladı.
Qızıldan taxtım olsa da,
Yeksanda qərq olan mənəm.

Dastanın sonunda Aşıq Heydər üzünü məclısə tutaraq dilləndi:

- Hörmətli məclis əhli, icazə versəniz məclisimizi Aşıq Şenliyin sözləri ilə yekunlaşdıraq, baxmayaraq ki, Aşıq Şenlik üzürlü səbəbdən məclisimizdə iştirak edə bilmədi, amma Aşıq Şenlik bu mahalın övladı olmaqla bərabər, el ağsaqqalı, tanınmış aşıqdır. Onun sözləri ilə məclisimizi yekunlaşdırmaq yerinə düşərdi.

Bu dəmdə Aşıq Heydər zili-zil, bəni-bəm yerində aldı görək "Osmanlı" havası ilə nə dedi:

Ay qonax, bir bəri bax,
Gör neçə dilbər oynayır?
Gül zərif, dəsdə dərif,
Dəstində güllər oynayır.
Naz ilə ağ üzünə,
Düzübdü tellər oynayır.
Səsinə, həvəsinə,
Car çəkib ellər oynayır.

Bu xına, əcəb xına,
Gör nə yaxıb əllərinə.
Mərd ana, dal gərdana,
Naxış düzüb tellərinə.

Bu kəmər, gümüş kəmər,
Qurşayıbdı bellərinə,
Bu vaxta, ağ otaxta,
Coşub samavar oynayır.

Ay gözəl, bundan əzəl,
Müşdəriyəm qələm qaşa,
Bu dünyada, bu libasda,
Səni görüm mın il yaşa.
Dilbərim, bu əllərim,
Qəm mülkünə olub paşa,
Bu başdan, qələm qaşdan,
Qurtarıb millər oynayır.

Nə cahanda, nə rizvanda,
Yoxdu sənin kimi Pəri.
Ev yıxdın, zalım baxtım,
Ağlım olub sərsəri.
Sən canım, sən cananım,
Olaydım Şirin nökəri.
Od salır, canlar alır,
Qaşlarının qələmləri.
Əbrüşümlər oynayır.

Ay Pəri, bu telləri,
Gəl saxla mənə əmanət,
Gər bilsə, yegin gəlsə
Ağlayar, eylər xəyanət.
Çöllərində, bu ellərində,
Bil ki, eylərəm qiyamət.
Əlbəttə, Məmmədqasımın,
Başında ləşkər oynayır.

Aşıx Heydər "Gümrü Qızı"dastanini belə yekunlaşdırdı.

**Allah Ağbabalı Aşıq Heydərə rəhmət eləsin.**

Deyilənə görə, o vaxtlar Gümrü şəhərinin valisi olan Məmmədqasım ağanın oğlunun toy məclisi çox maraqlı keçmişdi.

Məmmədqasım ağa və həmçinin Gümrünün tanınmış ağaları Aşıq Heydərə böyük məbləğdə xələt verib, ustadı təmtəraqla Ağbabaya yola saldılar.

Aşıq Heydərin "Gümrü Qızı" dastanının ciddi redaktə olunmasına, onları ilkin yazılış məqamına uygunlaşdırılmasına ciddi ehtiyac vardı. Çünki bu əsər dildən – dilə gəzərək təhriflərə uğramışdı.

Bu tarixi əsəri tam olmasa da bərpa edib əvvəlki vəziyyətinə qaytarılmasına qan eyniliyimiz imkan verdi.

Aşıq Heydərin çap olunmayan, yaddaşlarda yaşayan əsərlərini toplamaqda bundan sonra da bizə yardımçı olacaq hər bir kəsə əvvəlcədən təşəkkür edirik!

Ümid edirik ki, ictimayətin və geniş oxucu auditoriyasının mühakiməsinə verdiyimiz bu əsər Aşıq Heydərin irsini sevənlər və dəyərləndirənlər tərəfindən lazımınca qiymətləndiriləcək.

Bütün irad, təklif və qeyidlər üçün isə əvəlcədən təşək-kürümüzü bildiririk.

Bu tarixi əsəri 60 ildən artıq bir zamanda qəlbində yaşadıb, onu təkrar həyata qaytaran Aşıq Heydərin nəvəsi Yusif Rəhim oğlu Heydərova təşəkkür edirik!

**T. Səmimi**
Filologiya üzrə fəlsəfə doktoru.
**X. Məmmədli**
Pedoqogika üzrə fəlsəfə doktoru, dosent.
**Ə.Heydər**

# RƏVAYƏTLƏR

## TELLİ QARI

Bir gün Mahmud ağa qapıda durmuşdu. Əlini gözünün üstünə qoyub uzaqlara baxırdı. Birdən xeyli uzaqlarda bir atlı görüb xeyli təəccübləndi:

– Bu atlı kimdi belə? Hər kimdisə mənim yanıma gəlir. Qoy gəlsin.

Bu keçdi içəri. Aşıq Heydər dedi:

– Ay Mahmud ağa, sən sözlü adama oxşayırsan.

– Baxdım, bir atlı gəlir. İndicə burya gəlib çıxar. Qoy hələ gəlib çatsın bir, ondan sonra kimdi, nəçidi, bunu da onun özündən öyrənərik. Elə bu vaxt qapıda at kişnədi. Az keçmədi ki, ucaboy, arıq bir arvad içəri girdi. Aşıq Heydər təəccüblə arvadın belindəki tapança və xəncərə baxdı. Arvad ədəblə Mahmud ağaya salam verib dedi:

– Mahmud ağa, nəyə gəldiyimi bilirsənmi?

– Mən hardan bilim, a Telli qarı? Sən deyərsən, biz də bilərik.

– Bu Yastı Alı yaman qudurub ha! Sınıqda özünü padşah hesab edir. İndi nə eləyim ki, mən ondan kasıbam. And olsun Allaha… Üç dəfə qapısına elçiliyə getmişəm. Ağzına gələni mənə deyib. Elə şeylər istəyib ki, qalmışam mətəl. Ay bunun başı batsın, adını da kişi qoyub. Yurdunda bir qız var da… Mən onun qarayandı qızına elçi düşürəm gədənin xatirinə, o da özünü götürüb dağın başına qoyur. Daha demir Telli qarı da Yayçı qızıdı. Cinləndirərsən, qızı basar atın tərkinə. Hünərin var, gəl üstünə. Səni qoyar yana-yana.

Bu belə deyəndə Aşıq Heydər maraqla Telli qarıya baxdı:

– Səndən nə istəyir, onu deməzsənmi?

Mahmud ağa da bu sözləri eşidəndə razılıqla başını tərpətdi:

– Aşıq Heydər düz deyir. De görək Yastı Alı səndən nə istəyir?

Mahmud ağa da belə deyəndə Telli qarı Mahmud ağanın beşaçılanını sinəsinə basıb bir o yana, bir bu yana gedib görək burda nə dedi. Biz deyək, siz də sağ olun:

İyimri qoç istərəm, yanında şişək,
On can yunlu qoyun-yunu bir döşək,

Maya dəvə gətir, yanında köşək,
On batman yağ, düyü, qəndlə çay gətir.

On dəst paltar lazım təzə gəlinə,
«Yoxumdu» sözünü alma dilinə,
Qızıl kəmər gərək qızın belinə,
Qohuma-qardaşa yaxşı pay gətir.

Vəznəli çuxadan bir beşi bəsdi,
On beş donluq gətir, durma, tələs di,
Çoxmu şeylər dedim – dodağın əsdi,
Xonçalar hazırla, bizi say gətir.

Yaxşı yükünü tut tirmədən, şaldan,
Beş côngə də ayır heyvandan-maldan,
Daha nə lazımdı deyərəm daldan,
Tutursan özünü mənə tay – gətir!

Qanını qaraltma, a Telli qarı,
Mənə nə, taparsan haradan varı,
Bu elə-obaya salma havarı,
Yuz də qızıl beşlik bura say gətir.

Söz tamama yetən kimi Aşıq Heydər dedi:
– Telli qarı, sən lap şairsənmiş ki!
– İndi onun yeri deyil. Gəlmişəm ki, Mahmud ağa bu işi yolun qoysun. Qoymasa, mən bilərəm, o Yastı Alı bilər.
– Yaxşı, yaxşı.
Mahmud ağa gülümsündü. Bu sərt təbiətli adam mərd adam görəndə yumşalırdı. İndi də belə olmuşdu. Çünki Telli qarının hərəkəti xoşuna gəlmişdi. Odur ki, Aşıq Heydərdən soruşdu.
– Aşıq Heydər, sən bu işə nə deyirsən?
– Ağa, Telli qarı bu qapıdan narazı getməməlidi!
– Bu saat o yastı əclafı bura çağırtdıracağam.
Ona kimi ortaya süfrə salındı. Yeyib-içdilər. Aradan bir az keçməmiş içəri ortaboylu bir kişi girdi. Kişi qorxa-qorxa Mahmud ağaya salam verdi, içəridə Telli qarını görəndə boğazı qurudu. Mahmud ağa acıqlı-acıqlı dilləndi:

– Yastı Alı, deyəsən ağlını itirmisən.

– Ağa, ağa…

– De görüm, Telli qarının dedikləri düzdürmü? Sən bir bu qədər şeymi istəyirsən?

– Elə sözgəlişi dedim. Telli qarı da şair adam… Və mən toydan ötrü bir şey istəməyim?

– Belə de… İndi sən Aşıq Heydərə cavab verə biləcəksənmi?

– Yox, yox, mən hara, o hara?! Yenə insaf-mürvət səndədi, Aşıq Heydərə qalsa, evim yıxılacaq.

– Mən bitlmirəm, Aşıq Heydər, istədiyini istə bundan.

– Ağa, bu, Telli qarıdan nə istəyibsə, onun hamısını özü hazır eləsin. Xeyir işi gecikdirmək olmaz. Qaldı o yüz beşlik qızıl. Onu da Yastı Alı sayıb versin Telli qarıya.

Bunu eşidəndə Yastı Alı yerində qurcalandı:

– Ay Aşıq Heydər, bu, heç olmadı. Sən mənim evimi yıxmaqmı istəyirsən?

– Bəs sən bu deyilənləri Telli qarıdan istəməmişdinmi? İstəmişdin! İndi özün ver görək.

– Ay Mahmud ağa, Aşıq Heydər göz görə-görə Telli qarının tərəfini saxlayır. Axı…

Mahmud ağa yenə gülümsündü:

– Yastı Alı, daha mənlik iş qalmayıb. Buna Aşıq Heydər baxır. O nə desə, onu eləməlisən.

– Ona ki qaldı, nə istəsə, onu da alacaq.

Aşıq Heydər məzəynən Yastı Alıya baxıb əlini-əlinə vurdu:

– Utanmırsan heç? O qədər var-dövləti öləndə arxanca gor evinə aparacaqsan? Yox. Daha niyə sızıldayırsan? Nə deyim… nə demişəm, ona əməl elə. Allah xeyir versin. Nə təhər olur? Elə istəməyin belə də qaytarmağı var, daha dalına hay-havar salma.

Mahmud ağa əlini cibinə salıb bir çəngə yüzlük çıxardı verdi Telli arvada:

– Al bu pulu, toy xərci elə. Amma Aşıq Heydərin dediyi şərt qalır. Üç günə kimi toy başlamalıdır. İndi gedin toya hazırlaşın. Toy günü Aşıq Heydər də, mən də gələcəyəm.

Telli qarı da, Yastı Alı da onlarla sağollaşıb getdilər. Üç gündən sonra toy oldu, Telli qarının arzusu yerinə yetdi.

# AŞIQ HEYDƏRİN AXIRKƏLƏK SƏFƏRİ

Bir gün Aşıq Heydər oturub qəlyan çəkirdi. Birdən arvadı Yetər tələsik içəri keçdi:

– A kişi, bir nəfər cavan, boylu-buxunnu oğlan gəlif, amma nə qədər elədim içəri gəlmir.

– Ay arvad, kimdi, nəçidi? Bə demirmi?

– Vallah, heç nə demir. Amma ustad deyif durur, bu kimdi – bilmirəm.

– Eh, sən nəyi bilirsən ki!

Aşıq Heydər hirsnən qalxdı ayağa, qapıda duran oğlanın əlindən tutuf çəkdi içəri.

– Yetim Ləvənd bala, bu neçə ildi harda qalıbsan?

– Ustad, nə deyim, vallah …

Aşıq Heydər qəlyanını bir də doldurdu. Dalbadal bir neçə qüllab alandan sonra bir də Yetim Ləvəndə baxdı, ürəyi yandı.

– Ay bala, necə düşüfsən? Nər kimi oğuldun, bu nə işdi?

Yetim Ləvənd başını saldı aşağı.

– İndi dərdini mənə deməyəcəksənmi?

– Ustad, bilmirəm nə təhər deyim.

– Nə təhər deyirsən, de.

– Eşq atəşi yandırdı məni, amma… Molla Qara insafa-mürvətə gəlmir.

– Bu dediyin Axırkələkli Molla Qaradı?

– Ustad, sən onu tanıyırsan?

– Tanıyırsan da sözdü! Mən ha bu molla tayfasından qaçıram, amma… Bilirəm, mənsiz işin aşmayacaq, Molla Qaranın üzü qara olsun. Yaman müşkülə salacaq bizi. İndi nə deyirsən, onun yanına elçiliyəmi gedək?

– Sən bilən məsləhətdi.

– Yaxşı, de görüm bu Molla Qaranın neçə övladı var?

– Bir oğlu, bir qızı var. Oğlunun adı Hümmət, qızının adı Bəyazdı.

– Bəyazdı?

Aşıq Heydər həyəcanla ayağa qalxdı, yenə əyləşdi, kişinin dili-dodağı əsdi.



– Vay-vay, ay Yetim Ləvənd, sən mənim lap dinimi-imanımı yandırdın!

– Axı mən…

– Danışma, qoy öz dərdimnən ölüm.

Yetim Ləvənd təəccüblə Aşıq Heydərə baxdı, amma ustadının bu narahatlığınan heç nə qanammadı.

Elə bu vaxt içəri Məşədi Rəcəb gəldi. Salam verib bir Aşıq Heydərə, bir də qonağa baxıb başını buladı.

– Ay Heydər, bu nə qaş-qabaqdı səndə. Özgə vaxt olsa… Qonağın yanında.

– Əşi, sən bir əyləş. İş başqadı. Bu oğlan Yetim Ləvənddi, işi bir az dolaşığa düşüb.

– Nə kömək lazımdı, eləyim.

– Yox, yox, əşi, sən hirsli adamsan. Bu işi bir az da dolaşdırarsan.

– Axı bu nə işdi belə?

– Axırkələkli Molla Qaranın yanına getməliyik.

– Molla Qaradan mənim zəhləm gedir, təpəsindən bir güllə əksikdi.

– Başına dönüm əmi, bu işi mən özüm həll edərəm.

– Onda Axırkələyə gedəndə orada mənim Dəli Durmuş adlı bir dostum var, çətinliyiniz olsa, ona deyərsiniz.

– Yaxşı, Ləvənd, dur gedək.

– Ay kişi, qonaq bəlkə acdı.

Yetər arvad belə deyəndə Aşıq Heydər acıqlandı:

– Bəs bayaqdan niyə ortaya bir şey qoymursan?

O saat ortaya yemək-içmək gəldi. Yeyib-içəndən sonra Məşədi Rəcəb dedi:

– Heydər, necə bilirsən, elə də elə. Sizə yaxşı yol.

Bəli, Aşıq Heydərnən Yetim Ləvənd yola düşdülər. Gəlib Axırkələyə çatan kimi Molla Qaranın evinə gəldilər. Molla Qara Aşıq Heydəri görəndə boğazı qurudu. Elə can dərdi bunları qonaq elədi. Qonaqlar bir tərəfdə əyləşdilər, amma Aşıq Heydər qəlyanını doldurdu, bir-iki qüllab alıb sufra hazırlayan qızlara baxdı, nə fikirləşdisə dedi:

– Molla Qara, sən yaxşı bilirsən ki, sənin qapına niyə gəlmişəm.

– Niyə gəlifsən, o öz işindi, amma mənim qonağımsan.

– İndi bu beş qıza bir söz deyəcəm.

– Ay Aşıq Heydər, mən molla adamam, mənim evimdə Quran oxunur, bura aşıx-zad yığnağı deyil.

– Mən də sənin kimi molla deyiləm, mollalardan da xoşum gəlmir. Allaha da qurban olum, müqəddəs Qurana da. Qansan indi deyəcəyim sözlər də bir hikmətdi, əgər anlasan…

Görək burda Aşıq Heydər götürüb nə dedi:

Sallana-sallana gələn gözəlin,
Dördü qahqah çəksin, biri ağlasın.
Bir azca toxdasın, gəlsin özünə,
Verməsin özgəyə sirrin, ağlasın.

Çıxarsın qaranı, geyməsin qara,
Qara olan salıb onu azara.
Al-yaşıl geyinib çıxsın bazara,
Dərdi olan gəlsin bəri, ağlasın.

Aşıq Heydər deyər hər vaxt gördüyün,
Kor olsun düz işə salan kor düyün.
Allah qismət etsin barı toy-düyün,
Adını deyirəm Pəri ağlasın.

Söz tamama yetdi, amma Molla Qaranın az qaldı bağrı çatlasın. Öz-özünə dedi: «Əyə, bu Aşıq Heydər bilicidi, nədi. Bu nə bilir Pəri kimdi, mən oğlumu bazara yollamışam? Yox, bu betər adamdı, yaman pis yerdə ilişdim».

Elə bil Aşıq Heydər Molla Qaranın ürəyindən keçənləri oxudu. Odur ki, yenə sözə başladı:

Çoxdan ürəyində tutmuşdun məni,
İndi ki, gəlmişəm çıx meydanıma.
Aslansan, pələngsən, filsən, kərkədan,
Betər alov kimi ax meydanıma.

Qəlbini yandırır kinin, küdrətin,
Caduda, pitikdə çoxdu qüdrətin,
Sən bilən deyilsən qədir-qiyməti,
Gurla ildırım tək, çax meydanıma.

Mən Aşıq Heydərəm, sığınnam haqqa,
Şeytansan, olsa da başında cıqqa,
Qapına gəlmişəm, çıxarma hoqqa,
Yaxşı nəzər yetir, bax meydanıma.

Söz tamama yetdi, amma yenə Molla Qaranın halı betər dəyişdi. Özünü birtəhər ələ aldı:

– Aşıq Heydər, sən bir yaxşı adamsan, üstəlik də qonağımsan. Gəl bir-birimizin xətrinə dəyməyək. Molla evində sazın, sözün nə işi? Bu mənim qəlbimə dəyir axı.

– Eləmi?

– Bəli, bəli.

– Onda qulaq as.

Sözün ziyanı yox, sazım ondan çox,
Sənətkar görəndə xoflanma bir də.
Sərraf adamsansa, düz gözümə bax,
Sözümdə gövhər var, inci də, dürr də.

Sənətkar sayılmaz yoldan ötən, bil,
Haqqa biz də quluq, köləyik, sən bil,
Korsan, ya görmürsən, sil, gözünü sil,
Məni azca söylət, dindir bu yerdə.

Sənə qənim olmaz haqqın sahibi,
Şeytanlıq puluyla doldurma cibi,
Bu Aşıq Heydərin budur tələbi,
Boz üzün göstərmə mərd oğlu mərdə.

Söz tamama yetdi: Molla Qara ha özünü ələ almaq istəsə də bacarmadı. Qaşlı-qabaqlı dedi:

– Aşıq Heydər, bayaq dedim, yenə də deyirəm, sən aşıqsan, mən mollayam… Sənnən mənim sözüm tutmaz. Bu qədər yolu nahaq gəlifsən. Üstəlik, mənə də ağzına gələni deyirsən. Qonaqsan deyə başqa söz deyə bilmirəm. Bir də hələ tezdi… Qoy biz də bir fikirləşək.

Bu belə deyəndə Aşıq Heydər hirsli-hirsli qəlyanını doldurdu.

Bir-iki qüllab alandan sonra görək burada nə dedi:

Nə vardan qorxum yox, nə də ki, puldan,
Mərdlik adətimdi, bilnən, a molla.
Xeyir işdən ötrü tökmə qaş-qabaq,
Bizimlə bir yola gəlnən, a molla.

Nəyi bəyənmirsən, açıq söylə gəl,
Bu, Allah işidir, yoxdu bir əngəl,
Kişisən, kişi ol, mənə qurma pəl,
Bir dodağın qaçsın, gülnən, ay molla.

Bu sözü eşidəndə molla lap dəli oldu.
– Dəli-zad deyiləm ki, nəyə güləcəm ki?
Aşıq Heydər ona tərs-tərs baxıb aldı sözün möhürbəndini:

Niyə qaradasan, əzizin ölüb?
Sənin qaş-qabağın bizəmi qalıb?
Aşıq Heydər sənin mətləbin bilib,
Ya qızı ver, ya da ölnən, a molla.

Söz tamama yetdi, amma Molla Qara hirsindən-hikkəsindən qapqara qaraldı, amma dillənmədi. Aşıq Heydərin sinəsi dəmirçi körüyü kimi qızmışdı. Odur ki, dedi:
– Molla, sənə bir sözüm də var, qulaq as:

Dillərə salaram səni,
Od tutarsan, Molla Qara.
Xəstə olub sürünərsən,
Çox yatarsan, Molla Qara.
Başın dəyər neçə daşa,
Huşun itər, ağlın olmaz,
Düşərsən tozlu yollara,
Dərd satarsan, Molla Qara?!

Mollalardan xeyir gəlməz,
Neçə-neçə görmüşəm mən,
Üz-üzə gəlmişəm, neynim,
Paylarını vermişəm mən
El içində ad-sanım var,

Məclisimi qurmuşam mən.
Mən atlıyam, piyadasan,
Sən çatarsan, Molla Qara.

Cıdır, Ağbaba, Qağızman,
Qarsdan belə gəzən mənəm.
Şirin-şirin söhbətləri,
Nizamlayıb düzən mənəm.
Dərin-dərin dəryalarda,
Qəvvas kimi üzən mənəm.
Üzmə şərin ümmanında,
Tez batarsan, Molla Qara.

Söz tamama yetən kimi Aşıq Heydər yerindən qalxdı ayağa:

– Molla Qara, mən sənə dediyimi dedim, gəl inad eləmə.

– Yox, Aşıq Heydər, mən hələ düşünməliyəm.

– Onda bu gecə düşün, mən gedirəm.

– Axı…

– Yox, yox… Mən sənə qonaq ola bilmərəm. Əlbət, bir adam tapılar…

Aşıq Heydər, dalınca da Yetim Ləvənd eşiyə çıxdılar. Bunlar Dəli Durdunun evini xəbər alan kimi göstərdilər ki, filan evdi, getdilər oraya. Dəli Durdu onları çox mehribanlıqla qarşıladı. İşin nə yerdə olduğunu öyrənəndə, dəli beyni qızmadımı:

– Yox, bu Molla Qara lap ağ elədi. And olsun Allaha, onun atasını yandıracam. Ona divan tutmasam, bu bığlarını da qırxdıracam, adını da dəyişdirəcəm.

Aşıq Heydər işi belə görəndə, əlini yellədi:

– Yox, belə olmaz, Dəli Durdu. Bir gör mən hələ nə deyirəm.

Bu belə deyəndə Yetim Ləvənd də, ev sahibi və çox maraqlandılar. Aşıq Heydər qəlyanını doldurdu:

– Sabah Molla Qaranın özü adam yollayacaq buraya. Dəli Durdu, sən heç hirslənib eləmə. Ağama daxıl düşmüşəm, səbr elə.

Dəli Durdu qonaqlarını yaxşı ağırladı. Yeyib-içəndən sonra bir az oradan, bir az buradan söhbət eyləyib, başlarını atdılar yerə. Amma ilan vuran yatdı, biçarə Yetim Ləvənd yatmadı.

İndi görək Molla Qaranın başına nə gəldi. Mollanın adamları onun başına yığışıb dedilər:

– Sən çox səhv elədin, qapına gələn qonağı narazı yola saldın.

– Lap əcəb elədim. Görmürsünüz, mənə ağzına gələni dedi.

Bunların içində Uzun Əjdər adında biri vardı. O dedi:

– Molla Qara, bu səhvin altını çəkəcəksən. Bə sən bilmirsənmi, Aşıq Heydər haqq aşığıdı. Bir o qədər söz dedi, heç qanmadın. O nə bildi Pəri kimdi, nəçidi – bu bir. Niyə bazarı işarə eləyib keçənləri üzünə dedi – bu dörd. Pulunun hardan gəldiyini söylədimi – bu beş. Yenə deyimmi?

– Daha nə dedi? De görək.

Molla acıqlı-acıqlı Uzun Əjdərə əlini yellədi. O, yerindən dik qalxdı:

– Mən daha heç nə demirəm. Bir də onu deyirəm, Aşıq Heydər gedəndə sənə xəbərdarlıq elədi. Amma sən onu eşitmədin. Daha nə deyim?

O, qapını vurub çıxdı, adamlar da öz sözlərini dedi. Molla Qara baxdı ki, gecə yarıdan keçib, amma yuxusu gəlmir. Amma elə candərdi arvadına dedi:

– Arvad, yerimi sal. Bu Aşıq Heydər ovqatımı yaman korladı.

Arvad yeri açan kimi bu tirləndi yerə. Az keçmədi ki, onu yuxu tutdu. Azmı yatdı, çoxmu yatdı. Sabaha yaxın ayıldı ki, qan-tər içindədi. Dikəlib yerin içində oturdu. Gördüyü dəhşətli yuxudan hələ də vahimə içində idi. Bədəni əsə-əsə arvadına dedi:

– Ay arvad, bu nə işi idi mənim başıma gəldi?

– Nə olub ki?

– Yuxuda məni az qala boğub öldürürdülər…

– Əşi, yuxudu da…

– Yox,yox… dönə-dönə xəbərdarlıq elədilər: Gedib Aşıq Heydəri razı salmasan vay sənin halına! Dur sən evi qaydaya sal, mən də Aşıq Heydərin dalınca adam yollayım…

Bəli, Aşıq Heydəri çağırdılar. O, Dəli Durduynan, Yetim Ləvəndnən gəldi. Molla Qara Aşıq Heydərdən üzr istədi, çonra xeyir işə razılıq verdi. O günün sabahı toy başladı. Toyu Aşıq Heydər keçirdi. Bu əhvavlat da o vaxtdan dillərə düşdü.

# YETİM LƏVƏND İLƏ AŞIQ HEYDƏRİN QARŞILAŞMASI

Deyirəm bu söhbəti danışmamışdan qabaq bir-iki ustad kişiyi öz sözləriylə yada salaq, yenə söhbətimizə davam eləyək. Amma o sözlər ki, qəriblikdən, ayrılıqdandı… Çünki indi xeyli vaxtdı biz yurddan-yuvadan ayrı düşmüşük. Gərəkdi ki, bizim bu hal-əhvalımıza uyğun söz deyilsin. Xülasə, deyirəm qabaqca Yetim Əsgərdən bir söz deyək, ruhu şad olsun.

Müxənnət fələyin nəzərindəyəm,
Qəzaynan, xətaynan hədələr məni,
Yaxam əlindədi, qalmışam naçar,
Nə olsun tanıyır dədələr məni.

Yaş gedir, dərd artır, bel də bükülür,
Candan qüvvə gedir, nur də çəkilir,
Ürəyə xal düşür, bağrım sökülür,
Tutur tənələrə gədələr məni.

Əhli-hal tapmıram açam dərdimi,
Ona nişan verəm ata yurdumu,
Yetim Əsgər sevər elin mərdini,
İnsafdı, namərdlər didələr məni?!

Ustadlar bir deməz, iki deyər. Biz də yenə birini də Yetim Əsgərdən deyək, olsun iki.

Hardan, niyə gəldin, soruşma, qardaş,
O dağdan bu dağa güzardı düşdü.
Məni yurd-yuvamdan, eldən elədi,
Sədəmə toxundu, nazardı düşdü.

Əlindən iş gəlmir, eybinə kor ol,
Varda gözüm yoxdu, lap sahibkar ol,
Məni tanıyandan məni xəbər al,
Qəriblik qanıma azardı düşdü.



Dürlü sözləri var Yetim Əsgərin,
Bir zad deyil sənin anarı-bərin,
Mən indi qəribəm, yoxdu öz yerim,
Sanıram baxtıma məzardı, düşdü.

Ustadlar sözü iki deməz, üç deyər. Biz də birini Mağaraçıqlı Hasan xandan deyək, olsun üç.

En, ey könül, sən göylərdən,
Əhli-hal yerindədi,
Məqamın həmən məqamdı,
Cah-calal yerindədi.
Söz mülkünün ləl-cövhəri,
Qaradan gəldi ağa,
Çünki böyük zəhmətim var,
Var halal yerindədi.

Dərddən nələr çəkib başım,
Bilirik sən də, mən də,
Fələk məni tanıyıbdı,
Salıb qəmnən kəməndə.
Mən bir ürfan adamıyam,
Süvar olub səməndə,
Dolanıram oba-oba,
El, mahal yerindədi.

Hasanxanı gəl incitmə,
O ki, qırxlar quludu,
Safdı qəlbi, həm nəfəsi,
Könlü sözlə doludu.
Getdiyi yol haqq yoludu,
Şahi-mərdan yoludu.
Təbi qaynar, sözü lətif,
Pir, abdal yerindədi.

Bəli, Allah ustadlara rəhmət eləsin, keçək söhbətimizə. Aşıq Heydər Hacı Abbasoğlu Mahmud ağanın məclisinin nuru sayılırdı. Ağa ona aşıq kimi, şair kimi böyük hörmət eləyir, harya getsə, onu

aparırdı. Aşıq cavan vaxtı saz çalsa da, sonralar ana babasının sözüynən daha sazı yerə qoydu, amma avaznan elə oxuyurdu, az qalırdı ki, uçan quşlar da havada qanad saxlaya. Sözüm yox, yenə Mahmud ağaynan Aşıq Heydər Kəmərvana getmişdilər. İşlərini görəndən sonra, yəni orda məclis keçirəndən sonra onlar geri qayıdanda kəndin qırağında bir cavana rast oldular. Baxdılar, bu, cütün macından tutub yeri heç yaxşı əkə bilmir. Yeri əkməyin əvəzinə cızalayıb, zay eləyib bu. Odu ki, Aşıq Heydər Mahmud ağaya dedi:

– Ağa, əgər izn versən, bu cavana bir söz demək istəyirəm. Sinəmə bir neçə xana söz gəlib.

– İzindi, sən söz deməymində ol.

Mahmud ağa belə deyəndə Aşıq Heydər görək burda götürüb nə dedi:

Durma, macdan yaxşı yapış,
Xərək qoyub qaralama.
Ək ürəklə, həvəsiynən,
Gəl torpağı yaralama.

Haqosa bax, diqqət elə,
İşlə, çalış, gülə-gülə,
Bu obadan sən naz ilə,
Gəl özünü aralama.

Niyə oldu halın xarab?
Peşən olsun özünə bab.
Heydər deyər başqa iş tap,
Yeri-yurdu qaralama.

Bəli, söz tamama yetdi. Amma cavan oğlan öküzü əylədi. Alnının tərini slib atlılara, yəni Aşıq Heydərlə Mahmud ağaya yaxınlaşıb dedi:

– Düzdür, dediyinə iradım yoxdur, amma ağa özü məni məcbur elədi ki, get yeri sən ək. Mən də əkin işini bilən adam deyiləm. Mənimki daş işidir, ev tikirəm, mustuq yonuram, holuq düzəldirəm.

– Bə adın nədir ?

– Yetim Ləvənd.

– Soruşmaq ayıb olmasın, hansı tərəfdənsən?

– Axırkələkdənəm. Atam-anam öldü. Mən bir parça vaxtımnan düşdüm qapılara. Sağ olsun Usta Pirini, mənə sənət öyrətdi – güzaranım bu tərəfə düşür, o da belə...

Mahmud ağa bunu bir xeyli sorğu-suala tutdu, daha heç nə demədi. Yenə üzünü Aşıq Heydərə tutdu. Yəni görək Aşıq Heydər nə deyir bəs. Aşıq Heydər Yetim Ləvəndə dedi:

– Baxıram sinən söznən doludu. Bəlkə bir söz deyəsən.

– Ürəyimnən dedin, sən də cavab verərsənmi?

– Sən de görüm. Baxım, xoşuma gəlsə, mən də bir şey deyərəm.

İndi görək burda Yetim Ləvəndə nə dedi, Aşıq Heydər ona nə cavab verdi:

Kor baxdım mənimlə heç getmir yola
Yandırıb oddara hara gəlibdi.
Yığıb mənə verib dərdi, bəlanı,
Əzəldən belədir, qara gəlibdi.

***Aldı Aşıq Heydər:***

Boy-buxun, sir-sifət, cavanlıq səndə,
Bulud tək tutulub dolmağın nədi.
Dərd-sərini söylə, biz də bir bilək,
Heyva tək saralıb solmağın nədi.

***Aldı Yetim Ləvənd:***

Barı «hiş» də qanmır tərs öküz kimi,
Qəmi qabağıma düzür köz kimi.
Bircə faydası yox çürük qoz kimi,
Deyim bircə gün də kara gəlibdi.

***Aldı Aşıq Heydər:***

Qaradan qaradı o baxt dediyin,
Əlbət ki, varlıdı xoşbəxt dediyin.
Yerini alarmı hər vaxt dediyin,
Dərdi sinən üstə almağın nədi.

***Aldı Yetim Ləvənd:***

Feldardı, bal yağır yağlı dilindən,
Baş aça bilmirəm heç əməlindən.
Qurtarmaq olur ki, bunun əlindən.
Yetim Ləvənd bezib, zara gəlibdi.

*Aldı Aşıq Heydər:*

Aşıq Heydər deyər bir az tab elə,
Aç sinədəftərin, bir kitab elə.
Səxalı bəylərə bir xitab elə,
Baxtın qarasında olmağın nədi?

Söz tamama yetəndə Aşıq Heydər Yetim Ləvəndə dedi:

– Əyə, sən əməlli söz deyənsənmiş ki! İndi bir söz deyəcəm, mənə cavab verərsənmi?.

– Sən başla görüm, mən də sənə layiq bir-iki söz tapa bilərəmmi?.

Bəli, Aşıq Heydər burda yenə görürdü görək nə dedi:

Nə ucadı, nə alçaqdı,
Bu məqamlar kimdədi?
Gözəl işlər, gözəl peşə,
Böyük namlar kimdədi?
Pul oduna ömür verən
Nə qazanar dünyada?
Haqq ataşı, üzün nuru,
Dolu camlar kimdədi?

*Aldı Yetim Ləvənd:*

Mərd ucadı, namərd alçaq,
Uca məqam mərddədi,
Gözəl işlər, gözlə peşə,
Böyük namlar mərddədi,
Pul oduna yanan kəslər
Faniliyi qazanar,
Haqq ataşı, üzün nuru,
Dolu camlar mərddədi!

*Aldı Aşıq Heydər:*

Varü-dövləti, qızıl-gümüş,
Ləlü-göhhər nə şeydi?
Nədi söylə kişi işi
Bu dünyada nə yeydi?
Qara saçı nə ağartdı,
Əlif qəddi nə əydi?

Ağır məclis, şirin söhbət,
Qara damlar kimdədi?

*Aldı Yetim Ləvənd:*

Varü-dövlət, qızıl-gümüş
Aqillərə nə şeydi,
Kişi işi səxavətdi,
Eylik eləmək yeydi,
Qara saçı, əlif qəddi
Qoca fələk tez əydi;
Ağır məclis, şirin söhbət,
Qara damlar mərddədi!

*Aldı Aşıq Heydər:*

Mərd dediyin necə kəsdi?
İşi-gücü yoxdumu?
El içində yeri-yurdu,
Varı-yoxu çoxdumu?
Mala-pula meyl eləmir
Harda qurub taxtını?
Aşıq Heydər sual eylər
Şirin dəmlər kimdədi?

*Aldı Yetim Ləvənd:*

Mərd deyilən haqq elçisi,
Yaxşı bilir işini,
Əzəl başdan heç buraxmır
Yaxşılığın peşini;
El içində məclis qurar.
Mərdə verər aşını;
Yetim Ləvənd doğru söylər
Şirin dəmlər mərddədi!

Söz tamama yetəndə Aşıq Heydər baxdı yenə Yetim Ləvəndin sözü var deyən.
Odu ku, dedi:

– Baxıram yenə dənçiyində söz var. De görüm, nə deyirsən.

– Bu belə deyəndə Yetim Ləvənd yenə sözə başladı:

Bir yandan yetiməm, bir yandan kasıb,
Tale dərd şələsin belimə basıb.
Ataşlı zənciri boynundan asıb,
Kimsə pənah yoxdu, təkcə qalmışam,
Sitəmə tuşam.

*Aldı Aşıq Heydər:*

Darıxma darılma, dərdə qayım ol.
Əlbət, tanrı verər sənə da bir yol.
Ucadan ucadı çox adildi ol,
Hər vaxt pənahında saxlayar səni,
Gəl eşit məni.

*Aldı Yetim Ləvənd:*

Evsiz-eşiksizəm, simsarsız, fağır...
Nə məclis görürəm, nə də çal-çağır.
Dərd dərdin dalınca üstümə yağır.
Hələ indiyəcən kədər almışam,
Yuvasız quşam.

*Aldı Aşıq Heydər:*

Sən ki, söz deyəsən, simsar tapılar,
Açılar üzünə bağlı qapılar.
Dərddən sınıq könlün sözlə yapılar,
Qovarsan başından dumanı-çəni,
Gəl dərddən geni.

*Aldı Yetim Ləvənd:*

Yetim ləvənd deyər bir ustadım yox,
Saza həvəsim var, sözə ondan çox.
Aşıq Heydər, mənə yaxşı göznən bax,
Bu cavan yaşımda dərdə dalmışam,
Bir bağrıdaşam.

*Aldı Aşıq Heydər:*

Aşıq Heydər gördü sənin dərdini,
Həlbət bular el-obanın mərdini.
Qəm eləmə, mən bilirəm qədrini.
Gəl unut burada olub-keçəni,
Haqqa sal yönü.

Söz tamama yetən kimi Mahmud ağa bir qələm, bir kağız çıxarıb nəsə yazdı, sonra Aşıq Heydərə baxıb dedi:

– Aşıq Heydər, zəhmət olmasa, atdan düş, ver onu Yetim Ləvəndə, qoy getsin kəndə.

Bayaq Aşıq Heydər atı verdi Yetim Ləvəndə. Mahmud ağa dedi:

– Neçə aydı burda işləyirsən?

– Üç aydı.

– Yaxşı, ağa sənə 15-20 manat haqq verməlidi. Amma sən bu kağızı al, ver ona geri, dübara burya gəl... Özün də bir az çəpik ol.

– Bu saat.

Bayaq Yetim Ləvəndə ata minən kimi atı dəhmərləyib kəndə tərəf yol aldı. Aradan az keçmədi ki, Yetim Ləvənd geri qayıtdı, atdan düşüb onu sahibinə qaytaranda Mahmud ağa dedi:

– Yetim Ləvənd, min Aşıq Heydərin tərkinə. Deyirlər Aşıq Nəsib yaxşı aşıqdı. Səni onun yanına aparıram. Əlbət hünərin var, amma yenə xeyrinədi... Al bu da sənə yol xərcliyi.

Mahmud ağa Yetim Ləvəndə xeyli pul verdi. Yetim Ləvənd ağanı dualaya-dualaya pulu cibinə qoydu, Aşıq Heydərin tərkinə mindi. Gəlhagəl gəlib onlar bir kəndə çıxdılar. Mahmud ağa atını bir evin qabağında saxlayıb dedi:

– Bilirəm, Aşıq Nəsib burda olur.

Ona kimi qapı açıldı. Ev sahibi eşiyə çıxdı, gələnləri qarşıladı. Nökər-qulluqçu tökülüb atları tövləyə çəkdilər. Mahmud ağagili də evə apardılar. İçəri keçdilər ki, məclis qurulub. Aşıq Nəsib lap başda oturub qəlyan çəkir. Bunlar salam verib keçdilər başa. Aşıq Nəsib o saat Aşıq Heydəri tanıdı.

– Əyə, a qara Heydər. Mən harya gedirəm, gərək sən də oraya gələsən?

– Bə, neynim. Mən də belə adamam.

– Yanındakı bu cavan oğlan kimdi?

– Yetim Ləvənd.

– Axırkələkli cavandımı bu?

– Necə ki...

– Deyirlər bir az söz-zad deməyi var.

– Sən hardan bilirsən.

– Mənim bilmədiyim şey var ki?!

Aşıq Nəsib qəlyanı bir yana qoyub sazını sinəsinə basdı.

– Əyə, a qara Heydər, sən yaxşı söz deyənsən, amma sinəmə bir neçə xana yaxşı söz gəlib, deyim qulaq as.

İndii görək Aşıq Nəsib burda götürüb nə dedi:

Qırxların əlindən badə işmişəm,
Qəlbinin nurundan sözüm bol gəlir.
Dərdə alışmışam, düzü seçmişəm,
Sinəmin başına haqdan yol gəlir.

Meylim yox dünyada mala-dövlətə,
Pendir-çörək bəsdi, yemərəm kətə.
Mən tamah salmaram pişmişə, ətə,
Boğazdan, gödəndən axı ol gəlir....

Nəsibəm, sözümə sən də, yaxşı bax,
Yerdən öz-özünə qaynayır bulaq.
Yorğa yeriş nədi nə bilir ulaq?
Sağdan sonra əlbət, bir də sol gəlir.

Söz tamama yetən kimi Mahmud ağa aşığın qabağına bir onluq qızıl qoydu.

– Sağ ol, var ol, aşıq. Səndən bir xahişim var, bu oğlanı (əliynən Yetim Ləvəndi göstəridi) sənin yanına gətirmişəm ki, bunu özünə şəyirt götürəsən. Səsi də var, sözü də var... qalanını da sən bilirsən.

– Nə deyirəm. Mahmud ağa, amma bu cavanla ötəri deyişmək istiyirəm. Görək razı olacaqmı.

– Mən razıyam.

– Eləmi, onda gəl qabağa.

O saat Yetim Ləvənd keçdi Aşıq Nəsibin qabağına. Yenə

Aşıq Nəsib sazı sinəsinə basdı, görək nə dedi:

Ustadın, pirin kim, özün de kimsən,
Söz betər tutubdu harada səni?
Yoxsa natarazsan, bir ağlı kəmsən,
Xəcil eləmiyim burda səni.

*Aldı Yetim Ləvənd:*

Ustadım Əlidi, ol Şahi-Mərdan,
Yetiməm dərd üstə tutub söz məni.
Ağlı-huşu cəməm, ağlım başımda
Gəl sıxma-boğmuya salnan az məni.

*Aldı Aşıq Nəsib:*

Fağırsan, gədəsən, yoxsamı mərdsən,
Yoxsa özün boyda dünyaya dərdsən.
Olmuya bilmirəm, qurd oğlu qurdsan,
Dar yerdə qoyarsan qarada məni.

*Aldı Yetim Ləvənd:*

Fağıram, kasıbam, gədə deyiləm,
Nə də özüm boyda qada deyiləm.
Mən qurd oğlu qurdam – bilir bu aləm,
Dillənsə, ram edir telli saz məni.

*Aldı Aşıq Nəsib:*

Aşıq Nəsib deyər sözü uzatma,
Uca məqamlara əlini atma.
Mənim düz sözümə qaşını çatma,
Nədi dingildədən arada səni.

*Aldı Yetim Ləvənd:*

Yetim Ləvənd deyər sözüm uzanmaz,
Dərdə müştaq olan boşuna yanmaz.
Bir alçaq könüldü deyil ki, qanmaz.
Çağırar çöllərə gələn yaz məni.

Bəli, söz tamama yetdi. Aşıq Nəsib dedi:

– Yetim Ləvənd, sağ ol. Səndən yaxşı aşıq olacaq. Bu gündən səni özümə şəyird götürdüm.

Elə o vaxtdan Yetim Ləvənd Aşıq Nəsibə şəyird oldu. Bir neçə il onun yanında qaldı, aşıqlığın yolunu-izini öyrəndi. Allah sizləri də mətləbinizə çatdırsın.

# KƏRBƏLAYI HACI ABBAS OĞLU MAHMUD AĞA İLƏ AŞIQ HEYDƏRİN XOŞBİYA SƏFƏRİ

Bir gün Hacı Abbasoğlu Mahmud ağa Dələverə getmişdi, amma Aşıq Heydər də yanındaydı. Dələverdə Qara bəyin qonağıydılar. Qara bəyin Kərim adında bir yaxın adamı var idi. Bu Kərim həm yaxşı nağıl-dastan danışardı, həm də gözəl oxuyardı. Amma orasını da deyim ki, arada söz toxumağı da varıydı. Bəli, Qara bəyin evində xon qurulmuşdu. Yedilər, içdilər. Sonra Hacı Abbasoğlu Mahmud ağa Kərimə dedi:

– A Kərim, sən bir yaxşı dastan başda. Elə payızın bu vədələri daha yığnaqların vaxtıdı. Nə deyirsən?

– Mahmud ağa, mənim gözlərim üstə, amma Aşıq Heydər olan yerdə mən necə danışım.

– Biz burda qonağıq, ev sahibi sizsiniz.

– Amma qabaqca bir şey deyim, yəni bir-iki gün bundan irəli getmişdim Xosbiyaya. Bir olardı iyirmi beş-otuz cavan adam. Bellərinə xancal bağlayıb, bəzənib-düzənmişdilər. Düzü, cavanların bu formuda geyinib eləməsi məni çox təccübləndirdi. Yaxınlaşıb onlara salam verəndən sonra xəbər aldım ki, ay cavanlar, kimsiniz, nəçisiniz? Hamısı bir ağızdan dedilər, biz bəyik. Düzü, mat qaldım, daha nə deyim. Bu kəndin bir bu qədər bəyi ola, gör işin harasıdı. Mən gedəndə içlərindən Bəkir bəy adlı biri mənə baxıb əlini-əlinə vurdu.

– Mən sən deyən ağalardan deyiləm. Bəyəm, bəy, a kişi, elə bu yanımdakılar da...

– A bala, sən Hası Abbasoğlu Mahmud ağa qədər varsan yəni?

– Mahmud ağa kimdi mən olan yerdə...

Daha sözü iki eləmədim. Gördüm bu yekəxana gədə qan-qan deyir, çıxıb gəldim kəndə.

Bu sözləri eşidəndə Mahmud ağanın heç tükü də tərpənmədi. Kərim də sözünü burda kəsib dastana başladı. Yığnaq qurtaran kimi Mahmud ağaynan Aşıq Heydər eşiyə çıxdılar. Mindilər faytona. Mahmud ağa üzünü faytonçuya tutub dedi:

– Kişi, faytonu sür Xosbiyaya.

– Ağa, başına dönüm, gecədi axı?

– Sür, havaq çatarıq, çatarıq. Pulunu artıqlamasıynan vermişəm, yenə də verəcəm...

– Heyvanlar yazıqdır.

– Onda bir yerdə əyliyərsən, bir-iki saat dincələrik.

– Axı, soyuqdu, ağa.

– Kəndlərin birində qalarıq.

Daha faytonçü dinmədi. Bilmirəm, azmı getdilər, çoxmu getdilər, amma baxdılar, əyə bunların başları gedib gəlir. Yəni bunları yuxu belə tutub. Mahmud ağa faytonçüya dedi:

– Faytonçu, sür bu yaxın kəndə. Bir qapını döyüb qonaq olaq.

– Nə deyirəm.

Bəli, onlar kəndə çatan kimi bir qapını döydülər. Ev sahibi o saat qapını açdı. Baxdılar bu varlı-hallı bir adamdı. Ev sahibi o saat Mahmud ağanı tanıdı. Bir az söz-söhbətdən sonra yıxılıb yatdılar. Amma sabah açılan kimi, üzünüzə xeyirli sabahlar açılsın, Mahmud ağa Heydəri də, faytonçunu da oyatdı. Bir az nahar eyləyib düşdülər yola. Allah versin faytona, araba deyil ki, işini aşırmıya. Bəli, gəlib çatdılar Xosbiyaya. Mahmud ağa faytonu Alı ağanın qapısına sürdürdü. Faytondan düşdülər, ev sahibi qonaqları içəri apardı. Adamlarına göstəriş verdi. O saat heyvan kəsdilər. Qazan asıldı, xoruz-beçə də kəsildi. Aradan bir az keçmişdi ki, xörək hazır oldu, süfrə salındı. Mahmud ağa Alı ağaya dedi:

– Ağa, eşitmişəm kəndinizdə bir iyirmi-otuz bəy peyda olub, bu doğrudumu?

– Cavanlardı da... Hərəsinin bir 80-90, uzağı yüz can qoyunu var, özlərini bəy hesab eliyirlər.

– Xahiş eliyirəm, onları bura çağırtdırın. Görüm onlar doğrudanmı bəydilər.

– Baş üstə, çağırtdırım... amma qabaqca bir-iki tikə çörək kəsək, sonra nə desən mən hazıram.

Bəli, bunlar yeyib-içəndən sonra yenə ağa öz adamlarına tapşırdı gedib bəyləri çağırsınlar. Bir də baxdılar bir dəstə geyimli-keçimli adam Alı ağanın qapısına yığılıb. Alı ağa o saat gələnləri hörmətnən içəri apardı. Onlar keçdilər yuxarı başa. Yedilər-içdilər. Sonra söhbət başladı. Mahmud ağa dedi:

– Mən eşitmişəm sizin hamınız bəysiniz. Bu düzdümü?

– Düzdü, düzdü.

Mahmud ağa ona yekə-yekə danışıb cavab verənə baxıb başını buladı, sonra burda görək götürüb nə dedi:

Əsli zat olanın özü bəy olar,
Hər gədədən ağa olmaz, bəy olmaz.
Səxavət, mərifət ər oğlu ərdə,
Hər yetən ağılsız varnan bay olmaz.

Yüz qoyunu olmaq hələ var deyil,
Hər mənəm deyən kəs hünərvər deyil.
Qabaqda getməknən yabı nər deyil.
«Qarğa gəlib şüx tərlana tay olmaz».

Mahmud ağa sözün deyər bu başdan,
Yaxşı yeyin təzə kabab, lavaşdan,
Cavansınız durun çıxın yavaşdan,
Görməmişin axır işi yey olmaz.

Söz tamama yetən kimi Bəkir bəy Mahmud ağaya dedi:
– Ağa, sən sözünü dedin, indi də mən sənə cavab vermək istiyirəm.
– Buyur, buyur.
İndii görək Bəkir bəy nə dedi, nə söylədi.

Sən ağasan, biz də bəyik, sənə nə,
Çopur ağa, çox danışma, yeri get.
Yoxsa sənin dal qəddini bükərəm,
Sağ-salamat götür apar, səri get.

Dəli beynim gəl oyatma belə sən,
İstəmirəm sən əlimdə öləsən.
Aman vermən, əgər aman diləsən,
Qar suyu tək birdən-birə əri get.

Bəkir deyər bürda meydan mənimdi,
Mərd oğullar, müxənnətə qənimdi.
Nə çıxmısan, bu meydana, sən indi,
Qəfil gəldin, qəfildən də geri get.

Söz tamama yetən kimi Mahmud ağa göz-qaşnan işarə eyləyən kimi faytonçu eşiyə çıxıb ayaqlarının çamırını təmizləməmiş palçıqlı-palçıqlı özünü xalçanın üstünə saldı.

Bəkir bəy bunu görəndə coşdu.

– Ay eşşək, xalça-zad görmüyübsən?

Elə bunu dediyini gördü. O saat Mahmud ağa əllərini belinə aparıb qoşa tapancalarını çıxartdı.

– Kim yerindən tərpənsə beynini dağıdaram.

Heç kəsdən səs çıxmadı. Mahmud ağa cibindən bir yüzlük çıxarıb atdı faytonçunun üstünə.

– Apar bunu xırdala, o buladığın xalçanın əvəzinə bir təzə xalça al gətir.

Faytonçu pulu götürüb getdi, amma əliboş geri qayıtdı.

– Ağa, dükanda bu pula xırda tapılmadı.

Mahmud ağa üzünü bəylərə tutdu.

– Bəlkə içinizdə bu pulu xırdalayan ola.

Yenə heç kəsdən səs çıxmadı. Mahmud ağa pulu zornan ev sahibinə verdi:

– Götür ağa, bu o bulanan xalçanın əvəzinə...

Yenə ağa əlini cibinə salıb bir dəstə pul çıxartdı.

– Bəylər, bunlar da yüzlüklərdi. Burdakı ağalar, ev sahibi məni bağışlasınlar, çünki onlar təzə-təzə pul görmüyüblər ki, cibinizdə heç birinizin yüz manat pulu yoxdu. Amma adınızı bəy qoyubsunuz. Kişi olanın, yəni bəyin, ağanını pulu da olar, mərifəti də. Zoru da, zəri də... Bayaq biriniz mənə çopur ağa dediniz. Kişiyə gözəllik yapışmır. İgidlik, mərdlik yapışır. Belə deyilmi Aşıq Heydər?

– Belədi, amma izin versən bir söz də deyərəm.

– Buyur, buyur.

İndi görək Aşıq Heydər burda nə dedi. Amma üzünü tutdu Bəkir bəyə, yəni dediyim sözlər sənədi.

Gözün qızıb, ağlın itib,
Gəlibsən meydana sən,
Dayanmazsan sən, a bala,
Burada mərdana sən;
Qol qırılar, əng əzilər,

Sonra peşiman olarsan,
Ataşı salarsan betər
Əyilən gərdənə sən.

Dana kimi buynuz atıb
Kələ sürtünmə belə.
Gülünc olub el içində
Düşərsən dildən-dilə,
Köməyinə çatan olmaz
İstər yüz ağız mələ,
Tay olarsan gədələrə,
Oxşarsan xortdana sən.

Aşıq Heydər haqqı öyər,
Öyüdünü eşit gəl,
Kolu-kosu tez aparar,
Qopsa əgər qəfil sel,
Kor deyilsən sən, ay gədə,
Gözlərini yaxşı sil;
Doğru söz de, düşün danış,
Uymaynan şeytana sən.

Söz tamam yetdi. Dinməz, söyləməz Bəkir bəy, dalınca da yoldaşları çıxıb getdilər. Bir də onlar oldu ağızlarına bəy sözü gətirmədilər. Bu əhvalat da elə o vaxtlardan ağızlara düşdü.

# AŞIQ HEYDƏRİN PƏNLƏVAN HEYDƏRLƏ GÖRÜŞMƏSİ

Aşıq Heydərin cavan vaxtlarıydı. Babası Qurana and içdirib ona at bağışlasa da, düzü, kefi çox pozulmuşdu. Amma söz deməkdən qalmırdı. Elə avaznan oxuyurdu ki, az qalırdı göydə uçan quşlar da qanad saxlaya. Bir gün Aşıq Heydərin yolu Çıldır tərəfə düşdü. Yay vaxtıydı. Bu gedib kəndlərin birinə çıxdı. Gördü kənddən bir az aralı bulağın başında beş-altı nəfər oturub söhbət eliyirlər. Həm yorulmuşdu, həm də susuzdu, ciyəri yanırdı. Odu ki, Aşıq Heydər bulağın başına gəlib bu oturanlara salam verdi, dizlərini yerə qoyub dodaqlarını bulağın gözünə dayadı. Buz kimi sudan doyunca içib durdu ayağa. Bu adamlardan xeyli aralıda oturdu ki, bir az dincini alsın. Elə bu vaxt bir uzun boylu bir adam da gəlib çıxdı. Bulaqda əl-üzünü yuyub bir xeyli su içəndən sonra bulağın başında oturanlara tərəf gəlib salam verdi, dedi:

– Əyə, sizin adamlar nə namərd admlarmış!? Yolda məni soymaq istədilər... Dörd nəfər birdən üstümə düşmüşdü.

Bu belə deyəndə bu adamların içindən yekə gövdəli, çal bığlı kişi acıqlandı.

- Əyə, sən kimsən ki, bizim adamlara namərd deyirsən. Bu bir, ikincisi, sən özün kimsən.

– Mən pəhlivanam. Adıma pəhlivan Heydər deyirlər. Siz kimsiniz?

– Biz hamımız dəlləyik. Bax bu cavan oğlan da (Aşıq Heydəri göstərdi) elə qabağınca gəlib. Nə iş sahibidir, bilmirik. Sən deyirsən pəhlivansan ha... Bəh-bəh, pəhlivanlar qırılıb, elə sən qalıbsan?! Amma heç pəhlivana-zada oxşamırsan, bazburutlu deyilsən.

– Kişi, deyəsən, sən xata gəzirsən... Daha günah səndən düşdü.

Əyə, bu uzun adam o saat meydanı dolanmağa başladı. Ona kimi dəlləklər də bir-birinə göz-qaşnan qandırdılar ki, lap yetirdi, bu həddini aşdı, bir gücümüzü yoxluyaq. Pəhlivan qurşağa kimi soyundu. Yenə başladı hərlənməyə. O, üzünü meydana tutub dedi:

– İndi kimin hünəri varsa, gəlsin meydana. Amma güləşməmişdən qabaq deyişmək lazımdı. Bu şərtdi. Qabaqca kim bunu bacarsa gəlsin meydanıma.

Bu belə deyən kimi Aşıq Heydər kirimişcə qalxıb keçdi bunun qabağına. Pəhlivan təəccüblə buna baxdı.

– Əyə, sən gəlirsən qabağıma.

– Bəli, mən deyişməyə gəlmişəm. Pəhlivanlıq mənim işim deyil, amma sözdə ustayam.

– Ay bərəkallah, xoşum gəldi səndən. Onda belə elə, bulaqdan iki iri qabda su gətir, sonra soyuq sudan başıma tök, bəlkə bir az hirsim soyuya. Yoxsa bir xata çıxardaram, yaxşı düşməz.

Aşıq Heydər o saat deyiləni yerinə yetirdi. Yenə pəhlivan meydanı dolanmağa başladı.

– Hə, nə deyirsən, a cavan oğlan? Heç sənin adını da xəbər almadım, adın nədi. Qabağa sən düşürsən, yoxsa mən?

– Mənim də adım Heydərdi, qabağa sən düş.

– Sənin də adın Heydərdi, nə olar. Onda qabağa mən düşürəm. İndi görək burda pəhləvan Aşıq Heydərə nə dedi, o ona cavab verdi.

Mərd kişinin hər bir yanda
Kişi kimi cəngi var;
Gədə olan boş danışar,
Boş qafası, əngi var;
Dünya binnət olan gündən
Qara-ağ gedir qoşa;
Hər çiçəyin ayrı ətri,
Hər otun rəngi var.

*Aldı Aşıq Heydər:*

Dediyini yaxşı qandım,
Hər yerin pələngi var,
Kiminin xoş sifəti,
Kiminin bəd rəngi var;
Yaxşı-pislə qoşa gedər,
Bu dünyada yana-yana
Tula ayrı, köpək ayrı,
Bir də maşqı, şəngi var.

*Aldı Pəhlivan Heydər:*

Meydan mərdin, güc kişinin,
Xata fələyindi, bil;
Baş girləmək gədənindi.
Fənd də tüləyindi, bil.
Sənin işin güləş deyil,
Boşuna girdin bura
Gir dizdədi, taqət canda
Güləşin öz həngi var.

*Aldı Aşıq Heydər:*

Mərdə tanrı hər şey verib,
Bilirsən bunu sən də,
Sözlərimə sən baxırsan,
Batıb noğula, qəndə;
Mən də sözün aşiqiyəm
Niyə durum ki, gendə
Güləşmirəm, deyişirəm
Sözün də bir səngi var.

*Aldı Pəhlivan Heydər:*

Bu Heydəri görən bilir,
Az danışar, az deyər,
Yüz düşünüb, yüz danışıb
Mətləbini düz deyər,
Müxənnətə yön çevirməz,
Öz-özünü gözlüyər;
El yanında üzü ağdı,
Düzlükdən çələngi var.

Söz tamama yetsə də yenə pəhlivan Heydər meydanı dolandı. Sinəsi doluydu deyə görək yenə nə dedi:

Qürrələnib danışırsan,
Bir az da asta getnən,
Yaxşılığa arxalanıb
Tanışa, dosta getnən

Ürfanlığa işarə ver,
Xırxanı da yada sal,
Dərvişləri gətir dilə,
Məclisə usta getnən.

*Aldı Aşıq Heydər:*

Cırnamaram bu sözündən
Yolumu əyri getməm;
Sözlərimin bir kimsəyə
Olmasa xeyri getməm.
Xeyr olsun, fayda olsun,
Birdi mənə hamısı;
Üzülmərəm öz elimdən,
Elimdən ayrı getməm!

*Aldı Pəhlivan Heydər:*

Mən nə dedim, sən nə dedin,
Sufilərdən bir söz aç,
Quru sözdən, boş söhbətdən,
Nəzər eylə  uzaq qaç,
Yahu söylə, nurdan söz sal.
Bir özün də işıq saç,
Dərdlənməyə, aha-ufa
Dolanıb yasda getnən.

*Aldı Aşıq Heydər:*

Ürəyi saf, qəlbi geniş,
Sufinin sözü nurdu,
Yolunu haqqa yetirdi,
Tanrı dalında durdu;
Söz açdıqca dərvişlərdən
Məni gül ətri vurdu;
Ayrı ətir istəmirəm,
Yox bundan qeyri, getməm!

*Aldı Pəhlivan Heydər:*

Heydər deyər yatdı hirsim,
Kef açıldı-üz güldü,
Lətif sözdər ağla batdı,
Dodaq qaçdı, göz güldü,
Bərəkallah, pis deyilsən,
Nura batdı üz güldü,
Tez sağalar şafa tapar
Xəstənin üstə getsən.

*Aldı Aşıq Heydər:*

Haqqa düzün məclisində
Kef açılar, üz gülər
Aşıq Heydər yaxşı qanır,
Sözlə ürək güzgülər,
Yüz ölçər, bir biçər,
Öz yolunu düz bilər.
Müxənnətin məclisi nə,
Fitnədi seyri, getməm.

Söz tamama yetdi, amma dəlləklər çox bidamaq qaldılar. Bunlar elə bilirdilər ki, pəhlivan Aşıq Heydərlə güləşib onun qol-qıçını sındıracaq, amma belə olmadı. Oydu ku, bunlar bir-birinə baxıb qortdaşdılar. İşi belə görəndə pəhlivanın tərs damarı yenə tutmadımı.

– Əyə, ay aşıq, o qabdakı sudan başıma əndər, yenə hirsim tutdu. Deyən bir xata olacaq.

Bu deyiləni aşıq yerinə yetirdi, amma dəlləklərin belə hərəkəti onu yaman acıqlandırdığı üçün Aşıq Heydər üzünü onlara tutub görək nə dedi:

Ülgücə ülgüc deyərlər
Kəsəri lap çox olsa da.
Mərdin dərdi böyük olar,
Gözü-könlü tox olsa da.

Mən nərəm deyən bərbər də,
Əsib-coşur xəlbət yerdə.
Arada saxlamaz pərdə,
Edər pislik yox olsa da.

Heydər deyər gədə pisdi,
Əlimdəki cam da misdi.
Bilməz soyuq, bilməz isti,
Sözü acı ox olsa da.

Bu sözünü deyib qurtaran kimi dəlləkləri od götürdü:

– Çox yekə gedirsən, xata çıxardarsan ha!

Dəlləklər yerdən səs-küy salanda pəhlivan onların ağzından vurdu:

– Demək iş var ki, aşıq belə dedi. İndi səs salmayın. Yenə bir sözüm qalıb, deyim sonra.

– Görək yenə pəhlivan nə dedi, Aşıq Heydər ona nə cavab verdi.

Bu dünyanın qarası çox,
Ağı, da baxtabaxtadı.
Öləni çox, itəni çox,
Sağı da baxtabaxtadı.

*Aldı Aşıq Heydər:*

Fələyin qəhri az deyil,
Xeyri da baxtabaxtadı.
Nə bilirsən nə olacaq,
Xeyirnən şər qabaqdadı.

*Aldı Pəhlivan Heydər:*

Kasıbın olur yavanı,
Mərdlərə qaynayar qanı.
Saf ürəyi, quru canı,
Dağı da baxtabaxtadı?

*Aldı Aşıq Heydər:*

Kasıb könlü geniş olar,
Yolu yoxuş-eniş olar.
Dəmə də bir dönüş olar,
Tək çörəyi tabaxdadı.

*Aldı Pəhlivan Heydər:*

Heydər, zaman belə döndü,
Qalxan qalxdı, enən endi.
Çıraq yandı, qəfil söndü,
Yağı da baxtabaxtadı.

*Aldı Aşıq Heydər:*

Heydər deyər mərd sağ olsun,
Biri min bir budaq olsun.
Kefi çağ, üzü ağ olsun,
Onun gözü qabaqdadı.

Söz tamama yetən kimi pəhlivan Heydər Aşıq Heydərin qaşqasından çəkib öpdü:

– Halal olsun sənə. İndi sən bir yanda dur. Mənim işim dəlləklərnəndi.

Sonra yenə meydanı dolanıb dedi:

– Gedin zurnaçı, toyçu gətirin, bir də bir kəndir…

Bəli, deyilənləri yerinə yetirdilər. Pəhlivan kəndiri əlinə alıb qara zurnanın sədaları altında oynaya-oynaya dedi:

– Dəlləklər, hansınız gücünüzü sınamaq istəyirsiniz?

Onların heç birindən səs çıxmadı. Onda yenə Pəhlivan Heydər Aşıq Heydərə işarə elədi ki, durmasın, onun başına soyuq su töksün. Yəni yenə hirslənib. Bu onun başına bir az su tökən kimi pəhlivan zorba dəlləyin üçünü də yanına çağırdı. Bunların belinə kəndiri yaxşı bağlayan kimi güc verib onları sağ əlli göyə qaldırdı. Yenə başladı oynamağa. O qədər oynaya-oynaya o baş bu başa getdi ki, dəlləkləri yerə qoyanda üçü də canbəsər qaldılar. Pəhləvan kəndiri onların belindən açandan sonra da başları hərlənirdi. Xüləsə, bir təhər keçdilər öz yerlərinə. Amma bunlardan birinə bu çox əsər elədi və o biri yoldaşlarına işarə elədi ki, Mahmud ağanın bir dəli buğası var. Get

xəbər elə, qoy naxırçı naxırı bu tərəfə gətirsin. Pəhlivan da gücünü sınasın görək.

Pəhlivan çox ayar adamıydı. Bunu o saat başa düşdü.

– Tez eləyin, tez eləyin. Görüm bu deyilən buğa çoxmu vurağandı?

Bəli, bir az keçəndən sonra naxırçı naxırı yaxına gətirdi. Pəhləvan dalı-dalı, çəkilə-çəkilə buğanı düz gətirdi adamlar yığılan yerə. Buğa acılı-acılı böyürüb başını aşağı əydi, cumdu pəhlivanın üstünə. Pəhləvan cəld tərpənib onun buynuzlarından yapışdı. Necə güc verdisə buğa böyürüb qabaq ayaqları üstə çökdü. Pəhləvan bir əliynən onun boynundan necə sıxdısa, buğanın dili bir qarış eşikdə qaldı. Sonra Pəhlivan o biri əliynən buğanın belindən elə yapışdı ki, az qaldı buğanın beli sınsın. Pəhləvan dedi ki, buğanın sahibi kimdisə nəmər versin, yoxsa onun belini qıracağam.

O saat geyimli-keçimli bir kişi irəli gəldi. Cibindən bir niqalay yüzlüyü çıxartdı, bir cibindən də bir ovuc qızıl, verdi pəhlivana.

Pəhlivan buğanı buraxan kimi heyvan çıxıb getdi naxırın içinə. Dəlləklərdən biri ölüsü ölmüş kimi gəldi bu geyimli-keçimli kişinin qabağına:

– Bağışla, Mahmud ağa, bu gün sənin üzünü qırxmamışam, burda başım qarışdı.

Mahmud ağa deyilən kişi dəlləyə heç nə deməyib gülümsədi, deyəsən pəhləvanın qocaqlığı kişinin kefini açmışdı. Yoxsa ağa çox inadcıl adamıydı, dəlləyi matrağın altına salacaqdı. Amma dəlləyin baxtı onda gətirdi ki, pəhləvan ağanın xoşuna gəldi. Odur ki, dedi:

– Ay Vəli, eybi yox, bu gün olmasın, o biri gün olsun. Amma mən indiyə qədər bilməmişəm sənin pəhləvanlığın da varmış?!

Bu belə deyəndə dəllək başını aşağı salsa da, ağa yenə qəhqəhəynən güldü. Sonra adamlarına dedi:

– Tez iki yüyrək at gətirin. Birini pəhlivana verin, birini də bu aşığa.

Bəli, atları gətirən kimi Mahmud ağa öz atını çəkib mindi. Pəhləvanla Aşıq Heydərə dedi:

– Atlarınızı minib dalımca gəlin, siznən mənim işim var.

Onlar daha ağ bir, qara iki demədilər. Ordan düz gəldilər Köhnə İbişə. Mahmud ağa bir evin qabağında atını saxladı:

– Çatdıq.

O saat içəridən adamlar çıxdılar. Atları tövləyə, qonaqları içəri apardılar. Divar boyu taxtın üstündə oturanlar ortada tırınqı deyən iki nəfərə diqqətnən qulaq asırdılar. Trınqı deyənlərdən biri Misgin Tağı, o biri Çoban Əliydi. Onu da deyim ki, nobat Misgin Tağıya gəlmişdi.

Odur ki, Misgin Tağı gözəl avaznan tırınqıya başladı.

Nə zamandı yollardayam, düzdəyəm,
Bu ayrılıq qoymur özüm gözdüyəm.
İstiyirəm ürəyimcə söz deyəm,
Bizim dağdı o tərəfdən görünən.

Nə zamandı Ağbabaya getmirəm,
Deyib-gülüb qəlbini şad etmirəm.
Bircə gecə şirin-şirin yatmıram,
Bizim dağdı o tərəfdən görünən.

Nə zamandı yönüm düşmür kəndimə,
Kafır gəlib ağu qatıb qəndimə.
İnanıram öz özümə zəndimə,
Bizim dağdı o tərəfdən görünən.

Söz tamama yetdi. Amma zalım oğlu elə yanıqlı oxudu ku, hamı mətəl qaldı. Mahmud ağa elə ayaq üstəcə qalan pəhləvanla Aşıq Heydəri bir tərəfdə əyləşdirdi. Misgin Tağı dərinnən bir ah çəkib dedi:

– Daha neynim, Baxçalıya gedə bilmirəm. Pis adam Allah lənət eləsin, mənimki belə düşdü. Amma bir tırınqı da deyəcəm.

Bəli, bu genə tırınqıya başladı.

Yana-yana dolanıram elləri,
Bada verib ayı, günü illəri.
Əsib gəlir düz bu yana yelləri,
Bizim dağlar o tərəfdən boylanır.

Yana-yana dolanıram ah çəkib,
Yurd həsrəti sinəm üstə, dərd çəkir.
Zalım fələk düz başından dərd tökər,
Bizim dağlar o tərəfdən boylanır.

Yana-yana dolanıram, xeyri nə,
Gedəmmirəm el-obanın seyrinə.
Baş qaldırıb qəriblərin xeyrinə,
Bizim dağlar o tərəfdən boylanır.

Söz tamama yetdi. Misgin Tağının kövrək səsi, qəmli oxuması Aşıq Heydəri möhkəm tutdu. Birdən çiyninə dəyən bir əl onu sanki yuxudan ayıltdı. Çoban Əliydi.

– A bala, yatıbsan nədi. Sənnənəm axı. Bəri gəl, bizim yanımıza. Görək sənin nə sözün var. Mənim sənin butalı olduğunnan da, məcarandan da xəbərim var.

– Necə?

– Sən gəl burya. Burda otur. Mən də sözümü deyim.

Bu keçdi ortaya, Çoban Əligilin yanında oturan kimi

Çoban Əli sözə başladı:

Bir sarıköynəyin yandın oduna!
Düşdün çöldən-çölə divanə kimi.
Oduna bir kimsə su da səpmədi,
Qəlbin yanıb oldu viranə kimi.

Durub dincəlmədin eşq ataşından,
Bir kömək görmədin yar-yoldaşından.
Qoruna bilmədin qəmin daşından
O yıxıq qəlbini qurana kimi.

Çoban Əli deyər haqqı danma gəl,
Mərdin qabağına çıxar yüz əngəl.
O qara baxtınan olursan mətəl,
İndi dolanırsan pirana kimi.

Bu yerdə Aşıq Heydər aldı görək nə dedi

Haqqı dana bilməm, önündə qulam,
Tez-tez incitsə də dərdi-sər məni.
Çöllərə düşəndən cavan yaşımdan,
Təbim moc verdikcə tərpədər məni.

Kim uzaq oldu ki, eşq ataşından,
Çoxu məğlub çıxdı dərd savaşından.
Yolumu hey saldım bulaq başından
Qəm də etdi belə dərbədər məni.

Aşıq Heydər deyər yatdığım yerdə,
Ərənlər əreni üstümdə durdu.
Nur dolu badəni əlimə verdi,
İçdim, tutdu odu bir qədər məni.

Bəli söz tamama yetən kimi Çoban Əli Aşıq Heydərin qaşqasından öpüb dedi:

– Halal olsun sana ananın südü.

Mahmud ağa da irəli gəldi, Aşıq Heydərə nəmər verdi.

– Ay Heydər, daha bu gündən sən oldun mənim adamım. Mən harya getdim, səni də yanımca aparacağam. Nə ehtiyacın olsa, mən ödüyəcəyəm.

Elə o gündən Aşıq Heydər Mahmud ağanın yanında aşıqlıq eləməyə, məclis aparmağa başladı.

# AŞİQ HEYDƏRİN CƏNUBİ AZƏRBAYCANA GETMƏSİ

## AĞBABANIN GÖZ YAŞLARI

Türkiyənin vəziyyəti ağır idi. Bir tərəfdən də namərd ermənilər baş qaldırmışdılar. Onlar 1918–ci ildə quldur Andranikin başçılığı ilə hərəkətə başlamışdılar. İşin çətinliyi onda idi ki, Hacı Abbasoğlu Kərbəlayi Məhəmməd bəyin könüllülər alayı da Çıldırın müdafiəsinə qalxmışdı, Ağbabadan uzaqlarda düşmənə qarşı vuruşurdu. Əli silah tutanlar bir nəfər kimi cəbhəyə getmişdilər. Onlar türklərlə bərabər yunanlara, ingilis və başqalarına qarşı qəhrəmanlıqla vuruşurdular. Ağbabanın kəndlərində arvad–uşaq, bir də qocalar qalmışdı. Erməni nizami qoşunları Ağbabaya hücum etdilər. Çox az adamda berdanka, mauzer, ya da üçatılan, beşatılan vardı.

1918- ci ilin oktyabr ayından etibarən Türk qoşun birləşmələri Gümrü və Gümrü ətrafı azərbaycanlılar yaşayan yaşayış məntəqələrini tərk edib geri çəkilməyə başladılar.İngilislərlə bərabər bu bölgələrə erməni dviziyaları yerləşməyə başladı.

Erməni baş komandanı Dronun göstərişinə əsasən 1 –ci və 4- cü şərqi erməni dviziyaları  Gümrü, Şörəgəl, Ağbaba məntəqələrində azəri türklərinə qarşı divan tutmağa başladılar.

Ermənilər yaxşı silahlanmışdılar. Gümrü, Şörəgəl və Ağbaba müdafiyəsiz qalmışdı.

Vəziyyətin ağırlığı adamları İrana köçməyə vadar etdi. Bu hadisələr 1919-cu ilin əvvəllərindən başlandı.

1919-cu ilin fevralında İranın konsulu İbrahimxəlil Ağbabaya gəldi. O, adamlara dedi:

– Ey müsəlman qardaşlar, narahat olmayın, sizin İrana köçməyiniz üçün nə mümkündürsə eləyəcəyəm. Təbii ki, təhlükəsizlik tədbirləri də görəcəyəm.

Adamlar bu sözləri eşidəndə xeyli sevindilər, bir az rahat oldular. İbrahimxəlil əvvəlcə əhalini siyahıya almağa başladı. Bu işə xeyli adam cəlb edildi. Siyahıyaalma mart ayında başa çatdı. Bu iş

sona yetən kimi ağbabalılara üzü yaşıl cildli müvəqqəti pasportlar paylandı. İbrahimxəlil ermənilərlə danışıqlar aparıb ağbabalıların təhlükəsizliyinin təmin edilməsi haqda razılıq aldı. Amma ermənilər buna axıra qədər riayət etmədilər.

Müvəqqəti pasport alan adamlar yola düşmək üçün arabalarını hazırladılar. Yol üçün azuqə, yorğan–döşək və s. götürüb nə vaxt yola düşəcəklərini səbrsizliklə gözləməyə başladılar. Aşıq Heydər də, qohumları (əmisi Məşədi Rəcəb, oğlanları Kərim, Rəhim) ilə iki araba hazırladılar. Arabanın birində Aşıq Heydər, onun arvadı Yetər, oğlu Rəhim, o birində Məşədi Rəcəb və onun ailəsi, bir də Aşıq Heydərin qardaşı Molla Hüseynin 14–15 yaşlı oğlu Qənbər əyləşmişdi. Aşıq Heydərin dostu Kərbəlayi Şabanın ailəsi də onların arabalarının yanında dayanmışdı. Xəbər gəldi ki, yola düşmək olar. Arabalar yola düşmək istəyəndə bir nəfər Məşədi Rəcəbin yanına gəlib dedi:

– Məşədi Rəcəb, Murtuz ağa səni çağırır. O tərəfdən gəlib, əcəla işi var. Məşədi Rəcəb iki–üç ay öncə Ağbabanın ermənilər tərəfindən mühasirədə saxlanması vəziyyətini müzakirə edən vaxtı Murtuz ağa ilə mübahisə etmişdı. Amma buna baxmayaraq, onunla görüşməyə getmək istəyəndə Aşıq Heydər əmisinə dedi:

– Ay əmi, bu neçə işdi, mən anlamıram. Adamlar silahsız, köməksiz qalıblar, ermənilərin törətdikləri qətliamların ardı-arası kəsilmir, Andranikin qoşunları silahsız müsəlmanları ot kimi biçir.Bəs bu millətə yazıq deyilmı? Ay əmi, sən deyirdin bizim belə gücümüz var, bəs o gücünüz hanı? Bu Murtuz ağa indiyə kimi harada qalmışdı? İndi birdən peyda oldu?! Sən də indi onun sözüynən onun yanına gedirsən.

– Heydər, sən heç darıxma, Murtuz ağa Qərib ağanın evindədi. Qərib kişi çox ağıllı adamdı, Heydər. Bir də…Murtuz ağanın özü gəlməyib, onu göndərən var. Aşıq Heydər baxdı ki, yox, əmisinin tərs damarı tutub, daha heç nə demədi. Məşədi Rəcəb çıxıb getdi. Aradan xeyli keçəndən sonra Məşədi Rəcəb geri qayıtdı, amma kişinin qaşından–qabağından zəhər yağırdı. O, Aşıq Heydərə dedi:

– Daha mən İrana getmirəm, kənddə qalacam. Heydər, gəl sən də getmə, kənddə qal.

Aşıq Heydər bu sözləri əmisindən eşidəndə az qaldı dəli olsun. Acıqlı–acıqlı dedi:

– Sən ki, İrana getmirdin, niyə mənim mal–heyvanımı su qiymətinə satdırdın?

– Ay Heydər, mən özüm də mal–heyvanımı sən deyən qiymətə satmadımmı? Satdım. Əvəzində də bir at, iki mauzer almışam. Mənim də sənin kimi heç nəyim qalmayıb. İndi ki, məni eşitməyib İrana gedirsən, sənə yaxşı yol.

– Nə deyirəm, əmi! Onda biz gedirik, salamat qal.

– Allah amanında.

1919–cu ilin aprelində adamlar yola çıxdılar. Böyük araba dəstəsi gəlib Qaraçanta kəndinə çatdı. Çünki İrana köçənlər buraya toplanmışdılar. Arabaların sayı–hesabı yox idi, kənd qələbəlikdi. İranın səlahiyyətli nümayəndəsi İbrahimxəlil adamlara müraciətlə dedi:

– Müsəlman qardaşlar, ermənilər yolu kəsiblər, hələ danışıqlar gedir. Onlar torpaqbasdı pulu istəyirlər. Hələlik on–on beş gün burada gözləməliyik. Amma Məşədi Rəcəbin sözləri heç Aşıq Heydərin yadından çıxmadı. Əmisinin sözü onu yaman tutmuşdu. O, öz–özünə əzab çəkir, deyinirdi:

– Mən nə edim, Allah məni uşaq ikən yetim qoydu, əmimin himayəsində böyüdüm. İndi… Kaş mən də əmim kimi silah tutan olaydım, amma… amma Tanrı mənim əlimə saz, dilimə söz verdi.

Aşıq Heydər birdən–birə xəstələnib yorğan–döşəyə düşdü. Arvadı Yetər, gəlini Bəsdi onun qulluğunda dursalar da, kişi özünü çox pis hiss edirdi. Yetər arvad isə öz- özünə deyinirdi:

– Dilim–ağzım qurusun, birdən kişi ölər, onda biz nə edərik?!

Bu əhvalatdan üç gün keçəndən sonra Məşədi Rəcəb dörd nəfər Ağbaba Süvari Alayının igidləri ilə Qaraçanta kəndinə gəldi. Atlılar da, Məşədi Rəcəb də təpədən dirnağa kimi silahlı idilər. O, Aşıq Heydərin böyük oğlu Kərimi çağırıb dedi:

– Durun, arabaları qoşun, ardımca gəlin.

Kərim deyiləni yerinə yetirdi. Aşıq Heydərgilin köçü Düzkəndə yolu düşdü. Ömər dərəsi deyilən yerə çatanda Məşədi Rəcəb dedi:

– Burdan o tərəfə qorxu yoxdu. Mən qabaqda gedirəm, siz də yavaş–yavaş gəlin.

Bu vaxt Aşıq Heydər yataqda xəstə yatırdı. Arabanın oxu daşa dəydi, Aşıq Heydər gözlərinin açdı. Dərhal Kərimdən soruşdu:

– A bala, hara gedirsiniz?

– Düzkəndə. Əmim gəlmişdi. Dedi geri qayıdın, biz də…

– Tez arabaların ağzını geri çevir.

Kərim o saat atasının dediyinə əməl etdi, arabanın ağzını geri döndərdi. Yetər arvad işi belə görüb dedi:

– A kişi, bəlkə elə əmin düz deyir. Sən də xəstəsən, gəl geri qayıdaq. Aşıq Heydər arvadından bu sözləri eşidəndə bərk acıqlandı.

– Haçannan mənə ağıl qoyan olmusan? Qoy yolumuzu davam eləyək. Onlar gəlib Qaraçanta kəndinə çatanda Aşıq Heydər dərindən nəfəs aldı. İki gündən sonra onlar İrana yola düşdülər. Aşıq Heydər xəstə olsa da, xəstə olmasını büruzə vermirdi. Yol boyu ermənilər arabaların qabağını kəsib pul alandan sonra yolçuları buraxırdılar.

Köç 1919–cu ilin iyulunda gəlib Araz çayının kənarına çatdı. Adamları çaydan bərələr vasitəsilə o tərəfə keçirməyə başladılar. Araz çox iti axırdı. Hərdən bir bərələrin kəndirləri qırılır, üstündəki arabalar, adamlar suya tökülürdülər. Aşıq Heydərin ailəsi 1919–cu ilin avqustunda Xoy şəhərinə gəlib çıxdı. Amma Xoy şəhəri çox isti idi. Aşıq Heydər Kərbəlayi Şabana dedi:

– Bura betər istidi. Gəl Səlmasa gedək.

Kərbəlayi Şaban buna etiraz etdi:

– Yox, sən nə danışırsan, orada yəzdi kürdləri az deyil. Onlar ermənilərdən də pisdi. Mən ziyarətə gedəndə onların vəhşiliklərini görmüşəm. Məncə, Mərəndə getsək, yaxşı olar.

– Qoy sən deyən olsun.

Onlar Xoydan Mərəndə gəldilər. Mərənd camaatı gələnləri çox mehribanlıqla qarşıladılar. Məşədi Muxtar Aşıq Heydərgili qonaq elədi, onlara xoş üz göstərdi. Aşıq Heydər burada ağır məclislər keçirməyə başladı. Bu məclislərdə Aşıq Heydər özünün yaratdığı nağılları danışıb adamları heyrətə gətirdi. Onun gözəl səsi, şirin zəngülələri, gözəl nağıl danışmaq bacarığı ona Mərənddə böyük hörmət qazandırdı. Məşədi Muxtar da sinədəftər bir adam, həm də söz deyən olduğundan o, Aşıq Heydərlə dostluğunun binasını qoydu. Bu o vaxtlar idi ki, Ağbabadan Mərəndə gedib–gələnlər az deyildi. Ağbabadan gələnlərdən biri Mahmud ağanın məktubunu aşıx Heydərə verdi. Aşıx Heydar məktubu oxuyub bir xeyli fikrə getdi. Sonra dərindən bir ah çəkdi. Ax Mahmud ağa, Mahmud ağa, niyə qaysaq qoymuş yaralarımı qopardın, vətən bölünməzdir, bura da

mənim vətənimdi axı. Məşədi Muxtar Aşıx Heydarı qəmgin görüb dilləndi:

- Aşıx Heydar, nə oldu sənə birdən - birə halın dəyişdi, olmaya xətrinə dəyən olub?

Heydar Ağbaba Süvarı Alayının yüzbaşısı Mahmud ağanın məktubunu Məşədi Muxtara verdi. Al oxu, gör Mahmud ağa mənə nə yazıb? Məktub Ağbaba süvari alayının qərargahı olan "Taya Qayada" yazılmışdır.

- Hə əzizlərim, görək Mahmud ağa Aşıq Heydərə nə yazıb?

Aşıx Heydar baxma uzaq sözünə,
Baş götürüb kişi getməz vətənnən.
Təqsirkaram, tutma məni qınağa,
Baş götürüb kişi getməz vətənnən.

Sən getdin burada qalan sənindi,
Qohumundu, qardaşındı, əmindi.
Qeyrətini kim çəkəcək bəs indi?
Baş götürüb kişi getməz vətənnən.

Bu torpaqdan verəmmərik bir tikə,
Düşmən gərək qarşımızda diz çökə.
İgid odur gecə - gündüz dərd çəkə,
Baş götürüb kişi getməz vətənnən.

Kimsə bəlkə ucalmağa dağ istər,
Öz kefini gecə -gündüz çağ istər,
Yurdunu yox, öz başını sağ istər,
Baş götürüb kişi getməz vətənnən.

Yazılıbdır qismətimə duman - çən,
Dərd çəkməkdən saçlarıma düşdü dən,
Təqsirkaram, gəl Mahmudu eşit sən,
Baş götürüb kişi getməz vətənnən.

Məşədi Muxtar istehza ilə dilləndi:

-Aşıq Heydər Mərənd də sənin vətənin deyilmi, vətənin o başı bu başı olmaz axı?!

Di gəl Aşıq Heydər burada – Mərənddə çox darıxırdı. Mərənddə onun hörmətini saxlasalar da, Aşıq Heydər Ağbabanı, əmisi Məşədi Rəcəbi yaddan çıxara bilmirdi. Hər gün «Ağbaba» deyə ağlayır, af–uf eləyərdi. Məşədi Muxtar da, ağsaqqallar da Aşıq Heydərə ürək–dirək versələr də, onun dərdi–səri azalmır, dərddən kişinin gözü–könlü açılmırdı. Hərdən bir Məşədi Rəcəbi, onun arvadı Mədinəni gözü önündə canlandırır, onların çəkdiyi əziyyətləri xatırlayır, kişi peşmançılıq çəkirdi. Öz–özünə deyirdi:

– Mən çox səhv elədim. Niyə əmimi tək qoydum?! Birdən onu öldürərlər? Bir də… namərd ermənilərdən nəsə yaxşı hərəkət gözləmək olarmı? Yox! Axı, mən əmimi yaşlı vaxtında niyə orda qoyub gəldim? Bu nə səhv işdi mən tutdum, Allah? Mənə ata əvəzi olan bir kişinin sözünü eşitmədim, inad elədim. Yox, belə olmaz!

Aşıq Heydər baxdı yox, öz–özünə deyinməklə də iş aşmaz, üstəlik hər gün dərdinin üstünə dərd gəlir. Yox, yox, buna dözmək, tab gətirmək olmaz! Odur ki, Aşıq Heydər ürəyindən keçənləri Məşədi Muxtara dedi:

- Məşədi Muxtar, əvəlcə gərək Mahmud ağanın sözünün əvəzini qaytaram. Bu dəmdə Aşıq Heydər aldı görək nə dedi.

Aldım məktubunu, bil Mahmud ağa,
Layiq deyil səni tutam qınağa.
Canım olsun millətimə sadağa,
Millət qurban desə, siz məni kəsin.

Doğru sözü yalan mənəm, ay ellər,
Quru yerdə qalan mənəm, ay ellər,
El – obası talan mənəm, ay ellər,
Millət qurban desə, siz məni kəsin.

Mən hicran qəhrində, qəm taptağıyam,
Mehri-məhəbbətdən ev tustağıyam.
Cəmi Ağbabanın qurbanlığıyam,
Millət qurban desə, siz məni kəsin.

Yurdu taptaladı düşmən atları,
Tutdu tellərimdən qəm cəlladları,
"Ağbaba Alayının" mərd ovladları,
Millət qurban desə, siz məni kəsin.

Gecə hicran şahı yəhərlər məni,
Tutar tənələrə səhərlər məni.
Boğur qəmlər məni, qəhərlər məni,
Millət qurban desə, siz məni kəsin.

Zalım yağı, nə durmusan qəsdimə!?
Qəm ləşkəri hücum çəkib üstümə.
Cümlə - cahan batıb mənim tüstümə,
Millət qurban desə, siz məni kəsin.

Hicran yeksanıyam, qəm tarümarı,
Sönübdü ömrümün çıl-çıraqları.
Incitmə Heydəri, incitmə barı,
Millət qurban desə, siz məni kəsin.

Aşıx Heydər sözünü tamamlayıb üzünü Məşədi Muxtara tutaraq dilləndi.

– Məşədi Muxtar, mən səndən də, cəmi Mərənd camaatından da çox razıyam. Bura da mənim vətənimdir. Vətənin obaşı bu başı olmaz. Amma həyatda ilk dəfə göz açdığım torpaq məni elə sıxır ki, bu ayrılığa dözə bilmirəm. Bir də orda – Ağbabada mənim igid əmim Məşədi Rəcəb qalıb. Gərək necə olsa, özümü ona yetirim. Ondan hal–əhval tutmasam bağrım çatlayar.

Bu dəmdə aşıq Heydər dübarə üzünü Məşədi Muxtara tutaraq aldı görək nə dedi:

Necə dözüm, necə durub-dincəlim,
Mən ah çəkim, gərək dərddən incəlim,
Axı necə cana gəlim, dirçəlim,
Qoca Aslan yuvasında tək qalıb.

Hər tərəfdən düşmən gəlir üstünə,
Ermənilər durubdular qəsdinə,
Bilirsiniz yağıların qəsdi nə,
Bir mərd kişi obasında tək qalıb.

Aşıq Heydər səhv elədi, qanmadı,
Əmisinə canı-dildən yanmadı,
Tatlar kimi inadından dönmədi,
Ölüm-itim xanasında tək qalıb.

Aşıx Heydər gördü ki Məşədi Muxtarın da tərs damarı tutub. Odur ki Məşədi Muxtarın könlünü ələ almaq üçün aldı görək nə dedi.

*Aşıq Heydər:*

Hanı Ağbabanın uca dağları?
Bir başımdan qalxan dumana bax, bax.
Vətəndi kiridən mən tək ağları,
Sən mənim qəlbimdə gümana bax, bax.

*Məşədi Muxtar:*

Bir az insaf elə, ağlatdın bizi,
Yenə dərdi qoydun kamana bax, bax.
Yandırdın söz ilə mərdi odlara,
Ah çəkir Muxtar da, Zamana bax, bax.

*Aşıq Heydər:*

Vətən həsrətindən yanıb gül oldum,
Özüm öz dərdimə qara qul oldum.
Mərənd qucaq açdı, buna gül oldum,
Ürəyimdə qopan amana, bax-bax!

*Məşədi Muxtar:*

Axı səni sevir hər kəs bu yerdə,
Yurdu itirəndən düşmüsən dərdə.
Şükür rast olubsan kişiyə, mərdə,
Bu gözəl dəmlərə, həm ana bax-bax!

*Aşıq Heydər:*

Dar gündə dadıma yetdi yetənlər,
Amma ki, beynimdən çıxmır ötənlər.
Ölən öldü getdi, qaldı itənlər,
Bizləri yandıran zamana bax-bax!

*Məşədi Muxtar:*

Mərənd mərd yurdudu, darıxıb durma,
Ay söz xiridarı, qəmə baş vurma,
Könül sarayını ahla uçurma,
Gözümdən damcı tək damana bax-bax!

*Aşıq Heydər:*

Ürəyim yaralı, sinəmdə od var,
Yurdun qucağında bir ayrı dad var.
İllər ayrısıyıq, qohum var, yad var,
O qaçaqaç salan yamana bax-bax!

*Məşədi Muxtar:*

Dar gündə dadıma yetənlər oldu,
Mərdin harayına çatanlar oldu.
Özünü odlara atanlar oldu,
Fikirə, xəyala cumana bax-bax!

*Aşıq Heydər:*

Ağbaba deyəndə qəm gəlir gözə,
Vətən həsrətindən gəlmişəm dizə.
Burda aşıx Heydər güc verir sözə,
Bəlkə gələ bir az imana bax-bax!

*Məşədi Muxtar:*

Muxtarı hər zaman öz yanında gör,
Dərdi gözdən itir, dəmə də yer ver.
Könlü sınaq çoxdu, bizə dayaq dur,
Gətirmə könlümü amana bax-bax!

Aşıx Heydər gördü ki Məşədi Muxtarın gözləri yaşarıb, dübarə aldı görək nə dedi.

Hə əzizlərim, bizdən demək, sizlərdən eşitmək .

Dağıldı ellərim qaldım səhrada,
Bir kimsənəm yoxdu, anam ağlayır.
Titrəyir əllərim, görmür gözlərim,
Dəyişir döranım, zaman ağlayır.

Ayrı düşdüm öz yurdumnan, elimnən,
Qəm şələsi əl çəkməyir belimnən,
Danışanda nalə qopur dilimnən,
Könlümün səsinə kaman ağlayır.

Hələ qurumayıb gözümün yaşı,
Tutur tənələrə hər yetən naşı,
Ələnir üstümə dünyanın daşı,
Dağların başında duman ağlayır.

Heydər, bu yerlərdə yerin bilindi,
Mərənd qucaq açdı, qəlbin isindi.
Fələyin cəbrinə dayan, döz indi!
Indi biz yox, bütün cahan ağlayır!

Söz tamama yetdi. Aşıx Heydər üzünü Məşədi Muxtara tutaraq təkrar dilləndi:

Məşədi Muxtar, indi mənim səndən bir xahişim var.

– O nə xahişdi elə?

Məşədi Muxtar belə deyəndə Aşıq Heydər mülayimliklə dilləndi:

– Sən cəmi ağsaqqalları, başbilənləri cəm elə. Qoy mənə xeyir–dua versinlər . Mən burda bu mahalın adamlarından çox hörmət görmüşəm… Hamı ilə halallaşıb Ağbabaya qayıtmaq istəyirəm.

– Aşıq Heydər, sən gəl geri getmə. Elə burada qal. Şükür Allaha, dolanışığın yaxşı, məqamın pis deyil.

– Yox, Məşədi Muxtar, mən getməliyəm. Sən gəl mən dediyimi elə, adamları çağırtdır… Mən adamlarla vidalaşmaq istəyirəm.

Məşədi Muxtar baxdı ki, yox, Aşıq Heydər lap gerçəkləyib. Daha heç nə demədi, adamlara xəbər elədi. Hamı bir yerə toplandı. Aşıq Heydər hamıyla halallaşdı, adamlar ona xeyir–dua verdilər. Yenə Məşədi Muxtar Aşıq Heydəri dilə tutdu:

– Ay Aşıq Heydər, gəl sən getmə. Deyirlər indi orada Şura hökuməti qurulub. Deyirlər bu hökumət həm adamın malına, həm də canına şərikdi, adını da qoyub bolşevik. Cana şərik, mala şərik, sən hələ yeni hökumətə bax! Sən gəl belə elə, adam yolla, gedib Ağbabadan Məşədi Rəcəbi də gətirsinlər. Daha sənin nigarançılığın da qurtarsın. Gəl əlini Qurana bas, bu işə son qoy.

– Yox, yox! Bir dəfə ana babam Qurana əl basdırıb, indi də əziyyətini çəkirəm. Mən bu vətənin oğluyam. Mənə Şərur da, Xoy da, Mərənd də, Təbriz də, Ağbaba da, Qars da, Çıldır da doğmadır. Amma Ağbaba doğulub, boya–başa çatdığım yurddu. Əti dırnaqdan ayırmaq olmaz. Məşədi Muxtar, üz vurma, mən getməliyəm, savaş meydanında mərd oğulları tək buraxa bilmərəm.

Bu zaman bir ağsaqqal irəli çıxıb dillәndi:

- Aşıq Heydər axı bura da sənin vətənindi. Gəl sən daşı ətəyindən tök, getmə. Səhərdən  Xoydan, Mərənddən və Təbrizdən danışırsan, axı bura da sənin vətənindi.

- Aşıq Heydər:

- Baba, sən mənim tüstümü təpəmdən çixartdın. Təbriz mənim atam, Ağbaba isə anamdı.

- Bu dəmdə Aşıq Heydər üzünü ağsaqqal kişiyə tutub, görək nə dedi:

Şanlı vətənimin hər qarışında,
Hər daş altda bir igidim, ərim var.
Savaş meydanında, yetmiş yaşında,
Rəcəb adlı bir yüzbaşı nərim var.

Zirvədəyəm, qorxutmayır çən məni,
Sala bilməz heç kim burdan gen məni.
Oğul kimi bas bağrına sən məni,
Özüm boyda bir sehirli sirrim var.

Ucaltmışam hər bir yerdə səsimi,
Tanıyırlar soykökümü, nəslimi.
Qaxtağanlar dana bilməz əslimi,
Türk oğluyam, burda mənim yerim var!

Qul Heydərə aranlı de, dağlı de,
Bu vətənə, bu mahala bağlı de.
Hər vaxt mənə bu torpağın oğlu de,
Çünki, burda "Təbriz" adlı pirim var.

Bəli, Məşədi Muxtar baxdı, yox, olmur. Çarəsiz qalıb razı oldu. Aşıq Heydər camaatla halallaşıb xeyir–dua alandan sonra axşam Məşədi Muxtargil də yola hazırlıq gördü. Səhər subh namazından sonra Aşıq Heydər yola çıxdı. Mərəndlilər onları böyük hörmətlə yola saldılar. 1920–ci ilin martında Aşıq Heydər Mərəndi tərk etdi. Amma işin tərsliyindən Qənbər xəstə idi. Onlar gəlib Araz çayının qırağına çıxdılar. Amma çayın suyu çoxalmışdı, özü də çox iti axırdı. Aşıq Heydərin ailəsi çox çətinliklə çayın o tayına keçdilər. Az qaldı çay Yetər arvadı aparsın, onu birtəhər xilas etdilər. Di gəl Qənbərin xəstəliyi daha da şiddətləndi, elə çayın qurağında canını tapşırdı. Onu Araz çayının kənarında dəfn etdilər. Qənbərin cavan ölməsi hamının qəlbinə dağ çəkdi, könülləri riqqətə gətirdi.

Aşıx Heydər Qənbərin məzarının başında Qənbərin anasına baxıb, görək bayatı ilə nə dedi.

Ağlaram ağlar kimi,
Dərdim var dağlar kimi.
Yüz yerdən yaralıyam,
Gəzirəm sağlar kimi.

Belə bağlar,
Kəmərin belə bağlar.
Burda Qəmbərim ölüb,
Ğöy kişnər bulud ağlar.

Qəmər qaç,
Bulud oynar, qəmər qaç.
Sinəmnən oxlanmışam,
Üstünə qan damar qaç.

Dağım var,
Aranım var, dağım var.
Açma könül düyməsin,
Sinəm üstə dağım var.

Xan Arazım, Arazım,
Can Arazım, Arazım,
Neçə canlara qıydın,
Yan, Arazım, Arazım.

Yaralar məni,
Tapdı yaralar məni.
Fələk cəllada dönüb,
Tez – tez yaralar məni.

Yağıdı haylar mənə,
Il oldu aylar mənə.
Susadım su istədim,
Su verməz çaylar mənə.

Eşmə çox,
Çay yanında çemə çox.
Qəm dağları var məndə,
Qəmər yaram eşmə çox.

Əzizim, nələr keçər,
Quzular mələr keçər.
Heydər qəm tapdağıdı,
Yad baxıb, gülər keçər.

Yolçular özlərini birtəhər ələ alıb yollarına davam etdilər. Üç arabadan ibarət köç yavaş–yavaş Türkiyə sərhədlərinə gəlib çatdı. Bu yerlərdə Aşıq Heydəri yaxşı tanıyırdılar, onu böyük hörmətlə qarşıladılar. Aşıq Heydərgili evə apardılar, yaxşı ağırladılar. Zərşadda Aşıq Heydəri dilə tutub xeyli qonaq saxladılar, dedilər:

– Sən gəl getmə, hökumət sənə at, öküz, kotan, mal–heyvan verəcək. Üstəlik, on il səndən torpaq rusumu da almayacaq. Qal burada yaşa.Kimə deyirsən, Aşıq Heydər deyilənləri qəbul etmədi. Amma elə mehribanlıqla dilləndi ki, adamların könlü qırılmasın, heç kəs ondan inciməsin. Di gəl, adamlar onu buraxmaq istəmirdilər. Dedilər:

– Aşıq Heydər, sən axı el sənətkarısan, hansı yeri istəyirsən, get orada yaşa. Ancaq bircə burada qalmağa razılıq ver.

1920–ci ilin aprelində Aşıq Heydərgil gəlib Ağbabaya çıxdılar. Aşıq Heydər kəndin qırağında, Alçaq dağın yanında arabaları əyləyib arabadan duşdu, torpağı öpdü. Sonra yenə arabalar yola düşdü. Gəlib Düzkəndə çatan kimi Məşədi Rəcəb özünü Aşıq Heydərin üstünə atdı. Qucaqlaşdılar. Handan–hana bir–birindən ayrıldılar.

Məşədi Rəcəb dedi:

– A bala, (o çox vaxt Aşıq Heydərə belə deyirdi) sən gedəndən sonra ev–eşik başıma fırlandı. Məni bağışla, səninlə bir az sərt davrandım. Bunun da səbəbi var, sonra bilərsən. Onu da bil ki, mənim də qabaqdan ölümlü günüm gəlir. Bir bunu da düşün. Aşıq Heydər daha əmisinə ağ bir, qara iki, bir söz demədi. Doğrudan da Məşədi Rəcəb əvvəlki Məşədi Rəcəb deyildi, çox qocalmışdı. Kənddə evlərin

çoxu uçub–dağılmış, ya da yarımuçuq vəziyyətdə idi. Aşıq Heydərgilin evi Məşədi Rəcəbin evinə yaxın olduğundan salamat qalmışdı.

Bir il keçməmiş Qərib kişi Aşıq Heydərə mal–qoyun, toyuq–cücə və s. verdi. Yavaş–yavaş onların vəziyyəti yaxşılaşdı. Yenə Aşıq Heydər məclislər aparmağa başladı.

Məşədi Rəcəb 1922–ci ildə vəfat etdi. Qarsla, Çıldırla əlaqələr kəsildi, yollar bağlandı, ağbabalılarla qarslıların, çıldırlıların ürəkləri dağlandı. Qohum–qardaş bir–birindən aralı düşdü. Ortaya bir betər ağırlıq düşdü. Kərim də, Rəhim də firqənin üzvü oldular,hökumət işində işləməyə başladılar.

1937–ci ildə ispolkomun sədri Salmanov (əslən Göyçədən idi) Düzkəndə gəldi. O, Rəhimdən xahiş etdi ki, onu atası ilə, yəni Aşıq Heydərlə tanış etsin. Rəhim buna razı oldu. Salmanov Aşıq Heydərlə tanış olandan sonra dedi:

– Mən sənin haqqında çox eşitmişəm. Tanınmış bir sənətkarsan. Gəl səni Bakıya göndərim, get. Saz, paltar, həm nə desən hazırladım. İstəyinsən özünlə ailəni də, uşaqlarını da apar.

Aşıq Heydər Salmanova hə–yox deməmiş onun dostu Kərbəlayi Şaban işdən xəbər tutub oraya gəldi. Dedi:

– Aşıq Heydər, Bakı eşitdiyin Bakı deyil, oranı da Şura hökuməti əlinə keçirib. Hələ kəndin içində başı açıq gəzdiyin bəs deyil, indi də urusamı aşıqlıq edəcəksən?!

Bu belə deyəndən sonra Aşıq Heydər Salmanovun dediyini qəbul etmədi. Başqa yerə getməkdənsə, Ağbabada qalıb yaşamağı üstün tutdu.

# AŞIX HEYDƏRLƏ AŞIQ MƏHƏMMƏD

Əzizlərim, mən sizlərə Aşıq Heydərin İranın Mərənd şəhərindən (1919 – 1920 - ci il) qayitdıqdan sonra Ağbabada qarşılaşdığı çətinliklərdən söhbət açmaq istəyirəm.

Bu illər aşığın həyatında ağrılı - acılı çağlar kimi tarixə düşmüşdür.

Rus- erməni hərbi birləşmələri Qars, Çıldır, Van, Muş, Sarıqamış və Şörəgel mahallarını işğal etmişdilər. Demək olar ki, yerli əhalinin var- dövləti talan olunmuşdu.

Var- dövləti talan olunan Aşıq Heydər qazanc məqsədi ilə Gümrü, Qars, Çıldır və Ağbabada yenidən aşıqlıq etməyə başlamışdı.

Əzizlərim, indi isə keçək əsas məsələyə.

1920-ci ilin noyabr ayında Güllübulaqlı Aşıq Nəsibin dəvəti ilə Aşıq Heydər Güllübulağa gəlir. Burada Aşıq Nəsib Aşıq Şenliyin əziz xatirəsinə böyük məclis təşkil edir. Aşıq Şenliyin "Lətif Şah" dastani Aşıq Heydərə həvalə olnur. Bir həftə çəkən məclis böyük təmtəraqla başa çatır.

Aşıq Nəsib Aşıq Heydərın qarşılaşdığı çərinliklərdən tam halı idi. Ona görə də məclisə nə yığılmışdırsa hamısını Aşıq Heydərə verir.

Payizin qarlı- şaxtalı havasında Güllübulaqdan yola çıxan Aşıq Heydər günortaya yaxın Daşkörpü kəndinə çatır, lakin güclü dağ boranının qalxdığından öz kirvəsi Məşədi Zaloygilə getmək qərarına gəlir.

Aşıq Heydər əvvəllər həmişə Qars və Gümrüdən məclislərdən gələn zaman Məşədi Zaloyun əziz qonağı olurdu. Aşıq Heydər qazancının bir hissəsini Məşədi Zaloya verib deyərdi:

- Kasıb adamsan, bu pulları götür, xeyir var, şər var, lazımın olar.

Elə bu işlərinə görə də Məşədi Zaloyun ən sevimli qonağı Aşıq Heydər idi.

Vaxtıilə üzünə taybatay açılan qapılar, taybatay baglandı. Qapını açan olmadı ki, olmadı. Lakin içəridən Məşədi Zaloyun asta danışığını hiss edən Aşıq Heydəri təccüb bürüdü.
Məşədi Zaloy öz kiçik oğluna astadan dedi;

- Bala, qapını açma! qələt elədim, yol kənarında ev tikdim, hər yoldan keçən deyir məni qonaq elə!

Uşaq isə dilləndi:

- Ata, gələn Aşıq Heydərdi.

Məşədi Zaloy:

- Bu lap pis! İrandan gəlib, acın-gicin biridi, nəsə istəməyə gəlib!

İşi belə görən Aşıq Heydər kor- peşman geri qayıdır. Kəndin içində ona Daşkörpü kəndinin ağsaqqalı Qəhrəman kişi rast gəlir. Qəhrəman kişi Aşıq Heydərin soyuqdan tir- tir əsdiyini görüb onu öz evinə götürür.
Axşam Qəhrəmanla Aşıq Heydər şırin söhbətlər edirlər. Aşıq Heydər İranda başına gələnlərdən və öz qardaşı oğlunu Araz çayının qırağında dəfn etməsindən danışır.
Nə isə, səhər açılır. Qəhrəman kişi Heydərə altdan geyinmək üçün isti paltar verir və deyir:

-Aşıq Heydər, sən Məşədi Zaloydan incimə, meşə çaqqalsız olmaz, bu sağolmuşun gözünü pul tutub.

Aşıx Heydər isə gülümsəyərək deyir;

-Mənim heç kimdən inciməyə ixtiyarim yoxdur, bircə o böyük yaradan bizlərdən inciməsin. Ancaq Qəhrəman kişi, belə qohumluq olmaz axı. Bir qələm götür, mən deyim sən yaz.

Görək Aşıq Heydər Məşədi Zaloya nə deyir.

Salam Əleyküm, Məşədi,
Məşədi bir ağa kişidi.
Kişi əl - ayağım üşüdü,
Kirvə, məni qonaq eylə.

Gəlirdim Güllübulaqdan,
Boran da qaxdı qabaqdan.



Utan bizim kirvalıqdan,
Kirvə, məni qonaq eylə.

Bozqaladan qaxdı duman,
Şalvar altda yoxdu tuman.
Məşədidən qaçır iman,
Kirvə, məni qonaq eylə.

Aşıq Heydər bu yerdə sözünü yarımçıq qoyaraq Qəhrəman kişiyə dedi:

- Sağ ol, Qəhrəman, sənin bu yaxşılığın yadimdan çıxmayacaq. Nə bildin ki, mənim alt tuman - köynəyim yoxdu. Qəhrəman kişi isə gülə - gülə dilləndi:

- Aşıq Heydər, mən uşaq deyiləm ki, sən soyuqdan tir- tir əsirdin.

Bu dəmdə Aşıq Heydər aldı görək nə dedi:

Görüm səni burda tək qal,
Qonaq eylə məndən haqq al.
Boynu yoğun, özü çaqqal,
Kirvə, məni qonaq eylə.

Boran imkan vermir, əsir,
Maşqı da amanım kəsir.
Aşıq Heydər tir-tir əsir,
Kirvə, məni qonaq eylə.

Aşıq Heydər Qəhrəman kişi ilə sağollaşıb öz doğma kəndi Düzkəndə gəlir.

Aradan bir xeyli keçməmiş Aşıq Heydərın bu qoşması toylarda və məclislərdə səslənməyə başlayır.

Bu sözlər Məşədi Zaloya möhkəm təsir edir.

Məşədi Zaloy Aşıq Heydərdən əvəz çıxmaq məqsədi ilə Güllübulağa Aşıq Nəsibin yanina gəlir. Aşıq Nəsibə pul təklif edərək deyir:

- Aşıx Nəsib, sən bu mahalda tanınmış aşıqsan, Aşıq Heydər məni el- obada biyabır edib, ona bir həcv yaz, nə istəsən verərəm.
Aşıq Nəsib hirsli vəziyyətdə yerindən duraraq dillənir:

- Ayə, sən nə həyasız adamsan, adını Məşədi qoymusan, özün də ziyarətdə olmusan, sən lap iblissən ki, mən nə vaxtdan pulla özgələrinə böhtan yazıram, bir də ki, kimə Aşıq Heydərə, onun cörəyi sənə haram olsun. Sənə pul verəndə yaxşı adam idi, indi ermənilərin əlindən İrana qaçdi, sonra lüt qayidıb, pis adam olub. Necə gəlmisən, dur elə də geni get, mənim evimdə şeytana yer yoxdu. O ki, qaldı Aşıq Heydərə, o həm Allahin quludu, həm də böyük aşıqdı, ona canımı da qurban verərəm.

Bu sözlərdən sonra Məşədi Zaloy kor- peşman geri qayıdır. Ancaq Məşədi Zaloy Aşıq Heydərdən heyif çıxmaq üçün növbəti fitnəyə əl atdı.

Yaz başı Məşədi Zaloy at furqonuna iki yaxşı erkək qoyub Öksüz kəndinə Aşıq Məhəmmədin evinə gəlir. Aşıq Məhəmmədən xahiş edir ki, Aşıq Heydərə bir həcv yazsın. Aşıq Məhəmməd əvvəl bu işə razı olmur. Sonra erkəkləri görəndə kişini tamah basır, şeytan aldadır. Son sözü bu olur ki, mən gərək Aşıq Heydərə elə bir toy tutam ki, öz toyu yadından çıxsın. Gərək Aşıq Heydər Məhəmmədin adı gələndə sıçan deşiyini satın alsın. Ancaq bu heç belə də olmur, Aşıq Məhəmmədin özü pis vəziyyətə düşür.

Əzizlərim bu əhvalat belə baş vermişdir.
Günlərin birində Düzkəndli rəhmətlik dəllək Qəfər (Aşıq Heydərin qonşusu olub) Öksüz kəndində bir sünət məclisində olur. Məclisi Aşıq Məhəmməd aparırdı, cavanlardan biri Aşıq Məhəmmədin Aşıq Heydərə yazdığı həcvi oxumağı xahiş edir. Aşıq Məhəmməd bunu demək istəmirdi, ancaq mazarratlar yerdən dillənərək deyirlər:

-Aşıq Məhəmməd, səni belə qorxaq bilməzdik, hər aşıq öz sözünün sahibi olmalıdır.

Elə bu dəm də Aşıq Məhəmməd sözə başlayır:



Gedəndə Arazdan keçdin,
Gələndə suyundan içdin.
-----------------------------
Niyə gəldin qara Heydər?
Yol üstə bir dam tikmişəm,
Dörd yanında xan tikmişəm.
-----------------------------
Niyə gəldin qara Heydər?

Həm ağayam, həm nökərəm,
Basıb gözünü tökərəm.
Sinən üstə dağ çəkərəm,
Niyə gəldin qara Heydər?

Məşədi bir ağa kişidi,
Yediyi kətə, pişidi.
Deyinmək arvad işidi,
Niyə gəldin qara Heydər?

Adını aşıq qoymusan,
Bütün mahalı soymusan,
---------yeyib, doymusan,
Niyə gəldin qara Heydər?

İtiləmişəm ülgücümü,
Sənə göstərrəm gücümü.
Tanrı qorusun bicimi,
Niyə gəldin qara Heydər?

Öksüzdə meydan mənimdi,
Məşədi sənə qənimdi.
Canın çıxsın, di öl indi,
Niyə gəldin qara Heydar?

Bu mahaldan ar eylərəm,
Dəmxananı dar eylərəm,
Səni burda xar eylərəm,
Niyə gəldin qara Heydər?

Açmışam urfan meydanı,
Məhəmmədi yaxşı tanı.
Ağbabanın cin – şeytanı,
Niyə gəldin qara Heydər.

Aşıq Məhəmməd yenə sözə başlamaq istəyirdi ki, bu dəmdə məclisdə əyləşən Aslan ağa istehza ilə dilləndi:

- Aşıq Məhəmməd, heç olmasa Qəfər kişidən eyib elə, sözün varsa söz daniş, axı sənə söyüş, böhtan söyləmək yaraşmaz. Mən Aşıq Heydəri yaxşı tanıyıram, axı sən o kişinin bir put çörəyini yemişən, bu dediyin sözlər Heydərə çatsa sözünün arxasında dura biləcənmi.

Elə bil Aşıq Məhəmmədin başına qaynar su tökdülər. Heç səsi də çıxmadı.

Rəhmətlik Qəfərin boğazından cörək keçmədi. Yarımçıq məclisi tərk edərək başı alovlu özünü kəndə, yəni Aşıq Heydərgilə saldı.

Aşıx Heydər molla Rzaqulu ilə oturub şirin söhbət edirdi. O Qəfəri bu vəziyyətdə görüb təccüblə soruşdu:

- Qəfər, sənə nə olub, belə qan- tərin içindəsən? Axı sən Öksüzdə sünət məclisidə olmalı idin? Olmaya üzünə yaxşı baxmayıblar?

Qəfər hirsli vəziyyətdə dilləndi:

- Kəs səsini, Aşıq Məhəmməd nəyin vardısa ona söydü, mən də məclisi yarımçıq qoyub gəldim.

Heydər gülümsəyərək dilləndi:

- Qəfər kişi cox nahaq məclisi yarımçıq qoyub gəlmisən, mən onun sözlərini eşitmişəm, bu onun işi deyil, Məşədi Zaloyun iki erkəyinin işidi.

Qəfər yenə hirsli vəziyyətdə dilləndi:

- Ayə, mən səni bir kişi bilirdim, susmaq hər şeylə razılaşmaq deməkdir axı. Daha mən sənin yerinə utandığımdan Öksüzə ayaq

basa bilmərəm. On günə kimi Aslan ağa məni öz oğlunun sünnət məclisinə çağırıb, mən hansı üzlə bir də Öksüzə gedim?

Aşıq Heydər dedi:

- Gedərsən Qəfər, gedərsən, Allah kərimdi. Bu dəmdə molla Rzaqulu söhbətə qarışaraq dilləndi:

- Ay qardaş, axı Qəfərin sözündə həqiqət çoxdur, qanmazı yerində oturtmaq lazım deyilmi?

Aşıq Heydər dedi:

- Onda belə oldu, ay Rzaqulu, mən deyəcəm sən də yaz, ancaq bir şərtlə ki, Qəfər Aslan ağanın məclisinə gedəndə bu kağızı şəxsən mənim adımdan Aslan ağaya versin. Qəfər, hə, indi nə deyirsən?

- Qəfər dedi:

- Mən iki əllə razı.

Görək Aşıq Heydər aldı nə dedi:

Baxın, Məhəmmədin işinə,
El içində xar olubdu.
Uyubdu şeytan felinə,
O xənnasa yar olubdu.
El eşidib, özü də bilir,
Sanasan ki, kar olubdu.
Bəyənmir dostu- tanışı,
Bu qurumsaq kor olubdu.

Bu dəmdə Qəfər dilləndi:

- Ayə bu Heydər nə danışır, əməlli başlı söz desənə...

Heydər dedi:

- Qəfər səbrin olsun tələsmə, tələsən təndirə düşər, bir axırına qulaq as.

Yenə aldı görək Aşıq Heydər nə dedi:

Məşədi iki qoyun verib,
Bu gəda quzuya dönüb.
Saqqalı bulaşıb yala,
Nəzilib tazıya dönüb.

Öksüzdə meydan açıbdı,
Deyirlər qazıya dönüb,
Vurulub dünya malına,
İşi tam ah - zar olubdu.

Aşıq Heydər:
– Hə Rzaqulu catdıra bilirsənmi?
Rzaqulu dedi:
- Sən lap qılıncını kişinin iliyinə kimi vurdun.
Aşıq Heydər dilləndi:
- Qoy öz möhürümü vurum söz tamamlansın.

Doğru söz de, düşün danış,
Hədyan demə qul Heydara.
Ağlın qaçıb, huşun itib,
Başın götür vur divara.
Yahu, yahu deyə - deyə,
Əl atmışam Zülfüqara.
Adına dastan demişəm,
Mahallarda car olubdu.

Bu dəmdə Qəfər yenə sözə başladı:
- Ayə, ay qardaş oğlu, o sənə söyüşlə söz deyib, bir əməlli- başlı söz desən ki.
Aşıq Heydər;
- Ay Qəfər kişi, mən də ona söyüşlə söz desəm, olaram onun tayı, bu el- obada azca da olsa hörmətim var, bu hörməti itrmək istəmirəm axı! Bir də ki, ulağa deyəndə mərifətini göstər, onun nə etdiyini sən məndən yaxşı bilirsən. Hələ sözlərim yarımçıq qalıb.
Bir arxasına qulaq as.
Yenə Heydər sözə başladı:

Yekə - yekə çox danışma, ay gədə,
Götür sazı, gir meydana, cəngə gəl.



Kəl əvəzi səni də, qoşum kotana,
El içində xar eyləyim, təngə gəl.

Söz- söhbətin çatıb bizim qazıya,
Utan barı, bax yazdığın yazıya.
Səni gördüm əhsən dedim tazıya,
Buynuzunu sürtmə kələ, cöngə, gəl.

Qəfər kişi altdan- altdan gülərək dilləndi:
- Sağ ol, ay qardaş oğlu, bu lap yerinə düşüdü, bircə Yetər yengəmin yanında üzü qara olduq.
Heydər yenə sözə başladı.

Qodom oğlu, çox bilirsən, az danış,
Danışanda səndən qaçır dost- tanış.
Bu millətə nəsib olub aldanış,
Yürü, bala, asta yeri, küncə gəl.

Aşıq Heydər deyər sözün bu başdan,
Döşə tər kababdan, təzə lavaşdan.
Canını almamış, sürüş yavaşdan,
Geyin, keçin başında bir dingə gəl.

Aşıq Heydər sözünü qurtarıb üzünü molla Rzaquluya tuturaq dilləndi:
- Mən bilən bu sözlər öz ünvanına çatsa, onda Aşıq Məhəmməd öz səhvini başa düşəcək.
Amma elə bil ki, nə isə sözlərimdə catışmazlıq var. Axi mən Mərənddən qayıdanda sonra, Güllübulaqlı Aşıq Nəsib mənə əl tutub, bir də ki, Məşədi Zaloyun yaxşıca cavabını verib, qoy üstü örtülü də olsa adını aşıq qoyan Məhəmməd bilsin ki, bu meydanda tülkü kimdi, nər kimdi.

Bu dəmdə Aşıq Heydar yenə sözə başladı:

Ay aşıq, cənbərək meydanına gəl,
Mərifət elmində sirri göstərim.
Noxtalıyım, palan salım belinə,
Sənə bəyəndiyin yeri göstərim.

Saqqalın bulaşıb quymağa - yağa,
Xub yaraşır sənin kimi ulağa.
Əgər yolun düşsə Güllübulağa,
Maral yatağında nəri göstərim.

Tapdadın arada olan hörməti,
Aşiq Heydər verdi sənə qiyməti.
Bağlayım başına güllü heyratı,
Öksüzü gəzdirim, piri göstərim.

Hə, əzizlərim, bu əhvalat beləcə başa çatdı.

Aşıq Məhəmməd öz səhvini başa düşdü, Aşıq Heydərdən üzr istədi. Böyük ustadlar arasında olan umu – küsü tezliklə aradan qalxdı. Amma bu əhvalat Ağbaba elllərində dastan olaraq dillər əzbəri oldu, yaddaşlardan bu günümüzə kimi gəlib cıxdı.

**Allah hər iki ustada rəhmət eləsin.** **Yusif Heydərov.**

# QASIMOV İSGƏNDƏRİN AŞIQ HEYDƏRLƏ BAĞLI XATİRƏLƏRİ

Aşıq Heydər yaxın qohumumuz olduğuna görə biz onun xətrini çox istəyirdik. Rəhmətlik, özü də çox şirin danışıqlı adamdı. Olduqca gözəl səsi vardı. O, oxuyanda adam bütün dərd-sərini unudardı. Dastan danışmağı, lətifə deməyi də öz yerində. Bir də ona boş yerə Aşıq Heydər demirlər ki. Hə, bir dəfə çəkinə-çəkinə ona dedim:

– Mənim sənə bir sualım var, amma bilmirəm acıqlanmazsan ki!?

– Nə sualın var de. Sən bilirsən ki, sənin xətrin mənim yanımda əzizdir. Vallah, bu Göllü kəndində mənim ən çox iki adamnan xoşum gəlir. Bunlardan biri sənsən, biri də Alıdı. Çünki siz saza-sözə vurğunsunuz. Sözü uzatdın ha, sən sualını de.

– Deyirlər sənə vergi veriblər!

Bu sözləri eşidəndə Aşıq Heydərin nurani sifəti elə bil bir az da işıqlandı: Gəl onda belə eliyək. Mən başıma gələnləri danışım, sən də qulaq as.

– Buyur, buyur.

– Bilməmiş olmazsan, yanında çox danışmışam… mən uşaqlıqdan yetim qalmışam. Olardı bir on dörd- on beş yaşım. Əkin vaxtı idi. Cütün macından tutmuşdum. Özün də yaxşı bilirsən, bu əkin işi çox çətindir. Nolacaq, bir xeyli işlədim. Baxdım gün gəlib günorta olub. Ona kimi hodaq da dilə gəldi:

– Ay Heydər, gəl bir az dincələk, çörək yeyək.

– Düz deyirsən, qoy öküzlər də dincəlsin.

Öküzləri cütdən açdıq. Sonra surfa salıb olan-qalanımızı qoyduq ortaya. Bir az pendir-çörək yeyəndən sonra sürfəni yığışdırıb bir dalda yerdə uzandıq. Yuxu məni apardı. Yuxuda gördüm ki, bir nurani kişi durub başımın üstündə. Mən tez qalxıb oturdum. O da mənim yanımda oturub əlindəki camı mənə uzatdı:

– Oğlum, bunu nuş elə.

Mən camı alıb başıma çəkən kimi sinəmə od düşdü. Nurani kimi o saat iki barmağını aralı tutub dedi:

– Bax, gör nə görürsən?

– Baxdım bir gözəl qızdı, daha demə. Yemə-içmə, eləcə dur bunun xətti-xalına tamaşa elə.

– Bu qız kimdi?

– Bəyazdı. İstanbulun yaxınlığındakı Dəyirman kəndində Süleyman bəyin qızıdı. Onu sənə, səni də ona buta verirəm.

– Ay baba, bəs mən o dediyin yerə necə gedib çıxacam?

– Ay oğul, sən o yerə gedib çıxa bilməyəcəksən.

– Necə?

Qəhərdən gözlərim doldu.

– Demək mən Bəyaza qovuşa bilməyəcəm?

– Xeyr, Bəyaz xanıma qovuşa bilməyəcəksən, amma sözün dillərə düşəcək.

Nurani kişi belə deyəndə elə bir ürəyimin başından bir güllə vurdular, dizlərim yerə gəldi. Nurani kişi qollarımdan tutub məni yıxılmağa qoymadı.

– Qalx, Heydər, olcağa çarə yoxdu. Gedək bir az gəzək.

Düşdüm nurani kiminin yanına, xeyli gəzib dolandıq. Bir neçə gölə, çaya rast gəldik. Yolda iki dəyirmana da təsadüf elədik. Dəyirmanın biri uçub-dağılmışdı. Amma o biri saat kimi işləyirdi. Özümü saxlaya bilməyib soruşdum:

– Bu dəyirmanlar kimindi?

– Bu xaraba qalan Aşıq Qərib Hasanındı. O işləyən dəyirman sənindi, Heydər.

– Bəs sən kimsən.

– Mən Xızıram, oğul.

Mən istədim onun ayaqlarına düşüm. O qoymadı:

– Heydər, indi gedə bilərsən. Amma unutma, çətinə düşəndə məni yadına salıb yatarsan. Yuxuda üzü nurlu bir kişi görsən bil ki, işin yaxşı olacaq. Bir gör qabaqdan gələn kimdir?

Mən irəli baxanda heç kəsi görməyib geri döndüm ki, Xızır peyğəmbərə nəsə deyim, gördüm heç kəs yoxdu.Bəli, onda ayıldım ki, hodaq dostum üstümdə oturub hönkür-hönkür ağlayır. Ona acıqlandım.

– Uşaqsan nəsən,, niyə ağlayırsan?

– Sənin özündən xəbərin varmı? Ağzından köpük axırdi. Nə qədər silkələdim, ayılmadın… Axşama nə qalıb…

Doğrudan da, baxdım axşam düşüb. Daha hodaq dostuma heç nə demədim. Amma bərk-bərk tapşırdım:

– Bu sirri heç kimə demə. Bax elə o vaxtdan başladım aşıq kimi çalıb oxumağa… Öz aramızdı, bunu heç kimə deməmişdim. İndi söz düşdü sənə dedim.



# YUSİF RƏHİM OĞLU HEYDƏROVUN AŞIQ HEYDƏRLƏ BAĞLI XATİRƏLƏRİ

Böyük vətən müharibəsinin başlandığı ilk gündən Ağbabada vəziyyət pis həddə çatmışdı. Həm yaşlılar, həm də çavanlar müharibəyə səfərbər olunmuşdular.

Kəndlərdə tək-tük başı papaqlı kişilər qalmışdı. Mənim atamın yaşı çox olduğundan müharibəyə yox, arxa cəbhəyə yəni "Artekdə" tunel tikintisində 1942-1943-cü ilin axırlarına kimi işləməyə göndərilmişdir.

Ermənilər tez-tez kəndlərə gəlib müharibə üçün kasıb adamlardan, yəni qadınlardan yorğan-döşəyin yununu, evdəki yun corabları, isti paltarları, hətta bu bəs etməmiş kimi cammatın bir

illik əmək haqqına nə düşürsə onun tam yarısını müharibə adı ilə alırdılar.

Atam Artekə göndərildiyindən bizim evdə tək başı papaqlı 80 yaşında rəhmətlik babam Heydər qalmışdı.

Atamı 1943-cü ilin noyabr ayinda yarımcan xəstə bəziyyətində evə gətirdilər.

Demək olar ki, həmin gündən evin bütün ağırlığı mənim üstümə düşdü.

Bununla da məktəbə getməyim mənim üçün acı xəyallara çevrildi.

Çox danışmaq istəmirəm, Allah o illəri heç düşmənimə də göstərməsin.

1949-cu ilin mart ayı idi. Qaracanta kəndində Düzkənd kolxozunun inəklərinə baxırdım. Mart ayının 18-də Düzkənd kolxozunun sədri rəhmətlik (əsli Güllübulaqdandı) Abdüləzim məni at xizəyi ilə kəndimizə kötürəyəcəyini bildirdi. Mənə dedi ki, bala sənin atan Rəhim yazı-hesab bildiyindən həm də ki, kəndin partiya təşkilatının sədrı kimi, kolxoz üçün alqı- satqı məqsədilə Gümrü şəhərindədir. Ola bilsin, orada bir-iki gün qalsın. Bu gün aşıq Heydarın yanından gəlirəm, kişi, vallah, top kimidir. Mənə dedi ki, bir həftədir ki, gözüm yollardadır, nə nəvəmdən, nə də oğlumdan bir xəbər yoxdu. Mənim vaxtım, vədəm gəlib yetişib. Oğlumun gəlməsi mümkün deyilsə, son dəfə nəvəmlə Allah xatirinə bir görüşmək imkanı yarat. Onun sözünə görə gəlmişəm səni aparmağa.

1949-cu il martın 18-zi axşam evə gəldim. Rəhmətlik babam yataqda yatırdı. Evdə isə dörd-beş ağsaqqal kişilər var idi. Babam məni görən kimi gülümsəyərək dilləndi:- Kor olaydım, bala, bu gününü görməyəydim.

Mən dedim: - Nə olub, baba sən mənə niyə elə deyirsən? Mən cavan oğlanam, bəs nə vaxt atama kömək eləməliyəm? Sonra isə dedim:- Şükür Allaha, baba, səni gördüm. Bütün yolu fikirləşə-fikirləşə dəli kimi gəldim.

Babam isə gülə-gülə dedi. Allah mənə imkan yaratdı səninlə görüşdüm, sənə bir- iki sözüm, həm də son vəsiyyətim var, bala. Səhər gəlib gedən çox olacaq, dur hazırlıq gör.

Gecə yarıya kimi babamla danışdım. Sonra babam dedi ki, bala, gecdir, "Quran" kitabını başımın altına qoy, gedin yatin, səhər o başdan duracaqsınız.

Səhər tezdən molla Cabbarın "Quran" oxumasının səsinə oyandım. Gördüm ki, molla Cabbar babamın ayaq ucunda oturub "Quran" oxuyur. Babam əlimi əlinə alıb kəlmeyi-səhadətni oxuyub qurtardıqdan sonra gülə- gülə gözlərini (1949- cu il mart ayının 19-da) əbədi olaraq yumdu.

Elə həmin gundən indiyə kimi babamın üç vəsiyyəti elə bil mənim bu günüm üçün deyilibmiş.

1.Bu torpağın mayası qanla yoğurulub. Mən Ağbabada gözümü açan gündən müharibələr, ölüm, itim, haqsizliqlıq, dəfələrlə qəriblikdən başqa heç nə görmədim, amma öz amalımdan dönmədim. Qarşıdakı çətin günlər mənə qismət olmasa da, sizlər buna hazır olun. İnanmıram ki, bu tutuşla burda binə qura biləsiniz.

2."Quranda"da yazılb ki, insan dünyasını dəyişəndə böyük ziyafət işi görülməsi düzgün deyil. Elə mənim üçün də böyük ziyafət verməyin.

3.Qaxtağanlar məni Sibirə sürgün etmək istəyirdilər. Məni bu bəladan spalkomun sədri, mərd, cəsur Türk oğlu, Qəribov qurtardı.

Mənim sözlərim indiki zamanda sizlərin başına bəla gətirə bilər. Vaxt olar, hər şey bəlli olar, nə yadında qalsa onu demək kifayət edər.

Rəhmətlik babam bu sözləri deyib, əbədi olaraq gözlərini yumdu.

Siz məni özümdən xəbər almayın,
Gördüyün ellərdə axtarın məni.
Məqribdən məşriqə gedən yollarda,
Çaylarda, sellərdə axtarın məni.

Qadasın aldığım, bəri gəl, bəri,
Silinsin könlümün qalmasın səri.
Açılanda qızıl gülün lənbəri,
Süsən - sünbüllərdə axtarın məni.

Qıpqırmızı olub könlümün sacı,
Üstünə yazılıbdı dərdin əlacı.
Aç yaxam düyməsin başımın tacı,
Bu əsən yellərdə axtarın məni.

Pöhrə verib qızıl gülün toxumu,
Gecələr tapmışam sirin yuxumu.
Şeyda bülbüllərdən alın qoxumu,
O tuti dillərdə axtarın məni.

Hərdən bu dağlarda, hərdən aranda,
Hərdən sis dumanda, hərdən boranda,
Kimsə yada salıb məni soranda,
Laləli çöllərdə axtarın məni.

Eşqin ışığında yazdım - yaratdım,
Könlümdə bir gözəl daim yaşatdım.
Axırda sevdamın gölündə batdım.
Gedin o göllərdə axtarın mənı.

Mən Aşıq Heydərəm, gəlmişəm cuşa,
Məndən salam olsun dosta – tanışa.
Adım yazılanda bir cansız daşa,
Mənalı illərdə axtarın məni.

# AŞIQ HEYDƏRİN MÜQƏDDƏS MƏKKƏ ZİYARATI

Rəhmətlik atamın söylədiyinə görə, Aşıq Heydərin böyük oğlu Rəhimin hardasa on beş yaşı ancaq olardı, yəni bu hadisələr əsrin əvvələrində baş vermiş hadisələrdir.

Uşaq, idim yadımda qalan bu idi ki, rəhmətlik atam Heydər heç durub dincələ bilmirdi. Həmişə deyirdi: - Allahım, mənə hər şey verib, mən isə onun yolunda heç nə eliyə bilmədim. Bir dəfə də olsun Allahımı, Rəsulumu və İmamları yad eləyə bilməmişəm. Var olsun mal – pul verən elləri, qazancım da ki, hər şeyə bəs eyləyir.

Onu da deyim ki, rəhmətlik bu xəyallarla yaşayırdı. Bizim mahalda tək - tük adamlar artıq müsəlmanların müqəddəs yeri olan Məkkə ziyarətinə hazırlaşırdılar. Bu məqsədlə rəhmətlik atam öz ata əvəzi olan Məşədi Rəcəbin yanına gəlir və ondan hallalıq almaq ücün öz fikirini əmisinə bildirir.

Məşədi Rəcəb Məşhəddə ziyarətdə olduguna görə, Heydərin sözlərini müsbət qarşılayır, ona öz fikirini bildirdikdən sonra, deyilənlərə əməl etmək şərti ilə ona bu yolda, yəni Allahın yolunda ziyarətə getmək üçün yaxşı yol arzulayır. Məşədi Rəcəbin sözlərindən belə məlum olur ki, təmiz, safqəlbli və heç bir pis əməli olmayan, ev yıxmayan, qan tökməyən, başqasının malını zorla əlindən almayan, özgəyə şər- böhtan atmayan adamlar Məkkəni ziyarət edə bilər. Hər bir təmiz qəlbli müsəlman ora gedəndə yenə də Allahdan günahlarının bağışlanmasını istəməlidir. Allahın və Rəsulun hüzuruna getmək cox adamlara nəsib olmur. Bunun üçün birinci özünün halal qazancı olmalı, bundan əlavə bir illik ailənin dolanması üçün evdə mal - pul saxlamalıcan. Yəni sənin ailən bir il müddətində əziyyət çəkməməlidir.

Həmin vaxtlar Heydər ailə qurmuşdu. Kərim, Rəhim demək olar ki, böyük uşaqlar idi.

Atamın söylədiyinə görə həmin dövrlər Ağbabada vəziyyət ürək açan deyildi. Birləşmiş rus-erməni qoşunları Qarsı işğal etmiş, Nuş,

Van, Sarıqamış və bir cox türk torpaqları həmçinin Şörəgəl və Gümrü ətrafı azəri türkləri yaşayan yaşayış məntəqələri daşnaqlarin əsarəti altına düşmüşdü. Adı gedən bölgələr isə ordu birləşmələrinin nəzarətinə verilmişdir. Müsəlmanlara silah saxlamaq və gəzdirmək qəti qadağan olunmuşdur. Kimin evində və əlində silah tutulsa Qars qalasina salınıb, sonra isə guya məhkəmənin yalançı qərarı ilə bu silahı Nikalay dövlətinə qarşı istifadə etdiklərinə görə, böhtan deyib güllələyirdilər. Yığıncaqlar və topa halında gəzmək qadağan olunmuşdu. Əsgərlərə icazə verilmişdi ki, şübhələndiyi müsəlmanı saxlaya bilər və ondan lazimi izahatlar almaq üçün Qars qalasında saxlaya bilərlər. Həcc ziyarəti ilə əlaqədar olaraq Heydər işini əvvəlcədən qurmuş, yəni Ağbaba, Qars, Çıldır mahalında, Gümrü və Qağızman səhərlərində, eləcə də Gürcüstanin bir cox yerlərində məclislər və toy şənlikləri təşkil etmiş, cox sayda tələbələrinə aşıq sənətini öyrənilməsində aylarla əziyyət çəkmiş və bu bəs etməmiş kimi taninmiş adlı - sanlı ağalarin təsərüfatlarında məşğul olmuşdur. Bununla belə hamı bilirdi ki, Aşıq Heydər bu il ziyarətə gedəcək. Aşıq Heydərin Həcc ziyarətinə getməsi üçün ona yaxından köməklik edən Mahmud ağanın həyat yoldaşı Maya xanım idi.

Maya xanımın məsləhəti və Heydərin raziliğı ilə yığılan pulların çox hissəsi Mahmud ağanın evindı saxlanirdi. Çunki Heydər heç vaxt özündə pul saxlaya bilmirdi. Deyərdi var olsun verən elləri, elin pulu elə xərclənməlidir.

Heydər, ziyarətə Qağızmandan iki adlı - sanlı şəxslə Nuru və Alışan ağalarla bərabər getməli idi.

Qışın oğlan çağı idi. Söhbət fevral ayindan gedir. Mahmud ağanın göndərdiyi adamlar Heydərə dedilər ki, Maya xanim deyir ki, olmaya Heydarın bu il ziyarətə getmək fikri yoxdu. Axı Həccə getməyə çox az vaxt qalıb, onun isə bütün qazancı bizdədir. Alışanla Nuru ağa da onu gözləyir.

Pis vaxtlar idi. Yol-iz kafirlə dolmuşdu.

Onu da deyim ki, Mahmud ağanın ailəsi həmin il Qarsın işğalından sonra müvəqqəti olaraq dağ kəndlərindən birinə

köçümüşdü. Ancaq o tərəfə keçən adamlara Qarsda ruslar xüsusi buraxılış vərəqəsi verirdilər və nə məqsədə getdiyini və neçə gün qalacağını soruşurdular. Geri qayıdanda buraxılış vərəqəsi olmayan şəxsi geri buraxmırdılar.

Uşaq idim, Heydər anama bildirdi ki, mən Qarsa gedirəm, amma iki günə kimi geri qayıdacağam. Sizdə ona kimi mənə ziyarət üçün yol azuqəsi hazırlayın. Elə həmin gün səhər tezdən möhkəm şaxtalı havada yola cıxan Heydər günorta namazına gəlib Çaldaş deyilən kəndə çatır. Burada o bir yaxın dostu faytonçu İbişin evinə gəlir. İbiş əvvəllər Mahmud ağani faytonda gəzdirdiyinə görə ləqəbi faytonçu qalmışdı. İbiş elə buna görə də Heydəri yaxşı taniyirdı.

İbiş Aşıq Heydərə xoş üz göstərib qonaq qalmasını istədi. Lakin Heydər bildirdi ki onun Mahmud ağa ilə təcili işi var, getməlidir. Nə olubsa hamısını yerli - yataqlı inanılmış adam kimi İbişə danışdı. İbiş isə onu öz at xizəyi ilə Qarsa aparmağa razılıq verdi.

Onlar səhər tezdən yola çıxıb gün batanda Qarsa çatdılar. Heydar İbişə dua oxuya - oxuya ona zəhmət haqqını verəndə İbiş razılaşmayıb dedi:

- Aşıq Heydər, mənə düşən zəhmət haqqına ailəm üçün ziyarətdə dua oxutdurarsan.

Nə isə, Heydar İbişlə sağollaşdı və ona tapşırdı ki, onun Həccə getməyi barəsində heç kimə heç nə danişmasın.

Heydarı Qarsda buraxılış məntəqəsində gecikdirmədən o biri tərəfə yola saldılar.Hələ bir əskərdə dilləndi:

-A kişi, borana-qara düşərsən, türklər toy etməyə vaxt tapmadılarmı?

Gecədən keçmiş Heydar Mahmud ağanın qonağı oldu. Mahmud ağa onu xoş üzlə qarşıladı. Ora Nuru və Alışan ağa da gəldilər. İki günə yola cıxmaq haqqında qərar qəbul etdilər.

Heydar onlara bildirdi ki, mən səhər məscidin baş axundu Osman ilə görüşəməliyəm. Onun da xeyir duasını alim ki, halalıq olsun.

Mahmud ağa gülə - gülə dilləndi:

-Heydər, sən bizlərə halallıq ver. Sən nə iş görmüsənsə, pulunun heç yarsınıda almamısan. Sənin o qədər xeyirxah işlərin olub ki, sadalasam, bir dastan olar.

Bu vaxt Maya xanım böyük bir bağlamada ona çatacaq qızıl pulları ortaya qoydu.

Mahmud ağa da beş ədəd onluq qızıl pulları Heydəra verib dedi:

-Bunlar halal pullardı, götür orada yetim - yüsürə xərclə və bir də Allahdan bizim millətin bağışlanmasını xahiş edib, dualar oxu.

Mahmud ağa üzünü ağalara tutub bir də dilləndi:

-Ağalar, görürəm gecədi, Heydər bir az yatıb yuxusunu alsın ki, səhər o başdan evinə gedib hazırlıqlı gələ bilsin.

Bu vaxt İbiş Qarsda əslən öz kəndlərindən olan indi hal - hazırda burda yaşayan keçəl Tatının evinə gedir. Tatı gülə - gülə İbişin üzünə baxıb, sonra isə rişxəndlə deyir:

- A kirva, bu qarda - boranda qonaq vaxtıdır, canından bezmisən nədi, iti itliyi ilə cölə buraxmırlar ki xəstələnər, küllükdə toyun çalınır nədi?

Stola çay gəlir, keçəl Tatı yenə də şirin dilini işə salir, İbiş isə Heydarın sözlərini yadından çıxarıb hər şeyi yerli - yataqlı Tatıya danışır.Tatı bir xeyli fikrə gedib təkrar soruşur:

- Kirvə, sən bu işə necə baxırsan, kişinin pulu öz evində olar, bu heç inanılası iş deyil axı!

İbiş dedi:

-Sən deyən Mahmud ağanı yaxşı tanımırsan. Mən onu Heydərla cox yerlərə aparmışam. Sözünə bütöv adamdır, həm dəki Heydərın bir sözü onun yanında iki ola bilməz. Heydər isə ağıllı və uzaqgörən adamdı. Mala - pula heç vaxt meyl göstərməyib, ürəyi açıq kişidi. Hətta məclislərdən qayıdanda Mahmudun verdiyi puldan əlavə həmişə Heydər mənə Mahmud bilmədən pul verib deyərdi, kasıb adamsan götür ailəni dolandır. Elə Heydərı bu hörmətinə görə qarda – boranda bura gətirdim. Səhər tezdən o başdan gərək onu evlərinə aparam. Kişiyə söz vermişəm.

Tatı isə gülümsünərək dilləndi:

- Apar, nə deyirəm. Onu da bil ki, copur Mahmud məni burda qamçının altına salanda sənin tərifli Heydərının heç ruhu da incimirdi.

Sonra Tatı yenə sözə başladı:

- Kirvə, bu bir zarafatdır, artıq gecdir, siz səhər erkən geri qayitmalısınız, yerin hazırdı, dur yat.

Ancaq İbiş bilmirdi ki, Tatı həmin Tatı deyil, rus və daşnaqların puluna aldanıb, namərdlərə işləyir.

İbiş daş kimi yatağa uzandı. Gözünə döndüyüm Tatı tənbəllik etmədən rus kametdaturasına gəldi.

Gözətçilər Tatıya çest verib soruşurlar:

- Cənab leytinat sizə kim lazımdır.

Tatı isə gər səslə dilləndi:

- Təcili rəisi çağırın. Bir az keçməmiş kamendaturanın rəisi və yanında da tərcüməçisi əslən erməni (adları yadımdan cıxıb) içəri daxil olrular. Rus zabiti Tatıya baxıb dilləndi:

- Tato, gecənin bu aləmində xeyirdimi, nə xəbər var? Tatı əvvəl bu haqda danışmaq istəmədi.

- Gəlmişəm cənab nəçənniyi yoxlayam. Rus zabiti işin nə yerdə olduğunu başa düşüb, hirslənərək dilləndi:

- Gəl mənim başıma corab toxuma, sənə onsuz əvvəlkindən də cox pul verəcəm, de görüm nə xəbər var?

Tatı dedi:

- Onda belədisə o tərəfə keçən bütün adamların qeydlərinə baxmamış heç nə deyə bilmərəm. Bütün qeydlər gətrilir. Tatı Aşıq Heydər haqqında kı, yazıları ermənidən oxumağı xahiş etdi.

Orada yazılmışdır:

- "Türk aşığı Aşıq Heydər bir günlük toy məqsədi ilə (kəndin adını unudmuşam) buraxılsın". Tatı gülüb başını bulayır.

- Ağa nəçənnik, birinci buralarda toy yazda keçrilir və üç gün davam edir. İkinci isə məndə dəqiq məlumat var ki, Aşıq Heydər Mahmudun göstərişi ilə ora gedib. Guya onun orada pulu var, gətirib ziyarətə gedəcək. Ağa nəçənnik hər kişinin pulu öz evində olar, bəlkə elə deyil. Birdə ki, pulu Mahmud Aşıq Heydərə niyə

qarda - boranda verir, başqa vaxt vermək olmazdımı? Burda başqa məqsəd var. Rus hərbiçisi hirsli vəziyyətdə Tatıya yaxınlaşıb əlini onun kürəyinə astadan vuraraq dedi:

- Sağ ol, Tato, hər şey mənə məlumdur, bu çopur köpək oğlu Mahmudu gəbərdə bilmədik ki, canımız qurtarsın. Onun məqsədi o pullara silah aldırıb bizi arxadan vurmaqdır, artıq gecdir get evinə, səhər gəl buraya sənin pulunu artıqlaması ilə verəcəm. Ancaq elə et ki, qonağının bu işlərdən xəbəri olmasın. Tatı sevincək geri evinə qayıdıb səhərin açilmasını səbirsizliklə gözləyəməyə başladı.

Artıq səhər açılmışdı. İbiş at xizəyini sahmana salmağa başlayırdı. Bu vaxt Tatı guya heç nədən xəbəri olmayan kimi üzünü İbişə tutaraq dilləndi:

- Ay kirvə, yuxun yoxdu nədi, niyə belə tez durub qaçmaq istəyirsən, ayda ildə bir dəfə bizə gəlmisən, heç ətraflı danışa bilmədik, bu namərdlər qoyur ki millət bir – birinin xeyir – işinə arxeyin gedib - gələ bilsinlər, bu gün səni onsuzda geri buraxmayacam, mənim qonağımsan.

İbiş isə dedı:

- Sağ ol kirvə, bir arxeyin vaxt tapıb sizə gələcəyik, bu dəqiqə harda olsa Heydar özünü yetirəcək. Tatının evi buraxılış məntəqəsinə yaxın olduğundan İbiş sevincək dilləndi, bax o zınqırovlu atlar Mahmud ağanın atlarıdı, onunla Heydar gəlir. Elə də oldu.

Heydar bəzəkli xizəkdən düşüb asta -asta buraxılış məntəqəsinə yaxınlaşdı. Ora İbişlə Tatı da getdilər. Kamendaturanın rəisi və tərcüməçi erməni də orada idi. İbiş uzaqdan dilləndi, kişi çəpik oi gecikirik axı, hava qarışır ancaq axşama evə çatacıq. Heydar isə allah kərimdi, çatarıq dedi. Heydar kağızını əskərlərə uzadanda rus zabiti gülə - gülə dilləndi:

- Baba, sənin kağızın bizə lazım deyil, səndən birdən ikidən kağızmı soruşan olub, səni bu mahalda hamı aşıq kimi tanıyır, bizimdə sənə böyük höprmətimiz var, dedim birdən xəbərim olmadan evinə gedərsən, sizin bu ermənilərdən bu gün birinin

toyudu, məndən xahiş ediblər ki, kişi sənin sözünü yerə salmaz, qoy bizim məclisdə iştirak etsin, hə, nə deyirsən, baba razısanmı.

Heydər dilləndi:

- Sağ olun ki məni qiymətləndirirsiniz, toydan cıxmışam, yaman yorğunam, evdə məni gözləyirlər, inciməyin, qala bilməyəcəyəm.

Yenə rus zabiti sözə başladı:

- Kişi, mən səni bir el ağsaqqalı kimi tanıyıram, onu da yadınnan çıxarma ki, bizlər bir - birimizə düşməndə olsaq, döyüş meydanlarında bizim doxturlar düşmənin yaralı əsgərləri ilə bizlərin yaralı əskərlərə heç bir fərq qoymadan hər ikisinə eyni gözlə baxırlar. Sən də toylar doxturusan, fərq qoymadan sevənləri sağalda bilməzsənmi.

Bu sözləri eşidən Heydər İbişə dedi:

- İbiş, çox sağ ol sənə əziyyət verdim, sən evinə get mən də səhər gələrəm.

Keçəl Tatı dilləndi:

- Kirvə arxeyin get, kişini özüm səhər yola salacam.

İbiş evinə, üç nəfər namərd isə yaxınlıqdakı idarəyə yollandılar. Heydər içəri düşən kimi rus zabiti sözə başlamadımı:

- Ayə, ay aşıx mübarək toyunuz nə tez qurtardı. Heydər yenə də heç nə başa düşməyənlər kimi:

- Nə bilim, vallah, qış vaxtı belə olur da.

Rus zabiti dedi :

- Axı sizinkilər qışda toy eləmirlər, mənə düzünü de.

Heydər dedi:

- Hərdən cavanların belə işi də olur.

Tərcüməçi erməni dedi:

- Satqın, bəsdi sənin nazinla oynadıq.

Rus zabiti dedi :

- Özünü tülkülüyə vurma, de görum çopur köpək oğlu Mahmuddan hansı təlimatları almısan?

Heydər dedi:

- Mahmud ağa mənə heç bir göstəriş verməyib.

Tərcüməçi erməni dilləndi:

- Axtarın bu satqının üst - başını. Əsgərlər ortalığa böyük bağlamada olan qızıl pulları qoydular.

Rus zabiti dedi:

- Ara bu pullar bir böyük ordunun bir illik puludu ki!

Tatı dedi:

- Heydər, onsuz da bunlar hər şeyi bilir, düzünü boynuna al, səni öldürməsinlər.

Heydər dilləndi:

- Hə, mən indi başa düşdüm ki bu nə toydu. Keçəl satqın, de görüm kimə ərə gedirsən? Mən kişiyəm ölümdən qorxmuram. Kişi kimi yaşamışam, ağam icazə versə, kişi kimi də ölməyə hazıram, bu millətin çörəyi sənə haram olsun, səni Allaha tapşırıram, üçü haqlamıyasan.

Rus zabiti yerindən qızıl quş kimi şığayib Heydərın qarnına möhkəm bir təpik vurdu:

- Burda ağa mənəm, sən də belə ol, ağan da. Heydər huşunu itirib yerə oturdu.

Rus zabiti:

- De görüm, Mahmud bu pulları kimə göndərib?

Heydər ağrıdan danışa bilmədi.

Rus zabiti dilləndi:

- Biz bilirik ki, qanlı köpək oğlu bu pullarla silah aldırıb, bizi arxadan vurmaq istəyir. İstəyi baş tutmayacaq. Aşıq Heydər, sən öz əlinlə öz qəbrini qazdın.

Heydər hannan hana özünə gəldi.

Heydər dedi:

- Kafir, Mamud ağaya böhtan yaxma, mən sizə danışdım axi, bu pullar mənim halal pulumdur, Allahın yolunda xərcləməliyəm.

Rus zabiti hirsli vəziyyətdə Heydərın ağzina bir yumruq ilişdirdi. Heydərin qanı su kimi axırdı.

Rus zabiti:

- Mən dedim axı, burda Allah mənəm.. Bəyəm sənin Allahın görmür ki, yetim Tato acından ölür. Rus stolun üstündən iki ədəd beşlik qızılı Tatıya verib dedi:

- Sən get evinə, görürəm kövrəlirsən, mənim işim hələ coxdu. Mən ona kimin Allah olduğunu göstərəcəm.

Heydər dedi:

- O tək mənim Allahım deyil ki, sənin də Allahındı. Rus zabiti Heydəra yenidən möhkəm bir yumruq vurdu. Heydərın qanı zabitin üst - başına dağıldı.

Erməni dilləndi:

- Satqın qammır ki, burda Allah kimdir.

Rus zabiti dedi:

- Bunun hər iki ağası belə olsun.

Heydər:

- Olsun kafir, qoy olsun, əgər sən deyəndisə, həqiqətən Allah varsa, qoy bu gecə o da öz gücünü sənə göstərsin.

Rus zabiti dilləndi:

- Əskərlər aparın bunu qalada ən soyuq yerə atın, onsuz da danışan deyil, qoy səhərə kimi ağlı başına gəlsin, səhər ya danişacaq, ya da ki öləcək.

Əskərlər Heydərin qolundan tutub Qarsın qalasında hər tərəfi acıq olan yerə saldılar.

Rus əskərlərindən biri Heydərə dedi:

- Kişi, bizdə əmr var ki, sənin isti paltarını əlindən alaq. Ancaq Allaha inandığıma görə, elə bil mənim ağam İsa məni qoymur səni soyunduram.

Heydər güclə dilləndi:

- Bala, Allah sənə kömək olsun!

Səhər Heydərı yenidən danışdırmağa aparmalı idilər. Ancaq üç gün oldu heç kimnən səs səmir çıxmadı. Heydər üç gün müddətində taqətdən düşmüşdü. Hər tərəfini soyuq almişdı. Eləcə Allaha dua edirdi:

- Allahım sənin və Rəsulun yolunda müqəddəs Məkkəyə getmək mənə nəsib olmayacaq. Mənim nə günahlarım varsa məni öz dərgahına bağışla, mən sənin yolunda ölümə tam hazıram, deyib üzünü müqəddəs Kəbaya döndərərək kəlmeyi –şəhadətini oxumağa başlayanda icəri iki əskər girib sözləri ağzında yarımçıq qala - qala

onun qolundan tutub çölə çıxardılar. Heydər güclə əskərlərdən soruşdu:

- Bala bu ölünü hara aparırsınız.

Əsgərlər:

- Qaradavoy sizi görmək istəyir.

Heydəri taqətsiz halda yenidən komendaturaya gətirdilər. Ona çay verdilər ancaq o içmədi və bir təhər özünü ələ alıb dilləndi:

- Mən artıq dünyamı dəyişirəm, mundarlanmaq istəmirəm, mən öz əhdimə çatmışam, artıq sizdən hec nə istəmirəm, indi isə məni öldürə bilərsiniz.

Qaradavoy isə gülə - gülə dilləndi:

- Bizim səni öldürmək fikrimiz yoxdur, de görüm o pulları nə üçün sənə veriblər.

Heydər dedi:

- Pullar mənim halal qazancım idi, ziyarətdə Allahın yolunda əlsiz və ayaqsızlara paylamalı idim.

Qaradavoy: - Sən məni görə bilirsənmi?

Heydər:- Eşidirəm, görə bilmirəm, gözlərimi soyuq kəsib.

Qaradavoy dedi:

- Kişi mən də sənin Allahına inaniram, deyirlər ki, üç gun sən Allaha dua elədin, bəs Allah səni eşitdimi?

Heydər dedi:

- Mən ağamın isti nəfəsindən başqa heç nə his etmədim. Hərdən qulağıma səs gəlirdi ki, Allahına dua et ki, sən artıq ziyarətdəsən.

Qaradavoy dedi:

- Bəs başqa nə eşitdin?

Heydər:

- Mən Allahdan onu istədim ki, hər kəsə öz əməlinə görə versin.

Qaradavoy dilləndi:

- Bəs nəticəsi nə oldu.

Heydər dedi:

- Eşitdiyim bu oldu ki, çixarsan, görərsən. Məni az incidin, işinizi qurtarın.

Qaradavoy dedi:



- Sən onu bil ki, sənin Allahın həmin gün Tatını dünyadan apardı, mənim oturduğum yerdəki generalin isə əl-ayağı tutlub yerindən qalxa bilmədi. Bu gün onu Gümrüyə göndərdik.

Qaradavoy hirslə tərcüməçi erməniyə baxıb dedi:

- Ayə, yaramazın biri yaramaz, siz ki bu kişini yaxşı tanıyırsınız. Niyə bu milləti, bilə - bilə bizim üstümüzə qaldırırsınız. Hər şeyi sizin ücün edirik axı! Bəyəm türklər ölüblər, yatmısınız fil qulağında hər tərəfdən də silahı sizin özünüzə pul verib keçirirlər. Elə bilirsiniz ki, bunlardan xəbərimiz yoxdu. Bu kişinin pluna tamah salmısınız. Təcili bu kişini sağ - salamat evlərinə qoyub mənə bu haqda məlumat verin.

Qaradavoy dedi:

- Heydər kişi, bizi bağışla, mən Allahı da, bəndəni də yaxşı tanıyıram. Ancaq onu da deyim ki, sənin pullarını qaytara bilməyəcəyik, çünki sənin pulların generaldadı, o da ki, belə. İndi hər şey sənə agahdı. Allah amanında, sənə yaxşı yol. Ağan səni tez sağaldar.

Heydəri yarimcan vəziyyətində elə həmin gün evə gətirdilər. Məşədi Rəcəb əsgərlərdən soruşdu kı bu kişiyə nə olub, niyə bu haldadı. Tək sözləri o oldu ki, bu kişi üç gün Qars qalasında qalıb. Məşədi Rəcəb bir ah cəkib bircə sözü o oldu ah namərdlər, namərdlər!..

Biz atamı dövrəyə almışdıq. O dınib - danışa bilmirdi, rəngi qap - qara idi. Məşədi Rəcəb anama dedi ki, kişini mökəm soyuq alıb, qançıra oulb. Atam bir quzu saxlamışdı ki, Məkkədən qayıdanda kəsib bu quzunu camaata paylasın. Ancaq əmimin heç nəyi olmadığına görə naləc qalıb quzunu kəsdi və anama dedi ki, bir hissəsini qonşulara payla bu deyikli quzudu, dərisinə isə atami saldı.

Atam yerindən bir aydan çox olardı qalxa bilmədi. Onu da deyim ki, danışa bilməyən atam, yalnız nə isə deyib, hərdən Quran oxuyardı.

İki aydan sonra atam yavaş-yavaş gəzməyə başladı.

Üç ayın tamamında atam tam sağalmışdı. Səs yayılmışdı ki, Məkkədən gələn hacılar artıq evlərinə qayidırlar. Hətta hacılar atama xəbər gətirdilər ki, iki günə kimi Nuru və Alışan hacılar

Qağızmanda olcaqlar. Bu xəbəri eşidən atam sevincindən gözləri yaşarmışdı. Belə məsləhət gördü ki, mənlə gedib gələnləri qarşılasın. Biz atlamla axşam Qağızmana çatdıq. Şəhərin axundu Hacı Osman bizi axşam evində qonaq saxladı.

Hacı Osman atama dedi ki, səni çox gözlədik amma sən gəlmədin, mən həccə gedənlərə məsləhət gördüm ki, möhkəm boran qalxıb, ola bilsin, Heydar İran yolu ilə Həccə getsin. Atam isə sakit bir tərzdə dilləndi:- Hacı Osman, mənə müqəddəs Məkkəyə getmək qismət olmadı,- dedi. Osman daha heç nə demədi. Səhər səs yayıldı ki bir saata kimi Hacılar burda olacaq. Elə də oldu. Qayda bu idi ki, ziyarətə həm gedəndə, həm də gələndə hamı məscidə yığılardı, Allaha dualar oxunardı, qurbanlar kəsilib camaata paylanılardı.

Hər iki Hacı (Nuru və Alışan) məscidin qarşısında yerə çöküb birinci torpağı öpdülər, sonra ayağa durub məscidə daxil oldular. Hacı Osman "Qurani Kərimi" oxuduğundan hamı sakit dayanmışdı. Osman sözünü qurtaran kimi cammat hacılarla görüşməyə başladılar.

Birdən Nuru camatın içərisində Heydəri görüb, Alışana səsləndi.

-Hacı Alışan, bu hacı quşdu nədi, həm orda bizi qarşıladı, həm burda, deyib hər ikisi atama tərəf gəlib onun əllərindən öpdülər. Alışan əlindəki uşaq üçün hacı papağını mənim başıma qoyub, alnımdan öpərək, ay mənim qoç igidim allah saxlasın dedi.

Nuru isə atama baxıb gözləri dola - dola dilləndi:

- Ay qardaş, millət imkan vermədi, səninlə cox danışaq, bir də ki sən bizimlə Samirə şəhəhərində ayrıldın və dedin ki, mənim coxtanki arzumdu ki, Kəlbəlaya gedib İmamları ziyarət edim. Bu vaxt məscidə sakitlik çökdü. Hamı həm atama, həm də hacılara baxdılar.

Axund hacı Osman işi belə görüb dilləndi:

- Əziz hacılar, axşam Heydər mənim qonağım idi, soruşdum ki, səni çox gözlədik, niyə gəlmədin? O isə bircə kəlmə mənə dedi ki, ora getmək mənə qismət olmadı. Biz də onu hacı kimi qarşılaya bilmədik. Axı bu elə işdir ki, Heydər...

Nuru yenə sözə başladı. Əzizlərim, biz gözümüzə inanaq, yoxsa sizə. Bizim elin adamları orda ona həsəd aparırdı, hətta səhər namazı yaxşı səsi olduğuna görə ona tapşırılmışdı, minarədən azan verəndə hamının başından tükü ayğa qalxırdı, deyirdilər ikinci adamdı ki, belə səslə oxuya bilir, bir də ki, bir yerdə yatıb, bir qabdan yemək yeyirdik, hətta Alışanla belə qərara gəlmişdik ki, ilk o hacını qarşılayanlardan biri gərək bizlər olaq.

İşi belə görən atam hacılara üzünü ttutub dilləndi:

- Əziz Hacılar! ey Allahın qulları! Hacı Osman nə buyurursa düz buyurur? Axundumuz nə deyirsə sizlər ona inanın, və sakit bir tərzdə atam dilləndi:

- Şükür məsləhətinə, Allahım, öz qulunu unutmadın.

Hacı Osman heç nə demədən atama yaxınlaşıb alnından öpdü və dedi:

- Hacı Heydər bu gündən sən bizim mahalın nəyinki, aşığı, həm də axundusan, Allahın qapıları hər yerdə üzünə açıq olsun. Axı niyə belə şeyləri bizə əvvəlcədən başa salmadın.

Atam Heydər Məkkədən gətrilmiş "Quranı-Kərimi" axunda verərək dedi:

- Sizləri and verirəm bu əziz Qurana, mən son sözümü deyənnən sonra heç kimsə o namərdin ailəsində işi olmasin. Allah hər bir insana cəzanı öz günahlarına görə verir. Onun ailəsinin ağamın, mənim və eləcə də sizlərin qarşısında günahları yoxdur. Günahkar öz cəzasını bulub.

Aşıq Heydər:

- Axund Hacı Osman icazə versən, mən bunları sözlə deyim.

Hamı bir ağızdan dilləndi:

- Hacı Heydər, eşidirik səni.

Əzizlərim, bu dəmdə atam aldı görək nə dedi:

Bir qanmazın ucbatından,
Böyük balaya düşmüşəm.
Açılıb yerin göbəyi,
Yanar lavaya düşmüşəm.

Müxənnətin yoxdu zatı,
Çürükdü onların qatı,
Məni satıb keçəl Tatı,
Qarsda qalaya düşmüşəm.

Urus gəlir, millət gedir,
Qaradavoy malçi deyir.
Çinovniklər at belində,
Körpə uşaqları döyür.
İblisə oxşayan kafir,
Qaxtağan nadanı öyür.
Bura şeytan məclisidi,
Çaşıb alaya düşmüşəm.

Gedəmmədim ziyarətə,
Gözlərim yollarda qaldı!
Neçə illik qazancımı,
Uruslar əlimdən aldı!
Qəsdi məhv etməkdi məni,
Qarsın qalasına saldı!
Namərd yağının cəngində,
Mən ah – vaya düşmüşəm.

Bir göz qırpımında, ellər,
O müqəddəs yolu getdim!
Öpdüm ziyarət daşını,
Mətləbimə mən də yetdim!
Ruhum uçdu Ərəfatdan
Haqqın ətəyindən tutdum!
Mövlam yetişdi dadıma,
Ərşü - əlaya düşmüşəm.

Sinəmdə bir tufan qopdu,
Haqqın nurunda üzürəm!
Bu yollarda, kim deyər ki,

Mən də usanıb bezirəm!?
Cənnəti – rizvana girib,
Güllərini üzürəm!
Mən Aşıq Heydər olandan,
Müsəllaya düşmüşəm!

Onuda deyək ki, Müqədəs Məkkə Ziyaratı ilə bağlı Aşıq Heydər böyük həcimli bir dastan yaratmışdı. Ustad bu dastanın adını Qars şəhərinin ruslar tərəfindən işğal olunması ilə əlaqədar olaraq "Qan Çanağı" qoymuşdu.

Dastanın birinci hissəsi Anadolu torpaqlarının işğalı ilə bağlı olmasından xəbər verirdi.

Dastanın ikinci hissəsində, Qərbi Azərbaycanın (indiki Ermənistanın) Çuxur Səd (İrəvan), Gümrü, Şörəgəl, Ağbaba və.s regionlarında rus – erməni hərbi birləşmələrinin törətdikləri qətliamlarından danışılırdı.

Çox heyiflər olsun ki, dastanın ikinci hissəsi barəsində əlimizdə cox az məlumat vardır. Ona görə ustadın "Qan Çanağı" dastanının bu kitabda işıq üzü görməsi hələlik mümkün olmadı.

**Tərtibatçılar:** **X.Məmmədli**
Pedoqogika üzrə fəlsəfə doktoru, dosent.
**Ə.Heydər**



# QƏRİB AĞANIN HACI ABBAS OĞLU MƏHƏMMƏD AĞA və MƏŞƏDİ RƏCƏBLƏ BAĞLI XATİRƏLƏRİ

Camaat İrana gedəndə Murtuz ağa Qərib kişinin yanına gəlib ondan Məşədi Rəcəbi soruşur. Qərib kişi deyir:

– O da tezliklə yola düşmək istəyir.

Murtuz ağa həyəcanla Qərib kişiyə baxır:

– Sən yaxşı bilirsən ki, Məşədi Rəcəblə aramızda mübahisə olub. Başımın yarası təzə–təzə qaysaq tutur. Mən Kərbəlayi Məhəmməd ağa və Mahmud ağanın sözünü yerə salmayıb buraya gəlmişəm. Sən onu buraya çağırtdır. Məhəmməd ağanın ona bir–iki sözü var, deyim mən borcumdan çıxım.

– Yaxşı, Murtuz ağa, onda sən bir az gözlə.

Qərib kişi o saat Məşədi Rəcəbin dalınca bir adam göndərir. Az keçməmiş Məşədi Rəcəb gəlib çıxır. Murtuz ağa onu görən kimi qalxıb görüşür, hal–əhval tutur, sonra zənn ilə onun üzünə baxıb deyir:

– Bilirəm, Məşədi Rəcəb, sən mənə çətin inanacaqsan. Amma mən buraya özbaşına gəlməmişəm. Məni buraya sənin qardaşların göndəriblər. Mən də onların sözlərini yerə salmayıb səninlə görüşə gəlmişəm.

Məşədi qəmgin halda dilləndi:

– Sözünü müxtəsər elə, mən tələsirəm.

– O ki belə tələsirsən Məhəmməd ağanın dediklərini olduğun kimi sənə çatdırıram.

Məhəmməd ağa deyir, o mərd oğlu mərd niyə bizdən umu–küsü eləyir? O yaxşı bilir ki, bütün Türkiyə pis vəziyyətdədir. Kişi olan meydandan qaçarmı? Mən Məşədi Rəcəbi mərd kişi bilirəm! Rəcəb Ağbaba özünümüdafiə süvari alayının yüzbaşısıdır, o üzərinə düşən vəzifəni tam yerinə yetirməyib. Düzdür, Ağbaba uğrunda gedən qanlı döyüşlərdə Məşədi Rəcəb yaralandı, ermənilər Ağbaba kəndlərində yüzlərlə adm qətlə yetirdilər. Qətlə yetirilənlərdən biri də yüzbaşının qızı oldu.

Anadolu torpaqlarında on minlərlə qoca, qadın, uşaq, qız, gəlin erməni daşnaqları tərəfindən işgəncə ilə qətlə yetrilib. Bəs bu ölənlər yüzbaşının qızı, gəlini, övladı, atası və anası deyilmı?

Амма onun sərəncamında yüzlərlə Ağbaba Süvari Alayının aslanları var. Həmin igidlərin hər biri bir erməni alayına bərabərdi. Görəsən, Məşədinin İrandan sonra hara getmək fikri var?

– Sözünü qurtardınm Murtuz ağa?

– Bəli.

Məşədi Rəcəb patron yeşiyinin üstə oturub papiros çəkə–çəkə əlini yellədi:

– Daha mən İrana gedəsi olmadım, qayıdıram geri.

El İrana gedəndən heç bir ay keçməmiş 60, 70 atlı erməni kəndə hücum etdi. Kənddə çox az adam qalmışdı. Cəmi beş–altı ailə olardı–olmazdı. Diknə dağının üstündən erməni atlıları kəndə tərəf gəlməyə başladılar. Məşədi Rəcəbin evinin dörd yanı səngərə çevrilmişdi.

Məşədi Rəcəbin evi kəndin qırağında olduğundan düşmən buraya həmlə etdi. Erməni atlıları güllə ata–ata evə yaxınlaşmağa başladılar. Adamların çoxu bu evdə idi.

Ağbaba Süvari Alayının igidləri yüzbaşı Məşədi Rəcəbin başçılığı ilə Düzkənd uğrunda gedən döyüşlərdə nəzarəti öz əlinə keçirə bilmişdi. Düzkənd uğrunda qanlı döyüşlərdə onlarla erməni döyüşçüsü məhv edilmişdir.

Aradan bir xeyli vaxt keçəndən sonra türk qoşunları Ağbabaya daxil oldu, ermənilər tələm–tələsik qaçıb aradan çıxdılar. Ağbaba Milli Şurasının sədri Hacı Abbas oğlu Kərbəlayı Məhəmməd ağa on–on beş atlı ilə Qərib kişigilə gəldi:

– Yaman yorulmuşuq, Qərib ağa, bizə bir çay versən pis olmaz. Məşədinin könlünü almağa gəlmişəm.

Bu vaxt Məşədi Rəcəb yaraqlı – yasaqlı içəri girdi. Hacı Abbas oğlu Kərbəlayı Məhəmməd ağa ayağa qalxıb onunla hərarətlə görüşdü və ona dedi:

-Şükürlər olsun, böyük yaradana, yüzbaşı, yaraların tam sağalıb. İğidləri hazırla, 9-cu dviziyanın tərkibində Gümrünü azad etməliyik. Qaraməmməd kəndində ermənilərin törətdikləri qətliamın vaxtı gəlib çatıb. Sonra bikef halda dilləndi:

Görəsən, ay Məşədi, bu Aşıq Heydər necoldu? Başına nə iş gəldi? Gör neçə vaxtı onun səsinə, sözünə tamarzı qalmışıq.
Allah eləyə, kişinin başına bir iş gəlməyə. Necə olur–olsun, onu gəzib tapmaq lazımdı.

– Darıxma, ay Məhəmməd ağa, Mahmud ağa Heydəri tezliklə gətirəcək. Onda gərək məclisi sən keçirəsən. Mənim heç nəyim qalmayıb.

– Hə, deyirəm, təki Aşıq Heydər qayıdıb gəlsin, Ağbaba Süvari Alayında böyük bir məclis qurmaq mənim boynuma.

Hacı Abbas oğlu Kərbəlayı Məhəmməd ağa Məşədi Rəcəblə sağollaşıb Böyük Şiştəpə kəndinə yola düşdü.

# XƏSİS AĞA İLƏ AŞIQ HEYDƏR

Bir gün Aşıq Heydər Çıldırın kəndlərindən birində qonaq olmaq istəyir. Axşam tərəfi imiş. İstəyir getsin qonaqçısının evinə. Bir gəlin yalvarıb onun ətəyindən tutur:

– Əl mənim, ətək sənin, Aşıq Heydər, gəl bizə qonaq ol.

– A qızım, axı mənim burda öz qonaqçım var.

– Məsələ başqadı. Bizim kişi bizi acından qırır. Deyirəm bəlkə sən bu işə bir əncam çəkəsən. Bu nıqqız kişidən bizim canımızı qurtarasan.

– Yaxşı, gedək.

Aşıq Heydər keçir içəri. Ev sahibi Aşıq Heydəri görən kimi ayağa qalxır, ona yer göstərir.

– Gəl, gəl otur, sən nə yaxşı bizə gəlmisən. Arvad da bir az pendir-çörək gətirsin, iştaha işə yeyək.

Bəli, arvad süfrəyə beş-altı çörək qoydu, çoxlu pendir qoydu. Amma Aşıq Heydər əlini çörəyə uzatmamış, ev sahibinin uşaqları bir göz qırpımında pendir-çörəyi yeyib qurtarırlar. Ev sahibi işi belə görüb arvadına acıqlanır:

– A köpək qızı, görürsən ki, bir qonağın var, beş-altı çörək niyə gətirdin ki, bu qırılmış da yeyib qurtardı. Aşıq Heydər əlini heç çörəyə uzada bilmədi.

Aşıq Heydər gülümsündü:

– Ağa, sən heç qonaq-zad qəbul elməmisən, eləmi? Qonağa pendir-çörək verirlər?

– Axı, sənin öz qonaqçın var. Mən nə bilim, sən bizə qonaq gələcəksən?

– Görürəm ki, sən qonaq qəbul eləyən adam deyilsən. Nə olar, onda çıxıb gedərəm.

– Yox, yox, mən elə demədim.

– Onda qalx, bir qısır hevan kəs, bir də bir qoç.

– Aşıq Heydər, insaf elə…

– Bir azdan Mahmud ağa gələcək. Mənə dediklərini ona da deyərsən. Ona da pedir-çörək verərsən. Deyirsən, ağa gəlib sən salsın matrağın altına?

– Barı, qısır heyvan kəsim, qoç qalsın.

– Xeyr, elə şey yoxdu, qoçu da kəsdirməlisən.

– Yaxşı, yaxşı…

Bəli, heyvanlar kəsilir, qazanlar asılır. Süfrəyə xaşlama, kabab gəlir. Ev sahibinin uşaqları, Aşıq Heydər iştaha ilə yeyirlər, amma ev sahibi əlini yeməyə uzatmır. Aşıq Heydər gülə-gülə deyir:

– Ağa, ye, qorxma, öz malındı. Elə yeməyə-yeməyə boğazın tutulub, indi bir tikə də keçmir.

– İştaham yoxdu.

– Özün bil.

– Bəs deyirdin Mahmud ağa da gələcək, gecə keçib ki.

– Daha gəlməz. İndi sən məni eşit.

– Buyur.

– Bir də bu arvad-uşağa əziyyət vermə, bunları ac saxlama. And olsun Allaha, Mahmud ağaya bunu desəm, səni asdırar, eşitdinmi məni?!

– Yaxşı evimi yıxdın, Aşıq Heydər, daha məndə pul-para qalmaz.

– Qalan qalacaq, qalmayan qalmayacaq.

– Bu dediyini heç başa düşmədim, Aşıq Heydər.

– Varın çoxdu, bir qarın yeməklə var qurtarmaz – bu qalandı. Qalmayan sənin simicliyin, ninkızlığındı. Sən yedikcə o yox olub gedəcək, qalmayacaq. İstəyirsən ye, istəyirsən onun-bunun ağzına bax. Xətrin necə istəyir, elə elə.

Aşıq Heydərin bu sözlərindən sonra xəsis ağa insafa-mürvətə gəlir, kasıb adamlara köməklik etməyə başlayır!.

# AŞIQ HEYDƏRİN MƏHKƏMƏSİ

Xəbər gəlir ki, bəs Mahmud ağanın dostu Xəlilin qızı Tellini Məhəmməd qaçırıb Merədeşdən Ağbabaya, Qaraçantaya aparıb. Mahmud ağa hirsindən durub dincələ bilmədi:

– Öldürəcəm, asacam onu! Hələ bu yetim gədənin tutduğu işə bax! Aşıq Heydər, dur gedək. Bəli, onlar gəlirlər Qaraçanta kəndinə. Kosalardan Məşədi Mövlənin qapısında dayanırlar. O saat qonaqları içəri aparırlar. Mahmud ağa Məşədi Mövləyə deyir:

– Eşitmişəm, Məmməd sənin evindədi? Onu mənə ver, verməsən vay sənin halına.

Məşədi Mövlə ağaya mehribanlıqla baxıb deyir:

– Ay bala, mən Məmmədi görməmişəm. Yox, əgər mənə inanmırsan, evi gəz. Əgər burdan sən deyən adam tapılsa, mən günahkaram.

O saat Mahmud ağa adamlarına göstəriş verir. Di gəl Məmmədi tapa bilmirlər. Mahmud ağa işi belə görüb Aşıq Heydərə deyir:

– Aşıq Heydər, mən bilirəm, bu Məmməd bu evdə gizlənib. Di gəl tapa bilmədik. Yaxşı, indi bu Məşədi ilə neynəyək?

– Neyləyək, gəlmişik, bir qısır heyvan kəssin yeyək, səbr eyləyək. Yəqin çox çəkməz, Məmməd də tapılar.

– Yaxşı, sən deyən olsun. Məşədi Mövlə o saat bir qısır heyvan kəsdirir. Arada ehmalca Aşıq Heydərə işarə eləyir ki, Məmməd burdadı. Aşıq Heydər ona səbrli olmağı tapşırdı. Bu vaxt Mahmud ağa oturmuşdu qazan başında. Bir də baxdılar ki, qazanın dibində bir-iki qab ət qalıb. Əti qablara çəkib süfrəyə qoyurlar, ağız dadı ilə yeyirlər. Aradan bir həftə keçəndən sonra Məmmədi tutub qolubağlı gətirirlər Mahmud ağanın yanına. O, Aşıq Heydərə dedi:

– Bunu asdırmaq lazımdı.

– Ağa, əgər hirslənməsən, bir söz deyərəm.

– Buyur, birini yox, ikisini de.

– Bunu tutub buraya zorla gətiriblər, yoxsa özü könüllü gəlib?

– Könüllü gəlib.

Bəs onda bunun qollarını niyə bağlayıblar? Mahmud ağa, sən bir ədalətli, haq tərəfi adamsan.

Aşıq Heydər belə deyəndən sonra Mahmud ağanın razılığı ilə Məmmədin qollarını açırlar. Mahmud ağanın da hirsi yatır, səhv elədiyini başa düşüb Aşıq Heydərə mehriban-mehriban baxır:

– Aşıq Heydər, bu işə çox mat qalmışam ki, səndə nə var ki, həqiqəti həmişə birinci sən bilirsən?! O ki belə oldu, qərarı da sən ver. De görüm, bu Məmmədə nə cəzası verək?

–Tutaq ki, Məmmədi dama salıb Tellinin əlindən aldıq. Bu necədi? – Yaxşıdı.

– Yox, ağa, bundan sonra Tellini kim alar? Axı olan olub, torba da dolub. Gəl biz buna halallıq verək. Xəlil kişi də halallıq versin. Verməsə də verdirək.

– Yaxşı, bəs Məşədi Mövləynən nə eləyək? Deyirlər Məmməd onun evində imiş.

– Yox, onun evində yox, evinin yaxınlığındakı kalafada gizlənibmiş. Məşədi nə bilsin bunu?

– Onda deyirsən Məşədi Mövlə ilə işimiz qurtardı, eləmi?

– Yox, Məşədi Mövləyə xəbər yollayaq. Bir qısır heyvan kəsdirsin, bir də…

– Bir də nə?

– Bir qoç.

– Qoçmu?

– Bəli. Qısırı sən yeyəcəksən. Bəs biz bir şey yeməyək?

Bu sözləri eşidəndə Mahmud ağanın şeytanı qırılır: – Yaxşı, yaxşı. Qoy elə sən deyən olsun. Ağa Məmmədə baxanda yenə üz-gözünü turşudur:

– Sən də get xeyir işə hazırlaş. Mən Xəlilə xəbər göndərəcəm, nəm-nüm eləməsin. O, ürəklə toyda iştirak elməlidi. Toyu Aşıq Heydər keçirəcək. Ağa əlini cibinə atıb bir ovuc qızıl çıxardı, verdi Aşıq Heydərə. Aşıq Heydər Mahmud ağanın ona verdiyi pulu Məmmədə verib dedi:

– Allah Mahmud ağanın ömrünü uzun eləsin, cibini həmişə dolu eləsin. Apar bu pulnan toyunu elə. Di durma, get. Belə fürsət bir də düşməz ələ. Məmməd utana-utana çıxıb gedəndə Mahmud ağa Aşıq Heydərə dedi:

– Aşıq Heydər, amma Məmmədə yaxşı məhkəmə elədin ha!

– Ağa, mən nə deyim, yəqin ki, Aşıq Heydərin də məhkəməsi belə olar. İnsaf- mürvət olan yerdə mərhəmət də, bağışlamaq da var.

# ORUC KİŞİNİN ƏHVALATI

Bir gün Bağçalıdan Bala Hüseyn adlı bir oğlan Qızıldaşlı Orucun qızını qaçırır. Oruc kişi düz gəlir Hacı Abbasoğlu Mahmud ağanın yanına. Başına gələni ağaya danışır. Ağa Oruc kişiyə diqqətlə qulaq asandan sonra deyir:

– Bu necə oldu?

– Daha necə olacaq, indicə sənə danışdım ki… Bu Bala Hüseyndi, nədi… Allahın bəlasıdı bu… Bir xırda boyu var, amma… Oğlanlarımın yeddisi də onun dalınca düşmüşdü…

– Bala Hüseyn də atlı idimi?

– Atlı idi, oğlanlarım da atlanmışdılar ki, bunu tutsunlar, amma… Amma bu qaçıb aradan çıxdı.

– Demək qoçaq adamdı. Elə deyilmi, Aşıq Heydər?

Aşıq Heydər gülümsündü:

– Elədi, ağa, amma Oruc kişi, deyəsən, razı deyil, amma…

– Amma nə?

– Amma Oruc kişi bilmir ki, qoçaq adam həm də mərd olur. Qaldı onun boyu… Bu, çox vacib şey deyil. Mən də bilirəm ki, Bala Hüseyni bura çağırtdırsaq, gələr.

– Gəlməsə, onda?..

– Gəlməsə, cəzalandırarsan, ağa.

Mahmud ağa razılıqla Aşıq Heydərə baxdı:

– Onda bir sınayaq onu. Sən bu işə nə deyirsən, Oruc kişi?

– Ağa, sən onu çağırıb cəzalandır, qızımı da əlindən alıb bizə qaytar. Sən bu Aşıq Heydərin sözünə baxma. Kim bilir, bu bəlkə ona dost adamdı?

Oruc kişi belə deyəndə Mahmud ağa ona tərs-tərs baxdı:

– Kişi, sən darqursaqlıq eləmə. Bu saat bilərik ki, iş nə yerdədi!

O saat Mahmud ağa göstəriş verdi: bir nəfər Bala Hüseynin dalınca getdi. Aradan çox keçmədi ki, Bala Hüseyn gəlib çıxdı, ədəblə salam verdi. Oruc kişini görən kimi başını aşağı saldı. Bunu görəndə Oruc kişi bomba kimi partladı:

– Ağa, bu boyu bir qarışın cəzasını ver.

– Kişi, bu nə səs-küydü, toxda bir az.

Mahmud ağa acıqlanıb yerindən qalxdı.

– Bala Hüseyn, sən bu kişinin qızını nə cürətlə qaçırmısan?

– Ağa, mən bu kişinin qızına bir neçə dəfə elçi göndərdim, amma bu kişi məni təhqir etdi, ağzına gələni danışdı. Mən də… Qızın könlü var, olmasa, mən bu işə girişməzdim.

– Demək, qız razıdı.

– Bəli.

– Aşıq Heydər, sən bu işə nə deyərsən?

– Ağa, bu adam mərd adamdı. Mərd adamda yalan olmaz. Qaldı bunu sınamağın. İstəyirsən bunu bir sınayaq.

Ağa sərt adam olsa da, mərd adamlardan xoşu gəlirdi. Bu, yenə bir də Bala Hüseynin boyuna, enli kürəklərinə, bənövşə bığlarına baxıb gülümsündü:

– Demək, sən həm də yaxşı at minənsən. Onda belə olsun…

Ağa işarə edən kimi bir almanı bir daşın başına qoydular. Mahmud ağa Bala Hüseynə almanı göstərib dedi:

– İndi atını min, çapa-çapa güllə ilə o almanı vur. Əgər bunu eləyə bilməsən, vay sənin halına.

Bala Hüseyn o saat atın belinə sıçradı, ağanın ona atdığı tapançanı göydə tutdu, atı çapa-çapa atəş açdı. Güllə açılan kimi alma parçalanıb dağıldı.

– Əhsən, əhsən!

Mahmud ağa bu səsin sahibini səsindən tanıyıb yerindən qalxdı:

– Kərbəlayi Məhəmməd bəy, sən buraya xoş gəlib, səfa gətirmisən.

– Bayaqdan gəlmişəm, amma sənin başın elə qarışmışdı ki, mənim gəldiyimi görmədin. Üstəlik, adamlara işarə etdim ki, ağaya mənim gəldiyimi çatdırmasınlar. De görüm, indi bu cavan oğlanın taleyi necə olacaq?

– Qoçaq oğlandı. Oruc kişi onu bağışlamalı, gecikmədən toya başlamalıdı. Xeyir işi gecikdirmək olmaz.

Toy adını eşidəndə Oruc kişinin rəngi saraldı:

– Ağa, axı…

– Mənə heç nə demə. Dür get toya hazırlaş. Aşıq Heydərlə sənə qonaq gələcəyik. Bir qısır heyvan kəsərsən.

Kərbəlayi Məhəmməd bəy gülümsündü, əli ilə onu yanına çağırdı:

– Səhər gələrsən yanıma. Bəy paltarını, atını, toy xərcini apararsan.

– Bəy…

– Dedim, qurtardı. Dediyimə əməl eləyərsən, vəssalam!

Bəy çıxıb gedən kimi Mahmud ağa Bala Hüseyni də hörmətlə, nəmərlə yola saldı. Oruc kişi nəsə demək istəsə də, Mahmud ağa ona danışmağa imkan vermədi:

– Daha atılıb-düşməyin əbəsdi, get, deyilənlərə əmələ elə.

– Əməl eləyəcəyəm, amma…

Aşıq Heydər Oruc kişinin nə deyəcəyini bilirmiş kimi onun sözünü kəsdi, hazırcavablıqla dilləndi:

– A kişi, xoşluqla işini gör. Dilinə dən verincə, əlinə dən ver. Özün gəldinmi? Səni çağırmadıq ki? Yox. Yaxşı, sənin dediklərinə əməl elədik. İndi də sən deyilənlərə əməl elə.

# QULU KİŞİ İLƏ AŞIQ HEYDƏRİN AT MƏSƏLƏSİ.

Bir dəfə Qulu Aşıq Heydərlə furqonu qoşub Axısqaya gedəndə yolda bir yerdə qabaqlarına dörd-beş silahlı atlı çıxır. Onlar silahlarını bunlara tuşlayıb deyirlər:

– Durun, yerinizdə tərpənməyin. Bizə atlardan ikisini verməlisiniz.

Qulu istəyir ki, etiraz eləsin.

Atlılardan biri ona acıqlı-acıqlı deyir:

– Verməsəniz… ikinizi də öldürərik. Ya atları Verin, ya da…

Aşıq Heydər işi belə görüb dinməzcə furqondan duşur, atın ikisini açıb atlılara verir.

– Aparın.

– Belə ha… Sən deyəsən ağıllı adamsan.

Atlılar gedəndən sonra Qulu bir Aşıq Heydərə, bir də yurqondakı atlara baxıb deyir:

– Ay Heydər dayı, biz indi nə eliyəcəyik. Yaxşı bilirsən ki, Əbdüləzim kişi bizi dara çəkəcək. Bunlar kimiydilər, bu nə işiydi başımıza gəldi?

– Bunlar lazlarıydı, qaçaqlardı. Bir az o yan, bu yan eləsəydik ikimizi də güllələyərdilər.

– Bə indi neyniyəsik?

– Darıxma, a bala, buna bir şey fikirləşərəm. Sür furqonu bu qabaqdakı kəndə.

Qulu deyiləni yerinə yetirən kimi Aşıq Heydər bir yerdə ona furqonu saxlamağı deyən kimi o, furqonu dayandırdı. O saat Aşıq Heydər furqondan aşağı düşüb getdi. Aradan xeyli keçmiş geri qayıtdı, əlində iki kağız varıydı. Qulu bunu görüb maraqlandı:

– Heydər dayı, bu nə kağızlardı?

– Atların aktını almışam. Guya çatlayıb ölüblər. Lap daşdan keçən sənəddi.

Bax, bu ikinci kağız da gönləri təhvil verməyin haqqındadı.

Daha Qulu heş nə deməди. Onlar geri, Ağbabaya qayıtdılar. Kəndə çatan kimi Əbdüləzim kişi işdən xəbər tutan kimi az qaldı dəli olsun:

– Atlar hanı? Bu at məsələsi məni dəli eləyəcək. Kimə satdınız? neçəyə satdınız?  Bir əməlli danışın.

Aşıq Heydər sakitcə kağızları onun qabağına qoydu:

– Ay sədr, yolda atların ikisi çatladı. Qaldıq belə. Getdim döktor gətirdim. O baxıb akt yazdı, atların gönlərini də bir yerə təhvil verib kağızını aldım. Bə neynəyəydim.

Sədr belə deyəndə bir Quluya baxdı, bir Aşıq Heydərə say saldı, bir qabağındakı kağızlara gözlərini zillədi. Amma bir qərara gələ bilmədi:

– Dediklərinə inanmağım gəlmir.

– İstiyirsən inan, istiyirsən inanma. Bu sənədlər, bu da biz. asdırırsan asdır, kəsdirirsən kəsdir. Amma göydəki Allahı da yadına sal.

Sədr bu sözləri Aşıq Heydərdən eşidəndə nə düşündüsə daha heç nə demədi. Aşıq Heydəri də, Qulunu da rahat buraxdı.

# ARPA MƏSƏLƏSİ

Bir gün Aşıq Heydər baxır ki, Molla Cabbar çox çətin vəziyyətdədi. O, kənd rəhbərliyinə xahiş edib bu kişini anbara gözətçi qoydurur. İşin sonunda bölgü vaxtı iş yoğunlayır. Anbarda xeyli buğda çatışmazlığı aşkar olur. Bu xəbər Aşıq Heydərə çatanda o çox narahat olur. O, nə düşünürsə, əmisi oğlu Məhəmmədə deyir:

– Məhəmməd, mən anbara gedirəm, sən də oraya gəl.

Məhəmməd anbara gələndə baxır molla Cabbarla əmisi oğlu Aşıq Heydərlə şirin-şirin söhbət edirlər. Briqadir Musa kişi də qaş-qabaqlı siqaret çəkir. Məhəmməd içəri girən kimi Aşıq Heydər deyir:

– Ay Məhəmməd, bax bu anbarda olan arpa, buğda xalqındı, sizin ha deyil. Nə olar, bu kişi də qoca adamdı, tutaq ki, bir-iki kisə arpa-buğda aparıb. Dünyanımı dağıdıb? Sənin atanın mərdliyini, kişiliyini hamı söyləyir. Ayıb deyilmi, bütün kənddə yayılıb ki, belə,belə… Anbardan taxıl aparılıb. İndi gör, bu, rayona çatsa nə olar. Odur ki, bu məsələni elə buradaca mənim yanımda həll elə getsin. Məhəmməd Aşıq Heydərə diqqətlə qulaq asandan sonra başını yırğalayır:

– Əmi, sən işin içini bilmirsən axı! Beş-on kisə olsa idi, nə var ki… Amma anbardan düz səkkiz yüz kilo taxıl əksikdir. Bax, sən buna nə deyirsən? Mən başa düşürəm, Molla Cabbar qoca kişidi, bəs qohumu niyə dinmir?

Aşıq Heydər hirslə bir əmisi oğluna, bir Cabbar kişiyə, bir də kənarda duran Musa kişiyə baxıb deyir:

– Yaxşı, Məhəmməd, indi ki, belədi, onda mənim oğlanlarıma bölgüdə nə düşürsə, onu vermə, bu kişinin – Cabbarın borcuna çıx. Bircə bu məsələni rayon bilməsin. Cabbar kişi qoca adamdı, bu yaşında kişini incitməsinlər.

– Əmi, gəl sən heç hirslənmə, sənin xətirnə bu işi buradaca həll edəcəyəm. Amma mənim bir-iki sözüm var, onu deyim, məsələni qurtaraq. Məhəmməddən bunu eşidəndə Aşıq Heydərin hirsi yatır, üzü gülür:

– Hə, əmioğlu, de görüm, nə deyirsən?

Yenə Məhəmməd Molla Cabbara baxıb deyir:

Kişi qocadı deyirsən,
Taxılı Cabbar apardı.
Sən bunu nahaq öyürsən,
Taxılı Cabbar apardı.

Cabbar kitabın oxuyur,
Kolxoza cələ toxuyur,
Tez-tez xırmanı yoxluyur,
Taxılı Cabbar apardı.

Məhəmməd bilərəkdən yenə sözünü kəsib Cabbara baxanda görür kişinin qorxudan rəngi saralıb, qalıb udquna-udquna. Amma Aşıq Heydər altdan-altdan qımışır, Musa kişi də ayaq üstündə quruyub qalır. Məhəmməd yenə sözünə davam elədi:

Arpanın rəngi sarıdı,
Cabbar Musaynan yarıdı,
Paşa bu işə qurudu,
Taxılı Cabbar apardı.

Xəbərin olsun, ay əmi,
Tapılacaq işin çəmi,
Bilindi taxılın kəmi,
Taxılı Cabbar apardı.

Məhəmmədə gəl qulaq as,
Mən sözümü deməm əbəs,
Oğurluğa edib həvəs,
Taxılı Cabbar apardı.

Söz tamama yetən kimi Cabbar kişi Məhəmmədin ayağına düşmək istəsə də, o qoymadı. Cabbar kişi əlləri əsə-əsə, dili dolaşa-dolaşa deyir:

– Məhəmməd, necə deyirsən, elə olub. Mən bilmirəm bunu… bunu Paşa hardan… hardan bilib. Məhəmməd, indi ümid sənə qalıb.

– Yaxşı, yaxşı, sən heç qorxma. Bir iş oldu, keçdi. Bir də bu işə – oğurluğa qoyma qol, haq yolunda ol.

# İNƏK OĞRUSU

Düzkənddə Mahmud adlı fağır bir kişinin bircə inəyi varmış. Onu da oğurlayırlar. Kasıb adam qalır belə…

Axtarır, arayır, amma inək tapılmır ki, tapılmır. Mahmud kişi çox düşünüb-daşınır ki, bu aclıq, qıtlıq vaxtı ailəsini necə dolandıracaq. Bəli, ailənin olan-qalan inəyini də oğurladılar. Hə, bundan sonra külfət ac qalacaq. Kişi bunu fikirləşə-fikirləşə öz-özünə deyir ki, bu işi özümünkülərdən biri eləyib. Di gəl, heç kəs inəyi oğurladığını boynuna almır. Mahmud baxır, yox, iş düzələnə oxşamır. Gəlir düz Aşıq Heydərin yanına. Deyir, hal-hekat belə-belə. Mənim iənyimi özümünkülər oğurlayıblar, amma heç kəs boynuna almaq istəmir. Deyirəm gedim rayona şikayət eləyim, sən nə deyirsən?

Aşıq Heydər gülümsəyir:

– Sən get Məhəmmədin yanına. O da dövlət adamıdı. Dərdini de, qarışma, həllə eləyəcək. Məhəmməd mütləq inək oğrusunu tapacaq.

O saat Mahmud düz Məhəmmədin yanına gəlir. Dərdini Məhəmmədə deyən kimi o, xeyli fikirləşəndən sonra deyir:

– Biz bu kənddə doğulub böyümüşük. Hamı bir-biri ilə qohumdu, qonşudu. Sən bir az səbrli ol. Bu iş filan kəsin işidi. Sən heç yana getmə. İndi evinə get, səhər idarəyə gələrsən danışarıq.

Mahmud heç nə deməyib qayıdır geri. Səhər o, idarəyə, Məhəmmədin yanına gəlir. Az keçmir ki, inək oğrusu da gəlib çıxır. Di gəl ki, filan kəs oğurladığını boynuna almır ki, almır.

Axırda Məhəmməd hirslənib deyir:

-Yaxşı, indi sən heç nəyi boynuna almırsan. Mahmud da səhər gedib NKVD-iyə şikayət edəcək. Bəs sən onda nə eləyəcəksən? Orda da sənin nazın ilə oynayacaqlar? Enkeavedenin naçalniki Ağanik səni məhşər ayağına səkməyəcəkmi? Onda hər şeyi boynuna alacaqsan. Özünü də Sibirə göndərəcəklər.

Amma mənim sənə bir-iki sözüm var.

Ona da qulaq as.

Mahmud kəndə kişi gəldi,
Həlbət var ki, işi–gəldi:
Kor gəlinin döşü gəldi,
Zəhər olsun belə əti.

Böyüyün adı Fatı,
Bacanın yanında yatı.
Həvva qarın-qarta dartı,
Gizlədiblər hələ əti.

Sözü çoxdu Məhəmmədin,
Oğru olan, lal olma, din.
Şükür acından ölmədin,
Müftə gətdin ələ əti.

Söz tamama yetdi: inək oğrusu qızarıb pazı olsa da, yenə oğurluğunu boynuna almaq istəməyəndə Məhəmməd dedi:

– Deyəsən sənin oğurluğunu yaxşı göstərmədim. Onda bir sözümə də qulaq as, bağrına daş bas.

Biçarə yazıq Mahmudun
Başını qatdı inəyi,
Gözü kor, qıçı topal
Yaxşıca tutdu inəyi,
Yağlıca tikələr kimi
Gözüylə uddu inəyi,
Dişlərini itiləyib
Dağıtdı, yırtdı inəyi,
Şaqqaladı neçə yerə
Qazana atdı inəyi

İnək yaxşı yağlı imiş,
Qaşqaymış başı– bilindi,
Oğru axmaq gizlədibmiş
Gözədə leşi bilindi,
Başı keçəl, boz sifətin
Ağırmış daşı – bilindi,
Yediyi haram tikədi,

Zəhərmiş aşı – bilindi,
Beləcə xəlvət yedilər
Bu qaşqa addı inəyi.

Məhəmməd axı neyləsin,
Oğru: «mən doğruyam» – deyir,
Əlim əyri, gözüm əyri,
Ayaq topal – buyam – deyir,
Düşüb bir fursətdi ələ
Müftə yeyib doyam – deyir,
İçi-dişi, başı, qıçı
Gərək yaxşı yeyəm – deyir,
Vallah, çıxarmaram yaddan
Bu gümrah, süddü inyi.

Söz tamama yetəndə inək oğrusu ölüsü ölmüş adamlar kimi başını salır aşağı. Titrəyə-titrəyə gəlir Məhəmmədin qabağına:

– Ay qardaş oğlu, uşaq acıydı… Gümanım bu qohumum Mahmuda gəldi. Bildim inəyi mənə verməyəcək… Oğurlayıb kəsdim. Mən buna mətəl qalmışam ki, sən bunları yerli-yerində hardan bilirsən. Yer də qulaqlı imiş! İndii sən bilirsən, bu işi elə həll et ki, yaxşı olsun.

– Kişi, inəyin ətini çıxart arxayın ye. Amma o ətdən bir az da Mahmuda ver ki, halallıq olsun. Bu bir, ikincisi, indi qışdı. Gələn yaz bu kişinin inəyini özünə verərsən. Axı siz qohumsunuz, namərdlik nəyə lazımdır ki!

– Yaxşı, ay qardaş balası, sən necə dedin, qoy eləcə olsun.

Beləcə Məhəmməd hər iki qohumu barışdırıb yola salır. Onları yola salanda Mahmuda bir torba tütün verib deyir:

– Bunu əmimə verərsən. Bilirəm tütünü qurtarıb. Mən axşam evə gec gələcəyəm, əmim hirslənməsin. Həm də məsələnin həll olduğunu barəsində əmimə de ki, kişi bundan nigaran qalmasın.

## QAÇAQ USUBUN OĞLU HACIVƏLİNİN QARS MƏHKƏMƏSİ

Bir gün Məşədi Rəcəbə xəbər gəldi ki, bəs belə–belə… Öksüzdə Qaçaq Usubun arvadını görüblər. O, ağlaya–ağlaya Məşədi Rəcəbi axtarır. Amma o vaxtlar pis vaxtlar idi. Təzə qanun verilmişdi. Bu qanunu verən erməni generalı idi. Həmin qanunda deyilirdi ki, türk millətindən olan vətəndaşlar üstlərində silah gəzdirə bilməzlər. Əgər bir kəsin üstündə və ya evində silah tapılsa, o, ağır cəzalandırılacaqdır. Belə adamı ya güllələnmə, ya da sürgün gözləyir. Bütün bunlara baxmayaraq, Məşədi Rəcəbin dəli damarı tutmuşdu, hirsindən qapqara qaralmışdı, lap yaralı aslana dönmüşdü.

– Qaçaq Usubun arvadını ağlar qoyan, sən hər kimsənsə, ananı ağlar qoymaq mənə borc olsun!

O silahlanıb atının belinə sıçradı. Payız vaxtı idi. Məşədi Rəcəb səhər Öksüzə yola düşsə də, evə axşam qanıqara qayıtdı. İçəri girən kimi arvadına dedi:

– Mədinə, gəl halallaşaq, zəmanə yaman pis gəldi.

Bu belə deyəndə Aşıq Heydər çox narahat oldu.

– Əşi, bu nə sözdü deyirsən? Bir əməlli danış görüm, nə olub?

– Heydər, uşaqlarımı sənə tapşırıram. İş yaman çətinə düşüb. Mən Qarsa gedirəm. Qaçaq Usubun oğlu Hacıvəli orda qaladadı. Gedirəm onu qaladan çıxartmağa. Bu, çox çətin bir işdi, bəlkə sağ qayıtmadım. Deyirəm, halallaşsaq yaxşıdı.

– Əmi, sənin inandığın tək allaha, bir əməlli danış. Axı nə olub ki, Qaçaq Usubun oğlunu qalaya salıblar. Bir də indi hər tərəf düşmənlə doludu, silahlı gəzməyə də icazə vermirlər. Sən tələsmə hələ, mənə də qulaq as. Qarsın məhkəməsinin sədri mənim dostumdu. Sən məsələni ətraflı danış, ola bilsin, onun köməyi ilə bu işi həll edə bildim. Mən elə bilirəm ki, məhkəmənin sədri mənim sözümü eşidər. Çünki vaxtilə mən onu ölümdən qurtarmışam. Əmi, hirslənmə, hər şeyi silah həll etmir ki? Səndən çox xahiş edirəm, silahı bir yana qoy, bu işi mənim öhdəmə burax. Amma sən nə olub, onu danış.

Aşıq Heydər belə deyəndə Məşədi Rəcəb hirslənsə də, hirsini uddu.

– Məsələ belədir, ay Heydər. Hacıvəlinin anası mənə ağlayıb dedi ki, qonşu kənddən biri Hacıvəlini başlayıb ələ salmağa. Amma uşaq işi başa düşdüyündən dinmir. Bu namərd adam onu acıqlandırmaq üçün başlayır Qaçaq Usuba sataşmağa: «Gərək sən məni tanıyasan. Mən kazaklarla Öksüzün dağında neçə qaçağın qulağını, bax, bu əllərimlə kəsmişəm. Mən sənin atanı kişi bilirdim. Onun mənim qabağımda necə yalvarmağını görsəydin, sən özün özünə nifrət edərdin».

Hacıvəli acıqlı–acıqlı deyir:

– Sonrası… Sözünün canını de.

– Sonrasını siz də bilirsiniz. Bax, məni Niqalay hökuməti bu şücaətimə görə kəndin böyüyü təyin edib. Bax, elə bircə anın içində, a düşmən oğlu, səni içəri basdıraram, türmələrdə çürüyərsən.

Hacıvəli uşaq osa da, bu namərd adamın bu təhqirli sözlərinə dözə bilmədiyindən ordan birbaşa evə gəlir, atasının mauzerini götürüb həmin kəndə qayıdır. Həmin adamı vurub öldürür. Bunu kəddə çox adam görsə də, heç kim şahidlik etmir, həmin əhvalatı gördüyünü boynuna almır. Kazaklar Hacıvəlini tutub Qars qalasına aparırlar. Maraqlıdır, kənddə kimi dindirirsən, deyir, mən görməmişəm. Bu əhvalatı Hacıvəlidən soruşurlar, o deyir, bəli, onu mən öldürmüşəm. Düşməndən intiqam almışam. Nə bilirsiniz, onu da edin, mən heç nədən qorxmuram.

Mən bilirəm, bu uşağa məhkəmə qurulacaq, silah gəzdirdiyinə görə, bir də erməni daşnaqları və rusların əlaltısı olan bir namərdi öldürdüyünə görə ona camaatın gözü qabağında dar ağacına çəkmək cəzası veriləcək. İndi bilirsənmi, a Heydər, iş nə yerdədir? Bəli, bir mərd kişinin yadigarı darda qalıb. Bax, onun anası məni buna görə axtarırmış. Mən çox müsibətlər görmüşəm, amma bunu görmək istəmirəm. Ya gərək öləm, ya da Hacıvəlini bu bəladan qurtaram.

– Əmi, gəl sən mən deyənə qulaq as. Qan tökmək lazım deyil. Sən atını mənə ver, mən bu işi asanlıqla yoluna qoyacam.

– Yaxşı, a yetim, onda necə eləyirsən elə, Amma Hacıvəlini qurtar.

Aşıq Heydər həmin axşam Məşədi Rəcəbin atını minib Qaraçanta kəndinə, Hacı Əmrahın qapısına gedir. Ev sahibi onu böyük hörmətlə qarşılayıb atını tövləyə, özünü içəri aparır. O saat heyvan kəsilir, məclis qurmaq istəyəndə Aşıq Heydər məsələni açır, nəyə gəldiyini deyir. Hacı Əmrah onu diqqətlə dinləyib gülümsəyir:

– Aşıq Heydər, sənin xatirin hamının yanında əzizdi. İnşallah, bu işi də yoluna qoyacağıq. Bilməmiş olmazsan, oğlum Kamal Qarsda məhkəmədə işləyir, yazı–pozu adamıdı.
Hacı Əmrah belə deyəndə Aşıq Heydər böyründə oturan yaraşıqlı cavan oğlana baxdı:
– Ay hacı, bunumu deyirsən?
– Bəli, bəli.
– Allah saxlasın, yaxşı oğlana oxşayır.
Kamal Aşıq Heydərə məhkəmə sədri haqqında ətraflı məlumat verdi:
– O, əslən Çıldırdandı. Onu ölümdən Hacabbasoğlu Kərbəlayi Məhəmməd bəy qurtarıb. Bu erməni səni də yaxşı tanıyır. Həmişə Kərbəlayi Məhəmməd bəyə dua eləyir. Səhər mən onunla görüşəcəyəm. Gərək bu işdən heç kəs xəbər tutmasın. Narahat olmayın, məhkəmənin sədri Aram  işi yoluna qoyacaq.
Aşıq Heydər Hacı Əmrahla Qarsa gəldi. Aşıq Heydər məhkəmənin sədri Aramla görüşdü. Aram onun Çıldırda keçirdiyi məclisləri xatırladı. Aşıq Heydər nə üçün gəldiyini söylədi. Aram Aşıq Heydərə dedi ki, qala çox yaxşı mühafizə olunur. Qaldı Hacıvəlinin işi, onu da həll edəcəyik. Çünki Kərbəlayi Məhəmməd bəydən çox yaxşılıqlar görüb. O, biləraəkdən məhkəməni bir gün dala saldı. O həm də gözətçilərin sayının artırılmasına göstəriş verdi:
– Bu, onunla əlaqədardır ki, uşağın düşmənləri çoxdur, birdən ona xətər yetirərlər. Sonra Aşıq Heydərə dedi ki, indi Məşədi Rəcəb buraya gəlsə, silahsız gəlsin. Heç narahat olmayın, səhər Hacıvəlini azadlığa buraxacağam. Aram Aşıq Heydərə necə danışacağını başa salır, sonra Hacıvəliyə də lazımi göstəriş verir.
O vaxtlar məhkəmədən əvvəl bir adam əlini Qurana tutub axunddan icazə kağızı almalı idi. Aram bu məsələni Aşıq Heydərin öz ixtiyarına buraxdı. İş belə olanda Hacı Əmrah bu işi öz öhdəsinə götürdü. Elə həmin gün Aşıq Heydər Qarsda Məşədi Rəcəbə işin nə yerdə olduğunu çatdırdı. Amma Məşədi Rəcəb çox hirsli idi. O acıqlı–acıqlı dedi:
– O kafir sizi aldadır, mən ona inanmıram. Uşağı necə buraxacaqlar ki, qalanın mühafizəsini neçə qat gücləndiriblər.
– Əmi, sən bir az səbrli ol, heç kəsə bu barədə söz demə, işin dalını gözlə. Bax, yenə deyirəm, burada heç bir silah işlətməyə ehtiyac

yoxdur. Əmi, lap arxayın ol. Bu adam erməni olsa da, məni yaxşı tanıyır.
Həmin günün səhəri kazaklar Hacıvəlini məhkəməyə gətirdilər. Onun əlləri də, ayaqları da qandallı idi. Məhkəmə başladı. Məhkəmənin sədri Aram bir–bir şahidləri danışdırdı. Adamların çoxu baş verən hadisənin yalan olması haqqında danışırdılar. Öldürülənin qohumları kazaklara arxalanıb məhkəmədə səs–küy qaldırdılar. Axırda Aşıq Heydəri də dindirdilər. Aramın ona ilk sualı belə oldu:
– Heydər Kərim oğlu, sən bu uşağı tanıyırsanmı?
– Xeyr, məhkəmə sədri, mən bu uşağı tanımıram. Ancaq mən filan vədə Gümrüdə xanda olanda bu uşağı görmüşəm. Bəli, o, mənimlə Gümrüdə xanda qalıb. Mən ondan soruşdum ki, ay bala, sən uşaqsan. Burda nə gəzirsən? O mənə dedi ki, məndən başqa evimizdə bir qoca nənəm var. Onunla bərabər yaşayıram. Nənəm neçə aydır, qəndsiz qaldığına görə mənə dedi ki, a bala, böyük oğlansan, get Gümrüdən bir az qənd al gəl. Nə vaxtdır ki, qənd üzünə həsrət qalmışam, çay içə bilmirəm. Mən də ondan xəbərsiz gəldim Gümrüyə. Baxdım, doğrudan da bu, bir–iki kilo qənd alıb. Mən səhərisi gün onunla Gümrüdən yola çıxdım. Günortadan sonra Çaldaşda ayrıldıq. Mən ayrılanda ona tapşırdım ki, bala, bir az çəpik ol, axşama qalma, indi yəqin nənənin gözü yoldadı. Məhkəmə sədri, sağ olsun, mən bu uşağı belə tanıdım.
Məhkəmənin sədri Aram ayağa durdu, yanındakı iki nəfər də ayağa qalxdılar. Onlar keçdilər arxa tərəfə. Hacı Əmrahın oğlu Kamal (o həm tərcüməçi, həm də mirzə idi) camaata bildirdi ki, beş dəqiqəyə kimi məhkəmənin qərarı oxunacaq. Elə belə də oldu. Məhkəmənin sədri və onun yanındakı iki nəfər öz yerlərinə keçdilər. Məhkəmənin sədri stolun üstündəki zənciri götürüb boynuna taxdı, yanındakılar da belə etdilər. O zəncir ədalət zənciri adlanırdı. Aram məhkəmənin qərarını oxumağa başladı:
– Hacıvəli Usub oğlu günahsızdır. Vaxtilə onun atası hökumət əleyhinə olsa da, cəzasını almışdır. Amma bundan istifadə edən bəzi adamlar bu uşağa böhtan ataraq müsəlmana yaraşmayan hərəkət etmişlər. Maraqlıdır ki, bu uşaq heç silahdan istifadə etməyi bilmir. Bu, necə adam öldürə bilər. Bu barədə əlimizdə xeyli dəlil və sübut var. Ədalət məhkəməsinin qərarı ilə Hacıvəli Yusif oğlu günahsız olduğu üçün azadlığa buraxılsın.

Məhkəmə başa çatdı. Bu vaxt Məşədi Rəcəb içəridə yoxdu, bayırda məhkəmə binasının qabağında dayanmışdı. O, divara söykənib səbrsizliklə məhkəmənin nəticəsini gözləyirdi. Elə bu vaxt öldürülənin əmisi eşiyə çıxdı. Məşədi Rəcəbi görən kimi hirslə dilləndi:
– Ayə, a Məşədi, bu Aşıq Heydər nə vaxtdan o uşaqla Gümrü xanında bir yerdə qalıb? Elə bilirsən qan batırmaq asan işdir? Bəs demirsənmi ki, bu ölkənin də sahibi–yiyəsi var? Elə bilməyin ki, o uşaq sağ qalacaq.Gözləməkdən hövsələsi daralan Məşədi Rəcəb bu axmaq adamın çərənləməsinə dözməyib onun qarnına möhkəm bir təpik ilişdirdi:
– Satqın uşağı, satqın. Atasını kafirlərə satdınız, bəs etmədi, indi də bir parça uşağın dalınca düşübsünüz? O uşağın başından bir tük əksik olsa, qarşınızda məni görəcəksiniz.
Təpiyin zərbəsindən ikiqat olan kişi handan–hana özünə gəlib deyir:
– Uf, ay Məşədi, qanın üzünə dağılsın, Sən lap qan–qan deyirsən. Yenə sizin içinizdə qanan Aşıq Heydərmiş ki?
Məşədi Rəcəb Hacəvəlini atının tərkinə alıb Qarsdan Öksüzə yola düşür. Onu evlərinə çatdırandan sonra geri – Düzkəndə qayıdır. Aşıq Heydəri bərk–bərk qucaqlayıb deyir:
– Əhsən sənə, a Heydər! Sən düz deyirsənmiş. Hər şeyi silah həll edə bilmir. Doğrudan da, sənin hörmət–izzətin az deyilmiş. Heç bilmirəm, sənin bu yaxşılığının əvəzini necə ödəyim. Amma sən mənim bu vəsiyyətimi yadında saxla. Mən indi anlayıram ki, sənin el arasında hörmətin çoxdu. Yenə də söz deməyindən, məclis qurmağıdan qalma. Sən mənim balalarıma da sözün gücünü, qüdrətini öyrət, başa sal. Onlar da sənin kimi söz sahibi olsunlar, silah götürməsinlər. Sözün gücü silahdan çox üstün imiş.
Məşədi Rəcəb sözünü kəsib arvadına baxdı:
– Ay Mədinə, sənin o xoruzun bişmədimi? Gəl ortaya bir süfrə sal. Bu gün Heydər mənim kefimi yaxşı açdı. Elə bil anadan təzəcə doğulmuşam. O saat Mədinə ortaya süfrə saldı. Yeyib–içdilər, Məşədi Rəcəb nəşə ilə Aşıq Heydərə baxıb dedi:
– Ay oğul, indi Qaçaq Usubdan bir–iki ağız oxu, qoy onun da ruhu şad olsun.
Aldı görək Aşıq Heydər, Qaçaq Usubdan nə dedi.

Heç iyiddən fələk gözün əyməsin,
Mən atdığım güllə niyə dəyməsin,
Açan ölməz, görsün bəyaz düyməsin,
Yoxdu mənim bir imdadım, ay Mədəd!

Atamın anamın mən də biriyəm,
Qulaş qolu yar boynuna doluyam,
Güllə dəyib imkan yox yeriyəm,
Yoxdu mənim bir imdadim, ay Mədəd!

Dağdan enib biz də gəldik Ökşüzə,
Quzu kəsib hörmət etdilər bizə,
Xəbər çatdı Amasiyada knyaza,
Yoxdu mənim bir imdadım, ay Mədəd!

Qismət bu idi ki, dağlarda gəzək,
Zülümkar divana namələr yazax,
Insafdımı bir iyidə yüz qazax,
Yoxdu mənim bir imdadım, ay Mədəd!

Atışa – atışa biz çıxdıq dağa,
Sədd qurub burda bərk etdik dava.
Üstümə at sürdü cəmi Ağbaba,
Yoxdu mənim bir imdadım, ay Mədəd!

Dörd bir yandan mətərisi sardılar,
Güllə atdım, qayalara doldular.
Allahyar tək hacastanı vurdular,
Yoxu mənim bir imdadım, ay Mədəd!

Öksüzün ətrafı çayırdı, çöldü,
Usuf gəldiyini qazax nə bildi?
Aslan dayım getdi, simsarım öldü,
Yoxdu mənim bir imdadım, ay Mədəd!

Dəli Usuf sözün tamam eyləsin,
Yüz min kəlməsini bəyan eyləsin.
Təhna qalıb, kimə həyan eyləsin.
Yoxdu mənim bir imdadım, ay Mədəd!



# AŞIQ HEYDƏRİN HACI ABBAS OĞLU KƏRBƏLAYI MƏHƏMMƏD AĞA HAQQINDA XATİRƏLƏRİ



*Hacı ABBASOGLU Şəkildə arxa cərgədə soldan 3-cü*

Hacı Abbas oğlu Kərbəlayi Məhəmməd ağa Ağbabanın valisi idi. Çox mərd və ağıllı olan bu kişini dərd almışdı. Ara qarışıb məshəb itəndən, yəni 1918–ci ildən onun yuxusu qaçmış, qayğıları artmışdı. Kərbəlayi könüllülər alayı yaratsa da yenə narahat idi; qardaşı Mahmud ağaya sərvaxt tərpənməyi tapşırmışdı. Təbiətən sərt, nizam–intizamlı bir adam olan Mahmud ağa güllə atmaqda çox şöhrət tapmış, qorxmaz, cəsur adam kimi tanınmışdı. O, Kərbəlayi Məhəmməd ağanın tapşırığı ilə hər gün axşam olan kimi dörd–beş nəfərlik kiçik bir atlı dəstəsi ilə Ağbaba kəndlərinə baş çəkib, kənddəki vəziyyətlə maraqlanırdı. Vəziyyət ağır olduğundan hər

kənddə bir neçə yerdə qarovul qoyulmuşdu. Qarovullar ayıq–sayıq olmalı, yatmamalı idilər. Mahmud ağa olduqca cəld, yorulmaz adam olduğundan hər gecə bütün Ağbaba kəndlərinə baş çəkər, qarovullara nəzər yetirərdi.

Əvvəlcə qərargah Böyük Şiştəpədə idi. Amma rusların köməyi ilə ermənilər yenidən canlandılar. Ordunun qərargahı Böyük Təpəköy kəndinə köçürüldü. Türkiyənin başı namərd düşmənlərə (yunanlara, ingilislərə, ruslara və başqalarına) qarışdığından, ölkənin taleyinin həll olunduğu o ağır vaxtda Ağbaba müdafiyəsiz qaldı. Amma buna Kərbəlayi Məhəmməd ağa seyrçi qala bilmədi. Camaatın taleyi onu çox narahat edirdi. Elə buna görə də ermənilərlə danışıqlar aparmağa razılıq verdi. O, Gümrü şəhərinə yollandı. Erməni dilini mükəmməl bilən Kərbəlayi Rəsul onun yanında idi. Könüllülər onları Ocaqqulunun altındakı dəmir körpüyə qədər müşayiət etdilər. Dəmir körpüdən o tərəfdə erməni əsgərlərinin müşayiəti ilə Kərbəlayi Məhəmməd ağa, tərcüməçi Kərbəlayi Rəsul və dörd nəfər əsgər Gümrü şəhərinə yollandılar. Onlar Gümrüyə çatan kimi Kərbəlayi Məhəmməd ağadan ötrü ayrılmış binaya daxil oldular. Yəni Kərbəlayi Məhəmməd ağa və Kərbəlayi Rəsul içəri keçdilər. Bayırda iki erməni, iki türk əsgəri keşik çəkməyə başladı. Aradan bir az keçəndən sonra Kərbəlayi Rəsul Kərbəlayi Məhəmməd ağaya dedi:

– Bir erməni qadını sənin yanına gəlmək istəyir, amma keşikçilər buraxmır.

Kərbəlayi Məhəmməd ağa o saat tərcüməçiyə göstəriş verdi ki, keşikçilərə tapşırılsın, o qadını içəri buraxsınlar, yəqin əcala bir işi var. Tərcüməçi eşiyə çıxıb keşikçilərə Kərbəlayi Məhəmməd ağanın sözlərini çatdıran kimi onlar erməni qadınını içəri buraxdılar. Erməni qadını içəri girən kimi ağlamağa başladı:

– Ağa, başına dönüm, deyirlər sən türklərin başçısısan. Mənim gözümün ağı–qarası bir oğlum var, Qaramməd kəndinə nişanlı idi. Kəndə gedən vaxt sizinkilər onu öldürüblər.

Kərbəlayi Məhəmməd ağa qadını çox danışmağa qoymayıb dedi:

– Sən heç qorxma, sənin oğlun kəndə gedəndə bizim əsgərlər onu silahlı bilib atəş açıblar. O, hal–hazırda yaralıdır. İndi Oxçoğlu

kəndindəki xəstəxanada müalicə olunur. Qorxma, on–on beş günə oğlunu yola salacağam.

Qadın sevincək eşiyə çıxdı. Həyətə yığılan ermənilərə türklərin qoşun başçısı ilə görüşdüyünü deyib bildirir ki, oğlu yaralı imiş. Türklərin böyüyü on–on beş günə onu göndərəcəyinə söz verib.

Danışıq qurtarandan sonra Kərbəlayi Məhəmməd ağa ilə tərcüməçi geri qayıdanda Kərbəlayi Rəsul ondan soruşur:

– Ağa, iki gün əvvəl həmin ərazidə qanlı döyüş olmayıbmı?

– Bilirəm sən nə deyirsən. Düzdür, erməni bizim düşmənimizdir, amma o qadın erməni olsa da, axı… ona təsəlli vermək böyük işdi. Bir də siyasət təkcə silahla deyil, gərək dildə də olsun…

# AŞIQ HEYDƏRİN KƏLBƏLAYI XƏBƏR OĞLU RUSTAM AĞA HAQQINDA X A T İ R Ə L Ə R İ

Kəlbəlayı Xəbər oğlu Rustam ağa Düzkənd kəndində "Arıxlılar" tayfasının ağsaqqalı olmaqla bərabər, həm də adlı-sanlı şəxsiyyətlərdən biri idi. Rustam ağa Kəlbəlayı Xəbərin böyük oğludur. Rustam ağanın isə 7 oğlu (Hasan, Ənnağı, Məhəmmədtağı, Qasım, Cavoy, Cavad, Fəhrad) olub. Rustam ağanın var-dövləti onun zəhmətinin nəticəsində əmələ gəlmişdir. Ağanın böyük sayda mal-heyvan sürüləri var idi. Qızıl dağdan Təpəkəndə qədər böyük bir otlaq sahələri Rustam ağaya mənsub idi. Rustam ağa Düzkənd kəndinin yuxarı başında övladları ilə birgə yaşayırdı.

Günlərin birində mən (Aşıq Heydər) Gümrüdən toydan gəlirdim. Günün uzun vaxtı idi. Bu əhvalat təqribən 1914-1915 cı ilin iyul ayından gedir. Cox yorunuq olduğuma görə dedim, yolüstü gedib bir ağaya baş çəkim. Onu da deməyi özümə borc bilirəm ki, Rustam ağa mənim xətrimi çox istəyirdi. Hətta, yeri gələndə mənə öz maddi dəstəyini də əsirgəmirdi.

Mən nökərlərə heç nə demədən ot tayalarının arası ilə irəliləməyə başladım. Qəflətən Rustam ağanın səsini eşitdim;

- Ayə, zalım oğlu, az qaldı ki səni vuram, bir səsini çixatsana.

Rustam ağanın əlindəki 5 açılanın mənə tuşlandığını gördüm.

Rustam ağa:- Ay Heydar, ay bala, ilin-günün belə pis vaxtı sən haradan gəlrsən, görmürsən ki, aralıq qarışıb, məshəb itib, ruslar erməni daşnaqları ilə birləşib türkü qanına qəltan eləyir. Sən gəlməmişdən bir az əvvəl ruslar Sarıqamışda əsir düşən türkləri Gümrü şəhərinə apardılar.

Rustam ağa:

- Bala, bir de görüm, Gümrüdə vəziyyət necədir? Eşitmişəm dostum Məmmədqasım ağa (Gümrü şəhərinin tanınmış ağalarından biridir) bir az nasazlayıb.

Mən Məmmədqasım ağanin salamını Rustam ağaya çatdırdım. Bu şad xəbərə görə ağa mənə iki ədəd onluq qızıl verdi. Onu da deyim ki, bu pullara o vaxtlar bir yanı balalı inək almaq olardı. Mən bu qızıl pulları götürmək istəmirdim.

Onda Rustam ağa mənə dedi:- Aşıq Heydər, sən bu mahalın tanınmış aşığısan. Bu mahalın ad- sanını yüksəklərə qaldıran sən və sənin kimi adamlardı. Bizim də borcumuz sizin kimi adamlara hər cəhətdən kömək etməkdir. Dağ - dərə müxənnət qaxtağanlarla doludur, get o pullara bir üç açılan al, vaxt gələr lazımın olar.

**Rustam ağanın o qədər səxavətli işləri olub ki, danışsam bir dastan olar.**

**( Aşıq Heydərin xatirələrindən).**

---

Bu əhvalat təqribən 1917 ci ildə baş verib.

Artiq uşaqlar Asıq Heydərin övladları (Kərim və Rəhim) böyük bir kişi olmuşdular. Kərim ailə qurmuşdu. Rəhimi evləndirmək üçün ev lazım idi. Mən (Aşıq Heydər) belə qərara gəldim ki, gedib yuxarı kənddə "Diknə dağı"nın başında bir ev tikim.

Bu məqsədlə övladlarımla birgə Diknə dağının başında planlaşdırdığım evin himini qazmağa başladıq. Evin himi demək olar ki, hazır idi.

Bir də gördüm ki, Rustam ağa nökəri ilə birlikdə biz tərəfə gəlir. Ağanın gəlişinə çox sevindim. Çünki ağanın məsləhətinə böyük ehtiyacım var idi. Ağanın nökəri süfrəni açdı. Biz hamımız süfrəyə əyləşdik. Rustam ağa Gümrü və Qars şəhərlərində ermənilərin baş qaldırmasından söhbət açdı. Ağa ermənilərin Gümrü şəhərində müsəlmanlara qarşı qətliamlarından danışdı.

Sonra Rustam ağa üzünü mənə tutub dedi:

- Aşıq Heydər, görürəm dağın başında ev tikirsən, mübarək olsun, bu işə çox şad oldum. Amma Gümrü qətliamlarını gərək unutmayaq, çünki qaxtağanlar tez bir zamanda buralara da gəlib

çıxacaqlar. Mənim yeddi oğlum və hər oğlumun da yeddi aynalısı var. Ancaq mən yenə də gecələr sakit yuxu yata bilmirəm. Kafirlərin hərəkəti məni açmır. Rustam ağanın bu sözlərindən sonra Diknə dağının başında ev tikmək planından əl çəkdim. Arasından bir il keçməmiş ermənilər Diknə dağının başından kəndimizə hücuma keçdilər. Düzkənd və İlanlı kəndindən 60 nəfər adam qətlə yetrildi.
Onu da deməyi özümə borc bilirəm ki, yuxarı kənddə Rustam ağa və uşaqları, aşağı kənddə Məşədi Rəcəb olmasaydı, ermənilər Düzkənd kəndində daş üstə daş qoymayacaqdılar.

**Allah hər iki mərd və cəsur kişilərə rəhmət eləsin.**

**(Aşıq Heydərin xatirələrindən).**

---

Diknə dağının arxasında mənim (Aşıq Heydərin) bir hektara yaxın əkin sahəm var idi. O yerdə yaxşı taxıl bitmədiyinə görə cox vaxt əkin sahəm dəmyə qalardı.
Ağbabaya yaz gəlmişdi. Hamı əkinçilklə məşğul idi. Rustam ağa öz nökərini göndərib məni yanına çağırtdırdı.
Rustam ağa;- Aşıq Heydər, bütün qışı yatdığın bəs deyilmi? İndi hamı əkinçilklə məşğuldur. Sənin yerinin dəmiyə qalması mənə çətin gəlir. Mənim iki boyun öküzlərimi götür, nökərlərimlə bərabər öz yerini şumla. Sənə beş bardan təmənnasız taxıl verəcəm.
Mən xeyir-iş məclislərini təxirə salıb həvəslə əkin sahəsində işə girişdim.
Artıq Ağbabada taxıl biçini başlamışdı. Kərəntini götürüb diknə dağına qalxdım. Mənim yerimdə taxıldan əsər-əlamət yox idi. Rustam ağanın evi əkin sahəmə yaxın olduğuna görə tək- tük sünbülləri də ağanın qazları yemişdi. Artıq axşama yaxınlaşırdı, gördüm ki, ağa mənə yemək gətirib.
Rustam ağa əkin sahəsinə nəzər salıb sakit bir tərzdə dilləndi:

-Aşıq Heydər, gəl otur mənimlə bir qismət çörək kəs. Mənim qazlarım məni biyabır elədi.

Aşıq Heydər:- Ağa, mən dedim axı, bu torpaqda yaxşı taxıl bitmir, qazların heç bir günahı yoxdur.

Rustam ağa nökərlərinə möhkəm hirslənmişdi, çirtma vursan ağanın qanı tökülərdi. Rustam ağanı bir təhər sakitləşdirib yola saldım.Bir hektar yerdən iki araba ot ancaq biçdim.

Payız vaxtı idi. Ağbabada əkin-biçin sona çatmışdi. Mən bu il yenə də əkdiyim sahədən məhsul götürə bilməmişdim. Evdə istirahət edirdim. Bir də gördüm ki, Rustam ağanin nökəri məni səslədi:

-Aşıq Heydər, gəl taxılını götür.

-Rustam ağa bir araba taxılı sənin üçün göndərib, ağa dedi ki, Aşıq Heydərə deyərsiniz ki, qazlarım kişinin taxılini yeyiblər, bu da yeyilən taxılın əvəzi.

**Rustam ağa gözü tox, könlü tox, hər şeyin yerini bilən, kasıblara əl tutan görkəmli bir tarixi şəxsiyyət olub.**

**( Aşıq Heydərin xatirələrindən ).**

# AĞBABA VƏ ŞÖRƏYELİN TARİXİ ŞƏXSİYYƏTLƏRİ

## GENERAL MƏHƏMMƏDƏLİ

Ağbaba torpağı və Ağbabalılar mərd övladları ilə fəxr edə bilərlər. Ağbaba torpağı hədsiz dərəcədə ziyalılar yetişdirməklə bərabər, mərd, igid və çəsur ovladları ilə tanınır. Ağbaba əsrin əvvələrlindən Türkiyə və Azərbaycandan izolyasiya olunduqdan sonra, bu torpaqda millətimizə qarşı heç bir insani hərəkətlərə xas olmayan vandalizmini və vəşilikləri türksüz Ermənistan yaratmaq məqsədi ilə qonşularımız bizlərin üstündə tətbiq etmişdir.

Həhayət, ermənilər rusların köməyi ilə 1828-ci ildə başladıqları "Soyqırım"hərəkətini 1988-ci ildə sona çatdırıb türksüz ermənistan dövlətinin yaradılmasına nail oldular. Indi isə keçək əsas məsələyə. Mən öz həmkəndlim Zeynalabdının oğlu Rəhim barədə danışmaq istəyirəm. (Stat aşıq Heydərin oğlu Rəhim)

1951- ci ilin mart ayı idi. Atam Rəhim (Aşıq Heydərin oğlu, Yusifin atası) mənə dedi ki, bala, kəndin dükanından iki kilo qənd al, gedək adaşım Rəhimin yanına. Kişini qaladan buraxıblar, vəziyyəti də çox pisdi, bir də ki, aşağı kənddə qonşu olmuşuq. Onda Rəhimin atama dediyi sözlər bu vaxta kimi yadımda qalıb. Atam mənə dedi ki, bala, nə eşitmisənsə elə qoy burda da qalsın. Bizim danışdıqlarımızı heç kimə söyləmə.

Rəhmətlik Rəhim Düzkənd kəndində ən səxavətli, alicənab və son tikəsini kasıblara paylayan bir kişi olub.

1941-ci ildə cəbhəyə yollanan Rəhim 1942-cü ildə Ukrayna uğrunda gedən döyüşlərdə almanlara əsir düşür və 1945-ci ilə kimi İtaliyada sürgündə olur. Müharibə qurtardıqdan sonra kişinin başı çox bəlalar çəkir. Vlasovçu olmadığına görə çox çək- çevirdən sonra kişini zaminə buraxırlar. 1950-cı ildə Rəhim Düzkənd kəndində selmaqda, yəni kənd dükanında işə başlayır. Üç ay aradan

keçməmiş maqazini yoxlayırlar, kişinin o vaxtın pulu ilə 18 min manat borcu cıxir. Buna borc demək olmazdı. Kişi imkansızlara nisyə mal vermişdi. Pis vaxtlar idi. Bir manat ya artıq, ya da əksik çıxanada o dəqiqə tuturdular.

Rayondan gələn ermənilər maqazinin qapısına möhür vurdular və Rəhimə bildirdilər ki, səhər təcili rayonda olsun. Nə isə rətmətlik Zeynalabdın (Rəhimin atası) evdə nə var idisə hər şeyi satdı. Onu da deyim ki, ermənilər kişini aldadıb çoxlu pul aldilar ki, guya Rəhimi qalaya salmayacaqlar. Rəhmətlik Rəhimin söylədiyinə görə, 1950-ci ilin oktyabr ayında məhkəmənin qərarı ilə 5-il xüsusi rejimli iş verdilər. Kişinin dediyinə görə heç bir ay keçməmiş "Kazan" şəhərinə gəlir. Oradan isə 150 km məsafədə olan meşənin içərisində böyük bir hərbi (vlasovçular) kaloniyada olur. Bu türmədə insanlara çox əziyyət verirdilər. İnsanlar əlindən tərpənməyə yer yox idi. Türmədə insana bit göz açmağa imkan vermirdi.Hər tərəf hündür məftillərlə bağlanmışdı. Quş quşluğu ilə bura girə bilməzdi. Əsgərlər əllərində silah, yanlarında zəhimli itlər ilə hər səhər saat 6-da bizləri dəmir yolu tikintisinə aparırdılar. Axşam saat 8-də geri kazarmaya qayıdırdıq. Heç kimin əli axşam qaşıq tutmurdu. Hər gün kazarmadan bir-iki ölü aparırdılar.İki gündən bir kalonyanın rəisi "GENERAL SOKOLOV" kazarmaya girəndə hamının nitqi bağlanırdı. Bu insan hündür boy, enli kürəkli, gur səsli, saçı qara, özü sarışın və gözündə də qara eynək olardı. Kim onu görsə vahiməyə düşürdü. Onu da deyim ki, həftədə bir dəfə əsgərlər 4-5 nəfəri "generalın əmridi" deyib aparırdılar. Gedənlərdən heç kim geri qayıtmırdı. Ermənilər generalı görəndə yerindəcə canları çıxırdı, çünki gedənlərin əksəriyyətini ermənilər təşkil edirdi. Aradan üç ay keçməmişdi, axşam yemək vaxtıydı, 4 nəfər əli silahlı əsgər içəri girdi. Bir rus, iki erməni və bir də mənim adımı oxuyanda əlimdən qaşıq yerə düşdü. Öz-özümə dedim artıq vaxtım tamamdı. Nə isə bizi komendaturaya gətirdilər.Əvvəl üç nəfər içəri keçdi.On dəqiqə olmazdı ki, əlləri boyunlarında olan üç nəfər əsgərlərin müşayiəti ilə hara getdikləri məlum olmadı. Sonra məni içəri çağırdılar. Içəri girəndə demək olar ki, nitqim tutulmuşdu. Uzun bir kabinetdə

başda oturan general Sokolovdan başqa heç kim yox idi. O nə isə yaza - yaz məndən rusca soruşdu.

Milliyətin nədi; dedim-azərbaycanlı.

Haralısan; dedim- Ermənistandan.

Hansı rayondansan? dedim- Amasiyadanam.

Sonra general Sokolov Azərbaycanca məndən yenə soruşdu;

-Bəs hansı kənddən olduğunu niyə demədin.

Təmiz dilim, ağzım qurudu. Sonra Sokolov yerindən durdu yanıma gəldi və əli ilə astaca kürəyimə vuraraq mənə dedi:

- Heç nədən qorxma özünü ələ al, mənə tutulmağın barədə ətraflı danış. Sənin "delon" bir aydı ki, mənim qabağımdadır. Mən əsir düşən gündən bu günə kimi hər şeyi ona danışdim.O gözündən qara eynəyi çıxarıb, gözləri yaşarmış halda mənim yanımda oturdu.

O mənə dedi ki, mən bir el oğlu kimi sənin sənədlərini tam hazırlatmışam, burdan çıxan kimi sənin pasportunu verib səni yola salacaqlar, bu əlli manatı da götür, sənə lazım olacaq, özünə paltar alarsan, həm də birinçi adamsan ki, Ağbabanın iyini səndən alıram, ola bilsin səninlə bir də görüşmək mənə qismət olmasın, bu barədə nə badə həm burda, həm də kənddə danışasan. Bu sözlərdən sonra mən onun ayağına yıxıldım və yalvara-yalvara dedim: Onsuz da bunu heç kimə deyəsi deyiləm, bəs niyə demirsən kimlərdənsən.

O məni yerdən qaldırıb dedi:- Onda qulaq as, gör mən kiməm. 1927-ci ilin iyun ayı idi. Mənim onda 6-7 yaşım ancaq olardı. Bizim ailə, iki əmimgilin ailəsi və bir də dayımgil belə qərara gəldilər ki, gün batandan sonra Güllübulaq tərəfdən səhrəddi adlayıb Qarsa keçək. Gecə saat 2-də biz sərhədcilərlə qaşı-qarşıya gəldik. Atışma oldu, əmimin, dayımın ailəsi atişmada öldürüldü, anamı öldürdülər, atam yaralandı, tərpənə bilmirdi, iki baçı, iki qardaş və atamı ermənilər əsr götürdülər. Bizi ermənilər Gümrüdəki "qara qala" deyilən yerə gətirdilər. Səhər NKVD-nin rəisi Şin Hayrapetyan bizlərin gözləri qabağında atamı güllələdi. Bələkdə olan bacım orada öldü, o birisi bacım isə uşaq evində bir ay olmamış sarılıq xəstəliyindən öldü. Mən və məndən kiçik qardaşımı Kazan şəhərindəki yetimlər evinə göndərdilər. Biz rusca bilmədiyimizdən



bizə yeni adlar qoydular. Onda mənim adım "YEVGENİ SOKOLOV" oldu. Nə isə, qardaşımla mən hərbi məktəbdə oxuduq. Müharibə başladı, hər ikimiz müharibəyə getdik. Qardaşım müharibədə həlak oldu.

**Mən gördüyün "GENERAL SOKOLOV" yox, Güllübulaqlı "HACI MANININ oğlu general MƏHƏMMƏDƏLİYƏM".**

Anamın fəryadı indiyə kimi qulağımda səslənir:- Bizlərə nə edirsiniz edin, bircə o körpə balalarıma dəyməyin.
General Məhəmmədəli gözləri yaşarmiş halda dilləndi:- Zalım oğlu, yaralarımın qaysağını qopartdın, bəs eləyər, sənə yaxşı yol.
Rəhmətlik Rəhim atama dedi ki, adaş, mən sizlərdən həmişə xeyir görmüşəm, tutulanda da mənə ən çox köməklik göstərən sən oldun, eşitmişəm tutulandan sonra da ailəmə köməklik etmisən, sağ qalmağıma ümüd yoxdur, mənə halallıq ver. Bir dəki türmədən qurtarmağımın səbəbini heç öz yaxınlarım da bilmir. Bundan sonra mən ölsəm bunu bir sən, bir də o uşaq biləcək. Bilirəm, ağzı bütöv kişisən, ona görə bunları sənə danışdım ki, mənim başım çox bəlalar çəkib, həm İtaliyada düşmənlər əhatəsində, həm də Kazanda qaladan qurtarmağımın səbəbi yalnız bir allah bilir ki, Ağbabanın mərd, cəsur və qəhrəman oğullarının sayəsində indiyə kimi sağ qalmışam.

**Mən hər iki rəhmətliyə verdiyim əhd- peymanımı pozdum. Bu sirri 50 ildən coxdur ki, ürəyimdə saxlayırdım. Ancaq biz də bu dünyadan gedəcəyik, övladlarımızın igidliyi, qəhramanlığı və cəsurluğu isə daimi millətimizin qəlbində yaşayacaqdır.**

**(Yusif Heydərovun xatirələrindən)**

# XARABA AĞBABANIN ABADLAŞDIRILMASI
# ( 1859 - cu il)

1828-1829 -cu il Rus-Osmalı müharibəsində Xatunoğlu Mahmud paşa ilə Axıskadan qaçqın düşən qarapapaqlar, xaraba Ağbabanın yenidən bərpa olunması barəsində Osmanlı dövlətinə müraciət etdilər.

Krım müharıbəsi zamanı Kars sancağının rəhbəri olan Takiyəddin paşa, dövlətin qəbul etdiyi bəzi şərtlərlə xaraba halında olan Ağbabanı yenidən abadlaşdırma Xatunoğlu Mahmut bəyə həvalə olundu. Mahmut bəyin arzu halına görə Ağbabanın yeni bir qəza, yəni yaşayış məskəni halına gətirilməsi üçün buraya könüllü olaraq qonşu qəzalardan və vaxtıilə Ağbabadan qaçqın düşmüş qonşu kəndlərdə yaşayan qarapapaqlar və həmçinin dövlətə borcu olan, borçunu ödəyə bilməyən və Türk ordusunda qulluq etməkdən imtina edib qaçıb dövlətdən gizlənən insanların birinci növbədə yaziya alınması təşkil edildi. Bunun yerinə yetrilməsi uçun Xatunoğlu Mahmud bəy dövlətə borcu olan insanların borclarının əhv edilməsini, və əsgəri xidmətdən boyun qaçıran insanların Qars – Ərzurum tərəfində əsgəri borclarının yerinə yetrilməsini Osmanlı dövlətindən xahış etmişdir. Xatunoğlu Mahmud bəyin bu istəyi Osmanlı dövləti tərəfindən qəbul edilmişdir.

Tophanə Məclisinin rəisi Mehmet Selim paşa Ağbaba bölgəsini dolaşaraq hazırladıqları geniş raportu məclısə təqdim etmişdir.

11 sentyabr 1859/13 nömrəli 1276 tarixli bu raport: Xatunoğlu Mahmud bəy, onun ailəsi, bölgədəki Qarapapaqlar və bölgə tarixi baxımından mühümdir.

Oısa vaxt ərzində Ağbaba adlı bu yerin xəritəsi hazırlandı. Buranın bir tərəfi sınır üzərindəki Şiştəpə, Kiçik Öksüzlər, Böyük Öksüzlər və Gül dağı deyilən təpələrdir. O biri tərəfi isə Şörəgəl yaxınlığındakı Daşgiri və Haşhaştır. Bir diğər yanında Zərişat qəzası önündə Kırəc və Qarlı Süleyman adlı yerlər vardır. O bir tərəfində

Çıldır qəzası və cinahında Tarab adlı yer göstərilmişdir. Dört tərəfı tərif edilən Ağbabanın uzunluğu altı, genişliyi dört saat olup, sahəsini iyirmi dörd saata dolaşa biləcək bir ərazidir. Bu yerlər 1828 – 1829 - cu ildən etibarən əlli dörd (54) kənd xaraba halına gəlmişdir, və xarabalıqların yerləri aydin göstərilmişdir. İndi Urfa sancağının rəhbəri olan Qars sancağı eski rəhbəri Takiyəddin paşanın xeyırlı bir xidməti olarak, Ağbabanın abadlaşdırılması Mahmud bəyə həvalə edilmişdir. Mahmud bəyin 25 may 1858-ci il (11 şevval 1274) günündə başlayıp, bu günə qədər davam edilən anda Ağbaba qəzasında iyirmi iki (22) kənd salınmişdir və buraya 966 aıləlik 503 xana (ailə) toplanmıştır. Bunların 20.000 civarında qoyunu, sığırı ve sair hayvanları vardır. Sözü gedən ailələrin 421-i Rusya tərafindən, otuz yeddi ailə (37) Ardahan, Çıldır, Zərişad və Şörəgəl qəzalarından və qalan qırx beş (45) aılədə adı geçən qəzaların rəsmi yazımlarında nüfusundan gizlənən (nüffüs-i mektüme) olup qarapapaq deyilən tərəkəmə tayfasındandır. Bunların nüfus dəftərlərinə qeydli olduğu hesab edilsə belə, təbiətiylə əskər hissəsi alınmamaqda və hamısı yurdluq sahibi olmayıb kasıb kimsələrdən meydana gəldiyi üçün Ağbabanın geniş və məhsuldar ərazisinin sənədi onlara hədiyyə verilmişdir. Rusya tərəfındən gələnlərin isə, sırf osmanlı ədalətinə sığınmaq məqsədi ilə gəlmiş kimsələr olduğu təhqiqat nəticəsində açığa çıxmışdı. Bəhs edilən əhaliyə verilen 150 sənədin İstanbuldan gəlməsinə qədər, yerli idarə tərəfindən bunlara keçici sənəd verilmişdir.

Məhsuldar, sulaq, otlaq və çayırları çox geniş olan bu ərazi əhalisiz qalarsa, Rusya tərəfindən Gümrünün çox yeri çayır və otdan məhrum olduğu üçün, bundan əvvəl olduğu kimi indi də yaz və qış mövsümlərində heyvanlarının buranın otlaqlarında otladılaraq gələcəkdə Rusyanın mülkiyət iddiasına səbəb ola bilər. Ayrıca əhalisiz qalması halında bu bölgənin quldur və oğru sığıncağı olacağı da aşkardır. Şiştəpə adlı yerdə Gümrüyə gedən Tiflis yolu boyunca sıradan ediləcək polis bölmələri və buralara qoyulacaq müstahfız əsgərlər, hər hansı bir əskəri hərəkət halında birləşdiriləcək, səhrəddin qorunmasında büyük faydaları olacaqdır.

Ayrıca, bir illik müddətdə edilən sonucu dövlətin xəzinəsinə 65.000 qəpik gəlir təmin edlimiş olması, buranın şən və abadan edilməsinin faydalarını göstərməkdədir.İndiyə qədər edilənlərin həm indi, həm də gələcək baxımından lazımlı olduğu və olacağı təhqiqatla başa düşülmüşdür.

Topxana raporuna görə Xatunoğlu Mahmut bəyin xidmət və səyləri dövlətin faydasınadır və gərəyi yerinə gətirilməlidir. Məsələnin həvalə edildiyi Meclis-i Valada da oxşar qərar alınmış və bəzi təfərrüatla sədrəzəmliyə çatdırılmışdır. Mahmut bəyin 1000 qəpik aylıqla Ağbaba qəzasına müdür təyini və etdiklərinin davamının təmin edilməsi yolundakı qərarı dəyərləndirən sədrəzam, qəzanın mülkü və maliyyə işlərinin həlli üçün Qars sancağı rəhbəri Şərif Paşaya əmir yazılmasını ərz etmiş ve eyni yolda padişah əmri çıxarılmışdır.

# YAZILMAMIŞ TARİXİMİZDƏM

## AĞBABA MAHALINDA ŞƏRQİ ERMƏNİ DVİZİYASININ TƏŞKİL ETDİYİ OVÇULAR PLANI.

1-ci dünya müharibəsinin başlanması ilə əlaqədar olaraq Rusiya hüdudlarından kənarda yaşayan ermənilər rusların köməkliyi ilə könüllü drujina dəstələri yaratmağa başladılar. Könüllü dəstələrin yaradılması 1914 – cü ilin sentyabırında başlayıb, 1914 – cü ilin noyabr ayında başa çatdırıldı.

**Rus və erməni birləşmələri tərəfindən Qafqaz və şərqi Anadolu torpaqlarının işğal oluması (1914 – 1916 – ci illər)**



Beləliklə, ruslar tərəfindən yaradılan 4 erməni könüllü drujina dəstələrində 9 min əsgər və zabitlər fəaliyyət göstərməyə başlamışdır.

**Qafqaz cəbhəsində erməni könüllü drujina dəstələri**



Cənubi Qafqaz regionunda yaradılan erməni könüllü drujina dəstələrinin əsas məqsədi Türkiyə dövlətini daxildən sarsıtmaq, parçalamaq və Qafqazda xarici dövlətlərin maraqlarını həyata keçirməkdən ibarət idi.

Erməni könüllü drujinanın ilk dəstələri ABŞ - da tam hazırıq kursu keçdikdən sonra 12 mart 1915 – ci ildə Rusiya imperiyasının Arxangelsk şəhərinə çatdırılmışdır. Həmin istiqamətdə ikinci partiya 10 may, üçüncü partiya isə 21 noyabr 1915 – ci ildə Arxangelsk şəhərindən Qarqaz cəbhəsinə göndərilmişdir.

Qafqaz cəbhəsində erməni könüllü drujina dəstələri böyüdülərək batalıyonlar adlandırılmışdır. Beləliklə, Qafqaz cəbhəsində 6 erməni könüllü bataliyonu fəaliyyət göstərmişdir. 1917 –ci ilin iyul ayında erməni könüllü bataliyonu böyüdülərək polklarla əvəz olunmuşdur.

1917 – ci ilin oktyabr ayından etibarən Qafqaz cəbhəsində 2 erməni dviziyası yaradılmışdır.

13 dekabr 1917- ci ildən etibarən Qafqaz cəbhəsinin baş komandanı general mayor Yevqeniy Lebedinskiy könüllü erməni korpusu yaradılmasına nail olmuşdur. Həmin erməni korpusuna rəhbərlk general Foma Nazarbekova (Foma Nazarbekyan), ştabın rəisi isə general Vışınskiy Yevqeniy Yevqeniyeviçə (vaxtı ilə 13-cü İrəvan polkunun komandiri olub) tapşırılmışdır.

1917- ci ilin sonunda erməni millət sovetinin qərarı ilə ümumi erməni korpusuna rəhbərlik baş komandan general Dro ( Kanayan Drastamat Martirosyan) həvalə olunmuşdur.

Beləliklə, 1917-ci ilin noyabrında Rusiyada baş verən dövlət çevrilişindən sonra Qarsın və onun əyalətlərinin yenidən azad olması şansı yaranmışdı. 1917–ci il Rusiyada baş verən dövlət çevirlişindən sonra hakimiyyətə gələn sovetlər müharıbə zonasında olan silah-sürsatı ermənilərə buraxaraq Şərqi Anadolu torpaqlarını tərk etməyə başladılar.

Bu fürsətdən məharətlə isifadə edən ermənilər yaranmış boşluğun yerində yeni erməni diviziyaları yaratdılar.

**1-ci erməni diviziyası** (komandiri general Aramyan);
**2-ci erməni diviziyası** (komandiri polkovnik Movses Slikov);
**3-cü erməni atlı süvari briqadası** (komandiri polkovnik Qorqanyan);
**4-cü şərqi erməni diviziyası** (komandiri general-mayor Andranik Ozanyan);
4-cü şərqi erməni diviziyasının tərkibi Lori, Şuşa, Axırkələk və Qazax polklarından təşkil olunmuşdu.
Bundan əlavə 4-cü şərqi erməni diviziyasının tərkibinə yezidi kürdlərindən[1] ibarət süvarı dəstələr qatılmışdır. (komandiri Cahangir ağa)

**Yezidi kürdü:**- xristiyan dinini qəbul edən erməniləşdirilmış kürdlər

Şərqi erməni dviziyasının Axırkələk polku (komandiri polkovnik Marzmanov) Gümrü və Gümrü ətrafı kəndlərdə, həmçinin Şörəgəl və Ağbabada qətliamlar vastəsilə erməni-daşnaq idarəçiliyini qoruyub saxlamaqdan ibarət idi.

**1918-ci ildən etibarən Qərbi Azərbaycanın (indiki Ermənistanın) Ağbaba mahalında şərqi erməni dviziyasının Axırkələk polkunun qarşısında Kəlbalayı Məhəmməd ağanın rəhbərliyi altında 700 nəfər könüllülərdən təşkil olunmuş Ağbaba süvarı alayı dayanmışdı.**

Qırx ildən artıq müddətdə müəyyən fasilələrlə müharibə meydanına çevrilən Şərqi Anadolu əhalisi yenə də "Olüm, ya dirim" dilemması qarşısında qalmışdı. Birinci Dünya müharibəsində məğlub olan Osmanlı imperiyasını parçalamaq üçün, düşmənlər hər tərəfdən hücuma keçmişdilər.

Noyabrın ayında Ağbaba Milli Şurası təşkil edilir. Ağbabanın Köhnə İbiş kəndində olan Hacı Abbas oğlu Kərbalayi Məhəmməd ağa Şurasının sədri və konqresə nümayəndə seçilir. Şuranın tərkibində 7 nəfərdən – Hacı Abbas oğlu Kərbalayi Məhəmməd ağa, qardaşları Mahmud və Əsəd ağalar, Babaş ağa Bayram oğlu, Haşım Ağbaba, Xəlil Vəli oğlu Budaq və İbişli Hamza ağalardan ibarət idi.

Geri çəkilən türk ordusunun zabiti yüzbaş Xurşud bəy Ağbabada qalıb könüllü dəstələrin təlimi vəzifəsini öz üzərinə götürmüş, Ağbaba süvari dəstələri ermənilərə qarşı mücadilə edəcək bir gücə sahib olmuşdu.

1918-ci ildə Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Məhəmməd ağa Kiçik Şiştəpə kəndindən qərargahını Böyük Təpəköy kəndinə köşürüb nahiyəni idarə eləməyə başlamışdı.

Yüzbaşı Xurşud bəyin rəhbərliyi altında Çıldır, Ağbaba və Şörəgəl nahiyələrində yerli səfərbərlk keçrilmiş və erməni qoşunlarını lərzəyə salan 700 nəfərlik Ağbaba süvari alayı təşkil edilmişdi. Belə qayda qoyulmuşdu: əsgər verə bilməyən ailələr bir tüfəngin pulunu və bir at, yaxud bir inək verməli idilər.

Ağbaba süvarı alayının tərkibində **5 hərbi qrup (tabor)** mövcud olmuşdur. Hər bir taborun ayrı - ayrılıqda vəzifəsi və görəcəyi işlər dəqiq bəlli idi.

**1-ci qrup süvari alayı; -** 20 nəfər igidlərdən təşkil olunmuş **yuzbaşı Hacı Abbas oğlu Əsəd ağanın** səraəncamında Ağbaba Mlli Şurasının rəhbərlərini erməni terror təşkilatından qorumaqdan ibarət idi.

**2-ci qrup süvari alayı:-** 30 nəfər igidlərdən təşkil olunmuş **yuzbaşı Hacı Abbas oğlu Mahmud ağanın** sərəncamında ordunun təminatını ödəmək üçün Ağbaba kəndlərindən maddi vəsaitin toplanmasından ibarət idi.

**3-cü qrup süvari alayı;-** 600 nəfər igidlərdən təşkil olunmuş Türk ordusunun zabiti **yuzbaşı Xurşud bəyin** sərəncamında çevik dəstələr qrupu, düşmənlərin hər hansı həmlələrini dəf etməkdən ibarət idi.

**4-cü qrup çevik (xüsusi) təyinatlı süvari alayı;-** 40 nəfər igidlərdən təşkil olunmuş hərtərəfli təlim keçmiş, yaxşı silahlanmış, erməni və gürcü dillərini mükəmməl bilən iki xüsusi təyinatlı dəstələrdən ibarət idi.
20 nəfər say seçmə iğidlərdən təşkil olunmuş 1-ci aldadıcı xüsusi təyinatlı dəstənin başçısı **yüzbaşı Hacıvəli Usub oğlu**, 20 nəfər say - seçmə igidlərdən təşkil olunmuş 2-ci xüsusi təyinatlı dəstənin başçısı **yüzbaşı Həşim Mutruz oğlu Ağbaba** olmuşdur.

**5-ci qrup xüsusi təyinatlı kəşfiyyat dəstəsi:-** 10 nəfər igidlərdən təşkil olunmuş hərtərəfli təlim keçmiş, yaxşı silahlanmış, erməni, gürcü və rus dillərini mükəmməl bilən cavanlardan təşkil olunmuşdur.
5-ci qrup xüsusi təyinatlı kəşfiyyat dəstəsinin rəisi və həmçinin 4-cü qrup çevik (xüsusi) təyinatlı Ağbaba süvari alayının baş məsləhətçisi, **"Məşədi" ləqəbli Rəcəb Məmməd oğlu olmuşdur.**

Məşədi Rəcəb 1877-1878-ci il rus-türk müharibəsinin fəal iştirakçısı, həmin illərdə türk süvari alayının onbaşısı və həmcinin 1905 -1921 ci illər ərəfəsində Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Məhəmməd ağanın yaxın dostu və silahdaşı, 1917-1921- ci illər ərəfəsində Ağbaba süvarı alayının yüzbaşısı, həmçinin Ağbaba çevik (xüsusi) təyinatlı süvarı alayının baş məsləhətçisi və xüsusi təyinatlı kəşfiyyat dəstəsinin rəisi olmuşdur (Aşıq Heydərin əmisi).

**Çıldır - Ağbaba özünümüdafiə könüllü süvari alayı (qarapapaq tərəkəmələr) 1918- ci il**



1-ci aldadıcı xüsusi təyinatlı dəstənin başçısı yüzbaşı Hacıvəli Usub oğlu və 2-ci xüsusi təyinatlı dəstənin başçısı yüzbaşı Həşim Ağbabanin vəzifələri, Hacı Abbas oğlu Məhəmməd ağa ilə gürcü generalları arasında aparılan gizli danışıqlardan sonra böyük məbləğdə nikolay qızılına (qızıl pul nəzərdə tutulur) alınmiş silah – sürsatı Axırkələkdən Ağbabaya tam təhlükəsiz şəkildə gətirib, Ağbaba süvarı alayını silah və sürsatla təmin etməkdən ibarət idi.

Onuda qeyd etməliyəm ki, 1878-1920-ci il tarixidə Qars – Çıldır bölgəsi rus və erməni daşnaq birləşmələrinin nəzarəti altında idi. Ağbaba və Şörəgəlin müdafiyəsi üçün silah- sürsat yalnız Axırkələkdən gətirilirdi. Axırkələk yolu çox təhlükəli idi. Axırkələk Gürcüstanın nəzarətində olmasına baxmayaraq, bu yerlərə nəzarət ermənilərin əlində idi. 1919 -cu ilin dekabr ayında gürcü generalları sılah-sürsatın Ağbabaya aparılmasına zəmanət vermədilər. Üstəlik gürcü generalları Hacı Abbas oğlu Məhəmməd ağaya xəyanət edərək silah daşıyan dəstələrinin yerlərini daşnaq alay komandanı Marzmanova bildirdilər. 1920-ci ilin yanvar ayının qarlı-şaxtalı qışında Ağbaba süvarı alayının yüzbaşısı **Hacıvəli Usub oğlu**nun xüsusi təlim keçmış 20 nəfərdən ibarət dəstəsi Axırkələyin "Dəmir Körpü" deyilən hissəsində şərqi Erməni dviziyasının Axırkələk polku tərəfindən mühasirəyə alınır və Axırkələyin dəmir körpü deyilən yerində 6 saatdan artiq qanlı döyüşlər başlanır. Bu döyüşdə Ağbaba süvarı alayının xüsusi təlim keçmiş 20 nəfər cəngavəri və Ağbaba süvarı alayının 4-cü qrupunun yüzbaşısı Qaçaq Usubun oğlu Hacıvəli ermənilər tərəfindən qətlə yetirilir. Deyilənə görə bu döyüşdə ermənilər tərəfindən 83 nəfər öldürülmüşdür.

Bu döyüşlərdə Düzkənd kəndindən Mustafa Abbasəli oğlu, Usub İmamverdi oğlu, Qərib Bayrampaşa oğlu və Rus Əhməd (İrəvandan gəlmədir, rus dilini bildiyinə görə el arasında belə adlandırılıb) şəhid oldular. Allah cəmi şəhidlərimizə rəhmət eləsin. **Məşədi Rəcəbin xatirələrindən** yazıya alınıb.

Ağbaba süvarı alayının 4-cü qrup 1-ci aldadıcı çevik təyinatlı dəstəsinin başçısı yüzbaşı Qaçaq Usubun oğlu Hacıvəlinin əziz xatirəsi heç vaxt unudulmayacaq və yaddan çıxmayacaq.

**( Aşıq Heydərin xatirələrindən )**

2-ci xüsusi təyinatlı dəstənin başçısı yüzbaşı Həşim Ağbaba isə 6 araba silah-sürsatı Ağbaba süvarı alayının sərəncamına çatdira bilmişdi.

Ağbaba süvarı alayının 4-cü qrupunun 2-ci xüsusi təyinatlı dəstənin başçısı yüzbaşı Həşim Mutruz oğlu Ağbabanın taleyi necə olmuşdur?

**Həşim Mutruz oğlu Ağbaba** Axirkələk hadisələrindən sonra, həmkəndlisi və uşaqlıq dostu olan əslən Ağbabanın Göllü kəndinin sakini Ağbaba süvarı alayının 4-cü qrupunun 1-ci aldadıcı xüsusi təyinatlı dəstəsinin başçısı yüzbaşı Qaçaq Usubun oğlu Hacıvəlinin ölümündən sonra bir müddət öz vəzifəsini icra edə bilməmişdi. Buna həm də Ağbabanın qarlı-şaxtalı havası mane olmuşdur. Qış aylarında erməni birləşmiş dəstələri dağ kəndlərində döyüş əməliyyatları davam etdirə bilmədiklərinə görə döyüşlər dayandırılmışdır. 1920-ci ilin sentyabr ayında Hacıabbas oğlu Məhəmməd ağa Çıldır mahalından geri qayıdan zaman Ağbaba süvarı alayının 4-cü qrupunun 2-ci xüsusi təyinatlı dəstənin başçısı yüzbaşı Həşim Ağbabanin atası və Ağbaba süvarı alayının donoru olan Murtuz ağanı ziyarət etmək məqsədilə Göllü kəndinə gəlir. Murtuz ağanın evində Hacı Abbas oğlu Məhəmməd ağanın şərəfinə böyük məclis təşkil olunur. Məclisdə Həşim Ağbabani görməyən Haci Abbas oğlu Məhəmməd ağa təəcüblə Murtuz ağadan soruşur:

- "Ağa bəs bizim aslanımız harada qaldı?"

Murtuz ağa: -Həşim, 3 nəfər Ağbaba süvari alayının əsgərlərinin müşayəti ilə Hacı Abbas oğlu Mahmud ağanın göstərişi ilə Böyük Təpəköy kəndinə gedəcəyini bildirdi və bir daha geri qayıtmayıb. Hacı Abbas oğlu Məhəmməd ağa Göllü kəndindən Böyük Təpəköy kəndində gəlir. Böyük Təpəköy kəndində Hacı Abbas oğlu Məhəmməd ağaya məlum olur ki, Ağbaba süvarı alayının 4-cü qrupunun 2-ci xüsusi təyinatlı dəstənin başçısı yüzbaşı Həşim Ağbabanı Hacı Abbas oğlu Mahmud ağa Böyük Təpəköy kəndinə dəvət etməyib, və həmçinin yüzbaşı Böyük Təpəköy kəndinə gəlməyib. Beləliklə, Ağbaba süvari alayının 4-cü qrupunun 2-ci xüsusi təyinatlı dəstənin başçısı yüzbaşı Həşim Mutruz oğlu Ağbaba naməlum səbəbdən itgin düşür. Beləliklə, Mutruz ağa və Ağbaba Milli Şurasının sədri Hacı Abbas oğlu Kərbəlayi Məhəmməd ağa arasında soyuqluq yaranır. 1921-ci ilin oktyabr ayında bağlanmış "Qars Müqaviləsinə" əsasən Ağbaba süvarı alayı buraxılır və yeni yaranmış Sovet dövləti ilə Türkiyə hökuməti arsında bağlanmış müqaviləyə əsasən Ermənistan və Türkiyə arasında səhrəd xətti

müəyyənləşdirilir. Hacı Abbas oğlu Məhəmməd ağa, Murtuz ağa və həmçının Ağbaba milli şurasının üzvləri Türkiyədə yaşamağı qərarlaşdırırlar. Beləliklə, Həşim Ağbabanın naməlum səbəbdən itgin düşməsi axıra qədər araşdırılmır.

**Bəs Ağbaba süvarı alayının 4-cü qrupunun 2-ci xüsusi təyinatlı dəstənin başçısı yüzbaşı Həşim Ağbabanın aqibəti necə olur?**

1937-1944-cü illərdə 5 kəndin baş hesabdarı işləyən (Düzkənd, İlanlı, Qaranamaz, Göllü və Balıxlı) əslən Mağaracıq kəndinin sakini və sonralar Güllübulaq kəndində yaşayan Axundov Əhməd Əli oğlundan alınan məlumat ilk dəfədir ki, işıq üzü görür.

**Axundov Əhməd Əli oğlunun xatirələrindən** :- Ermənistan SSR-nın NKVD-nin göstərişi ilə 1937-ci ilin avqust ayından etibarən Amasiya rayonunda əksinqilabı qüvvələri aşkar etmək məqsədilə "Troyka" deyilən bir üçlük qurum yaradılmışdır və bu quruma olduqca böyük səlahiyyətlər verilmişdi. "Troykanın" tərkibi ermənilərdən təşkil olunmuşdur. 1941- ci ilin noyabr ayı idi. Gün batmışdı. Gümrü şəhəri "NKVD"-nin rəisi Şin Hayrapetyan sərxoş vəziyyətdə Göllü kəndindəki "Qənsələr"ə [1] daxil oldu.

Bu bina vaxtı ilə Murtuz ağanın evi olmuşdur. O mənə istehza ilə baxıb dilləndi:- Əhməd, Torosyan Yediyar hanı?

Mən dedim:- Yediyar Düzkənd kəndinə gedib, amma nə vaxt qayıdacağını mənə deməyib.

Şin Hayrapetyan:- Çox ğözəl cavab verdin Əhməd, Torosyan Yediyar mənim uşaqlıq dostum olub, gör bizim başımıza türklər nə işlər gətirib.

1915-ci ildə Tüklərin əlindən Sarıqamışdan qaçıb qohum - əqrabamızla birilkdə Allahu – Əkbər dağında 3 ay ot yemişik. O vaxtlar bizim on beş- yirmi yaşımız ancaq olardı. Allahu–Əkbər dağında 70 nəfərdən cəmi 3 nəfər uşaq mən, Aram və Yediyar canımızı qurtara bildik.

---

Ağbabada yerli camaat idarənin inzibati binasına "Qənsələr[1]" deyirdilər. Qənsələr rus sözündən götürülb "Konsilyar" deməkdir.

Qalan qohum - əqrabalarımızı türklər qırdı. Bizi Alksandrapol qrup qoşunlarının rəisi general Primov türklərin əlidən alıb Gümrü şəhərinə gətirdi. Əhmətcan, indiyə kimi bu əllərimlə 70 nəfər ermənininin əvəzinə 700 türkün canını almışam.

Əhməd, ancaq bu evin sahibi Murtuz ağa ilə mənimki qalsın sonraya. Biz onu nə ölü, nədə ki, diri ələ keçirə bilmədik. Onun pulu və oğlu Həşim yazıx erməniləri qanına qəltan elədi. Əhmət, Murtuz ağa Ağbabada ən ağıllı türklərdən biri idi. Çox təəssüflər olsun ki, biz onu cəhənnəmə göndərə bilmədik.

1919 – cu ilin sentyabr ayı idi. Mən, Aram və Yediyar həmin bu Ağbabada erməni milli qəhrəmanı, şərqi Erməni dviziyasının Axırkələk polkunun komandanı polkovnik Marzmanovun yanında gənc zabitlər idik.

Şərqi Erməni dviziyasının Axırkələk polkunun xüsusi briqadasının rəisi Ermənistan milli qəhrəmanı general Osepyan bizi Gümrü şəhərində yanına cağırtdırıb belə bir təlimat verdi:

- Ağbaba Milli Şurasının sədri Kərbəlayı Məhəmməd ağanın yaxın dostu, həmçinin "Ağbaba Süvari Alayını" hər cəhətdən maliyələşdirən Göllü kəndinin adlı- sanlı ağası Murtuz ağanı və oğlu Ağbaba süvarı alayının 4-cü qrupunun 2-ci xüsusi təyinatlı dəstənin başçısı yüzbaşı Həşim Ağbabanı, Murtuz ağanın qardaşları Hacıəhməd və Əmrahı, Ağbaba süvarı alayının 4-cü qrupunun 1-ci aldadıcı xüsusi təyinatlı dəstəsinin başçısı yüzbaşı Qaçaq Usubun oğlu Hacıvəlini, Ağbaba süvari alayının baş komutanı yuzbaşı Xurşud paşanı, Çıldırda ermənilərin qanına susuyan Əsəd ağanı, Dələver kəndində İsrafil ağanı, Qaraçanta kəndində Əhməd ağanı, Elləroyuğundan Babaş ağanı, İbişli Hamza ağanı, Qaranamaz kəndindən Səqir oğlu Hasan ağanı və Abdüləzim oğlu Kazım ağanı, Düzkənd kəndindən Xəbər oğlu Rustam ağanı, Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Məhəmməd ağanın yaxın dostu və silahdaşı, həmçinin 5-ci qrup xüsusi təyinatlı kəşfiyyat dəstəsinin rəisi "Məşədi" ləqəbli Rəcəb Məmməd oğlunu və.s aradan götürməliyik.

-Osipyan:- Siz, türk dilini mükəmməl bilən və yüksək təlim keçmiş peşəkar gənc zabitlərsiniz, bu əməliyyat sizlərə həvalə olunur. Ancaq elə etmək lazımdır ki, guya bu işləri qotur Mahmud ağa törədib, tükləri bir- birinə vuruşdurmaqla biz öz planlarımıza nail ola bilərik, yoxsa silah gücünə Ağbabanı almaq mümkün deyil.

General Osepyan bizə hazırladığı **"Ovçular"** planı əsasında hərəkət etməyi tapşırdı.

"Ovçular" planına əsasən Mən, Aram və Yediyar yaxşı sılahlanıb, Ağbaba süvari alayına xas olan paltarları geyınıb adlı - sanlı adamları aradan götürməli idik.

Ovçular planına əsasən, biz 1919 – cu ilin sentyabr ayında, dumanlı – çiskinli bir havada, gün batan vaxtı, Ağbaba Süvari Alayının yüzbaşısı Kəlbəlayı Hacıabbas oğlu Mahmud ağanın adından Düzkənd kəndinin adlı – sanlı el ağsaqqalı və Ağbaba Süvari Alayının donoru olan Xəbər oğlu Rustam ağanı aldadıb Böyük Təpəköy kəndinə aparacağımızı bildirdik. Xəbər oğlu Rustam ağa bizə inanıb, bizimlə Böyük Təpəköy kəndinə gedəcəyini bildirdi. Biz gün batan vaxtı, "Qara Çayır" deyilən yerdə, Xəbər oğlu Rustam ağanı qətlə yetirib, ovçular planına əsasən "Qara Çayır"da yerləşən "Qanlı Gözəyə" atdıq və oradan Göllü kəndinə gəldik.

Ağbaba Süvari Alayının 4 – cü taborunun yüzbaşısı, erməni millətinə qənim kəsilən, Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Hacıabbas oğlu Məhəmməd ağanın döyüş meydanında "Ağbabanın Aslanı" adlandırdığı Həşim Murtuz oğlu Ağbabanı, Xəbər oğlu Rustam ağa kimi aldadıb, "Qara Çayır"da, qaranlıq bir gecədə, arxadan güllələyib "Qanlı Gözə"yə atdıq və oradan Dələver kəndinə gəlib İsrafil ağanı öldürüb, Gümrüyə yollandıq. Murtuz ağanı, Mahmud ağanı, Əsədi, Əhmədi və Babaşı öldürmək bizə qismət olmadı.

Onlar Türkiyəyə qaçmaqla canlarını qurtardılar. İbişli Hamza ağa və oğlu Yusifi sağ - salamat ələ keçirdik.

Amma Hamza ağanın pulları bizi aldatdı. Ata və oğul Türkiyəyə qaçmaqla canlarını qurtardılar.

1937 –ci ildə isə Qaranamaz kəndindən Səqir oğlu Hasan ağanı və Abdüləzim oğlu Kazım ağanı Gümrü şəhərində "Qara Qala" deyilən yerdə güllələdim.

Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Məhəmməd ağanın yaxın dostu və silahdaşı, həmçinin çevik təyinatlı süvari alayının baş məsləhətçisi "Məşədi" ləqəbli Rəcəb Məmməd oğlunu öldürmək bizə qismət olmadı. O,1922- ci ildə öldü. Oğlu Məhəmməd Amasiya rayonunun baş hesabdarı işləyirdi. O da müharibəyə (1941-ci il) getməklə canını bizim əlimizdən qurtara bildi.

Amma ermənilər Məşədi Rəcəbin qisasını oğlu Məhəmmədin iki oğlu (Baxşəli, Müzəfər) və bir qizindan (Qotaz) çıxdılar. Ermənilər bir ayın içində Məşədi Rəcəbin üç nəvəsini aradan götürdülər.

**( Yusif Heydərovun xatirələrindən )**

Düzkəndli Məcid Məmmədov hal - hazırda (1941-ci il noyabr) Amasiya rayonunun partiya komitəsinin kadrlar şöbəsinin müdiri, və Amasiya rayon hərbi komisarlığının 4 - cü hissəsinin rəisi vəzifəsində işləyir. Hamza ağanın oğlu Yusiflə yaxın dostudur, Qori və İrəvan şəhərlərində bir yerdə təhsil alıblar.

Məcid Məmmədov Amasiya rayonunda sayılıb seçilən şəxsiyyətlərdən biridir. Mən ona təklif etdim ki, o Yusifin əli ilə Türkiyədə adı gedən şəxsləri zərərləşdirsin. O isə Amasiya rayon icraiyyə komitəsinin sədri Yaqub Qəribova güvənib, Əhmət, gör mənə nə dedi:- Hınger[1] Hayrapetyan, get Gümrüdə qanun – qayda yarat. Ona çatmadı ki, dəvədən də böyük fil var. Mən ona çox məsləhət verdim, ancaq o qulaq asmadı.

O vaxtlar erməni millətini qanına qəltan eləyənlər, indi də sovet hökumətini dağıtmaq planlarından əl çəkmirlər.

Erməni millətinə qan udduran Ağbaba süvarı alayının fəal üzvləri olan Düzkənd kəndindən Rustam ağanin övladları Ənnağı, Məhəmmədtağı, Qasımı və Daşdəmirov Həbib Əhməd oğlunu 1937-ci ildə və hal- hazırda həmin təşkilatın rəhbəri Məmmədov Məcidi isə Gümrü şəhəri "Qara Qala" deyilən yerdə bu əllərimlə güllələyib gəlmişəm.

**Axundov Əhməd Əli oğlunun xatirələrindən** - Şin Hayrepetyanın danışdığı bu əhvalat məni daxilən çox sarsıtdı. İmkanım olsa, Şin Hayrapetyanın qanını içərdim, amma nə eyləyim, çarəsizəm, zaman onlar üçün işləyir.
Bu əhvalat 72 ildən sonra ilk dəfədir ki, işıq üzü görür.

**НКО-СССР**
**Главное Управление Контрразведки "Смерш"**
**Ордер N476**

**Тер-Арутюнян Г. Е. арестован 2.11.1944г.**
**Главным Управлением "Смерш".**

**1947-ci ildə SSRİ Dövlət Təhlükəsizlik Komitəsinin əməkdaşları tərəfindən İrəvan şəhər həpsxanasında saxlanılan Ter-Arutunyan Qareqin Eqişeviçin (Qareqin Njde) dindirilməsi:**
По данным Центрального Госархива N16/2/396-2.
По следственному делу N111278 Тер-Арутюнян Гарегин (Нжде)

**Ter-Arutunyan Qareqin Eqişeviç:** Mən 1919-cu ilin may ayında erməni milli şurasının tələbi ilə Aleksandrapol (Gümrü) şəhər baş komissarı təyin olundum. Həmin il mənim rəhbərliyim altında Ermənistanın Şirak bölgəsinin dağlıq zonası olan Ağbabada, erməni hökumətinə tabe olmayan Ağbaba Süvari Alayını məhv etmək planını hazırladıq. Məqsədimiz Ağbaba Süvari Alayının rəhbərlərini aradan götürmək və onlar arasında nifaq salmaqdan ibarət idi. Plana əsasən biz Ağababa Süvarı Alayının komutanlarından birini Axırkələkdə, dıgərini isə Ağbabada, Arpa çayının sağ sahılındə "Qara Çayır" deyilən yerdə zərərsizləşdirə bildik, amma Ağababa Süvarı Alayını tam məhv edə bilmədik. 1919-cu ilin payızında 4-cu şərqi erməni dviziyasının tərkibində Andranık Ozanyanın rəhbərliyi



altında biz qüvvələrimizi birləşdirib Qarsa hücuma keçdik. Mən Qarsda yaralandım. 1920-ci illərdən etibarən erməni milli şurasının qərarı ilə mən Zəngəzur, Qapan, Mehri və Naxçıvanın müdafıyəsinə rəhbərlik etməyə başladım.

Dindirilmə zamanı bu kafir 21 noyabr 1920-ci ildə Zəngəzurun tam şəkildə ermənilərin əlinə keçməsindən və bu döyüşlərdə 1200 azəri türkünün (əsgərinin) vəşicəsinə qətlə yetirilib Tatev qayasından atılmasından söhbət açmışdır.

Deməli buradan belə məlum olur ki, Axundov Əhməd Əli oğlunun (Göllü kəndi noyabr 1941-ci il) dedikləri əsasında yazıya alınmış bu məlumatı Ter-Arutunyan Qareqin Eqişeviçin (Qareqin Njde) təsdiqləmiş olur.

**Ə.Heydər**

## АКТ МЕДИЦИНСКОГО ОСВИДЕТЕЛЬСТВОВАНИЯ ЗДОРОВЬЯ
## Заключённого Тер-Арутуняна Г. Е.

Мы, ниже подписавшиеся: Начальник санитарного отдела МГБ Армянской ССР подполковник медслужбы Мелик-Пашаев М. А., врач нервопатолог поликлиники и санотдела МГБ Армянской ССР капитан медслужбы Чимишкян А. И. и врач внутренней тюрьмы МГБ Армянской ССР подполковник медслужбы Окоев Г., осмотрев заключённого Тер-Арутюняна Г. Е. составили настоящий акт при амбулатории внутренней тюрьмы МГБ Армянской ССР 24-го марта с. г., причём обнаружили следующее:

Заключённый Тер-Арутюнян Г. Е., 1886г. рождения, жалуется на: общую слабость, постоянные головные боли, особенно при всяких физических движениях, забывчивость,



иногда мелькание чёрных кругов перед глазами, на боли в нижних конечностях, главным образом, левой ноги, при ходьбе теряет равновесие, шаткая походка, шум в ушах, левым ухом слышит плохо, боли в области печени и желчного пузыря, сон тревожный, просыпается по утрам с головными болями. Постоянные боли в области сердца и левой верхней конечности, чувство онеменения, ползание мурашек и дрожание левой руки.

Болел брюшным и сыпным тифом 1914г., туберкулёзом - в 1914г., малярией и ревматизмом в 1912г. Дважды ранен в войнах с турками в 1918-1919.,Карссим направленам близлежащих районов горы Акбабы.

Начальник санотдела МГБ Арм. ССР
подполковник м/сл. **Мелик-Пашаев**
Врач-нервопатолог поликлиники и санотдела МГБ Арм. ССР капитан м/сл. Чимшинян
Врач В/тюрьмы МГБ Арм. ССР
подполковник м/сл. Окоев Г.

25-ое марта 1952г.
г. Ереван

## ПРОТОКОЛ ДОПРОСА
## Свидетеля Хойлунца Арсена Арутюновича
## От 16-го сентября 1947г.

**Вопрос:** Известен ли Вам Тер-Арутюнян Гарегин (Нжде)?
**Ответ:** Да, Гарегин Нжде мне известен по Зангезуру с конца1919г. по июль 1921г. Нжде в Зангезуре являлся командующим дашнакскими вооружёнными силами Кафанского района.
**Вопрос:** Что Вам известно об антисоветской деятелности Нждев Зангезуре?
**Ответ:** В 1919-20гг. под руководством Нжде, который



командовал вооружёнными силами дашнакской армии в Кафанском районе, были уничтожены десятки азербаджанских сёл Кафанского и близлежащих районов и истреблены тысячи мирных жителей этих сёл.
**Вопвос:** Расскажите, какие меры были приняты Нжде против азербайджанцев, революционеров-коммунистов в Зангезуре?
**Ответ:** 27-го мая 1920г. села Хндзореск было поднято восстание против дашнаков. Восстание было подавлено вооружёнными силами дашнаков под руководством Нжде и Дро.
Во время подавления восстания были расстреляны активные участники этого восстания азербайджанцев расстрел был совершён под руководством Нжде.

## ПРОТОКОЛ ДОПРОСА
## Арестованного Деведжяна Оганеса Акоповича

Допрос начат в 10ч. 05м. — 28 августа 1947г.
Окончен в 16ч. 30м. — След. дело N11411
Арх. N8882 том 1, стр. 189-197.

**Вопрос:** Ныне дайте подробное показание, что Вам известно о Нжде -- Тер-Арутюняне Гарегине?
**Ответ:** Тер-Арутюнян Гарегин, Нжде, более 60 лет, уроженец одного из сёл Нахичеванской АССР, сын священика, старый дашнак, в 1903-1909гг. привлекался царским правительством как дашнак, затем обучался на курсах по подготовке боевиков для направления в Турцию. Во время Балканской войны 1912-1913гг. совместно с известным хмбапетом Андраником руководил добровольческим отрядом (хумбом) против турок. Во время первой мировой войны Нжде переезжает в Россию и здесь, на Кавказе, принимает активное участие в организации армянских добровольческих отрядов против турок. В 1920г., военный отряд Нжде расстреливает около 18 тысяч человек



азербайджанцев жителей Эривани.
При дашнакском владычестве в Армении он дашнакским правительством использовался по военной линии, т. е. возглавлял военное дело в Зангезуре, сперва по усмирению местных азербайджанцев, скорее по очищению территории от азербайджанцев.

**Нжде в Зангезуре допустил зверское убийство азербайджанцев, заживо сбрасывал их с Татевской скалы в пропасть.** Об этом факте мне стало известно сперва из бесед с лидером партии Дашнакцутюн и ответственными деятелями дашнакской авантюры 1921г. в Тавризе, а затем об этом же говорил мне и сам Нжде, заявляя, что он действовал как государственный деятель, а не как христианин.

Факты сбрасывания азербайджанцев с Татевской скалы в пропасть сперва были известны очень ограниченному кругу руководителей дашнаков, которые в лице Рубена Тер-Минасяна (Рубен паша), Амо Оганджаняна и Врацяна Симона, старались хранить в строгом секрете.

Записан с моих слов верно, переведён на армянский язык
подпись - Деведжян
переводил - Товмасян
Допросил нач. отделения 1-го отдела МГБ Арм. ССР
капитан Гукасов

---

**Qeyd: Bu dəyərli arxiv materiallarını bizə Heydərov Heydər təqdim etdi.**

---

**İstifadə olunmuş ədəbiyyat**

Дирекция **«Централен военен архив», София 2006, с. 521**, Михайлов, Иван. Карекин Нъждех, в. Македонска трибуна, г. 31, бр. 1601, 21 ноември 1957

Овсепян В. Гарегин Нжде и **КГБ — воспоминания разведчика**
2004. — 338 р. — ISBN 076580834X,ISBN 9780765808349



# UNUTSAQ UNUDULARIQ

## ÇILDIR SÜVARİ ALAYI BARƏSİNDƏ QİSA MƏLUMAT

Baş komutan – Qoca oğlu Məhəmməd bəy
Baş qərargah - Çıldır
Dayaq nöqtələri– Qara qala kəndi, Baş köy kəndi

Ordunun tərkibi

1.Çıldır süvari alayı (atlı dəstələr) – 1500 nəfər

Silahları

1.Avtomatik makinalı silah (pulemyot) - 4 əd
2.Nişangahı olan silah aynalı (snayper) – tam təminatlı
3.Xirda caplı silahlar – tam təminatlı

## AĞBABA SÜVARİ ALAYI BARƏSİNDƏ QİSA MƏLUMAT

Baş komutan – Kəlbəlayı Hacı Abbas oğlu Məhəmməd ağa
Baş qərargah - Taya qaya dağı
Dayaq nöqtələri – Qalaça dağı, böyük Təpəköy kəndi, kiçik Şiştəpə kəndi

Ordunun tərkibi

1.Ağbaba süvari alayı (atlı dəstələr) – 700 nəfər

Silahları

1.Avtomatik makinalı silah (pulemyot) - 2 əd
2.Nişangahı olan silah aynalı (snayper) – tam təminatlı
3.Xirda caplı silahlar – tam təminatlı



# 4-CÜ ŞƏRQİ ERMƏNİ DVİZİYASININ AXIRKƏLƏK POLKU BARƏSİNDƏ QİSA MƏLUMAT

4 – cü şərqi erməni dviziyasının baş komutanı: ordu generalı:
Andranik Ozanyan

Şörəgəl - Ağbaba cəbhəsinin Axırkələk polkunun baş komutanı
Polkovnik: - Marzmanov
Alay komandirləri:- Baratov, Sarxunov

Çıldır cəbhəsinin Axırkələk polkunun baş komutanı
Polkovnik:- Vağ Arşak

Baş qərargah - Gümrü şəhəri.
Dayaq nöqtələri – Qızılqoc qəsəbəsi, Böyük Şiştəpə kəndi, Təzəkənd kəndi, Qazançı kəndi, Qaraməmməd kəndi, Meğraşad kəndi, Qoca bəy (Baqdanovka) qəsəbəsi, Axırkələk şəhəri və.s.

Ordunun tərkibi:- (4-cü şərqi erməni dviziyasının Axırkələk polku)

1.Erməni piyada dəstələri ~ 500 nəfər
2.Çevik süvarı dəstələr (atlı dəstələr) ~ 3000 nəfər
3. Xüsusi təyinatlı süvari dəstələr ( atlı dəstə) ~ 600 nəfər

Silahları

1.Ağır silahlar:- toplar – 70 əd
1.Avtomatik makinalı silah (pulemyot) - 20 əd
2.Yüngül çaplı silahlar (3 və 5 açılan) – tam təminatlı
3.Xirda caplı silahlar – tam təminatlı

# AĞBABA UĞRÜNDA GEDƏN DÖYÜŞLƏRDƏ ŞƏRQİ ERMƏNİ DVİZİYASININ AXIRKƏLƏK POLKUNUN MƏĞLUBİYYƏTƏ UGRAMASI.

## AĞBABA QIRĞINLARI (may 1918-ci il).

Ağbaba süvari alayının sütununu Ağbaba, Şörəgəl və Çıldır mahalından könüllülərdən ibarət cavanlar təşkil edirdi. Onu qeyd etmək istəyirəm ki, Ağbaba süvari alayı demək olar ki, tamamilə könüllü dəstələrdən ibarət idi. Ağbaba Milli Şurasının rəhbəri Kəlbəlayı Hacıabbas oğlu Məhəmməd ağa tərəfindən könüllülərin ailələrinə hərtərəfli köməklik göstərilirdi, hətta onlar üçün qan pulu da ayrılmışdı. **( Aşıq Heydərin xatirələrindən )**

1915-1916-cı illərdə Türkiyənin içərilərindən köçüb gələn "qaxdağan" ermənilər Daşnaksütyun partiyasının proqramına uyğun olaraq Qərbi Azərbaycanın mərkəzi sayılan İrəvan şəhəri başda olmaqla butün əyalətlərində həmçinin Ağbabanın Gümrüyə yaxın aran kəndlərinə hücumlar edib, onları Türkiyənin içərilərinə doğru qaçqın düşməyə məcbur etmişdilər. Macal tapıb qaça bilməyən kimsəsiz qocaları, xəstələri və uşaqları quyulara atıb ağzını bağlamış, yaxud saman damına doldurub,üstlərinə neft tökərək yandırmışdılar.

Həmin dövrdə Ağbaba nahiyəsinin 14 aran kəndinin əhalisinin bir qismi qırğınlardan qurtulmaq üçün nahiyənin dağ kəndlərinə sığınmış, bir qismi də Türkiyənin içərilərinə köç etmək məcburiyyətində qalmışdı.

Aşıq Qərib Hasan Qərbi Azərbaycanda müsəlmanlara qarşı törədilmiş rus – erməni vəhşiliyini və qətliamını "Taya Oaya"da belə qələmə almışdir.

Görməyəydim, kor olaydı gözlərim,
Yolda, izdə meyidə bax, leşə bax.
Arvad – uşaq qan selində boğulub,
Kəsik başa, kəsik ələ, döşə bax.



Viran qalıb İrəvanın köyləri,
Öldürülüb ağaları, bəyləri,
Yetimlərin göyə çixir vayları,
Ürəklərə pərcümlənən şişə bax.

Kafir olan burun kəsib, göz dəlib,
Haqq üzülüb, niyə belə incəlib?
It erməni qan sümürüb dincəlib,
Urus ilə birləşibdi, işə bax!

Harda qalıb türkün əri – igidi?
Yandırıblar qocaları, seyidi.
Aman Allah, itlər yeyir meyidi,
Basdırmağa yoxdu xəlvət guşə, bax.

Evlər uçub, oba tüstü – dumandı,
Yanan insan, demə otdu – samandı,
Müsəlmanın halı necə yamandı,
Ayıqlığı edəcəkmi peşə, bax!

Dığa – mığa , qarğa – quzğun olubdur,
Köpək kimi obalara dolubdur.
Müsibətdən dağın külü olubdur,
Kəllələrdən yaranıbdı meşə, bax!

Qərib Hasan bu vəhşətdən ah çəkər,
Fəryad eylər, gözlərindən yaş tökər.
Qan içində burda yatır bəy, nökər,
Oyuq gözə, o qıcanan dişə bax.!

1918-1920 ci illər tarixində bizim məclislərimiz Ağbaba süvari alayında təşkil olunurdu.

**( Aşıq Heydərin xatirələrindən)**

Mahmud ağa tez- tez mənim dalımca capar göndərərdi. Biz də öz sazımızla, sözümüzlə döyüş gedən yerlərdə gənclərinizi ruhlandırırdıq.

1918-ci ilin may ayının əvvələri idi. "Taya Qaya" deyilən yerdə Məhəmməd ağa tərəfindən ermənilər üzərində qələbə münasibətilə Ağbaba süvari alayının əskərlərinə ziyafət təşkil olunmuşu.

Bu ziyafətdə Aşıq Heydərin "Taya Qaya"da Ağbaba süvari alayının qarşısında dediyi sözlərdən bir parçanı qələmə almışıq.

Ərəsət günüdür, qoç igidlərim,
Düşmənlər əlində daş oynatmasın.
Mərdin qabağına çıxmasın namərd,
Müxənnət sevinib qaş oynatmasın.

Qara zurna çalır döyüş cəngini,
İgidlər oynayır millət səngini,
Əzin igidlərim, düşmən əngini,
Başsız qalan kafir baş oynatmasın.

Ey Allah, sən yetiş mərdin dadına,
Qoy xətər gəlməsin Heydər adına.
Onun xatirinə, onun adına,
Gələnlər gözündə yaş oynatmasın.

Mən (Aşiq Heydər), Gümrülü Yetim Tapdiq və qocaman aşığımız Aşıq Qərib Hasan bu məclisdə iştirak edirdik. Ağbaba süvari alayının aslanları Şörəgəldə şərqi erməni dviziyasının Axırkələk polkununa (polkovnik Marzmanovun dəstəsinə) sarsıdıcı zərbə vurmuşdu. Həmin döyüşlərdə ermənilərdən 4 pilemyot və coxlu sayda silah-sursatı ələ keçrilmişdi. Məclisin axırında Ağbaba Milli Şurasının rəhbəri Kəlbəlayı Hacıabbas oğlu  Məhəmməd ağanin fərmanı oxundu. Bu fərmanda əsgərlərdən 5 nəfərə on başı və 30 nəfərə hər birinə bir ədəd nikolay 5-lik qızılı (pulu) verildi. Bir nəfər əsgər isə fərari aldandırılıb ölümə məhkum olundu. Qələbə münasıbətilə Mahmud ağadan həmin cavan oğlanın əhv olunmasını xahış etdim. (Aşıq Heydərin xatirələrindən)

Mahmud ağanın tərs damarı tutmuşdu. O mənə dedi:- Mən fərmanı icra  eləməyə borcluyam, başqa cür mümkün deyil, biz orduda yaranan yaramaz halların qarşısını almalıyıq. Bu yaramaz

ermənilərə işləyir. Onu ermənilər tərəfə qaçan yerdə ayağından güllələyiblər. İşi belə görüb mən ağadan xahış etdim ki, onda məni həmin əsgərin yanına aparın. Ağa məni özü ilə "Taya Qaya"da böyük bir mağaraya apardı. Bura əsgərlər zindan deyirdilər. Fərari əsgəri görəndə gözlərimə inana bilmədim. Əsgərə o qədər işgəncə vermişdilər ki, onun üz-gözü qanın içində idi. Mən əsgərdən soruşdum:- Bala, mənim bu mahalda coxlu tanışlarım var, de görüm sən kimlərdənsən, kişi olan öz namus - qeyrətini düşmənlərə satarmı? Əsgər güclə mənə cavab verdi:- Baba, mən Qoca bəyin[1] Sarcalar kəndindənəm, dəyirmançı Aslanın oğlu Xıdıram.
Mən könüllü olaraq bu orduda 3 aydir ki, ermənilələ vuruşuram, özüm də ki, ölümdən qorxan olsam bura gəlməzdim. Onsuz da mən ölumə məhkum olunmuşam, ancaq mən nə fərari, nə dəki satqın deyiləm. Mən Xıdırdan soruşdum:-Bəs nə üçün silah-sürsatı götürüb aradan çıxmaq istəyirdin?

Xıdır:-Mən Sarcalar kəndində Hasan ağanın qızını istəyirdim. Amma başlıq pulum olmadığına görə qızı mənə vermədilər. Mən Məşədi Rəcəbin məsləhəti ilə Ağbaba ordusuna yazıldım. Axırkələkdən silah gətirən Ağbaba süvarilərinin bələdçisi oldum. Məşədi Rəcəb mənə söz vermişdi ki, Şörəgəldə gedən döyüşlərdən üzü ağ çıxsaq, Hasanın qızını sənə alacam. Məşədi Rəcəb 30 nəfər döyüşçü ilə ermənilərə arxa tərəfdən sarsıdıcı zərbə endirdi.

Amma ermənilərə arxadan kömək gəldi. Biz mühasirəyə düşdük. Mən Məşədi Rəcəbin dəstəsində idim. Dəstəmizdəın 7 nəfər yaralı və 18 nəfər adam şəhid oldu. Məşədi Rəcəbi ermənilər güllə ilə vurub atdan yerə saldılar. Mən ordu komutanım olan Məşədi Rəcəbə köməyə qaçdım. Nə edəcəyimizi özümüz də bilmirdik. Bu vaxt Xurşud bəyin ordusu mühasiə həlqəsini yardı. Döyüş meydanında ermənilər çoxlu sayda yaralı və silah-sürsat buraxıb qaçmaqla canlarını qurtardılar.

Məşədi Rəcəbi isə bizimkilər arabanın üstündə huşsuz vəziyyətində apardılar.

**Qoca bəy –** Gürcüstan Respublikası indiki "Boqdonovka" rayonu.

Məni mühasirə həlqəsinin içində özümüzünkülər səhvən arxadan ayağımdan güllələdilər və adımı da satqın qoydular.
Mahmud ağa:-Çox heyiflər olsun bu qanlı döyüşdə təcrübəli ağsaqqalımız olan Məşədi Rəcəb ağır yaralanıb, hüşü özündə deyil, amma həkimlər deyir ki, yüzbaşı tezliklə ayağa qalxacaq.

Mahmud ağa:- Aşıq Heydər, əminin yaralı olmasını sənə demədiyimizə görə bizi üzürlü hesab elə. Kişi Qalaçadadı, gedək bir baş çəkək. Mən isə ağaya dedim:- Xıdırı tələsik öldürmək düzdün deyil, qoy son sözü Məşədi Rəcəb desin.

Mahmud ağa:- Aşıq Heydər qoy sən deyən olsun.

Biz 15 nəfər əsgərlərin müşayəti ilə Taya Qayadan Qalaçaya tərəf yola düşdük. Qalaçada həkimlər bizi içəri buraxmadılar.

Burada mənə məlum oldu ki, Ağbaba Milli Şurasının rəhbəri Kəlbəlayı Hacıabbas oğlu Məhəmməd ağa və baş komutan Xurşud ağa Məşədi Rəcəbin yanındadılar. Aradan bir xeyli keçmışdi içəridən Kəlbəlayı Hacıabbas oğlu Məhəmməd ağa çıxıb bizə tərəf gəldi.

Kəlbəlayı Hacı Abbas oğlu Məhəmməd ağa:- Mahmud, Məşədi Rəcəb əldən gedir, kişiyə bir şey olsa, onda mənim belim qırıldı. Bu döyüşün planını mən və Xurşud hazırlamışdıq. Plan riskli bir plan idi. Planın baş tutmaması Ağbabanın məhvi demək idi.

Plana görə düşmənlərə arxadan yüzbaşı Qaçaq Usubun oğlu Hacıvəli zərbə enrirməli idi. Ancaq Məşədi Rəcəb bununla razlaşmadı. Məşədi Rəcəbin bizə son sözü bu oldu:- Mənim artıq ölümlü günüm gəlib, 70-dən cox yaşım var, Hacıvəli gənc və cavandı, o bizə çox lazım olacaq, düşmənə arxadan zərbə endirməyi mən öz üzərimə götürürəm və həmçinin bunun nə demək olduğunu yaxşı anlayıram. Kəlbəlayı Hacı Abbas oğlu

Məhəmməd ağa:

-Aşıq Heydər, bu qələbə Məşədi Rəcəbin qələ-bəsidir, kişinin sağalması üçün Allaha dua etməliyik və həmçinin bunu da deməyə özümə borc bilirəm. Ermənilər bu məğlubiyyətin acısını böyük və kiçik Şiştəpə, Bozqala, İlanlı, Düzkənd, Çaldaş və Kiçik Təpəköy kəndlərindən çıxdılar. Ermənilər kiçik Şiştəpə kəndinin əhalisini saman damlarına doldurub yandırıldılar və kəndə od vurublar.

İlanlı və Düzkənddən 60-dan çox adam öldürülüb. Mənə verılən məlumata görə Məşədi Rəcəbin qızı Məsimin həyat yoldaşı Nərgizi də ermənilər öldürüblər. Məşədi Rəcəbin ailəsi və Nərgızın övladları Hacı və Əlidən bir xəbər yoxdur. 100 nəfərdən çox qoca, uşaq və qadınlardan ibarət olan əsirləri Bozqala dərəsində bizim ordudan qaçıb dağlarda qaçaqlıq eləyən, 12 nəfər igidimiz ölümlərinə fərman verdiyim fərarilərlər ermənilərin əlindən aiıb Çaldaşa tərəf gətirirlər. Kiçik Təpəköydə Hacıvəlinin dəstəsi ilə ermənilər arasında qanlı döyüşlər gedir.

Kəlbəlayı Hacıabbas oğlu Məhəmməd ağa:

- Mahmud ağa, 200 nəfərdən ibarət süvari dəstələri sənin və Həşim Ağbabanın sərəncamındadır. Sən 50 nəfər süvari dəstəsi ilə bizim arxa cəbhə əsgərlərimizin (onlara mənim fərari deməyə dilim gəlmir) köməyinə tələs və təcili əsirləri təhlükəsiz yer olan Köhnə İbiş kəndinə gətirin, Həşim Ağbaba isə Hacıvəliyə köməyə getsin. Yaranmış vəziyyət barəsində mənimlə əlaqə saxlayın.

Gümrü ətrafı və Şörəgəl kəndlərində qətliamlar törətmiş erməni daşnaq komandanı olan, qanlı Marzmanov Ağbaba Milli Şurasının sədri Hacı Abbas oğlu Kərbəlayı Məhəmməd ağaya hədə - qorxu gələrək, ona namə yazıb təslim olmağını istəmişdir. Bu namənin cavabını Aşıq Heydər belə dəyərləndirmişdi.

Aldıq məktubunu, qanlı Mazmanov,
Bilirik üstümüzə yaramaz gəlir.
Başına yığıbsan beş, on dığanı,
Gündə sizdən bizə bir avaz gəlir.

Kişi deyil bu işləri boşduya,
Bir namədə yazıb saldıx poştuya.
İsəmirdik qanlı savaş başdıya,
Döyüş meydanına yüz min laz gəlir.

---

Qalaça – Göllü kəndi ilə Öysüz kəndi arasında Şiş dagının (3130) zirvəsindəki bir qala.
Çaldaş - 1918-1920-ci ildə kənd ermənilər tərəfindən dağıdılıb

Bu qaniçən kafir Hələbdə sülənirdi,
Bu binamus oğlu Vanda dilənirdi,
Oğurluq üstündə qanına bələnirdi,
Görrəm Şörəgəldən kefi saz gəlir.

Gümrüdə binalar od tutub yanır,
Müsəlmanlar bizim ellər talanır,
Leş - leşin üstünə gəlib qalanır,
Qartalnan savaşa ördək, qaz gəlir.

Getdi payız, gəldi yazın havası,
Əynimə geymişəm zireh libası.
Qana- qan günüdür, allıq qisası,
Daşnağın kökünü qaz ha, qaz gəlir.

Əsir etdin Gümrüdə bir kənd uşağı,
Od vurdun məscidə qalmadı sağı.
Heydərə çəkdirdin sağalmaz dağı,
Hazırlaş ay yağı, sizə paz gəlir.

Çaldaş kəndində mənə məlum oldu ki ermənilər bizim kənddən 28 nəfər adam öldürüb. Öldürülən adamların arasında əmim qizi Nərgiz, Yunusun gəlini Nazxanım, Dəli Əhmədin həyat yoldaşı Xeyrənsə, Qərib ağanın 8 yaşlı oğlu Məhərrəm və.s- ləri olub.
**(Aşıq Heydərin xatirələrindən).**

Beləliklə, ağır döyüşlərdən sonra 1918-ci il may ayında böyük Təpəköy kəndinin yaxınlığında şərqi erməni dviziyasının Axırkələk polkununun hüçumlarının qarşısı alındı.

Ağbaba süvarı alayının igidləri erməni – daşnaq birləşmələrinə sarsıdıcı zərbə endirdi.

Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Hacıabbas oğlu Məhəmməd ağa butün qaçaqları (Ağbaba süvarı alayının fərariləri) əhv etdi və onları arxa cəbhə əsgərləri adlandırdı.

Bu hadısələrdən 4 il sonra, yəni 1922-ci ilin mart ayında 1-ci rus-türk müharıbəsinin onbaşısı və Ağbaba süvarı alayının qocaman və

təcrübəli yüzbaşısı Məşədi Rəcəb Ağbaba mahalının Düzkənd kəndində gözlərini əbədi olaraq yumdu.

## "Məşədi" ləqəbli Rəcəb Məmməd oğlu (1844-1922)

1877-1878-ci il rus-türk müharibəsinin fəal içtirakcısı, həmin illərdə türk süvari alayının onbaşısı və həmcinin 1905 -1921 ci illər ərəfəsində Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Məhəmməd ağanın yaxın dostu və silahdaşı, 1917-1921 ci illərdə Ağbaba süvarı alayının yüzbaşısı, həmçinin Ağbaba çevik (xüsusi) təyinatlı süvarı alayının baş məsləhətçisi və xüsusi təyinatlı kəşfiyyat dəstəsinin rəisi "Məşədi" ləqəbli Rəcəb Məmməd oğlu.

Yaşlıların dediklərinə görə, bu tayfanın adı dəqiq deyil. Bəlli olanı budur ki, tayfanın Məşədi Rəcəb, Aşıq Heydər, Məhəmməd, Baxşəli, Rəhim kimi tanınmış adamları olub. Bunların ulu babaları haqqında heç bir məlumat qalmayıb. Çünki bu tayfanın yeri–yurdu Naxçıvanın Şərur mahalı olub. Yaşlıların dediklərinə görə bu tayfanın adamları əslən Təbrizdən gəliblər. Onların Naxçıvana gəlişi XVI yüzilliyin sonuna təsadüf edir. Çox güman ki, onlar cəsur və məğrur qızılbaşlardan I Şah İsmayıl Səfəvinin igid döyüşçülərindən olmuşlar. Bu tayfanın adamlarının Naxçıvana gəlişi I Şah Abbasın farspərəst siyasəti ilə ilgilidir (Seyid Həsən baba, 110 yaşlı, Qaraçanta kəndi, Cəlil baba, 101 yaşlı, Qaraçanta kəndi; İsgəndər baba, 80 yaşlı, Göllü kəndi; Təzəgül nənə, 75 yaşlı, Güllü kəndi). Rəhimli tayfasından bir nəfər XIX yüzillikdə Ağbabaya pənah gətirib. Bu şəxsin adı Məmməddir. Məmməd 1818–ci ildə Şərurda anadan olub.

Məmməd mərd, igid bir adam olmuş, 1877–ci ildə İlanlı kəndində 59 yaşında vəfat etmişdir. Məmmədin ölümü rus – türk müharibəsi ilə bağlıdır. Onun üç oğlu (Məşədi Rəcəb, Kərim, Molla Hüseyn) və bir qızı (Xeyrənsə) olub. Məşədi Rəcəb 1844–1922–ci illərdə yaşayıb, Düzkənddə vəfat edib. Onun bir oğlu (Məhəmməd), üç qızı (Bəsdi, Gülsüm, Şərəf) olub. Məşədi Rəcəb Aşıq Heydərin əmisi olmaqla bərabər ata əvəzidir. (Aşıq Heydər üç yaşında olanda atası Kərim Ağbaba mahalının İlanlı kəndində rəhmətə gedib)

# MƏŞƏDİ RƏCƏBİN AĞBABA SÜVARİ ALAYI İLƏ 4- CÜ ŞƏRQİ ERMƏNİ DVİZİYASININ AXIRKƏLƏK POLKU ARASINDA BAŞ VERMİŞ DOYÜŞLƏRİN XRONOLOJİYASI BARƏSİNDƏ X A T İ R Ə L Ə R İ.

## 19 MART 1920 – Cİ İL.




ŞƏRQİ ERMƏNİ DVİZİYASININ AXİRKƏLƏK POLKU

AĞBABA – ÇILDIR SÜVARI ALAYI

1920 – ci ilin mart ayının əvvəli idi. Ağbabada yazın ətri hiss olunurdu.

Ermənilər Qərbi Azərbaycanın (indiki Ermənistanın) axırıncı dayaq nöqtəsi olan Ağbaba mahalını işğal etmək üçün Şərqi erməni dviziyasının Axırkələk polkunu tam hazır vəziyyətə gətirilmişdilər.

Amma ermənilərin döyüş planı və həmçinin döyüşlər aparılan yerlər bizə tam məlum idi. Mənim rəhbərliyim (Məşədi Rəcəb) altında olan kəşfiyyat dəstələri Gümrü şəhərində bir yüksək rütbəli rus zabitini əsr tutub mənim yanıma gətirdilər.

Rus zabitinin mənə verdiyi məlumata görə ermənilər 1920- ci ilin mart ayının 19 – da Novruz bayramı günü Ağbaba üzərinə 5 istiqamətdən (Qızıl qoc, Qazançı, böyük Şiştəpə, Qoca bəy (Boqdonovka) və Amasiya) təqribən 4 ağır top, 20 ədəd iri çaplı silah, pulemiyot və 4 min nəfərdən çox olan əsgəri qüvvə ilə hücuma keçməyə hazırlaşırlar. Bu məlumatları dəqiqləşdirmək üçün adı gedən yerlərdən bizim adamlar mütamadi olaraq bizə son məlumatları verirdilər.

1920-ci ilin mart ayının 15-ci günü bizə tam məlum oldu ki, həqiqətən də adı gedən istiqamətlərdə erməni silahlı dəstələri yerləşdirilməyə başlanılıb.

Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Hacı Abbas oğlu Məhəmməd ağa böyük Təpəköy kəndində bir toplantı yığaraq ordu komutanlarının və bir çox tanınmış ağsaqqalların rəhbərliyi ilə bu məsələni müzakirə etmək üçün məni adı gedən kəndə dəvət etdi. Onu da qeyd edim ki, buraya Çıldır Milli Şurasının sədri Qoca oğlu Məhəmməd bəy və Çıldır süvarı alayının komutanları dəvət olunmuşdu.

O illər Ağbaba və ağbabalılar üçün çox ağır illər idi. Böyükdən kiçiyə hamının yuxusu ərşə çəkilmişdi. Gümrü və İrəvan şəhərlərində ermənilərin törətdikləri vəşiliklərdən danışılırdı.

Toplantıda qırğınların qarşısını almaq üçün döyüşlər gedən yerlərdən yerli əhalinin (qocalar, qadınlar və uşaqlar) bir qismini çıxarmaq qərara alındı. Müharibə zonasına yaxın kəndlərin bir

qisminə isə könüllülərdən ibarət (3 və 5 nəfərdən çox olmayan) kiçik dəstələr yerləşdirmək qərara alındı.

Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Hacı Abbas oğlu Məhəmməd ağa ordu komutanlarına belə bir göstəriş verdi;- Elə etmək lazımdır ki, ermənilər döyüşlərdə ağir sılahlardan, yəni toplardan istifadə edə bilməsinlər. İki ordunun üz - üzə gəlməsi üçün Arpa çayın sol sahili AlMərdanın çayırı adlı yer münasib bilindi. Adı gedən bu yer bataqlıq olduğundan, burada hündür qamışlar bitmişdir. Bu yer topların yerdəyişməsi üçün olduqca cətindir və digər tərəfdən də Ağbaba süvari alayının tez- tez mövqelərinin dəyişməsi üçün yaxşı şərait yaradır.

Çıldır süvarı alayı üç istiqamətdən Ağbaba süvarı alayına dəstək verməsi qərara alındı. Çıldır süvarı alayı Baqdanovka rayonunda yerləşdirilmış 200 nəfərdən çox olan erməni dəstələrini ləğv edib, onların yenidən qruplaşmasına imkan verməmək üçün əks hücuma keçıb ermənilərin dayaq nöqtələri olan Qazancı və Qızıl qoc məntəqələrini ələ keçirmək, digər bölmələr isə Arpa gölün alt hisəsi ilə hərəkət edib Amasiyanın Bəndivan və İyli məntəqələrində erməni birləşmələrini məhv etməkdən ibarət idi.

Ağbaba süvari alayını isə şərqi erməni dviziyasının Axırkələk polkununun əsas hissələrini Arpa çayın sol sahili AlMərdanın çayırında qarşılayıb 6 məntəqədən;- Düzkənd kəndinin Qızıl dağ və Ayı çınqılı dağından, Göllü kəndi istiqamətdən, Kıçık Təpə köyün Qum dağı istiqamətindən və Arpa çayının sol sahılində yerləşdirilmiş əsas qüvvələr hesabına əks hücuma keçməli idi.

Bu planı Türk ordusunu və həmçinin Ağbaba süvari alayının yuzbaşısı Xurşud bəy hazırlamışdı. Yuzbaşı Xurşud bəy Ağbabanın dağliq zona olmasını nəzərə alaraq Ağbaba süvari alayının kiçik dəstələrlə şərqi erməni dviziyasının Axırkələk polkununun əsas hissələrinə gözlənilmədən zərbə endirməsini nəzərdə tutulmuşdu. Razılaşdırılmış plana əsasən ermənilər tərəfindən ağır silahların döyüş meydanına gətirilməsinin qarşısı nəyin bahasına olursa - olsun alınmalı idi. Bu da Ağbaba – Çıldır süvari alaylarının aynalı (snayper) silahlarla ermənilər üzərində qələbəsi demək idi.

1920-ci ilin mart ayının 19 – da şərqı erməni dviziyasının Axırkələk polku Qızıl qoc, Qazançı, böyük Şiştəpə və Amasiya istiqamətindən Ağbaba üzərinə hucuma keçdilər. Ağır silahlardan istifadə edə bilməyən şərqı erməni dviziyasının Axırkələk polku, Ağbaba süvarı alayı tərəfindən Arpa çayının sol sahilində AlMərdanın çayırında mühasirəyə alındı.

1920-ci ilin mart ayının 20-də Çıldır süvarı alayı ermənilərin Baqdanovka rayonunda dayaq nöqtələrini məhv edib Qazançı, Böyük Şiştəpə, Qizıl Qoç (Axuryan rayonu) və Amasiya istiqamətində hüçüma keçdilər.

1920-ci ilin mart ayının 22 –də Düzkənd və Kiçik Təpəköy kəndi arası Arpa cayının sol sahilində AlMərdanın çayırında 1- ci Rus – Türk müharibəsi, demək olar ki, təkrarlandı. 1878- ci iln iyul ayında həmin bu yerdə türklər ruslara məğlub olmuşdu və həmçinin hər iki tərəfdən coxlu sayda əsgər qətlə yetrilmişdi.

1920-ci ilin mart ayının 22- də isə isə həmin bu yerdə Ağbaba Milli Şurasının rəhbəri Kəlbəlayı Hacı Abbas oğlu Məhəmməd ağanın tabeçiliyində olan Ağbaba süvarı alayı ilə şərqı erməni dviziyasının Axırkələk polkunun komandiri Mazmanovun tabeçiliyində olan birləşmiş erməni daşnaq süvari alayının 4- cü polku arasıda qanlı döyüşlər başlandı.

Ağbaba süvarı alayının igidləri erməni – daşnaq birləşmələrinə sarsıdıcı zərbə endirdi. Bu döyüşlərdə ermənilər 300 dən cox itgi verərək Gümrü istiqamətinə geri çəkildilər. Ağbaba uğrunda gedən döyüşlərdə ermənilər ikinci dəfə məğlubiyyətə uğrayıb atəşkəs müqaviləsini Gümrünün valısi Qaro Sasuni ilə Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Hacıabbas oğlu Məhəmməd ağa və Çıldırdan Qocaoğlu Məhəmməd bəy imzalamışdılar. Ağbaba nahiyəsinin dağlıq hissəsi Qars vilayətində yeganə bölgə idi ki, axıradək ermənilər ora girə bilməmişdilər. Ağbaba Milli Şurasının gecəli-gündüzlü gərgin əməyi nəticəsində Ağbabanın dağ kəndləri erməni qırğınlarından tamamilə xilas ola bilmişdi.

**QƏRBİ AZƏRBAYCANIN AĞBABA VƏ ŞÖRƏGƏL NAHİYƏSİNİN MÜDAFİYƏSİ ZAMANI, 4 – CÜ ŞƏRQİ ERMƏNİ DVİZİYASININ AXIRKƏLƏK POLKU İLƏ, ÇILDIR-AĞBABA SÜVARİ ALAYI ARASINDA BAŞ VERMIŞ MÜHARİBƏNİN ACI NƏTİCƏLƏRİ BARƏSİNDƏ QİSA MƏLUMAT (1918-1920)**

**1**. Gümrü şəhəri və Gümrü ətrafı 100 - dən artıq azəri türkləri yaşayan yaşayış məntəqələri şərqi erməni dviziyası tərəfindən (komandiri ordu generalı Andiranık Ozanyan) darmadağın edilmış, və tam şəkildə nəzarətə götürülmüşdür. Adı gedən yaşayış məntəqələri üzrə yerli əhali, azəri türkləri öz dədə- baba torpaqlarından qovulmuş və 8000 nəfərdən artıq yerli əhali (qoça, qadın və uşaqlar) işgəncə ilə öldürülmüşdür. Qovulmuş və qətlə yetrilmiış azəri türklərinin yerində Qars və Sarıqamışdan köç etmiş qaxtağanlar yerləşdirilmişdir.

**2.** "Şörəgəl Süvari Alayı" şərqi Ermənistan dviziyası tərəfindən (komandiri ordu generalı Andranık Ozanyan) darmadağın edilmış, 1000 nəfərdən artıq yerli əhali (qoça, qadın və uşaqlar) işgəncə ilə öldürülmüşdür.Yerli əhalinin bir hissəsi Türkiyəyə, bir hissəsi isə Ağbaba nahiyəsinə sığınmaqla canlarını qurtara bilmişdilər

**3.** Birləşmiş "Çıldır – Ağbaba Süvarı Alayları" Ağbaba uğrunda gedən döyüşlərdə, 1920 – ci il mart ayının 22 – də şərqi Erməni dviziyasının Axırkələk polkuna Arpa çayının sol sahilində 2-ci dəfə sarsıdıçı zərbə endirmişdir.

Ümumiyyətlə, 1918-1920- ci illər Çıldır- Ağbaba uğrunda gedən döyüşlərdə erməni tərəfindən 600 nəfərdən artıq əsgəri qüvvə, Çıldır- Ağbaba süvari alayı tərəfindən isə 200 nəfərdən artıq əsgəri qüvvə həlak olmuşdur. Ağbaba nahiyəsində 500 nəfərdən artıq yerli əhali (qoça, qadın və uşaqlar) ermənilər tərəfindən işgəncə ilə öldürülmüşdür

**4.** Çıldırın 150 dən artıq yaşayış məntəqəsi şərqi erməni dviziyasının Axırkələk polku tərəfindən yandırılıb talan olunmuş və 12000 nəfərdən artıq yerli əhali (qoça, qadın və uşaqlar) ermənilər tərəfindən işgəncə ilə öldürülmüşdür.

**(Ağbaba süvarı alayının yüzbaşısı Məşədi Rəcəbin xatirələrindən)**

# MƏŞƏDİ RƏCƏBİN GÜMRÜ ŞƏHƏRİ İLƏ BAĞLI XATİRƏLƏRİ.

## GÜMRÜNÜN QARA GÜNLƏRİ
## 1918 – ci il oktyabr.




1-ci cərgə soldan sağa üç nəfər qaxtağanlardan (gəlmə ermənilər) başqa şəkildə görünənlər: - Gümrünün adlı – sanlı tannınmış azərbaycanlı ağaları (öz ovladları ilə birlikdə)

**Gümrü azərbaycanlıları.**
**Rusiya İmperiyası dövrünün poçt kartı. 1917- ci il .**

Gümrü şəhəri Qərbi Azərbaycanın (indiki Ermənistanın) qərbə açılan qapısıdır. Bir sıra tarixçılər indiki Gümrü şəhərinin adının kimmerilərdən qalma olduğunu təsdiq edirlər.

Gümrü şəhəri 1804-cü il tarixinə qədər, yəni rusların Qafqazı işğal etməsinə qədər Qərbi Azərbaycanın Şörəgəl sultanlığının

mərkəzi olmuşdur. Düzənlikdə Arpa çayın sahilində salınmış bu şəhər dağlarla əhatə olunmuşdur. 1840-cı ilədək kənd olan və Gümrü adlanan yaşayış məntəqəsinin əhalisinin 85%-ni (4000 nəfər) azəri türkləri təşkil edirdi. Məntəqə 1840-cı ildə rəsmən şəhər statusu aldı. 1849-cu ildə İrəvan quberniyasının təşkili ilə onun tərkibinə verildi. Hazırda əsas əhalisi 1850-ci ildə Türkiyədən bura köçürülmüş (15000) qaxtağanlardan (gəlmə ermənilərdən) ibarətdir. 1857-ci ildə I-ci rus çarı Aleksandırın Zaqafqaziya regionuna səyahəti zamanı bu şəhərdə qala tikilmiş, şəhərə və qalaya çarın şərəfinə "Aleksandropol" adı verilmişdir.

Qərbi Azərbaycanın qərbə açılan qapısı Gümrü şəhəri, 1857-1924-cü illərdə Aleksandropol, 1924-1990-cı illərdə Leninakan, 1990-cı ildən isə Kumayri adlandırılır.

Gümrü şəhəri 2 əsrdən artiq bir müddətdir ki, erməni daşnaqlarının əsarəti altında qalan, Qədim Oğuz yurdu olan Azərbaycan torpağının ayrılmaz bir hissəsidir. Unudulmuş vətən torpağı haqqında əlimizdə olan maraqlı tarixi faktların bir hissəsini qələmə almağa özümüzə borc bilirik. Çünki bu torpaqlar bizim əzəli dədə - baba torpaqlarımızdır. Gümrü və onun ətrafında baş verən hadisələr, rus və erməni hərbi birləşmələri tərəfindən Türk millətinə qarşı törədilmiş soyqırım hadısələridir. Millətimizə qarşı törədiımiş bu soyqırım hadisəsi ilk dəfədir ki, işıq üzü görür.

1818-1920 - ci illər ərəfəsində Gümrü şəhəri və ona bitişik yaşayış məntəqələrində Azəri Türklərinə qarşı bilərəkdən yaradılmış soyqırım hadısələrini sizlərə 1877-1878-ci il rus-türk müharibəsinin fəal içtirakcısı, həmin illərdə türk süvari alayının onbaşısı və həmcinin 1905 -1921 - ci illər ərzində Ağbaba Milli Şurasının sədri Hacı Abbas oğlu Kəlbəlayı Məhəmməd ağanın yaxın dostu və silahdaşı, 1917-1921- ci illərdə Ağbaba Süvarı Alayının yüzbaşısı, həmçinin Ağbaba çevik (xüsusi) təyinatlı süvarı alayının baş məsləhətçisi və xüsusi təyinatlı kəşfiyyat dəstəsinin rəisi Məşədi Rəcəb Məmməd oğlunun dili ilə təqdim edirik.



**Məşədi Rəcəbin xatirələrindən**;- 1917-ci ildə Rusiyada baş verən inqilabdan sonra rus qoşunları işğal altında olan Anadolu torpaqlarından pərakəndə halında geri çəkilməyə başladılar. Geri çəkilən rus ordusu silahlarını 4-cü şərqi erməni dviziyasının komandani Andranık Ozanyana təhvil verdilər. Anadolu torpaqlarında rus ordularının yerində möhkəmlənən erməni dviziyaları türk millətinə qarşı görünməmiş işgəncələrə əl atdılar. Kazım Qarabəkir paşanın komandanlığı altında türk qoşunları Anadolu torpaqlarında erməni işğalına son qoymaq məqsədilə 1918- ci ilin fevral ayında əks hücuma keçib Trabzonu, mart ayında isə Ərzurum, Ərzincanı, aprel ayında Sarıqamış, Batum, Poti, Maku, Naxçıvan və Qarsı azad etdilər.1917-1918-ci illər tarixində isə Ağbaba, Şörəgəl və həmçinin Gümrü və Gümrüətrafı məntəqələrdə erməni vəşiliklərini saymaqla qurtarmaq olmaz. 1918-ci ilin fevral ayından etibarən türk qoşunları qarşısından geri çəkilən erməni dviziyaları türk kəndlərini oda qalamağa başladılar. Erməni dviziyaları tərəfindən Qarsdan, Sarıqamışdan və Ərdəhandan minlərlə türk əsirləri:- köməksiz qadınlar, qocalar və uşaqlar Gümrü şəhərində müsəlmanlar məhəlləsində (avtovaqzalın dörd ətrafı) Məmməd Qasım ağanın xanına (qonaq evləri) doldurulub bizlərin gözləri qarşısında diri-diri yandırıldı. MəmmədQasım ağanın evi təpəlikdə yerləşdiyindən yanan insanların qanı sel kimi təpədən aşağı dərəyə axıb Arpa cayına qarışdı. Erməni dığaları türk körpələrini kilsələrdə qurbanlıq qoyun kimi kəsirdilər. Türk millətinin qanına susayan cəllad Andranik başkəsənlərinə (Marzmanov, Baratov, Sarxunov, Vağ Arşak və.s) belə göstəriş vermişdir ki, hansı müsəlmanın üstündə silah tutulsa, həmin insan yerindəcə güllələnsin, qohum - əqrabası isə Gümrünün mərkəzində qurulmuş dar ağacından asılsın. Deməк olar ki, hər gün Gümrüdə 100 – lərlə türk qətliamları baş verirdi. Andranikin əsas məqsədi və əsas tələbi ondan ibarət idi ki, yerli camaatın bu qətliamlardan gözü qorxsun, Ağbaba Süvari Alayı buraxılsın və türk qoşunları isə erməni dviziyalarına qarşı əks hücumlarını dayandırsınlar.

Gümrü və Gümrü ətrafı azəri türkləri yaşayan yaşayış məntəqələrində qətliamların qarşısını almaq məqsədilə may ayında türk qoşunları Kazım Qarabəkir paşanın komandanlığı altında Arpa çayı keçərək Gümrünü ələ keçirdilər.

Türk qoşunlarının önündən geri çəkilən Andranikin qoşunları 1918-ci ilin mayında Gümrünü tərk edərək Ağbaba-Qızılqoç istiqamətində hücüma keçdilər. Çaldaş və Təpəköy məntəqələrində bizim, yəni Kərbalayi Məhəmməd ağanın qoşunları ilə qarşılaşan Andranikin qoşunu şiddətli vuruşmalardan sonra geri çəkilməyə məcbur oldular və Çaldaş, Düzkənd, İlanlı, Şiştəpə kəndlərini viran qoyub Arpaçayı keçərək Qaraxaç dağlarından Cəlaloğlu (Stepanavan) istiqamətinə hərəkət etməyə başladılar.

Türk qoşunları Gümrüdə çox qala bilmədi. 1918-ci ilin oktyabr ayından başlayaraq şəhərə ingilis qoşunları ilə birlikdə 1- ci və 4 – cü erməni dviziyaları daxil oldu.

Bundan sonra Gümrü şəhərinin qara günləri başladı. Şəhərə təntənə ilə daxil olan 1 – ci və 4 – cü şərqi erməni dviziyaları Andranikin göstərişi ilə Gümrü şəhərində yaşayan yüzlərlə az yaşlı uşarlarını yığıb müsəlmanlar məhləsindəki yarıuçuq məscidə doldurub öz ata və analarının gözləri qarşısında yandırdılar. İş o yerə gəldi ki, Gümrü və Gümrü ətrafı kəndlərdə yaşayan Azəri türklərini erməni qırğınlarından xılas etmək üçün Ağbaba Milli Şurasının sədri Kəlbəlayı Hacıabbas oğlu Məhəmməd ağa ermənilərlə danışıqlar aparmaq məcburiyyətində qaldı.

Danişıqlar zamanı Gümrü və Gümrü ətrafı 60 – dan çox yaşayış məntəqələrindən 800 araba ilə 5000 nəfərdən çox yerli sakinlərin, yəni azəri türklərinin təhlükəsiz Qarsa köçürülməsi nəzərdə tutuldu.

Mən, yəni Məşədi Rəcəb Ağbaba Milli Şurasının Sədri Kəlbəlayı Hacı Abbas oğlu Məhəmməd ağadan xahiş etdim ki, 5000 nəfər qoca, qadın və uçaqlar olan arabaları bizim özünümüdafiyə süvari alayı müşaiyət eləsin. Məndə olan məlumata görə ermənilər sərhəddə yaxın məntəqələrin birində Gümrü və Gümrüətrafı kəndlərdən köçürülən qaçqınları yolda məhv etməyi planlaşdırırlar. Lakin Hacı Abbas oğlu Məhəmməd ağa mənimlə razlaşmayıb bildirdi

ki, biz ermənilərlə belə qərara gəlmişik ki, qaçqınların təhlükəsiz köçrülməsi üçün heç bir silahlı dəstələrdən istifadə olunmasın.

Ermənilər tərəfindən 4- cü şərqi erməni dviziyasının Axırkələk polkunun komandirləri:- Marzmanov, Baratov, Sarxunov həmçinin Gümrü şəhərinin valisi Qaro Sasunu; Azəri türkləri tərəfindən isə Ağbaba Milli Şurasının sədri Kəlbalayı Hacı Abbas oğlu Məhəmməd ağa, İsrafil ağa, Xurşud ağa, Murtuz ağa ilə aparılmış danışıqlarda ermənilər növbəti dəfə bizi aldatdılar.

Arabalar Şörəgəlin Qaraməmməd kəndi yaxınlığında düzəngahda Axırkələk polkunun komandiri Marzmanovun pusqusuna düşdü. Güclü top atəşinə məruz qalan arabalardan bir neçəsi Arpa çayını keçməklə canlarını qurtara bildi. Demək olar ki, 5000 nəfərdən cox olan insanlardan yalnız onlarla insan canını qurtara bildi. Qaraməmməd kəndi yaxınlığında düzəngahda insan meyidindən yer yox idi. Torpaq al – qana bələnmişdi. Bu hadisə azəri türklərinə qarşı ermənilər tərəfindən törədilmiş Qərbi Azərbaycanın ən ağrılı bir faciyəsi idi.

Ermənilər bu döyüşdə öldürülən kiçik yaşlı uşaqların başlarını kəsib ağaclara taxmışdılar. Kəsik körpə başlarının altından bu sözlər yazılmışdı;- "Erməni millətinə əl qaldıran hər bir türkün aqibəti belə olacaq". Bu bəs etməmiş kimi hətta erməni komandiri qanlı Marzmanov Ağbaba Milli Şurasının Sədri Kəlbəlayı Hacı Abbas oğlu Məhəmməd ağaya belə bir təhqiramiz məktub da ünvanlamışdı.

**Məktubun mətni belədir: - Molla Mamed, sizə Oxçoğlu düzündə bir kənd basdırma, Qaraməmməd düzündə isə bir kənd qızartma hazırlamışıq. Buyurun nuş eləyin!**

Çox ağır gedən danışıqlardan sonra (yəni bölgədə olan ingilislərin işə qarışmasından sonra) ermənilər qətlə yetirilmiş insanların basdırılmasına icazə verdilər. Öldürülən insanlar ağır topların atəşi ilə erməni vəşilikləri nəticəsində tanınmaz hala salınmışdı.

Onu da qeyd etməliyəm ki, ermənilər bölgədə olan ingilisləri inandira bilmişdilər ki, güya müqaviləni Türklər pozmuşdur və ölənlərin çoxu Qarsdan köçən erməni qaçqınlarıdı.

**Məşədi Rəcəbin xatirələrindən**;- Biz döyüş meydanında Qaraməmməd kəndinin düzündə qətlə yetirilən balalarımızın ermənilər tərəfindən necə qətlə yetirilməsinin həm şahidi, həm də ki, ən böyük günahkarlarıyıq.

Biz Ağbaba süvari Alayının komutanları;- Kəlbalayı Hacı Abbas oğlu Məhəmməd ağa, Kəlbalayı Hacı Abbas oğlu Mahmud ağa, Kəlbalayı Hacı Abbas oğlu Əsəd ağa, Xurşud ağa, Hacıvəli Usub oğlu, Həşim Mürtüz oğlu Ağbaba, mən Məşədi Rəcəb Məmməd oğlu eləcə də Ağbaba cəngavərləri əlimizi ölən körpələrin qanına batırıb bu meydanda and içdik ki, axırıncı damla qanımıza qədər vuruşub bu qanı yerdə qoymamalıyıq. Belə də oldu. Qaraməmməd qətliamı ermənilərə cox ağır başa gəldi.

Bu hadisələr Ağbaba – Şörəgəl Süvari Alayı üçün böyük bir faciyəyə çevrildi. İgid oğullar öz doğmalarının dəfni ilə əlaqədar Ağbaba Süvari Alayını tərk etdilər.

Ağbaba Süvarı Alayında erməni kəşfiyyatı tərəfindən yaradılan sünnü – şiyə məsələsi ortaya atıldı. 2000 nəfərdən çox olan bu alay iki yerə parçalandı. 700 nəfər dəstəyə Kəlbəyayı Hacı Abbas oğlu Məhəmməd ağa (şiyələrdən İbarət) və 1000 nəfərdən cox olan 2 – ci dəstəyə isə Dələver kəndinin sakini İsrafil ağa (sünnü) başçılıq etməyə başladı.

Məşədi Rəcəb; - Biz tez bir zamanda içərimizdə olan erməni kəşfiyyat qrupunu aşkar edib hamısını məhv etdik.

İsrafil ağanın sərəncamında olan süvari dəstələr isə daxili çəkişmələr nəticəsində öz fəaliyyətini dayandırdı və igidlərin cox hissəsi bizə qoşuldu.

Bu hadısələrdən 4 il sonra yəni 1922-ci ilin mart ayında 1-ci rus- türk müharıbəsinin onbaşısı və Ağbaba süvarı alayının qocaman və təcrübəli yüzbaşısı Məşədi Rəcəb Ağbaba mahalının Düzkənd kəndində gözlərini əbədi olaraq yumdu.

**Mərd və cəsur babalarımıza Allah rəhmət eləsin!**

**Yusif Heydərov.**
**Rəcəb Rəcəbov**



# AĞBABA, RUS – TÜRK MÜHARİBƏSİ İLLƏRİNDƏ iyul 1877- ci il.

**MƏMMƏDOV MƏHƏMMƏD RƏCƏB OĞLU.**
**ATAMIN RUS – TÜRK MÜHARİBƏSİ İLƏ BAĞLI XATİRƏLƏRİNDƏN**
**1940 – CI İL.**

**Ağbaba Süvari Alayının yüzbaşısı Məşədi Rəcəbin xatirələrindən yazıya alınıb:**

1877-ci ildə atam Məmməd (Məşədi Rəcəbin atası) Ağbaba mahalında, Türk ordusunun, Qars-Ərdahan dairəsi üzrə, Qazançı kəndində yerləşmiş sərhəd məntəqəsinin zabiti idi. Vəziyyətimiz pis deyildi. Osmanlı hökuməti bizim ailəyə hərtərəfli köməklik göstərirdi. Onda biz Ağbabanın İlanlı kəndində yaşayırdıq. İlanlı kəndindən Bozqala kəndinə qədər olan məhsuldar ərazilərdə bizim əkin sahələrimiz var idi.

Ağbabada rus – türk müharibəsinin (iyul-1877-ci il) başlanmasının ilk günləri idi. Mən gənc yeniyetmə bir oğlan idim. Mən Ağbabada baş verən qanlı döyüşləri, rus – türk müharibəsini, ölənə kimi unuda bilmədim. 1877-ci ilin iyul ayında, bizim ailə üçün böyük bir faciyə baş verdi.

1877-ci il iyul ayının əvvəli idi. Rus hərbi qoşunlarının bir ucu Ağbabanın "Qaraxaç" dağında, bir ucu isə, İlanlı kəndinin şimal hissəsində, Arpaçay ətrafında yerləşimişdi. Adı gedən ərazilərə çoxlu sayda əsgərlər yerləşdirilmişdi.

Qafqazda, yəni Batumnan tutmuş İrəvana qədər, 300 mindən artıq rus hərbi birləşmələri, türkün qanına susayan qatil erməni Loris Melikovun (Melikyan) sərəncamında idi.

1877-ci il iyul ayının əvvəlində Ağbabada rus- türk qoşunları üzüzə dayanmışdı.

O ağrılı - acılı illərdə mənim 30 - 35 yaşım ancaq olardı. Həmin hadisələri unutmaq mənim üçün çox çətindir.

**02.09.1829-cu il. Ədirnə müqaviləsinə əsasən Rusiya Türkiyə sərhəd xətti**

**13.10.1921-ci il . Qars müqaviləsinə əsasən Türkiyə Ermənistan sərhəd xətti**

Müharibənin ilk günlərində Loris Melikovun (Melikyan) əmri ilə Ağbaba mahalının Qazançı və Təzəkənd kəndlərinin sakinləri, (Azəri türkləri) öz dədə - baba torpaqlarından qovuldular. Adı gedən kəndlərin sakinləri, guya türk kəşviyyatçılarının əli ilə, həmin iki sərhəd məntəqələrində yerləşmiş rus ordusuna məxsus olan, çoxlu sayda atları zəhərləyib öldürüblər.

Loris Melikov Qafqazda rus hərbi birləşmələrinin rəhbəri olduğu illərdə, (1877-1878) Rusiya ilə Türkiyə arasında sərhəd məntəqə-

lərində yaşayan Azəri türklərini tam şəkildə öz dədə - baba torparlarından qovmaq üçün, lazımı şərait yaratmış və həmin ərazilərə isə, Türkiyədən köçürülən qaxtağan ermənilərin yerləşdirilməsinə start vermişdi.

1877 – ci il iyul ayının əvvəli idi. Türk qoşunları İlanlı kəndini tərk edən kimi, onların yerlərində rus kazakları öz mövqelərini möhkəmləndirməyə başladılar.

Onda mən ilk dəfə olaraq, İlanlı kəndində Loris Melikovu gördum.

Loris Melikov Tiflis şəhərində anadan olmuşdu. Uşaqlığı bu şəhərdə keçmışdi. Qonşularının əksəriyyəti Azəri türkləri olduğundan o, bizim ana dilində çox yaxşı danışa bilirdi.

Loris Melikov uzun, bədəndən arıq və üzü saqqallı, 50 – 55 yaşında bir kişi idi. Çox səliqəli geyinmişdi. Belində gümüşdən qılıncı və yaxasında çoxlu sayda xaç şəkilli orden və medalları var idi.

İlanlı kəndinin ağsaqqalları Loris Melikovun qarşısına duz – çörəklə çıxdılar. Loris Melikov düz-çörəyi öpüb, meydana yığılmış cammat qarşısında bu sözləri dedi:

- Mən, sizləri vəhşi, qaniçən bir millət kimi təsəvvür edirdim. Amma indi mən öz fikrimdən daşınıram. Qazançı və Təzəkənd kəndlərinin sakinləri rus dövlətinin üzünə ağ olması, hamınıza məlumdur. Mən inanıram ki, siz onların tutduqları yolu getməyəcəksiniz. Rus dövləti sizləri öz doğma övladları kimi qoruyacaq. Bizə silah qaldıran hər bir insan rus dövlətinin düşmənidir. Bu torpaqlar Rus dövlətinə məxsusdur. Biz bu torpaqları türk qaniçənlərindən azad etməyə gəlmişik.

1877 – ci il iyul ayının ortalarında Ağbabada Arpaçayın sağ və sol sahilində AlMərdanın çayırı deyilən düzənlikdə qanlı savaş başlandı. Hər iki tərəfdən ölən və yaralananların sayı – hesabı yox idi. Bu amansız döyüşlərdə Rus qoşunları Arpaçayını keçib, Qars şəhərini mühasirəyə aldılar.

Bu qanlı döyüşlərdə mənim atam Məmməd ağır yaralandı və bir gündən sonra dünyasını dəyişdi. Atamın son vəsiyyətinə görə, biz onu İlanlı kəndində, cavan yaşında rəhmətə gedən qardaşım Kərimin yanında (Aşıq Heydərin atası) dəfn etdik. Elə həmin gün biz

İlanlı kəndini tərk edib Düzkənd kəndində özümüzə yeni binə qurduq. Çünki, İlanlı kəndində bizim yaşamağımız təhlükəli idi. İlanlı kəndində rusların qərargahı yerləşmişdi. Əgər ruslar mənim atamın Türk zabiti olmasını bilsəydilər, bu bizim ailənin sonu demək idi.

Atam rəhmətə gedəndən sonra ailənin ağsaqqalı mən oldum. Mən atamın silahını və atını götürüb Türk ordusunda qulluq etməyə başladım. Bu atamın mənə son vəsiyyəti idi, mən də onu həyata keçirdim.

Türk ordusunun könüllülər taborunda mən onbaşı vəzifəsinə yüksəldim. Mənim rəhbərlik etdiyim taborda gənc çavuşlar, Kərbəlayı Hacı Abbas oğlu Məhəmməd ağa və Qaçaq Usub rus hərbi birləşmələrinə qarşı mübarizə aparırdılar.

Elə o vaxtlardan başlayaraq, mənim Kərbəlayı Hacı Abbas oğlu Məhəmməd ağa və Qaçaq Usubla dostluq əlqələrimin binası quruldu.

1918-ci ildən başlayaraq mən Ağbaba Milli Şurasının sədri Kərbəlayı Hacı Abbas oğlu Məhəmməd ağanın fərmanı ilə Ağbaba Süvari Alayının 5-ci taborunun yüzbaşısı kimi fəaliyyət gösrərməyə başladım. Mən həmin illərdə, Ağbaba Milli Şurasının sədri Kərbəlayı Hacı Abbas oğlu Məhəmməd ağanın baş məsləhətçisi və Ağbaba Süvari Alayının kəşviyyat taborunun rəhbəri kimi öz xalqıma qarşı ləyaqətlə, anlıaçıq və üzüağ xidmət göstərmişəm. **Məşədi Rəcəb.**

**Söyləyədi:** **Y.Heydərov**
**Qələmə aldı:** **Ə.Heydər**

# AŞIQ HEYDƏRİN MƏŞƏDİ RƏCƏBLƏ SON GÖRÜŞÜ

1922- ci il yazın əvvəli idi. Erməni – müsəlman davası demək olar ki, səngimişdi. Mən, Heydər Güllübulaqdan evə gələn kimi həyat yoldaşım Yetər dedi: – Heydər, əmin bərk xəstədir, səni çox arzulayır.

Heydər tələm–tələsik özünü Məşədi Rəcəbin yanına çatdırdı. Baxdı ki, əmisi yataqda yatır. Gördü kişinin qarın nahiyəsi və döşü çox şişib. Dedi:

– Ay əmi, bir həftə deyil ki, mən səni evdə sağ–salamat qoyub getmişəm. Sənə nə oldu belə?

– Heç nə olmadı, ay bala. Sən yadıma düşmüşdün. Gəl səninlə halallaşım, ay qardaşımın yadigarı, bilmək olmaz bu dünyanın işini.

Bu vaxt Mədinə nənə onun qabağına çay gətirdi. Arvad ağlaya–ağlaya Aşıq Heydərə dedi:

– Son vaxtlar əminin göbəyinin üstündə bir şiş peyda oldu. Amma bunu heç oğlu Məhəmmədə də demədi. Üç gün bundan qabaq mənə dedi:

– Bu ağrı məni haldan saldı. Hər dərdə–acıya dözmüşəm, amma buna dözə bilmirəm. Ay Mədinə, o xəncəri ver görüm burda nə var axı.

Əllərim qırılaydı, ay bala, o xəncəri verdim əlinə. Xəncəri alıb yaraya soxdu. Yaradan çoxlu qan axdı. Ondan sonra şiş daha da artdı.

Məşədi Rəcəb bunları eşidəndə gülümsündü:

– Ay arvad, hələ bir xəncəri verməmək də fikrin vardı? Mənim canim Qaraməmməd kəndində ermənilər tərəfindən qətlə yetirilən körpə balalarımızdan artıq deyil! Mənim bu dönyada heç bir əhdi-peymanım qalmayıb, bundan sonra rahat ölə bilərəm.

Həmin günün səhəri Məşədi Rəcəb gözlərini əbədi olaraq yumdu. Ancaq onun mərdliyi, igid adı ürəklərdə əbədi olaraq qaldı.

Ağbaba Milli Şurasının Sədri Hacı Abbas oğlu Kərbəlayı Məhəmməd ağa Məşədi Rəcəbin dəfn yerinin Türkiyənin Qars şəhərinin "Qazilər Qəbristanlığı"nda olunmasını istədi, amma yüzbaşının ailəsi buna razı olmadı.

# AĞBABA KƏNDLƏRİ (1906 – 1988 -ci il) (36 kənd rəsmən mövcuddur*)*

## Ağbaba kəndləri haqqında qısa məlumat;

**1*-AMASİYA (Ağbaba mahalının rayon mərkəzi*** ) -Ermənistan SSR-də şəhər tipli qəsəbə, eyni adlI rayonun mərkəzi. Azərbaycanlılar yaşayan Daşkörpü ilə birləşdirilmişdir. Əhalisi 1907-ci ildə 502, 1914-cü ildə 564 nəfər azərbaycanlı, 1931-c ildə 237 nəfər azərbaycanlı, 401 nəfər erməni olub. 1980-ci ildə isə 3175 nəfər əhalinin əksəriyyəti azəri idi. 1914-cu ildən sonra azərbaycanlı əhalinin 2 dəfə azalması 1918-1920-ci il soyqırımının nəticəsidir. Ermənilər buraya 1929-cu ildə Basendən və Qarsdan köçüb yerləşdirilmişlər. 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlıların hamısı qovulmuşdur.

**2*-BAYTAR (ALAKİLİSƏ, 1991-ci ildən OVTUN*)** – Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 9 km şimal-şərqdə, Axuryan (Qərbi Arpa) çayının sol sahilində kənd. Əhalisi 1831-ci ildə 27 nəfər azərbaycanl olub. Sonrakı illərdə azərbaycanlılarla yanaşı yunanlar da yaşamışdır. Ermənilər buraya 1918-1920-ci illərdə Qars vilayətinin Gülseyran kəndindən gəlmişlər. 1979-cu ildə isə 235 nəfər erməni əhalisi olub.

***3.BALIQLI (1991-ci ildən ZORAKERT)*** - Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 21 km şimal-qərbdə, Axuryan (Qərbi Arpa) çayının qərb sahilində, azərbaycanlılar yaşamış kənd. Əhalisi 1886-cı ildə 205, 1905-ci ildə 372, 1914-cü ildə 474, 1922-ci ildə 119, 1931-ci ildə 171, 1979-cu ildə 472 nəfər azərbaycanlı olub. Qonşu Xançallı kəndinin əhalisi 1930-cu illərdə köçüb bu kəndə gəlmişdir. (1918 - 1920-ci illər soyqırımı zamanı əhali 3 dəfə azalmışdır). 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlılar bütünlüklə qovulmuşlar.

***4-BAXÇALI (BAĞÇALI)*** - Qars vilayətinin Ağbaba bölgəsində, Ermənistan SSR Amasiya rayonunda azərbaycanlılar yaşamış kənd. Əhalisi 1886-cı ildə 162, 1897-ci ildə 240, 1905-ci ildə 277, 1914-cü ildə 236 nəfər azərbaycanlı. Kənd erməni daşnaqları tərəfindən 1918-1920-ci illərdə dağıdılmışdır.

***5- BOZQALA (ŞİNDİLƏR***) - Ermənistan SSR Amasiya rayonunda azərbaycanlılar yaşamış kənd. 1908-ci ildə 139, 1914-cü ildə 159, 1926-cı ildə 55, 1931-ci ildə 94, 1939-cu ildə 104 nəfər azərbaycanlı əhalisi olub. Kənd 1940-cı ildə ləğv edilmişdir.

***6-ÇAXMAQ (1991-ci ildən KAMXUT)*** - Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 7 km cənub-qərbdə azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 360, 1914-cü ildə 406, 1931-ci ildə 4,5 dəfə azalaraq 89, 1970-ci ildə 197 nəfər olub. Ermənilər bu kəndə 1918-ci ildə Türkiyənin Qars vilayətindən gətirilib. 1931-ci ildə 179 nəfər erməni var idi. Onlar ötən əsrin 80-ci illərində Leninakana (Gümrüyə) köçmüşdülər.

***7-ÇİVİNLİ (1991-ci ildən YEĞNACUR***) –Ermənistan SSR Amasiya rayon mərkəzindən 27 km cənub-qərbdə azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 270, 1914-cü ildə 350, 1931-ci ildə 324 nəfər olub. 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlıların hamısı buradan qovulmuşdur.

***8-DAŞKÖRPÜ*** - Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 3 km məsafədə azərbaycanlılar yaşamış kənd. Amasiya heyvandarlıq sovxozuna birləşdirilmişdi. 1905-ci ildə 396, 1914-cü ildə 431, 1931-ci ildə 233 nəfər azərbaycanlı əhalisi olub. 1988-ci ilin faciəli olayları zamanı onlar hamısı buradan qovulmuşdur.

***9- DÜZKƏND (1988-ci ildən Alvar)*** - Ermənistan SSR Amasiya rayonunda, Axuryan (Qərbi Arpaçay) çayının sağ sahilində, rayon mərkəzindən 13 km şimalda, azərbaycanlılar yaşamış kənd. Əhalisi 1907-ci ildə 638, 1914-cü ildə 722, 1931-ci ildə 468, 1970-ci ildə

516 nəfər azərbaycanlı. 1914-1931- ci illər kəsiyində əhalinin təxminən 2 dəfə azalması 1918-1920-ci illərdə azərbaycanlılara qarşı törədilmiş soyqırımın nəticəsidir. 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlıların hamısı qovulmuşlar.

**10*- ELLƏR OYUĞU (1931-ci ildə ELLƏRKƏND*)** - Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 26 km şimal-qərbdə azərbaycanlılar yaşamış kənd. Dəniz səviyyəsindən 2140 metr yüksəklikdə yerləşir. Əhalisi 1905-ci ildə 286 nəfər, 1914-cü ildə 437 nəfər, 1931-ci ildə 294 nəfər, 1970-ci ildə 292 nəfər azərbaycanlı. 1914-1931- ci illər kəsiyində əhalinin təxminən 2 dəfə azalması 1918-1920-ci illərdə azərbaycanlılara qarşı törədilmiş soyqırımın nəticəsidir. 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlıların hamısı qovulmuşlar.

**11*-GÖLLÜ(1991-ci ildən ARDENİS*)** - Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 18 km şimal-şərqdə, Qərbi Arpaçayın sol sahilində azərbaycanlılar yaşamış kənd. 1897-ci ildə 284, 1907-ci ildə 313, 1914-cü ildə 403, 1931-ci ildə 334, 1959-cu ildə 470, 1979-cu ildə 757 nəfər azərbaycanlı əhalisi olub. 1988-ci ildə ermənilərin azərbaycanlılara qarşı törətdikləri soyqırım əməlləri zamanı azərbaycanlıların hamısı qovulmuşlar.

**12*-GÜLLÜBULAQ (GÜLLÜBULAĞI) -*** Ermənistan SSR Amasiya rayonunda, Axuryan (Qərbi Arpa) çayının sağ sahilində azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əşalisi 1886-cı ildə 673, 1897-ci ildə 958, 1907-ci ildə 1020, 1914-cü ildə 1137, 1931-ci ildə 1268, 1970-ci ildə 2459, 1979-cu ildə 2580 nəfər olmuşdur. 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlıların hamısı buradan qovulmuşdur.

**13*-GÜLLÜCƏ*** - Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 24 km şimal-qərbdə, Arpa gölü sahilində azərbaycanlılar yaşamış kənd. Əhalisi 1886-cı ildə 193, 1897-ci ildə 288, 1907-ci ildə 324, 1914-cü ildə 378, 1931-ci ildə 576, 1959-cu

ildə 594 , 1979-cu ildə 985 nəfər olmuşdur. 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlıların hamısı buradan qovulmuşdur.

**14-*XANÇALLI (XANCARLI*)** - Ermənistan SSR Amasiya rayonunda, dəniz səviyyəsindən 2110 metr yüksəklikdə azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 290, 1914-cü ildə 392, 1931-ci ildə 2 dəfə azalaraq 187 nəfər olub. Kənd ötən əsrin 30-cu illərində ləğv edilib və əhalisi yaxınlıqdakı Balıxlı kəndinə köçürülüb.

**15-*İBİŞ ( AYÇINQIL, 1991-ci ildən YERİZAK)-*** Ermənistan SSR Amasiya rayonunda, eyniadlı rayon mərkəzindən 15 km şimal-qərbdə azərbaycanlılar yaşamış kənd. Ərazisi Qonçalı heyvandarlıq sovxozunun ərazisinə qatılmışdı. 1906-cı ildə 460, 1914-cü ildə 568, 1931-ci ildə 2 dəfə azalaraq 280, 1970-ci ildə 382 nəfər azərbaycanlı yaşayırdı. 1988-ci ildə faciəli olaylar zamanı azərbaycanlılar kənddən bütünlüklə qovulub.

**16-*İLANLI( 1935-ci ildən ÇAYBASAR, 1991-ci ildən ARAVET)*** – Ermənistan SSR Amasiya (Ağbaba) rayonunda, rayon mərkəzindən 17 km şimal-şərqdə, Arpa çayı sahilində azərbaycanlılar yaşamış kənd. Düzkənd heyvandarlıq sovxozu ilə birləşdirilmişdi. 1905-ci ildə 250, 1914-cü ildə 453, 1931-ci ildə 2,5 dəfə azalaraq 201, 1970-ci ildə 501 nəfər azərbaycanlı yaşayırdı. 1988-ci ildə faciəli olaylar zamanı azərbaycanlılar kənddən bütünlüklə qovulub.

**17-*QARABULAQ (1991-ci ildən ŞAQİK*)** - Ermənistan SSR Amasiya rayonunda, Arpa gölü sahilində, rayon mərkəzindən 33 km şimal-qərbdə azərbaycanlılar yaşamış kənd. Quzukənd heyvandarlıq sovxozu ilə birləşdirilmişdi. Əhalisi 1905-ci ildə 295, 1914-cü ildə 382, 1931-ci ildə 4 dəfə azalaraq 94, 1970-ci ildə 215 nəfər azərbaycanlı olub. 1988-ci ilin faciəli olayları zamanı onların hamısı qovulmuşlar.

**18**-***QARANAMAZ (1935-ci ildən YENİ YOL, 1991-ci il-dən AĞVORİK***) - Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 15 km şimal-şərqdə azərbaycanlılar yaşamış kənd. Əhalisi 1907-ci ildə 459, 1914-cü ildə 541, 1931-ci ildə 475, 1979-cu ildə 1072 nəfər azərbaycanlı olub. 1988-ci ilin faciəli olayları zamanı onların hamısı qovulmuşlar.

**19**-***QARAÇANTA (1935-ci ildən ƏZİZBƏYOV, 1991-ci ildən AREQNADEM)*** – Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 6 km cənub-qərbdə, Gümrü-Amasiya yolunun sol tərəfində azərbaycanlılar yaşamış kənd. Əhalisi 1897-ci ildə 440, 1905-ci ildə 665, 1914-cii ildə 729, 1931-ci ildə 692, 1959-cu ildə 803, 1980-ci ildə 1940 nəfər azərbaycanlı olub. 1988-ci ilin faciəli olayları zamanı onların hamısı qovulmuşlar.

**20-*QIZIL KİLİSƏ (TÜRK QIZIL KiLİSƏSİ, QIZIL KƏND***) – Ermənistan SSR Amasiya rayonunda azərbaycanlılar yaşamış kənd. 1905-ci ildə 230, 1914-cü ildə 339, 1931-ci ildə 2 dəfə azalaraq 162 nəfər azərbaycanlı əhalisi olub. Kənd 1930-cu illərdə ləğv edilmişdir.

**21*-QIZILDAŞ*** - Qars vilayətinin Ağbaba bölgəsində, Dələver kənd icması tərkibində, Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 15 km cənub-qərbdə, azərbaycanlılar yaşamış kənd. 1886-cı ildə 394, 1905-ci ildə 547, 1914-cü ildə 147 nəfər azərbaycanlı əhalisi olub. Əhalinin azalması 1905-1906-cı və 1918-ci illərdəki soyqırımın nəticəsidir. XX əsrin 40-cı illərində kənd ləğv olunmuşdur.

**22*-QONCALI (1935-ci ilədək ÖRDƏKLİ, QONÇALI, 1991-ci ildən ZARİŞAT)*** – Ermənistan SSR Amasiya rayon mərkəzindən 14 km şimal-qərbdə azərbaycanlılar yaşamış kənd. 1905-ci ildə 330, 1914-cü ildə 531 nəfər azərbaycanlı əhalisi olub. 1918-1920-ci illərdə azərbaycanlılar kənddən qovulmuş, Türkiyədən gələn ermənilər yerləşdirilmişdir. 1970-1980-ci illərdə ermənilərin əksər hissəsi Leninakana (Gümri) köçmüş, təsərrüfatda başqa kəndlərdən gələn azərbaycanlılar çalışmışlar. Qonşu İbiş kəndi bu sovxoza

birləşdirilmişdi. 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlıların hamısı buradan qovulmuşlar.

**23**-***QUZUKƏND (1935-ci ilədək XOZIKƏND***) – Ermənistan SSR Amasiya rayonunda, Arpa gölü sahilində, rayon mərkəzindən 25 km şimal-qərbdə azərbaycanlılar yaşamış kənd. Əhalisi 1905-ci ildə 372, 1914-cü ildə 455, 1931-ci ildə 474, 1970-ci ildə 865 nəfər azərbaycanlı olub. 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlıların hamısı qovulmuşdur.

**24*-MAĞARACIQ-*** Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 11 km cənub-qərbdə azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 480, 1914-cü ildə 539, 1931-ci ildə 490, 1970-ci ildə 860 nəfər olmuşdur. 1988-ci ildə faciəli olaylar zamanı azərbaycanlılar kənddən bütünlüklə qovulub.

**25*-MUMUXAN-*** Ermənistan SSR Amasiya rayonunda, dəniz səviyyəsindən 2135 metr yüksəklikdə azərbaycanlılar yaşamış kənd. 1905-ci ildə 144, 1914-cü ildə 229, 1931-ci ildə 2 nəfər əhalisi olub. Erməni quldurlarının 1918-1920-ci illərdə törətdikləri qanlı olaylardan sonra əhali 4 dəfə! azalmış, sağ qalan azərbaycanlılar kəndi tərk etmiş, kənd Türkiyədən köçürülmüş ermənilər tərəfindən məskunlaşdırılmışdır. Kənd 1931-ci ildə ləğv edilmişdir.

**26*-MUSTUXLU-*** Qars vilayəti Qars dairəsinn Ağbaba məntəqəsində, Ermənistan SSR Amasiya rayonunda, azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 253, 1914-cü ildə 317 nəfər olub. Kənd 1918-ci il erməni vəhşiləri tərəfindən dağıdılmışdır.

**27*-OXÇUOĞLU (1991-ci ildən VAXÇI***) – Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 16 km cənub-qərbdə, Qərbi Arpa (Axuryan) çayı sahilində azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 854, 1914-cü ildə 980, 1931-ci ildə 873, 1970-ci ildə 1412 nəfər olub. 1988-ci ildə faciəli olaylar zamanı azərbaycanlılar kənddən bütünlüklə qovulmuşlar.

**28*-ÖKSÜZ( ÖYSÜZ, 1991-ci ildən DARİK)*** – Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 23 km şimal-qərbdə, dəniz səviyyəsindən 2165 metr yüksəklikdə azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 138, 1914-cü ildə 176, 1931-ci ildə 270, 1970-ci ildə 241 nəfər olub.Əhalinin bir hissəsi 1948-ci ildə məcburi qaydada Daşkəsənə deportasiya edilmişdi. 1988-ci ildə faciəli olaylar zamanı azərbaycanlılar kənddən bütünlüklə qovulmuşlar.

**29*-ÖRDƏKLİ*** – Qars vilayətinin Ağbaba bölgəsində Seldağıdan kənd icması tərkibində, Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 15 km şimal-qərbdə, azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1886-cı ildə 253, 1905-ci ildə 330, 1914-cü ildə 531 nəfər olub. 1918-ci ildə ermənilər tərəfindən dağıdılmış bu kənd sonradan bərpa olunmayıb6

**30*-SELDAĞILAN*-** Qars vilayəti Qars dairəsi Ağbaba məntəqəsində, Ermənistan SSR Amasiya rayonunda, azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 418, 1914-cü ildə 414 nəfər olub. Ermənilərin 1918-1920-ci illərdə azərbaycanlılara qarşı törətdikləri soyqırım zamanı kənd sonradan bərpa olunmayıb.

**31*-SNIX*** – Qars vilayəti Qars dairəsi Ağbaba məntəqəsində, Ermənistan SSR Amasiya rayonu ərazisində, azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 104, 1914-cü ildə 201 nəfər olub. 1918-1920-ci illərdə kənd millətçi erməni daşnakları tərəfindən dağıdılmışdır.

**32*-SÖYÜTLÜ-*** Qars vilayəti Qars dairəsinin Ağbaba məntəqəsində, Ermənistan SSR Amasiya rayonunda azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 80, 1914-cü ildə 158 nəfər olub. 1918-1920-ci illərdə vəhşiləşmiş ermənilərin aramsız basqınları zamanı kənd dağıdılıb.

**33*-SULTANABAD -(1935-ci ildən ŞURABAD)***

-Ermənistan SSR Amasiya rayonunda, Arpa gölü bəndi yaxınlığında, rayon mərkəzindən 20 km şimal-qərbdə azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 262, 1914-cü ildə 384, 1931-ci ildə 257, 1970-ci ildə 219 nəfər olub. 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlıların hamısı buradan qovulmuşdur.

**34*-ŞİŞTƏPƏ*** - Qars vilayətiinin Qars dairəsindəki Ağbaba məntəqəsində, Ermənistan SSR Amasiya rayonu ərazisində, azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 151, 1907-ci ildə 189, 1914-cü ildə 253 nəfər olub. 1918-ci ildə erməni vəhşilikləri zamanı bütünlüklə dağıdılmış kəndin ərazisi erməni kəndlərinin mal-qarası üçün örüş yerinə çevrilib.

**35*-TƏZƏKƏND-*** Qars vilayəti Qars dairəsinin Ağbaba məntəqəsində, Ermənistan SSR Amasiya rayonu ərazisində, azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 151, 1907-ci ildə 189, 1914-cü ildə 253 nəfər olub. Kənd 1918-ci ildə erməni quldurlarının aramsız basqınlarından sonra ləğv edilib.

**36*-TƏPƏKÖY ( BÖYÜK TƏPƏKÖY*)**- Ermənistan SSR Amasiya rayonunda Arpa gölünün şərq sahilində, rayon mərkəzindən 17 km şimal-şərqdə azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 278, 1914-cü ildə 357, 1931-ci ildə 174, 1970-ci ildə 772 nəfər olub. 1988-ci ilin faciəli olayları zamanı azərbaycanlıların hamısı buradan qovulmuşdur.

**37*-TƏPƏKÖY (KİÇİK TƏPƏKÖY*)** – Ermənistan SSR Amasiya rayonunda, rayon mərkəzindən 17 km şimal-qərbdə, Böyük Təpəköy kəndi yaxınlığında azərbaycanlılar yaşamış kənd. Azərbaycanlı əhalisi 1905-ci ildə 140, 1914-cü ildə 209, 1931-ci ildə 170 nəfər olub. Ötən əsrin 30-cu illərinin sonunda Böyük Təpəköy kəndi ilə birləşdirilmişdir.

# FAKTLAR, HƏQİQƏTLƏR VƏ ŞƏXSİYYƏTLƏR HAQQINDA.

## Qərbi Azərbaycanın (indiki Ermənistanın) Amasiya rayonunun tabeçiliyində olan Düzkənd kəndi haqqında.

Əski türk torpağı olan Ağbaba mahalının tarixi taleyi qlobal və regional siyasi proseslərin təsiri ilə elə şəkilə gətirilib ki, bu ərazi Türkiyə ilə Azərbaycanı həm qovuşdurub, onların arasında ortaq bir məntəqə olub, həm də ayırıb, yadelli ölkələrin hərbi-siyasi təcavüzü nəticəsində iki yerə parçalanıb; bir hissəsi Türkiyənin, bir hissəsi isə Azərbaycanın tərkibində qalıb. Tarixi materiallardan məlum olur ki, Ağbaba XVI yüzillikdən başlayaraq Çıldır sancağı, Çıldır əyaləti adıyla Türkiyə ərazisinin inzibati vahidi kimi qeyd olunur. Çıldır əyalətinin içərisində yerləşən Ağbaba bölgəsi şimal tərəfdən Axılkələyə, qərb tərəfdən Çıldır- Qarsa, şərq tərəfdən isə Dağ-Borçalısına söykənir.

Bu ərazi 1877- 1878-ci illərdə baş vermiş rus-türk müharibəsindən sonra işğalçı rusların əlinə keçmişdir.

Bu dövrdə Ağbaba Qars vilayətinin tərkibində bir nahiyə idi. XIX əsrin əvvəllərindən başlayaraq rus imperyasının Qafqaza doğru başlanan işğalçı hərbi təcavüzü nəticəsində bütövlükdə regionun sosial-mədəni həyatında tənəzzül baş vermişdir.

1918-1920-ci illərdə gəlmə ("qaxtağan") ermənilərin törətdiyi kütləvi qırğınlar nəticəsində Ağbaba əhalisinin bir qismi Türkiyənin Qars-Çıldır vilayətinə, bir qismi isə İranın Xoy, Salmas, Mərənd və Təbriz şəhərlərinə köç etmiş, bir hissəsi isə erməni "təmərküzləşməsi" nəticəsində ağır məhrumiyyətlərə düçar edilmiş, kəndlər xarabazara çevrilmişdir. Rəsmi sənədlərdən məlum olduğu kimi, keçən əsrin əvvəllərində Ağbabada əllidən artıq kənd olmuşdur. Rus imperyasının havadarlığı ilə ermənilər tərəfindən

bölgə kəndlərinin təxminən yarısı 1950-ci illərədək yerlə-yeksan edilmişdir.

XX əsrin əvvəllərindən artan erməni axını bu əraziyə, əsasən, Muş, Sarıqamış, Van, Qızılçaxçax, Zərşad, İqdır və s yerlərdən gəlmişdir.

Ağbaba bölgəsində 1988-ci ilə qədər 27 kənd mövcud idi. Bunlardan 22-də ( Güllübulaq, Quzukənd, Qaraçanta, Çaybasar, Göllü, Balıxlı,Gülsehran, Güllücə, Öksüz, Ellərkənd,Çaxmaq, İbiş, Qoncalı, Düzkənd, Oxçoğlu, Daşkörpü, Təpəkənd, Şurabad, Qarabulaq, Yeniyol və Mağaracıq) Azərbaycan türkləri yaşamışdır. Eləcə də Ağbaba bölgəsinin mərkəzi sayılan Amasiyada əhalinin böyük əksəriyyəti Azərbaycan türkləri təşkil edirdi. Ağbaba bölgəsi 1988-ci ilə qədər Azərbaycan tüklərinin doğma yurdu olmuşdur.

**AMASİYA (Ağbaba mahalının rayon mərkəzi** )

Ermənistan SSR-də şəhər tipli qəsəbə, eyni adll rayonun mərkəzi. Əhalisi 1907-ci ildə 502, 1914-cü ildə 564 nəfər azərbaycanlı, 1931-ci ildə 237 nəfər azərbaycanlı, 401 nəfər erməni olub. 1980-ci ildə isə 3175 nəfər əhalinin əksəriyyəti azəri idi. 1914-cu ildən sonra azərbaycanlı əhalinin 2 dəfə azalması 1918-1920-ci il soyqırımının nəticəsidir. Ermənilər buraya 1929-cu ildə Basendən və Qarsdan köçüb yerləşdirilmişlər.

Bu da bir həqiqətdir ki, 1850 –1938 ci illər ərəfəsində Amasiya rayonunun inzibati ərazilərində əhalinin 90%-ni azəri türkləri təşkil etdiyinə görə həmin illərdə Amsiya rayonunda rəhbər vəzifələrdə də Azəri türkləri işləmişlər.

Lakin çox çəkmədi ki daşnaqlar sovetlər dövründən başlayaraq (1937-ci il) açıq- aşkar şəkildə öz çirkin əməllərini həyata keçirməyə başladılar. Bu bolğə 1988-ci ildən etibarən tamamilə darmadağın edilmiş, mədəniyyət ocaqları dağıdılmış, xarababazar olan kəndlərə erməni adları qoyulmuşdur.

Ağbaba mahalı əsrin əvvəllərindən bir çox ictimayi-siyasi xadimlər yetişdirib Azərbaycan və Türk dünyasına bəxş etmişdir.

## 1924-1989-cu İLLƏRDƏ AMASİYA RAYONUNDA PARTİYA KOMİTƏSİNİN BİRİNCİ KATİBİ VƏZİFƏSİNDƏ İŞLƏMİŞLƏR.

| | | |
|---|---|---|
| 1 | Səfər Alməmmədov.................................... | 1924-1930 |
| 2 | Cəfər Vəlibəyov.......................................... | 1930-1936 |
| 3 | Ələsgər Vəliyev.......................................... | 1936-1938 |
| 4 | Məsim Vəliyev............................................ | 1938-1939 |
| 5 | Yeğişe Ağacanyan...................................... | 1939-1944 |
| 6 | Nikol Harutunyan....................................... | 1944-1948 |
| 7 | Muşek Hayrapetyan.................................... | 1948-1950 |
| 8 | Marat Qukasyan.......................................... | 1950-1952 |
| 9 | Aleksan Kirakosyan..................................... | 1953-1956 |
| 10 | Həbib Həsənov........................................... | 1956-1960 |
| 11 | Hüseyin Məmmədov................................... | 1960-1963 |
| 12 | Azad Hovhannisyan.................................... | 1963 |
| 13 | Levin Yeranosyan....................................... | 1963-1964 |
| 14 | Harutun Hakopyan..................................... | 1964-1969 |
| 15 | Məhərrəm Bayramov.................................. | 1969-1974 |
| 16 | Cahangir Əliyev......................................... | 1974-1981 |
| 17 | Zərbəli Qurbanov....................................... | 1981-1985 |
| 18 | İldırım Bağırov........................................... | 1985-1988 |
| 19 | Qəşəm Həsənov.......................................... | 1988-1989 |

## İCRAİYYƏ KOMİTƏSİNİN SƏDRİ VƏZİFƏSİNDƏ İŞLƏMİŞLƏR.

| | | |
|---|---|---|
| 1 | Hüseyn Salmanov........................... | 1924-1926,İrəvan |
| 2 | Musa Hüseynov.............................. | 1926-1930,Balıqlı |
| 3 | İbrahim Qəribov............................. | 1930-1931, Güllübulaq |
| 4 | Mirzə Bəşirov................................. | 1931-1936,Zəngibasar |
| 5 | Rza Şeyxzadə................................. | 1936-1939, İrəvan |
| 6 | Yaqub Qəribov............................... | 1939-1948, Vedi |

| | | |
|---|---|---|
| 7 | Əli Məmmədov............................... | 1948-1952,Mehri |
| 8 | Abram Qurginyan.......................... | 1952-1961 |
| 9 | Harutyun Hakopyan........................ | 1961-1963 |
| 10 | Levon Bdoyan................................ | 1963-1965 |
| 11 | Cahangir Əliyev.............................. | 1965-1969,Düzkənd |
| 12 | Murat Hakopyan............................. | 1969-1986 |
| 13 | Murat Harutyunyan......................... | 1986-1989 |

**DÜZKƏND kəndi (Rusların Qafqaza yürüşü nəticəsində Qərbi Azərbaycanın Ağbaba bölgəsinin Düzkənd kəndi 1828-ci ilin avqust ayında yerlə yeksan olmuşdur. 1859-ci ildə isə Türkiyə Topxana Məclisinin qərarı ilə (11 sentyabr 1859/13 nömrəli 1276 tarixli raport) Düzkənd kəndi yenidən abadlaşdırılmışdır. 1988-ci ildən etibarən erməni daşnaqları yerli əhalini (azəri türkləri) öz doğma dədə-baba torpaqlarından qovmuşdurlar. Hal-hazırda Düzkənd kəndində yaşayış yoxdur, yaşayış evlərinin və həmçinin inzibati binaların 80% erməni daşnaqları tərəfindən dağıdılmışdır. Qərbi Azərbaycanın Ağbaba bölgəsinin Düzkənd kəndi 1991-ci ildən etibarən Alvar adlandırılıb)**

**DÜZKƏND kəndi** Ermənistan SSR Amasiya rayonunda, Arpaçayın çayının sağ sahilində, rayon mərkəzindən 13 km şimalda, azərbaycanlılar yaşamış kənd olmuşdur. Əhalisi 1907-ciildə 638, 1914-cü ildə 722, 1931-ci ildə 468, 1970-ci ildə 516 nəfər azərbaycanlı olmuşdur. 1914-1931 illər ərəfəsində əhalinin təxminən 2 dəfə azalması 1918-1920-ci illərdə azərbaycanlılara qarşı törədilmiş soyqırımın nəticəsidir. 1918-1920-ci illərdə xain ermənilərin "təmizləmə" siyasəti nəticəsində yerli əhaliyə divan tutulmuşdur. Yaşlı adamların dediyinə görə Amasiya rayonunun Düzkənd və İlanlı kəndlərindən 60 nəfərdən çox yerli əhali qətlə yetrilmişdir. Əhalinin bir qismi Qars-Çıldır və onun bölgələrinə, bir qismi isə İranın Xoy, Salmas və Mərənd bölgələrinə köçrülmüş, bir qism insanlar isə Borçalıya qaçmaqla canlarını qurtara bilmişlər.

1988-ci ilin faciəli olayları zamanı isə azərbaycanlıların hamısı öz dədə- baba torpaqlarından qovulmuşlar.

# 1928-1989-CU İLLƏRDƏ AĞBABA NAHİYƏSİNİN DÜZKƏND KƏNDİNDƏ KOLXOZ SƏDRİ VƏZİFƏSİNDƏ İŞLƏMİŞLƏR.

| | | | |
|---|---|---|---|
| 1 | Müseyib Məmmədov.. | 1928-1933 Düzkənd.... | 1942-ci ildə Kazaxıstana sürgün olunub |
| 2 | Binnət Hacıyev.......... | 1933-1934 Düzkənd.... | 1939- cu ildə Kazaxıstana sürgün olunub |
| 3 | Səməd Seyidov......... | 1934-1936 Əzizbəyov | |
| 4 | İbrahim Allahverdiyev Oruc oğlu | 1936-1938 Düzkənd | Qeyd |
| 5 | Həşim Məmmədov.... | 1938-1939 Düzkənd | |
| 6 | Əmir Usuf................ | 1939-1941 Əzizbəyov | |
| 7 | Hacı Aslanov............. | 1941 Düzkənd | |
| 8 | Əbdüləzim Qurbanov. | 1941-1946 Oxçoğlu | |
| 9 | Hacı Aslanov............. | 1946-1948 Düzkənd | |
| 10 | Qurban Dərvişov....... | 1948-1949 Düzkənd | |
| 11 | Qara Söyünov........... | 1949-1950 Düzkənd | |
| 12 | Əbdüləzim Qurbanov. | 1950-1951 Oxçoğlu | |
| 13 | Camal Rüstəmov....... | 1951-1955 Güllübulaq | |
| 14 | Ramazan Budaqov..... | 1955-1956 Düzkənd | |
| 15 | Xıdır İskəndərov........ | 1956-1957 Balıqlı | |
| 16 | Faiq Əliyev Mamoş oğ | 1957-1960 Yeniyol | |
| 17 | Hamza Aslanov......... | 1961-1963 Düzkənd | |
| 18 | Adil Səfərov............. | 1964-1967 Amasiya | |
| 19 | Hamza Hacıyev......... | 1967-1970 Amasiya | |
| 20 | Yusif Kazımov........... | 1970-1971 Amasiya | |
| 21 | Nadir Məmmədov...... | 1971-1972 Düzkənd | |

Qeyd: İbrahim Allahverdiyev Oruc oğlunun rəhbərliyi dövründə 1937-1938 ci il tarixində "aşağı kənd qəbiristanlığı" ləğv olunub və yerində kolxozun ot tayaları yerləşdirilib.

## 1972-1989-CU İLLƏRDƏ AĞBABA NAHİYƏSİNİN DÜZKƏND KƏNDİNDƏ SOVXOZ DİREKTORU VƏZİFƏSİNDƏ İŞLƏMİŞLƏR

| | | |
|---|---|---|
| 1 | Rəsul Məmmədov............................ | 1972-1981 Amasiya |
| 2 | Aydın Yusifov.................................. | 1981-1985 Çaybasar |
| 3 | Xəmməd İbrahimov.......................... | 1985-1986 Çaybasar |
| 4 | Vaqif Qədirov.................................. | 1986-1989 Quzukənd |

## 1924-1989-CU İLLƏRDƏ AĞBABA NAHİYƏSİNİN DÜZKƏND KƏNDİNDƏ SOVET SƏDRİ VƏZİFƏSİNDƏ İŞLƏMİŞLƏR

| | | |
|---|---|---|
| 1 | Əli Kərbəlayı Qurban oğlu................ | 1923-1924 Düzkənd |
| 2 | Müseyib Məmmədov......................... | 1928-1933 Düzkənd |
| 3 | Həşim Ramazan oğlu Məmmədov....... | 1933-1936 Düzkənd |
| 4 | İsmayıl.......................................... | 1936-1937 Quzukənd |
| 5 | Məmməd........................................ | 1937-1938 Daşkörpü |
| 6 | Xurşud Həsənov............................... | 1938-1939 Düzkənd |
| 7 | Hacı Aslanov.................................... | 1939-1940 Düzkənd |
| 8 | Bəhlul Yusifov.................................. | 1940-1941 Çaybasar |
| 9 | Ələmdar Mehrəliyev......................... | 1941 Düzkənd |
| 10 | Səttar Qarayev................................. | 1941-1943 Düzkənd |
| 11 | Qurban Dərvişov.............................. | 1943-1949 Yeniyol |
| 12 | Ramazan Budaqov............................ | 1949-1953 Düzkənd |
| 13 | İsoy Rüstəmov................................. | 1953-1957 Düzkənd |
| 14 | Müxtər Hümbətov............................ | 1957-1960 Düzkənd |
| 15 | Miri Məmmədov............................... | 1960-1970 Çaybasar |
| 16 | Allahqulu Əliyev.............................. | 1970-1988 Düzkənd |
| 17 | Hacoy Yusibov................................. | 1988-1989 Çaybasar |

**Əli Kərbəlayı Qurban oğlu, 1926-cı ildə Sovetlər tərəfindən "qolçomoq adlandırılıb, 2 dəfə malı-mülkü talanıb (1926,1929 cu illərdə Sovet dövləti tərəfindən müsadirə edib) 1930 cu ilin may ayında doğma vətəni Ağbabanı tərk edib Qarsa pənah gətirib.**

**Müseyib Məmmədov 1942 ci ildə Kazaxıstana sürgün olunub .**

## 1933-1988-Cİ İLLƏRDƏ AĞBABA NAHİYƏSİNİN DÜZKƏND KƏNDİNDƏ MƏKTƏB MÜDİRİ VƏZİFƏSİNDƏ İŞLƏMİŞLƏR.

| | | | | |
|---|---|---|---|---|
| 1 | İbrahim.......................... | 3 illik məktəb | 1933-1936 | Əzizbəyov |
| 2 | Həbib............................ | 5 illik məktəb | 1936-1941 | Güllübulaq |
| 3 | Çeyran Allahverdiyeva..... | 7illik məktəb | 1941-1943 | İrəvan |
| 4 | Abbas Ağayev................ | 7 illik məktəb | 1943-1947 | İrəvan |
| 5 | Cəfər Allahverdiyev......... | 8 illik məktəb | 1947-1951 | İrəvan |
| 6 | Qəhrəman...................... | 8 illik məktəb | 1951-1956 | Mağaracıq |
| 7 | Əsəd Məmmədov............ | 8 illik məktəb | 1956-1960 | Əzizbəyov |

**Qeyd:**
**İbrahim müəllim 1937-ci ilin noyabr ayinda Amasiya rayonunda təşkil olunmuş "Troykanın Qərarı" ilə xalq düşməni adlandırılıb və Gümrü şəhəri Qara qalada faciəli şəkildə qətlə yetirilib.**
**Abbas Ağayev 1949 cu ildə Kazaxıstana sürgün olunub.**
**Cəfər Allahverdiyev Çeyran xanımın həyat yoldaşıdır.**

## DÜZKƏND KƏND ORTA MƏKTƏBİNİN DİREKTORLARI.

| | | | | |
|---|---|---|---|---|
| 1 | Allahqulu Əliyev............. | 8 illik məktəb | 1960-1970 | Düzkənd |
| 2 | Abuzər Ələskərov........... | orta məktəb | 1970-1982 | Düzkənd |
| 3 | Ramazan Hüseyinov....... | orta məktəb | 1982-1988 | Düzkənd |

## 1859-1920-Cİ İLLƏRDƏ AĞBABA NAHİYƏSİNİN DÜZKƏND KƏNDİNİN İLK ZİYALILARI.

**1**.**Molla Hüseyin Məmməd oğlu** (1859-1907) (Aşıq Heydərin əmisi):- 1885 ci ildə cənubi Azərbaycanın Təbriz şəhərində 3 aylıq ruhani təsili alıb. Düzkənd kəndində yazıb-oxuma bilən ilk şəxs olub.
**2**.**Məmmədov Məcid** (1895-1941):- 1914-cü ildə Qori şəhərində sonra isə İrəvan şəhər müəllimlər seminariyasınn tam kursunu başa vurub, 1928- cı ildən etibarən Amasiya rayonunun partiya komitəsinin kadırlar şöbəsinin müdiri, Amasiya rayon xalq komissarlar sovetinin sədri və Amasiya rayon hərbi komissarlığının 4 cü hissəsinin rəisi vəzifəsində işləmişdir. 1941-cu ildə xain ermənilər tərəfindən siyasi məhbus kimi həbs olunub, xalq düşməni

adlandırılıb troykanın qərarı ilə Leninakan (Gümrü) şəhərində 46 yaşında qətlə yetirilib. (Allah rəhmət eləsin)

## 1859-1929-Cİ İLLƏRDƏ AĞBABA NAHİYƏSİNİN DÜZKƏND KƏNDİNİN VARLI ŞƏXSİYYƏTLƏRİ

**1. Kərbəlayi Xəbər oğlu Rüstəm ağa:-** Bəzi mənbələrdə Kərbəlayi Xəbər oğlu Rüstəm ağanın ölümü barəsində dəqiq olmayan, yalnış məlumatlar verilmişdir. Lakin əlimizdə olan tutarlı faktlara istinad edərək bildiririk ki, yəni Axundov Əhməd Əli oğlunun 1941-ci ildə verdiyi dəyərli məlumatlardan belə məlum olur ki, Kərbəlayi Xəbər oğlu Rüstəm ağa 1919 cu ilin sentyabr ayında erməni terror təşkilatı tərəfindən hazırlanmış (4-cü şərqi erməni diviziyasının Axırkələk polkunun xüsusi briqadasını rəisi general Osipyan) "Ovçular" planı əsasinda Ağbaba mahalının Düzkənd və Təpəkənd kəndləri arasında yerləşən Arpa çayının sağ sahilində "Qara Çayır" deyilən yerdə qətlə yetirilmişdir və cənazəsi Qara çayırda "Qanlı Gözəyə" atılmışdır.

Kitabda erməni-terror təşkilatının hazırladığı "Ovçular" planı barəsində geniş məlumat verilib.

**2. Kərbəlayi Qurban ağa.**

**3. Qərib ağa.**

**4.Seyid oğlu Ramazan**; 1926-cı ildə Sovetlər tərəfindən "qolçomoq" adlandırılıb, 2 dəfə malı –mülkü talanıb, (1926 və 1929 cu illərdə Sovet dövləti tərəfindən müsadirə edib) 1930 cu ilin may ayında doğma vətəni Ağbabanı tərk edib Qarsa pənah gətirib.

**5.Kərbəlayı Qurbanın oğlu Əli:-** 1926-cı ildə Sovetlər tərəfindən "qolçomoq" adlandırılıb, 2 dəfə malı –mülkü talanıb, (1926 və 1929 cu illərdə Sovet dövləti tərəfindən müsadirə edib) 1930 cu ilin may ayında doğma vətəni Ağbabanı tərk edib Qarsa pənah gətirib.

**6.Qəribin oğlu Qasım:-** 1926-cı ildə Sovetlər tərəfindən "qolçomoq" adlandırılıb, 2 dəfə malı –mülkü talanıb, (1926 və 1929 cu illərdə Sovet dövləti tərəfindən müsadirə edib) 1930 cu ilin may ayında doğma vətəni Ağbabanı tərk edib Qarsa pənah gətirib.

# SSRİ Xalq Daxili İşlər Komissarlığının (NKVD) 00447 SAYLI TAM MƏXFİ ƏMRİ. 30 iyul 1937-ci il.



НКВД Ленинград. обл. т. Заковскому

СОВЕРШЕННО СЕКРЕТНО.
Экз. № 3

ОПЕРАТИВНЫЙ ПРИКАЗ

НАРОДНОГО КОМИССАРА ВНУТРЕННИХ ДЕЛ СОЮЗА ССР

30 июля 1937 г. № 00447 гор. Москва.

Материалами следствия по делам антисоветских формирований устанавливается, что в деревне осело значительное количество бывших кулаков, ранее репрессированных, скрывшихся от репрессий, бежавших из лагерей, ссылки и трудпоселков. Осело много, в прошлом репрессированных церковников и сектантов, бывших активных участников антисоветских вооруженных выступлений. Остались почти не тронутыми в деревне значительные кадры антисоветских политических партий /эсеров, грузмеков, дашнаков, муссаватистов, иттихадистов и др./, а также кадры бывших активных участников бандитских восстаний, белых, карателей, репатриантов и т.п.

Часть перечисленных выше элементов, уйдя из деревни в города, проникла на предприятия промышленности, транспорт и на строительство.

Кроме того, в деревне и городе до сих пор еще гнездятся значительные кадры уголовных преступников – скотоконокрадов, воров-рецидивистов, грабителей и др. отбывавших наказание, сбежавших из мест заключения и скрывающихся от репрессий. Недостаточность борьбы с этими уголовными контингентами создала для них условия безнаказанности, способствующие их преступной деятельности.

Как установлено, все эти антисоветские элементы являются

СЕКРЕТАРИАТ
УНКВД СССР ЛО
Вх. № [illegible]
344

30 iyul 1937-ci ildə SSRİ Xalq Daxili İşlər Komissarları Sovetinin sədri (NKVD) Nikolay İvanoviç Yejov (1936—1938) tərəfindən Stalının ğöstərişinə əsasən tam məxfi 00447 saylı əmr imzalanmışdır. Əmrə əsasəm "keçmiş qolçomaqlar, cinayətkarlar və digər anti-sovet elementləri üzrə əməliyyatın" keçirilməsi nəzərdə tutulmuşdur.

Bu əmr əsasında 1937- ci ilin avqust ayından 1938-ci ilin noyabr ayına qədər 390 min adam güllələnməli, 380 min adam isə qolçomaq əmək düşərgələrinə göndərilməsi nəzərdə tutulmuşdur. Belə ki, başlanğıc kvotaya əsasən 268,95 min adam represiyaya olunmalı və bunlardan 75,95 min adam güllələnməli idi.

00447 saylı əmr kəndlilərə, fəhlələrə, kənd ruhanilərinə, anti-sovet elementləri olan cinayətkarlara və müxalifət partiyalardan olan insanların keçmiş üzvlərinə, həmçinin adi vətəndaşlara şamil olunmuşdur.

Əmrə əsasən ayrı-ayrı respublikalarda ərazi və regional bölmələrdə üçlüklər (üç nəfərdən ibarət qruplar) (Troykalar) yaradılmışdır. Üçlüklərə olduqca böyük səlahiyyətlər verilmişdir.

00447 saylı əmrin icrası 5 avqust 1937-ci ildən etibarən bütün respublikalarında, ərazilər və rayonlarda, 10 avqust 1937-ci ildən etibarən Özbəkistan, Türkmənistan, Qazaxıstan, Tacikistan və Qırğızıstan SSR-də, 15 avqust 1937-ci ildən etibarən isə Uzaq Şərq və Şərqi Sibir, Krasnoyarsk rayon və digər rejionlara tətbiq olunmasına start verilmişdir.

**00447 saylı əmr əsasında yaradılan üçlüklər tərəfindən 1937- ci ilin avqust ayından 1938-ci ilin noyabr ayına qədər 767,397 min adam mühakimə olunmuşdur. Bunlardan 386,798 min adam güllələnmişdir.**

---

00447 saylı əmr ilk dəfə 4 iyun 1992-ci ildə "Trud" qəzetində cap olunmuşdur.

# NKVD ÜÇLÜYÜNÜN ÖLÜM PROTOKOLU

ТРОЙКИ УНКВД Калининской области 21

„27" декабря 1937 г.

| СЛУШАЛИ: | ПОСТАНОВИЛИ: |
|---|---|
| 231.Дело № 7641 Бежецкого РО УНКВД по обвинению ЗИНОВЬЕВА Петра Константиновича,1894 г.р. ур.с.Березники,Саратовского края,служитель религиозного культа-кулак,в 1935 г.органами ОГПУ из Саратовского края административно выслан. ОБВИНЯЕТСЯ в том,что открыто вел к-р агитацию,направленную на подрыв Советского правительства,распространял провокационные слухи о гибели Совввласти и восстановлении капитализма. | ЗИНОВЬЕВА Петра Константино РАССТРЕЛЯТЬ |

Ölüm hökmünü İ.Stalin imzalayıb.

---

Справка НКВД СССР о количестве осужденных за время с 1 октября 1936 г. по 1 ноября 1938 г.. Архивировано из первоисточника 2 июня 2012. Проверено 29 февраля 2012.

## ERMƏNİSTAN SSRİ-də ERMƏNİ DAŞNAQLARI TƏRƏFİNDƏN TƏŞKİL OLUNMUŞ, MƏHKƏMƏ ÜÇLÜYÜNÜN (TROYKANIN) TƏRKİBI VƏ İTTİHAMI 05.08.1397-ci il.

**"TROYORKANIN İTTİHAMI":- "Keçmiş qolçomaqlar, cinayətkarlar və digər anti-sovet elementləri üzrə əməliyyat planı"**

**"TROYKANIN TƏRKİBİ":**

**1.Muqdusi X.X**;-Ermənistan SSR Daxili işlər komissarı (troykanın sədri). SSRİ Xalq Daxili İşlər Komissarlığının (NKVD - nin) 00447 saylı tam məxfi əmrinə əsasən və həmçinin 11.07.1937-ci il, 51/212 saylı əmrinə əsasən troykanın sədri vəzifəsinə təyin olunub, sentyabr 1937- ci ildə həbs olunub.

**2.Xvorostyan B.B**;- Ermənistan SSR Daxili işlər komissarı (troykanın sədri). SSRİ Xalq Daxili İşlər Komissarlığının (NKVD- nin) 00447 saylı tam məxfi əmrinə əsasən və həmçinin 02.11.1937-ci il, 55/76 saylı əmrinə əsasən troykanın sədri vəzifəsinə təyin olunub.

**3.Mikvelyan S**;- Ermənistan SSR prokurorunun müavini (troykanın üzvü ). SSRİ Xalq Daxili İşlər Komissarlığının (NKVD- nin) 00447 saylı tam məxfi əmrinə əsasən və həmçinin 11.07.1937-ci il, 51/212 saylı əmrinə əsasən troykanın üzvü vəzifəsinə təyin olunub.

**4.Ternakalov (Ter-Nakalyan) S.A**;- Ermənistan SSR Speçkolleji Ali Məhkəməsinin sədri. (troykanın üzvü ). SSRİ Xalq Daxili İşlər Komissarlığının (NKVD- nin) 00447 saylı tam məxfi əmrinə əsasən və həmçinin 11.07.1937-ci il, 51/212 saylı əmrinə əsasən troykanın üzvü vəzifəsinə təyin olunub.

**5.Arutyunov Q.A**;-Ermənistan SSR KP MK-in 1- ci katibi (troykanın üzvü ).SSRİ Xalq Daxili İşlər Komissarlığının (NKVD- nin) 00447 saylı tam məxfi əmrinə əsasən və həmçinin 30.09.1937-ci il ş/t 915 saylı əmrinə əsasən troykanın üzvü vəzifəsinə təyin olunub.

**6.Petrov Q.A**;- Ermənistan SSR NKVD UPVO rəisi. (troykanın üzvü). NKVD–nin 30.09.1937-ci il ş/t 915 saylı əmrinə əsasən, troykanın üzvü vəzifəsinə təyin olunub.

**Архив: ЦА ФСБ РФ. Ф. 3. Оп. 4. Д. 586. Л. 2-4. Подлинник**



## 5 AVQUST 1937-ci İL AMASİYA RAYONUNDA ERMƏNİ DAŞNAQLARI TƏRƏFİNDƏN TƏŞKİL OLUNMUŞ, ÜÇ NƏFƏRDƏN İBARƏT MƏHKƏMƏ ÜÇLÜYÜNÜN (TROYKANIN) TƏRKİBI VƏ İTTİHAMI.

**ÜÇLÜYÜN ("TROYKANIN") İTTİHAMI;- "Keçmişdə yəni 1917-1921-ci illərdə Sovet Ermənistanında erməni xalqına qarşı qətliamlar törədən, 1924-1936-cı illərdə SSRİ-yə qarşı gizli fəaliyyət gostərən, əksinqilabı qrupun fəal üzvləri və rəhbərləri, kəndlilər arasında antisovet təblığatı aparan, Türk dövlətinin casusları, vətən xainləri və xalq düşmənlərinin həbsi üzrə əməliyyat planı".**

**ÜÇLÜYÜN ("TROYKANIN") TƏRKİBİ;**

**Üçlüyün ("Troykanın") sədri;- Aram Kiraqosyan Ermənistan SSR "NKVD"-sinin baş müstəntiqi**
**Üçlüyün ("Troykanın") üzvləri;- Şin Hayrapetyan Gümrü şəhəri "NKVD"-sinin rəisi**
**Üçlüyün ("Troykanın") üzvləri;- Torosyan Yediyar Amasiya rayon "NKVD"-sinin rəisi**

## 1937-1941-ci İLLƏRDƏ ERMƏNİ DAŞNAQLARI TƏRƏFİNDƏN, QƏTLƏ YETİRİLMİŞ AĞBABA MAHALININ DÜZKƏND KƏNDİNİN SİYASI MƏHBUSLARI.

1. **Xəbərov Qasım Rustam oğlu;-57 yaş**
2. **Xəbərov Məhəmmədtağı Rustam oğlu;-59 yaş**
3. **Xəbərov Ənnağı Rustam oğlu;-62 yaş**

1937-ci ilin noyabr ayinda Amasiya rayonunda təşkil olunmuş "Troykanın Qərarı" və son ittihamı:- Əksinqilabı qrupun fəal iştirakçıları olan Ənnağı, Məhəmmədtağı və Qasım Rustam oğlu Xəbərov qardaşları, 1920-1921- ci il tarixində İranın Salmas vilayətindən Ağbabaya qayıtdıqdan sonra Ağbabaya daxil olmuş

Türk 9- cu süvari alayının tərkibində iştirak etmiş və erməni xalqına qarşı görünməmiş qətliamlar törətdikləri bəs etməmiş kimi, hal – hazırda yəni 1937- ci ildə Türk dövlətindən təlimat alan bu şəxslər, yəni xalq düşmənləri, Ənnağı, Məhəmmədtağı və Qasım Rustam oğlu Xəbərov qardaşları Sovet hökumətini daxildən parçalamaq, dağıtmaq məqsədilə Sovet hökumətinin yerlərdə dayaqlarını məhv etmək planlarından əl çəkməyərək, kolxozun texnikası olan 20 baş iri buynuzlu erkək malını zəhərləyib öldürmüşlər."Troykanın Qərarı" ilə Ənnağı, Məhəmmədtağı və Qasım Rustam oğlu Xəbərov qardaşlarına yalandan böhtan atılaraq, Gümrü şəhərində "Qara Qala" deyilən yerdə Troykanın üzvü, Gümrü şəhər NKVD-sinin rəisi Şin Hayrapetyan tərəfindən faciəli şəkildə qətlə yetrilmışlər. (Allah rəhmət eyləsin)

**4.<u>Daşdəmirov Həbib Əhməd oğlu 55 yaş</u>**;- 1937-ci ilin noyabr ayinda Amasiya rayonunda təşkil olunmuş "Troykanın Qərarı" və son ittihamı:- Əksinqilabı qrupun fəal iştirakçısı olan Daşdəmirov Həbib Əhməd oğlu İranın Salmas vilayətindən Ağbaba mahalına qayıtdıqdan sonra, yəni 1920-1921-ci il tarixində Ağbabada "Türk 9-cu Süvari Alayının" tərkibində iştirak etməsi və erməni xalqına qarşı qətliamlar törətməsi, və həmçinin türk dövlətinin casusu olduğu sübut edilərək xalq düşməni adlandırılıb, "Troykanın Qərarı" ilə ona yalandan böhtan atılaraq, Gümrü şəhərində "Qara Qala" deyilən yerdə Troykanın üzvü, Gümrü şəhər NKVD-sinin rəisi Şin Hayrapetyan tərəfindən faciəli şəkildə qətlə yetirilmişdir.
(Allah rəhmət eyləsin)

**5.<u>Ələkbər (Qayadaqalan) 60 yaş</u>**;- 1939-cu ilin fevral ayinda Amasiya rayonunda təşkil olunmuş "Troykanın Qərarı" və son ittihamı:- Əksinqilabı qrupun fəal iştirakçısı olan Qayadaqalan ləqəbli Ələkbər Sovet hakimiyyətinə qarşı düşmənçilik mövqeyi tutduğuna görə, həmçinin 1924-cü ildə Ağbaba mahalının Düzkənd kəndində yeni yaradılmış kolxozun texnikası olan 3 baş dəvəni öldürüb, "Qara Çayır" deyilən yerdə gözəyə atmışdır. Qayadaqalan ləqəbli Ələkbər kişi Türk dövlətinin casusu kimi də ifşa olunaraq

xalq düşməni adlandırılıb, ona yalandan böhtan atılaraq ölümə məhkum olunmuşdur (Allah rəhmət eyləsin).

**6.Seyidov Məhərrəm Ramazan oğlu 30 yaş**; - 1939-cu ilin fevral ayinda Amasiya rayonunda təşkil olunmuş "Troykanın Qərarı" son ittihamı:- Əksinqilabı qrupun fəal iştirakçısı olan Seyidov Məhərrəm Ramazan oğlu Sovet hakimiyyətinə qarşı düşmənçilik mövqeyi tutduğuna görə və həmçinin Ağbabada Türk dövlətinin casusu kimi fəaliyyət göstərməsi ifşa olunaraq ona yalandan böhtan atılaraq ölümə məhkum olunmuşdur (Allah rəhmət eyləsin).

**7.Rzaqulu İmamverdi oğlu 60 yaş**;- 1941-cu ilin noyabr ayinda Rzaqulu İmamverdi oğlu barəsində Amasiya rayonunda təşkil olunmuş "Troykanın Qərarı" son ittihamı:- Əksinqilabı qrupun fəal iştirakçısı olan Rzaqulu İmamverdi oğlu Sovet hakimiyyətinə qarşı düşmənçilik mövqeyi tutduğuna görə və həmçinin Ağbabada Türk dövlətinin casusu kimi fəaliyyət göstərməsi ifşa olunaraq ona yalandan böhtan atılaraq ölümə məhkum olunmuşdur.
(Allah rəhmət eyləsin).

**8.Məmmədov Məcid (1895-1941)**;- 1914 –cü ildə İrəvan Müəllimlər Seminariyasının tam kursunu başa vurub, 1928-ci ildən etibarən Amasiya rayonunun partiya komitəsinin kadırlar şöbəsinin müdiri, Amasiya Rayon Xalq Komissarlar Sovetinin sədri və Amasiya Rayon Hərbi Komissarlığının 4 cü hissəsinin rəisi vəzifəsində çalışıb. 1941-ci ilin noyabr ayında xain ermənilər tərəfindən Amasiya rayonunda təşkil olunmuş "Troykanın Qərarı" ilə, guya əksinqilabı qrupun rəhbəri Məmmədov Məcidin gizli fəaliyyəti aşkar olunmuşdur. Məmmədov Məcid 1920-1921-ci illərdə Ağbaba mahalına daxil olan Türk 9-cu Süvari Alayının tərkibində yüzbaşı vəzifəsində Ağbaba və Gümrü şəhərində erməni xalqına qarşı qətliamlar törətmişdir. Hal-hazırda da, yəni 1941-ci ilin noyabr ayında vəzifəsindən sui - istifadə edərək Türk dövlətinin casusu kimi fəaliyyət göstərməsi ifşa olunaraq, ona yalandan böhtan atılaraq xalq düşməni adlandırılmışdır. Troykanın qərarı ilə troykanın üzvü,

Gümrü şəhər NKVD-sinin rəisi Şin Hayrapetyan tərəfindən faciəli şəkildə Leninakan (Gümrü) şəhərində "Qara Qala" deyilən yerdə 46 yaşında qətlə yetirilmişdir (Allah rəhmət eyləsin).

**9.<u>Qulu Kərbəlayı Qurban oğlu 70 yaş</u>**;- 1941-cu ilin noyabr ayinda Qulu Kəlbəlayı Qurban oğlu barəsində Amasiya rayonunda təşkil olunmuş "Troykanın Qərarı" son ittihamı:- Əksinqilabı qrupun fəal iştirakçısı olan Qulu Kəlbəlayı Qurban oğlu Sovet hakimiy-yətinə qarşı düşmənçilik mövqeyi tutduğuna görə və həmçinin casusluqda günahlandırılaraq ona yalandan böhtan atılaraq xalq düşməni adlandırılmış və ölümə məhkum olunmuşdur. Daşkənd şəhərində siyasi məhbus kimi güllələnib. 1972-ci ildə bərayət qazanıb (Allah rəhmət eyləsin).

**10.<u>Vəli Məşədi Əşrəf oğlu 65yaş</u>**;- 1941-cu ilin noyabr ayinda Vəli Məşədi Əşrəf oğlu barəsində Amasiya rayonunda təşkil olunmuş "Troykanın Qərarı" son ittihamı:- Əksinqilabı qrupun fəal iştirakçısı olan Vəli Məşədi Əşrəf oğlu Sovet hakimiyyətinə qaşı düşmənçilik mövqeyi tutduğuna görə və həmçini casusluqda günahlandırılaraq ona yalandan böhtan atılaraq xalq düşməni adlandırılb ölümə məhkum olunmuşdur (Allah rəhmət eyləsin).

Yusif Rəhimoğlu Heydərov dedikləri əsasında yazılıb:
Əbülfət Heydər:

---

**İsifadə olunmuş ədəbiyyat:**
**Документ № 144**
**Приложение 2. Составы троек НКВД—УНКВД 1937–1938 гг., созданных для рассмотрения дел арестованных в ходе массовой операции по приказу НКВД СССР № 00447 от 30 июля 1937 г.**
**Архив: ЦА ФСБ РФ. Ф. 3. Оп. 4. Д. 586. Л. 2-4. Подлинник**



# QƏRBİ AZƏRBAYCANIN (İNDİKİ ERNƏNİSTANIN) AĞBABA MAHALINDA, ERMƏNİ DAŞNAQLARININ AZƏRİ TÜRKLƏRİNƏ QARŞI REPRESSİYALARA BAŞLAMASI 5 avqust 1937-ci il.

1918-ci ilədək Qars vilayətinin tərkibində olan Ağbaba nahiyəsinin ərazisinin böyük qismi əvvəlcə Gümrü (1920), sonra isə Qars (1921), müqavilələrinə əsasən Sovet Ermənistanının tərkibinə qatılmışdır. Beləliklə, Ağbaba nahiyəsinin 594,75 kv verst ərazisinin 450 kv versti - 32 kəndi Ermənistana qatılmışdı. Ermənistanda Sovet hakimiyyəti quruldugdan sonra nahiyənin mərkəzi yenə də Hamasa (Amasiya) kəndi olmuşdu.

20-ci illərin əvvəllərində bu nahiyədə ermənilər yeganə olaraq Qaraməmməd kəndinə yaşayırdı.

1924-cu il sentyabrın 30-da Ağbaba nahiyəsinin əsasında Amasiya rayonu təşkil edilmişdi.

Əhalisi kütləvi repressiyalara məruz qalan rayonlardan biri də Ağbaba mahalı (Amasiya) rayonu olmuşdu.

Ağbaba mahalı 1920-ci ilin sonunadək - Ermənistanda Sovet hakimiyyəti qurulanadək daşnaq qoşunlara qarşı vuruşmuş, Ağbaba nahiyəsində erməni daşnaq hökumətinin yerli sturkturlarını yaratmağa imkan verməmişdi. Ağbaba nahiyəsi daşnaq hökumətinin axıradək ayaq basa bilmədiyi yeganə bölgə olmuşdu.

1936-1938-ci illər repressiyası zamanı daşnaq tör-töküntülərinin əlinə gözəl fürsət düşdü.

SSRİ Xalq Daxili İşlər Komissarlığının (NKVD) 00447 saylı tam məxfi əmrinə əsasən və Ermənistan SSR-nin Xalq Daxili İşlər Komissarlığının 11.07.1937-ci il, 51/212 nömrəli tam nəxfi əmrinə əsasən, 5 avqust 1937-ci ildə Amasiya rayonunda Azəri Türklərinə qarşı cinayət akti baş verdi. Ermənistan SSR-nin Xalq Daxili İşlər

Komissarlığının sədri B.B Xvorostyanın rəhbərliyi ilə Amasiya rayonunda cinayətkar bir qrum ("troyka") yaradıldı. Kommunist maskası taxmış daşnaq komandirlərindən, Ermənistan SSR NKVD-nin baş müstəntiqi Aram Kiraqosyan (troykanın sədri), Leninakan şəhər (Gümrü) NKVD-nin rəisi Şin Hayrapetyan və Amasiya rayonu NKVD-nin rəisi Yediyar Torosyandan ibarət, troykanın tərkibi təşkil olundu.

Əhalisinin sayı 90%-i Azəri Türklərindən təşkil olunmuş Amasiya rayonunda, bu üçlüyə azərbaycanlıların qatılmasına icazə vetilmədi.

Aram Kiraqosyan, Şin Hayrapetyan və Yediyar Torosyan 1917-1921-ci ildə Gümrü, Şörəgel, Ağbaba, Çıldır və Axırkələkdə 4-cü şərqi erməni dviziyasının (komandiri, general – mayor Andranik Ozanyan) Axırkələk polkunun (komandiri, polkovnik Marzmanov) gənc zabitləri olmuşlar.

**Bu çinayətkarlar 1919-cu ilin sentyabr ayında 4-cü şərqi erməni dviziyasının Axırkələk polkunun xüsusi briqadasının rəisi, ermənistan milli qəhrəmanı general Osipyanın hazırladığı "Ovçular" planına əsasən Ağbaba Süvari Alayının bir neçə adlı – sanlı şəxsiyyətlərini aradan götürməyə nail olmuşlar.**

**"Qvçular planı" barəsində kitabda ətraflı məlumat verilib.**

Leninakandakı (Gümrüdəki) "Qara Qala" adlanan dustaqxanada Amasiyanın hər kəndindən onlarla azərbaycanlı saxlanılırdı. "Troyka"nın qərarı ilə insanların barəsində ya ölüm hökmü çıxarılır, ya da Sibirə, yaxud Qazağıstana sürgün edilirdi. Təkcə 1937- ildə həbs edilən və sürgünə göndərilənlərin hesabına rayonun azərbaycanlı kəndlərinin əhalisi yarıbayarı azalmışdı. Tutulanların bir çoxlarına məhkəmə edilməmişdi. Onların əksəriyyəti güllələnmişdi.

Represiyanın 1-ci dalğası zamanı 1-ci və 2-ci kateqoriyalı insanların artırılmasını tələb edən Sovet hökumətinin rəhbəri İ.V Stalın öz dəsti xətti ilə 300 nəfər 1-ci kateqoriyalı insanları (ali təhsilli) 500 nəfərə çatdırmalı, 2- ci kateqoriyalı insanları isə 500 nəfərdən 800-ə çatdirmaq tələbini qoymuşdur.

СТРОГО СЕКРЕТНО — ПОДЛЕЖИТ ВОЗВРАТУ В 48 ЧАС. 185

Снятие копий воспрещается (Пост. НБ от 5 мая 27 г. пр. № 100, п. 5)

Кому послана ... Учет. П. Б. № 54 п. 487

25.X.37.

# ШИФРОВКА

Из КИРОВА отправлена 17-20 21.X. 193 7г. Поступила в ЦК ВКП на расшифрование 21.X. 193 7г. ч. 19 м. 50

Вх. № 2320/Ш

МОСКВА ЦК ВКП(б) тов. СТАЛИНУ.

В результате операции по первой, второй категориям в области вскрыто свыше 70 различных активно действовавших кулацких, белогвардейских, церковно-сектантских организаций, групп. В частности выявлена значительная засоренность на железнодорожном транспорте, где подлежит из"ятию свыше 500 человек белогвардейско-кулацкого элемента.

Прошу об увеличении лимита по первой категории дополнительно на 300 человек, второй категории дополнительно на 1000 человек.

Секретарь обкома РОДИН.

Расшифрована 22.X. 193 7г. в ч. 10м. 00 Напечатано 4 экз. Чечулин Подпись
НК

ИЗВЛЕЧЕНИЕ ИЗ ИНСТРУКЦИИ:

1. Шифротелеграмма должна храниться только в секретных хранилищах.
2. При ссылках на текст шифротелеграмм воспрещается указывать, что цитируемый текст получен шифром, также воспрещается указывать и номера шифровок.
3. Ответ на шифровку посылается также в шифрованном виде, текст передаваемого шифром сообщения составляется коротко и ясно; пишется только в одном экземпляре, который и передается на шифрование.

Represiyanın 2-ci dalğası zamanı Uzaq Sibir, Mərkəzi Asya və Qafqaz respublikalarında SSRİ Xalq Daxili İşlər Komisarlığının 00447 saylı məxfi əmrinə əsasən ölümə məhkum olunan 1-ci kateqoriyalı insanları (ali təhsilli və vətənpərvər) 1000 nəfərdən 4000 nəfərə çatdırılması nəzərdə tutulmuşdur. Repressiyanın böyük terror planı Ermənistanda pik nöqtəsinə 5200 nəfərə çatdırılmışdır. Bu da Ermənistanda yaşayan soydaşlarımız hesabına olmuşdur.

СТРОГО СЕКРЕТНО

Снятие копий воспрещается

тов. Ежову

ПОДЛЕЖИТ ВОЗВРАТУ В 48 ЧАС.

(Пост. ПБ от 5 мая 27 г. пр. № 100, п. 5)

61 п. 58

28.IV.38 г.

**ШИФРОВКА**

ИРКУТСКА отправлена 15-54 26.IУ 1938 г. Поступила в ЦК ВКП

26.IУ 1938 г. ч. 19 м. –

Вх. № 472/Ш

МОСКВА ЦК ВКП(б) тов.СТАЛИНУ.
Н К В Д тов.ЕЖОВУ.

Ввиду значительной засоренности области право-троцкистскими пан-монгольскими и кулацко-белогвардейскими элементами, подпадающими под первую категорию, просим ЦК ВКП(б) разрешить дополнительный лимит по первой категории для Иркутской области 4 тысячи.

И.О.СЕКРЕТАРЯ ИРКУТСКОГО ОБКОМА ВКП(б) ФИЛИППОВ.

НАЧАЛЬНИК НКВД ПО ИРКУТСКОЙ ОБЛАСТИ МАЛЫШЕВ.

За. И. Ст. В. Молотов К. Ворошилов Каганович Ежов

т. Микоян – за
т. Чубарь – за.

26.IУ 1938 г. в ч. 19 м. 20 Напечатано 4 экз. Паршин.

ИЗВЛЕЧЕНИЕ ИЗ ИНСТРУКЦИИ

Ermənistan SSR-nin Xalq Daxili İşlər Komissarlığının sədri B.B Xvorostyanın tam məxfi əmrinə əsasən, Şin Hayrapetyan Amasiyanın bütün kəndlərindən xalq arasında nüfuzu olan, az-çox savadlı sayılan azəriləri Türkiyədə qohumları olması və onlarla gizli əlaqə saxlamaları bəhanəsi ilə həbs etdirmiş, onlara siyasi dustaq damğası vurduraraq Sibirə və Qazağıstana sürgün etmişdi.

## Ağbabalıların 1937 – ci il sürgünü.
## "Qazaxıstan"



## 1948 -1953-cü İLLƏR DEPORTASİYASI.

SSR Xalq Komissarları Soveti **1945-ci il noyabrın 21**-də "Ermənilərin xaricdən Sovet Ermənistanına qayıtmaları ilə əlaqədar tədbirlər planı haqqında "qərar qəbul etmiş, 19 oktyabr 1946-cı ildə isə SSR Ali Sovetinin Rəyasət Heyəti "Xaricdən Sovet Ermənistanına qayıdan erməni millətindən olan şəxslərin SSR vətandaşlığlı əldə etməsi qaydaları haqqında" fərman vermişdi.

**SSR Nazirlər Sovetinin 1947-ci il 23 dekabr tarixli 4083 nömrəli və 1948-ci il 10 mart tarixli 754 nömrəli qərarları Azərbaycan xalqına qarşı növbəti tarixi cinayət aktı olmuşdur**.

Bu qərarlar əsasında 1948-1953-cü illərdə yüz əlli mindən çox azərbaycanlı Ermənistan SSR ərazisindəki dədə-baba yurdlarından kütləvi surətdə və zorakılıqla deportasiya olunmuşdur.

**Ermənistandan köçürüləçək əhalinin Azərbaycanın hansı rayonlarında yerləşdirilməsi məsələsi Azərbaycan SSR Nazirləri Sovetinin 2 fevral 1948-ci il tarixli qərarı ilə müəyyənləşdirilmişdi.**

**Azərbaycanlıların 1948-1953-cü illər deportasiyası dövründə Ermənistanda mövcud olan abu havanı əks etdirən sənədlərdən biri Siyasi Partiyalar və İctimai Hərəkatlar Arxivində (keçmiş Partarxiv) saxlanılır**.



Совет Министров Азербайджанской ССР

СОВЕТ МИНИСТРОВ СССР
ПОСТАНОВЛЕНИЕ № 4083
от 23 декабря 1947 г. Москва, Кремль.

О переселении колхозников и другого азербайджанского населения из Армянской ССР в Кура-Араксинскую низменность Азербайджанской ССР.

Совет Министров Союза ССР ПОСТАНОВЛЯЕТ:

1. Переселить в 1948-1950 гг. на добровольных началах в Кура-Араксинскую низменность Азербайджанской ССР 100 тыс. колхозников и другое азербайджанское население из Армянской ССР, из них: 10 тыс. человек – в 1948 году, 40 тыс. человек – в 1949 году и 50 тыс. человек – в 1950 году.

11. Разрешить Совету Министров Армянской ССР освобождаемые азербайджанским населением постройки и жилые дома в связи с переселением их в Кура-Араксинскую низменность Азербайджанской ССР использовать для расселения зарубежных армян, прибывающих в Армянскую ССР.

Председатель Совета Министров Союза ССР И.Сталин

Управляющий Делами Совета Министров СССР Я.Чадаев

1. Көчмə билети, көчəнин вə онун аилəсинин, ганунда көстəрилəн күзəштлəрдəн истифадə етмəк һүгугуну тəсдиг едəн ваһид бир сəнəддир.

2. Көчмə билети шəхсиjјəти əвəз едə билмəз.

3. Сахта көчмə билети дүзəлтмəк, јахуд ону башгасына вермəк гануна чəзаландырылыр.

1. Переселенческий билет является единственным документом, удостоверяющим право переселенца и его семьи на пользование льготами, предусмотренными законом.

2. Переселенческий билет не может служить удостоверением личности.

3. Подделка переселенческого билета или передача его другому лицу карается по закону.

Тип. Амумешр. Зак. № 235. ФГ 10123. 15 X-48 г.

Азəрбајҹан ССР Назирлəр Совети јанындакы Көчүрмə Идарəси
Переселенческое Управление при Совете Министров Азерб. ССР

КӨЧМƏ БИЛЕТИ
ПЕРЕСЕЛЕНЧЕСКИЙ БИЛЕТ
№ 1305

Настоящий билет выдан Переселенческим Управлением при Совете Министров Азерб. ССР

в том, что он с семьей действительно является переселенцем в Азербайджанской ССР и пользуется льготами и правами, предусмотренными Постановлением ЦИК и СНК СССР от 17 ноября 1937 г. № 113/2043 „О льготах для переселенцев".

(имза—подпись)

1948 года

Көчəнин чыхмасы вə кəлмəси һаггында мə'лумат.
Сведения о выбытии и прибытии переселенца

Көчəнин аилə һеј'əти — Состав семьи переселенца

Ermənistan SSR- dən kütləvi surətdə və zorakılıqla deportasiya olunuş Azərbaycanlılar üçün nəzərdə tutulmuş köçmə biletinin surəti.

## AĞBABA SÜVARİ ALAYININ DÜZKƏND KƏNDİ ÜZRƏ ŞƏHİD OLMUŞ CƏSUR ÖVLADLARI 1918 – 1920-Cİ İLLƏR.

**1** Mustafa Abbasəli oğlu
**2** Usub İmamverdi oğlu
**3** Qərib Bayrampaşa oğlu
**4** Rus Əhməd (rus dilini bildiyinə görə el arasında belə sağırırlarmış)

**Qeyd:**
**Bu oğullar Ağbaba Süvari Alayının 4-cü xüsusi təyinatlı taborunda, (yüzbaşı Hacıvəlinin rəhbərliyi altında) 1920-ci ilin yanvar ayında, Axirkələk şəhəri yaxınlığında Ağbaba uğrunda, şərqi erməni dviziyası ilə aparılan döyüşlərdə şəhid olublar. Allah rəhmət eləsin.**

## II- Cİ DÜNYA MÜHARİBƏSİ İLLƏRİNDƏ HƏLAK OLMUŞ DÜZKƏND KƏNDİNİN CƏSUR OVLADLARI. 1941- 1945 –Cİ İLLƏR

II- ci dünya müharibəsi illərində (1941-1945) Ağbaba mahalının Düzkənd kəndindən **34** nəfər insan faşist Almaniyası ilə aparılan amansız müharibə nəticəsində qəhrəmancasına həlak olmuşdur.

**1.** Xəbərov Fəhrat
**2.** Mehrəliyev Ələmdar
**3.** Ələsgər Məhərrəm oğlu
**4.** Əliyev Fəhrat
**5.** Məmməd Söyün
**6.** Allahqulu Məhərrəm oğlu
**7.** İsmayıl Süleyman oğlu
**8.** Məsim Məmmədov
**9.** Xalıx Söyün oğlu
**10.** Yasın Söyün oğlu
**11.** İsmayıl Vəliyev
**12.** Cəlal Vəliyev
**13.** Allahqulu Allahverdiyev
**14.** Əli Qəribov
**15.** Şahmurad Qəribov
**16.** Ramazan Mustafa oğlu
**17.** Məcid Hümbət oğlu
**18.** Paşa
**19.** Həşim Məmmədov
**20.** Cəfər
**21.** Əlirza Məmmədov
**22.** Vəli
**23.** Kərəm Qurbanov
**24.** Halay Qurbanov
**25.** Məhərrəm Abbasov
**26.** Akoy Abbasov
**27.** Məhəmməd Məmmədov
**28.** İsmayıl Şaşoy oğlu
**29.** Oruc Yaqub oğlu
**30.** Qurban Abbasov
**31.** Əli AbuTalıb oğlu
**32.** HacıMurad Əli oğlu

# YUSİF HEYDƏROV
# (Babamla bağlı xatirələr)

Yusif dayı Aşıq Heydərdən söz açan kimi bir an xəyala getdi. Çənəsini ovcuna alıb bir xeyli beləcə lal-dinməz dayandı. Sonra yavaş-yavaş sinəsinə əyilən başını qaldırdı, yanıqlı bir ah çəkib dedi:

– Babam kimi gözəl səsli, şirin danışıqlı adam yox idi. Yaxşı yadımdadır, otuz yeddinci ilin tutatutu adamların rahatlığını əlindən almışdı, adamlar alayuxu yatırdılar. Kim oldu tuturdular, bircə bəhanə olsun. Sanki buna görə də xüsusi plan vardı. Elə buna görə də atam da, əmim də, başqa qohumlarım da vahiməyə düşmüşdülər. Bir də onları qınamaq olmazdı. Üstəlik, onlar babamın tutulacağından ehtiyat edir, həmişə ona deyirdilər:

– Baxın, adamlar bir bəhanə axtarırlar ki, sənə ləkə yaxsınlar. Yaşlı adamsan, amandı, həmişə sözünə, danışığına fikir ver. Türk adını dilinə gətirmə. Özünü də, bizii də bəlaya salarsan.

Babam bu deyilənlərdən acıqlansa da, nə atama, nə əmimə, nə də o biri qohumlarıma cavab verməz, uzaqlara baxardı. Kişinin gözləri yol çəkərdi. Axırda özünü saxlaya bilməyib deyirdi:

– A bala, mən ağır - ağır məclislər keçirmişəm – bu bir, ikincisi, o türk deyilən mənim dədə-babam, elə özüm deyləmmi? Bunu danmaqmı olar? Mən el sənətkarıyam, deyirsiniz innən belə lal olum, ağzı yumulu durum?! Axı dərd ürəyimi didir… Çıldır, Qars həsrəti məni yandırıb-yaxır. O mən getdiyim yollar bağlanıb, «türkəm» deyən dillər dağlanıb. Bəs mən dərd-sərimi kimə deyim? Daşa-divaramı deyim?.. Kim qalıb, kim mənə qulaq asa?…

Babamın yana-yana dediyi bu sözlər əmimə də, atama da, o biri qohumlarıma da təsir etsə də, onlar susmağa üstünlük verirdilər. İşi belə görəndə babam qolunu boynuma salar, deyərdi:

– Gəl, a mənim ağıllı nəvəm., gəl dərdimi sənə deyim.Səndən başqa dərd bilən yoxdu deyən.

Mən uşaq marağı ilə babamın dizinin dibini kəsdirən kimi babam yanıqlı-yanıqlı oxuyardı:

Ovçu olan ona güllə atmasın,
Qəssab olan bunun ətin satmasın,



Ovçu, görüm heç ruzun artmasın,
Bu dağda bir maral nə yaman ağlar!

Güllə dəyib bu heyvanın dizinə,
Qan tökülür dırnağının izinə,
Gözü bənzər Xan Əslinin gözünə,
Bu dağda bir maral nə yaman ağlar!

Babamın yanıqlı səsi məni kövrəltdiyindən bir an özümü unudar, harada olduğumdan xəbərim olmazdı. Handan-hana babamın səsinə özümə gələr, yenə onun qucağına sığınardım:

– Ay baba, sən niyə belə yaralı oxuyursan?

– Ay mənim balam, inşallah, böyüyəndə bilərsən. Demək olmur, danışmaq olmur. Eh, a mənim balam, ürəyi yaralı adamın səsi də yaralı olar. Nə deyim, necə deyim. Bir vaxt məclislər yaraşığı indi əlimdə qamçı yaz-yay arabaçı, qışda xizəkçi olmuşam. Başda oturan kişini ayağa salıblar.

– Ay baba, sən nə danışırsan? Mən heç başa düşmürəm.

Babam mənə baxıb dərdli-dərldli gülümsədi:

– Elə başa düşməməyin yaxşıdı.

– Belə niyə?

– Niyəni sonra bilərsən.

Yenə babam avazla oxuyar, qəlbimi yerindən oynadardı.

Bəli, mənim babam belə adamdı.

Aşıq Heydər nəyinki bizim nəslin qürur mənbəyidir, eyni zamanda Ağbaba mahalının boya, başa çatdırdığı ustad sənətkarlardan biridir.

Nəhəng sənətkarın açılmamış xəzinəsi, yəni əsərləri tamamı ilə Ağbaba mahalına həsr olunub.

Ümid edirəm ki, ictimayətin və geniş oxucu auditoriyasının mühakiməsinə verilmiş bu əsər, Aşıq Heydərin irsini sevənlər və dəyərləndirənlər tərəfindən lazımınca qiymətləndiriləcək.

Bu kitabın araya- ərşəyə gəlməsində cox böyük zəhməti olan, Tacir Səmimi və Xurşud Məmmədliyə əvvəlcədən təşəkkür edirəm.

# İTİRDİK

Yağı bizi tora saldı,
Alan bizdən betər aldı,
El dağıldı darda qaldı,
İtirdik yurdu, itirdik.

Töküldük tozlu yollara,
Düşdük dillərdən-dillərə,
Səpildik qərib ellərə,
Götürdük dərdi-götürdük.

Bu günə nəs gün dedilər,
Taleyi küskün dedilər,
Qaçqın, didərgin dedilər,
Gətirdik dərdi, gətirdik.

Yusif də bu sözü yazdı,
Mənimki də beş-üç sözdü,
Nə demişəm hələ azdı,
Ağbaba birdi, itirdik.

# GÖR MƏNİ NƏ HALA SALDI QOCALIQ

Belə bir əyyamda, ağır zamanda,
Gör məni nə hala saldı qocalıq!?
Istədim danışam, tutdu yaxamdan,
Gör məni nə hala saldı qocalıq!?

Otuz iki dişdən qalmadı biri,
Polad biləklərin yox oldu giri.
Qanan da, qanmaz da əmr etdi kiri,
Gör məni nə hala saldı qocalıq!?

Gənclik illərimi mən verdim bada,
Bəlalı başıma çox gəldi qada.
Ömrüm hədər getdi, düşmədi yada,
Gör məni nə hala saldı qocalıq!?

# DAĞLAR

Çıxmırsan yadımdan bircə an belə,
Əllərim uzanır vətənə, dağlar.
Nə bir hay verirsən, nə də baxırsan,
Dərddən qan ağlayıb ötənə, dağlar.

Yaşlı vaxtlarımda didərgin oldum,
Səni itirəli çox qəmgin oldum,
Çıxdım Ağbabadan, gül kimi soldum,
Çox yandım ölənə, itənə, dağlar.

Çiçəkli-güllüydü yamacı, döşü,
Uçurdu göylərə könlümün quşu,
Biçarə Yusifin cəm olmaz huşu,
Əllərim yetişməz ötənə, dağlar.

# BAXMIR

Ay həzarat, gəlin sizə söyləyim,
Mehriban soltanım üzümə baxmır.
Titrəyir əllərim, tor görür gözüm,
Telli iftidanım sözümə baxmır.

Çəkilmir ekrannan o səhər - axşam,
İşə buyuranda, deyir naxoşam.
Göz yaşı axıdır o qoşam - qoşam,
Başını qaldırıb gözümə baxmır.

Çırmamır qolunu, yumur əlini,
Daramır telini, didir gəlini.
Tanrı qırsın qız doğanın belini,
Məndə olan səbrə, dözümə baxmır.

Seryallar əlindən gəlmişəm zara,
Dərd basıb çiynimdən salıb azara.
Xurcunu götürüb getsəm bazara,
Görürəm cibim də sözümə baxmır.

Qalxıb məhəllədə malın qiyməti,
Bəyənmir bazarlardan alınan əti.
Yusifin çəkdiyi bu müsibəti,
Fil çəkmir,oduma – közümə baxmır.



# BU AYRILIQ MƏNİ YAMAN İNCİDİR

O dağları duman basıb, dərd alıb,
Bu ayrılıq məni yaman incidir.
Ətəyində qarğa quzğun kök salıb,
Bu ayrılıq məni yaman incidir.

Əl acıram mən vətənə catmağa,
Az qalıram qəm gölündə batmağa.
Yorğan - döşək məni qoymur yatmağa,
Bu ayrılıq məni yaman incidir.

Təbib gəlib yaralarım açıbdı,
Yumulmur kirpiyim, yuxum qaçıbdı.
Yusif, xoş dövranın çoxdan keçibdi,
Bu ayrılıq məni yaman incidir.



# KÖNLÜM

Ya Rəbbim, canımız daşdı, dəmirdi?
Çevrilib dönübdü bir daşa könlüm.
Vətən həsrətindən qürbət diyarda,
Nə betər düşübdü təlaşa könlüm!

Ustadım Heydərdən mən dərs anmışam,
Səmada vurnuxan bir qərib quşam.
Sınıb qol – qanadım, gülləyə tuşam,
Çıxıb öz – özüylə savaşa könlüm!

Yusifəm, mən unutmaram elimi,
Tülək tərlan tora salıb gülümü.
Haq yolunda kəssələr də dilimi,
Qoymaram ki, əyilə, ya çaşa, könlüm!



# MƏN QƏRİBƏM, MƏNƏ QƏRİB DEMƏYİN

Yönüm düşmür o, yaralı ellərə,
Sözüm dedim gurultulu sellərə,
Adım düşüb qərib kimi dillərə,
Mən qəribəm, mənə qərib deməyin.

Yağıların əməlləri bilindi,
Doğma yurdum parçalandı, bölündü,
Ağbabamız yer üzündən silindi,
Mən qəribəm, mənə qərib deməyin.

Təbib gəlib yaraları bağlasın,
Anam - bacım sinəm görüb ağlasın,
Allah sizi xətalardan saxlasın,
Mən qəribəm, mənə qərib deməyin.

Dağildı el - obam, qaldı virana,
Bu işlər agahdı o yaradana,
Sizi and verirəm əziz Qurana,
Mən qəribəm, mənə qərib deməyin.

Apar məni Qaraxaçın qaşına,
Üzüm sürtüm qəbirlərin daşına,
Hava gəlir qul Yusifin başına,
Mən qəribəm, mənə qərib deməyin.



## QALMAYIB

Ey nazənin səni görməyə gəldim,
Yanağında qoşa xalın qalmayıb.
Bir zaman mənimlə deyib gülərdin,
Mənlə danışmağa halın qalmayıb.

Əllərim titrəyir, belim bükülür,
Bu həsrət gözlərim sənə dikilir.
Baxdıqca halına bağrım sökülür,
Ləblərdən süzülən balın qalmayıb.

Fələk qəzəbini çalandan bəri,
Açılmayır qızıl gülün lənbəri.
Tovuz tamaşalı, ey gözəl pəri,
Danışmağa hal-əhvalın qalmayıb.

Yusif deyər qurban şirin dillərə,
Bağçamızda bitən qızıl güllərə.
Görürəm ki, qubar qonub tellərə,
Qocalmısan, dür cəmalın qalmayıb.



# BİR İMDADIM YOXDU MƏNİM, AĞLARAM

El dağıldı, millət köçdü ay allah,
Bir imdadım yoxdu mənim, ağlaram,
Fələk salıb məni qəm kəməndinə,
Bir imdadım yoxdu mənim, ağlaram.

İnləməkdən gün batdı, qaş qaraldı,
Nalə çəkdim, dağ yandı, daş qaraldı,
Danışanda gözümdə yaş qaraldı,
Bir imdadım yoxdu mənim, ağlaram.

Yediyim, içdiyim demə ki, baldı,
Yusif, kor olaydın gör bu nə haldı.
Şövkətli ellərim yağıya qaldı,
Bir imdadım yoxdu mənim, ağlaram.



# DÜŞDÜM

Qoyundan, quzudan üzüldü əlim,
Dağıldı var –dövlət, mən zora düşdüm.
Bardanın kəndiri kəsdi belimi,
Bismillah eylədim, bazara düşdüm.

Arvad dedi; mənim kişim var olsun,
Mən söyləyim mahallarda car olsun.
Bazarın gəliri zəhrimar olsun,
Saxta pul verdilər azara düşdüm.

Bardana baxanda, dizlərim əsdi,
Oğruynan - kəsəyən nəfəsim kəsdi,
Mənəm, deyən qohumlar məndən küsdü.
Nəfs aldatdı məni, tez tora düşdüm.

Eşidib - bilənlər çox mənə güldü,
Dərdimi söylədim bazarkom bildi,
Bir günlük borcumu beş aya sildi,
Bazarı buraxdım, biyara düşdüm.

Arvad dedi: Daha bəsdi a kişi,
Lazim deyil kətə, lalanqa, pişi,
Yusif, ud qəhəri, unut keçmişi.
Gör mən nə əcayib rüzgara düşdüm.



# NƏNƏ

Ey bizə səcdə yeri, ad-san, Nənə!
Ey günəş üzlü, nəcib insan Nənə!

Bəxşi - ilahidürür ömrün bizə
Bir nur olub qəlbimə yatsan, Nənə!

Kim sənə hökm eylədi qəmküsar ol,
Arxa olub arxasıza yan, Nənə!?

Nuri – təcəlli eləyib möcüzə,
Qəlbim içində doğulub can, Nənə!

Xoş baxışın, xoş taleyin töhfəsi,
Sərt baxışın qasırğa, tufan, Nənə!

Gözlərinə çeşmeyi – zəmzəm dedim,
Sözlərinə məlhəmü dərman, Nənə!

Dilsizə dil verdi sənin xoş halın,
Ey sözü nəğmə, özü dastan, Nənə!



# ÜZÜN MƏNDƏN NİYƏ DÖNDÜ

Sən ey vəfalı dilbərim!
Üzün məndən niyə döndü!?
Niyə mənim xoş sözlərim,
Sənə zəhrimar göründü!?

Sən bir solmaz çiçək idin!
Şux, mehriban, göyçək idin!
Sən ömrümə bəzək idin!
Kim qarğayib sənə indi!?

Alıb əlvan geydirmədim!
Nemətlərdən doydurmadım!
Əzizləyib sevdirmədim!
Sinəmdə arzular söndü!

Minnət yükün əydi belim,
Soruşmadım dərdi – dilim!
Dar ayaqda qoydun, zalım
Ömrüm,bəxtim, dilim yandı!

Həsrət qoydun xoş üzünə!
Uydun fələyin sözünə!
Zülm elədin əzizinə!
Bu nə rüzgar, bu nə gündü!

Şah deyiləm düşəm taxtdan
Quştək uçaram budaqdan...
Sinəmə çəkdiyin dağdan
Demə sonra nə düyündü!?

# AŞIQ HEYDƏR SAYAĞI

Əsir Ağbaba yelləri,
Göydədi xalqın əlləri!
Xudam, sən saxla elləri
Namərdlərin bəlasından!

Ağbaba qoynu cənnətdi!
Həsrəti çəkilməz dərdi!
Qaxtağanlar çox namərddi...
Quş pərikib yuvasından!

Bu dərdə kim çarə tapar?
Kim yurdu dardan qurtarar?
Eli yurduna qaytarar?
Çıxarar qəm libasından!

Ağbaba qoynu bahardı!
Sinəm həsrətdən qabardı!
Həsrətim o bulaqlardı!
Sızlaram hər damlasından!

Şişdağatək qabardı sinəm!
Arpaçay qurşadı mənəm!
Şairəm, o yurddu binəm!
Öpəm, qucam ayağından!

# SANDIM

Ağbaba elində çoxdu gözəllər,
Mən səni bir solmaz bənövşə sandım!
Duydum əllərinin hərarətini,
Hənalı gözləri bir nəşə sandım!

Öpdüm yanağının tər laləsini!
Qucdum saçlarının şəlaləsini!
İçdim dodaqlarının piyaləsini!
Düşdüm bir yanğıya, atəşə sandım!

Xurşudam Vaqifə çox bənzərim var,
Şeirdən, sənətdən sərf-nəzərim var!
Gözəl, adın kimi dil əzbərim var,
Onu da özümə bir peşə sandım!



# SİNƏMDƏ

Ağbabanın gur selləri
Çağlar mənim bu sinəmdə!
Bir el öz yurd həsrətini
Saxlar mənim bu sinəmdə!

Göy çəmənlər, buz bulaqlar
Yol üstə elin soraqlar...
Arpaçay körpülər, çağlar
Ağlar mənim bu sinəmdə!

Şişdağın sinəsi dağlı
Əsirdi-qolları bağlı!
Yolları sirli-soraqlı
Yoxlar mənim bu sinəmdə!



# SÖZÜM

Qəlbimdə sehrli nurdan yaranıb
Bir sevgi işığı, balıdı sözüm!
Şəhid qanlarının torpağa hopmuş,
Gürşada çevrilmiş selidi sözüm!

Cismi yorğrulubdu alovdan-oddan!
Yadigar alıbdı Dədəm Qorquddan!
Babək qılıncıdı - üzü poladdan
Anamın şəfqətli əlindi sözüm!

Arxadan boylanıb önə yollanan
Müdrik bir qocadı, çılğın bir cavan!
Tale ulduzudu zülmətdən doğan
Dərdli könüllərin dilidi sözüm!

Nadanlar əlində sınıb saz kimi,
Səmtini tapmayıb xoş avaz kimi!
Çəkilib sinəmə çal-çarpaz kimi,
Dərdlə, ahuzarla doludu sözüm!

Şirindi şəhdindən küçə bilmirəm!
Sınıbdı qanadım qaça bilmirəm
Zənciri qolumdan aça bilmirəm!
Bir sadiq yolçunun yoludu sözüm!



# ƏZİZİM

Gücə salma, dedim ürəyi bunca
Sel yuyub aparır dağı, əzizim!
Xəzan küləkləri çox tez başlanır,
Soldurur baharlı bağı, əzizim!

Bərbəzək vurursan özünə yaman!
Bəzənib çıxırsan Allah yolundan!
Mənəm odda yanıb, közdə qovrulan
Əriyir qəlbimin yağı, əzizim!

Qranit qayalar toza çevrilir!
Başı qarlı dağlar düzə çevrilir!
Həyatın astarı üzə çevrilir!
Solur şamamanın tağı, əzizim!



# UNUTMARAM

İçdim yenə yar əlindən
Eşqin şirin şərbətini!
Ömrüm boyu unutmaram
Vüsalın ləzzətini!

Fələk ayırdı əlimi!
Qabar eylədi dilimi!
Bükdü həsrətin belimi
Necə çəkim minnətini!

Üzdü məni, üzdü həsrət!
Qalmadı dizimdə taqət!
Qoynun içi şiriin cənnət!
Necə çəkim minnətini!

Bu möhnətdən necə qaçım!?
Yoxdu ixlasım, əlacım!
Kimə deyim, kimə açım
Qəlbimin söz-söhbətini!?

Şair Xurşud bəxti kəmdi!
Dərddən sinəsi vərəmdi!
Sənsiz dünya cəhənnəmdi
Ver qurtar can nemətini!



# MƏKTUB

Qərib qürbət eldən məktub göndərdim
Qəib komasına qan qardaşının!
Dəryaya döndərdin, selə döndərdin
Qardaş gözlərinin qanlı yaşını!

Bir atadan yetim bir övlad idik
Yaxa didik – didik, qəlb didik – didik...
Qohumdan – qardaşdan aman istədik...
Atmışdılar biz yazığın daşını!

El – obamız viran olub dağıldı!
Vətən eşqi sinəmizdə doğuldu!
Hicran gəlib aramızda dağ oldu!
Bulud aldı bu dağların başını!

Xurşud deyər:demə qardaş yad oldu!
Ulduzumuz bir sönməyən od oldu!
Arzum gəlib arzulara qatıldı!
Gülən gördüm öz bəxtinin quşunu!

# OLDUM YAĞILAR QINAĞI

Hər kəsin şəfa qaynağı
Doğma obası – oymağı!

Torpaq çıxıb əlimizdən,
Yurd olub duşmən tapdağı!

Hər el dözməz belə dərdə,
Hər yurd çəkməz bu sınağı!

Məzəmmətdir, dərd yüküdür
Xalqın belinin yumağı!

Ucalıb Qaf dağlarına
Qaçqın, köçkünlərin ahı!

El gücünə güvənmədik!
Çağıraq dada Allahı!

Mənim iki gözüm göldü!
Göz yaşım yaxamda seldi!

Mən ağladım, düşmən güldü,
Oldum yağılar qınağı!

# GÖZLƏRİMİN HALI VARMI BAXMAĞA

Gözlərinin ulduzu çağırır məni,
Gözlərimin halı varmı baxmağa?
Hər sözünü güllə kimi sıxırsan!
Qəsd edirsən yandırmağa, yaxmağa!

Düz sarmadın mənlə fələk çarxıtək!
Yandı bağrım lalələrin bağrıtək!
Haqqı saxla, mərhəmətdə doğru çək
Cəhd eyləmə yar ürəyin yıxmağa!

Sən zərif ol! Sən incə ol, nəcib ol!
Təsəlli ol! Yar, könlümün içi ol!
Mən istərəm lap könlümə köçüb ol!
Fürsət vermə dərdin məni sıxmağa!



# ƏBÜLFƏT HEYDƏR

## AĞLADI

Gözəllər gözəli, ay gözəl vətən,
Səndən ayrı düşdü, ellər ağladı.
Dagıldı ellərin, söndü ocağın,
Sındı qol qanadın, əllər ağladı.

Igidlər dayandı sağın, solunda,
Ərlər şəhid oldu vətən yolunda.
Övladın can verdi, sənin qolunda,
Axıtdın göz yaşı, sellər ağladı.

Tanrı verdiyini geriyə aldı
Şövkətli ellərim virana qaldı.
Fələk asimandan dərd - kədər saldı,
Sızıldadı ruhlar, dillər ağladı.

Əbülfət vətənə anacan dedi,
Düşmənlərə qarşı qana-qan dedi.
Ərşdən səda gəldi, bir dayan dedi,
Dən düşdü saçına, tellər ağladı.

# GÖRƏN

Səni axtarıram xəyallarımda,
Vətən də xəyaldan itərmi görən?
Gənclik illərimin gülşəni sənsən,
Vətən də xəyaldan itərmi görən?

Söz-söhbətin qalıb, bir adın qalıb,
Səndə arzum qalıb, muradım qalıb.
Yazdığım şeirdə fəryadım qalıb,
Çəkdiyim əzablar yetərmi görən?
Vətən də xəyaldan itərmi görən?

Qoy düşüm dağlarda, izimi gəzim,
Qaya kögəsində özümü gəzim,
İsti ocağımı, közümü gəzim,
Bu həsrət tezliklə ötərmi görən?
Vətən də xəyaldan itərmi görən?

Sənsən qibləgahım, bəs pirım hanı?
Dağında, daşında ləpirim hanı?
Yerlə yeksan olan qəbirim hanı?
Gözümdən göz dağı gedərmi görən?
Vətən də xəyaldan itərmi görən?

Dünyaya gözümü sənnən açmışam,
Dumannan açmışam, çənnən açmışam,
Desəm Əbülfətəm, qəmnən açmışam,
Bu həsrət tezliklə bitərmi görən?
Vətən də xəyaldan itərmi görən?



# BAĞIŞLA MƏNİ

Günahgar qulunam, keç günahımdan,
Mərifət yazana bağışla məni,
Yunusu dəryadan qurtaran şahım,
O böyük soltana bağışla məni.

Kəlbala çölündə axdı qızıl qan,
Imam Hüseyinə bu canım qurban.
Yeri, göyü, ərşi, kürşü yaradan,
Şühəda yeksana bağışla məni.

İmam Zeynalabdın dilim əzbəri,
Qəlbimdə yaşatdım Həsən Əskəri.
Sənə sığınmışam imam Cəfəri,
Həzrəti Həsənə bağışla məni.

Əyyubən Nağıya qan ağlar gözüm,
Qərib İmam Rza söhbətim, şözüm.
Möminlər mömini Museyi Kazım,
Haqqı Xorasana bağışla məni.

Məhəmmətbağıra yetdi bir nida,
Həzrəti Abbasa bu canım fəda.
Mehdiyə güc verən Hikməti Xuda,
Ədalət divana bağışla məni.

Əbülfətəm, yoxdu mənim əlacım,
Fatmeyi - Zəhradır səadət tacım.
Dizimin taqəti, a Yusif hacım,
Müqəddəs Qurana bağışla məni.

# GƏLDİ

Ağbabadan köç elədik,
O dağlara duman gəldi.
Töküldük tozlu yollara,
O yurda qaxtağan gəldi.

Hərə üz tutdu bir yana,
Ah çəkərək yana-yana.
Geri baxdıq dönə-dönə,
Neçə betər zaman gəldi!?

Qərib olduq tapdıq qəmi,
Dindirmə məni, ay əmi!
"Can Ağbaba"deyən kimi
Əbülfətə iman gəldi!

# GÖRMÜRƏM

Öz-özümdən gileyliyəm qardaşım,
Gülən üzü, zarafatı görmürəm!
Bu dünyada sənsən mənim sirdaşım,
Şirin sözü, xoş söhbəti, görmürəm!

Durub köməyim də dar gündə ağam,
Onun sayəsində böyuk bir dağam.
Hərdən bir kövrələn dəcəl uşağam,
Uşaq kimi məhəbbəti görmürəm!

Ağrı dağın zirvələri görünür,
Ag örpəyi başımıza bürünür.
Onun buzu qəlbimizə sürünür,
Mənə olan hörməti, mən görmürəm!

Gözə dəymir mənim durnam, leyləyim,
Mən dərdimi görən kimə söyləyim.
Yalan tutub bu dünyanı neyləyim,
Gədalarda mən mürvəti  görmürəm!

Zalım fələk bizə atdı kəməndi,
Uçurdu bərəni, dağıtdı bəndi.
Yandı Əbülfətin şəhəri, kəndi,
Heç yerdə bu müsibəti görmürəm!

# İNDİ

Ellərimiz pərən - pərən olubdu,
Zalım fələk, qəm tütəyin çal indi.
Biz içmirik abu kövsər suyundan,
Durna gözlü buz bulaqlar qal indi.

Ağbabanı duman basıb, dərd alıb,
Ətəyində qarğa,quzğun kök salıb.
Qartalları yaralanıb tək qalıb,
Gen dərələr, xəyallara dal indi!

Uşaq ikən o yerlərdə gəzərdim,
Qartal olub qayalarda süzərdim,
Bağban olub bağından bar üzərdim,
Əbülfətdə qalıbmı o hal indi!?

# GÖRƏSƏN

Ağbabanın ləzzətini, ay balam,
Novruz vaxtı sel daşanda görəsən.
Dərələrdə əlvan güllər açanda,
Ördək - qaza qarışanda görəsən.

Axşamüstü Qaraxaçdan əsir yel,
Şımşək çaxır, sal qayalar açır dil.
Bayram vaxtı dərələrdən axan sel,
Arpa çaya qarışanda görəsən!

Əbülfətin sözü öz qiymətini,
Alar el içində düz qiymətini.
Sevən ürəklərdə göz qiymətini,
Taleləri barışanda görəsən.



# OYNASIN

Durma qızlar meydan indi sizindi,
Bu meydanda tuti dillər oynasın!
Sığal ver saçına, ay gözəl Pəri,
Toz dəyməsin zərif tellər oynasın!

Yerişi - duruşu sanki bir sona.
Allah naxış çəkib cilvədən ona,
Al – yaşıl geyinib çıx bu meydana,
İnciməsin, incə bellər oynasın!

Əbülfətəm, gözəllərdi əzbərim,
Əlim qələmimdi, sinəm dəftərim.
Sizə zəhmət çəkdi yazıq əllərim,
Əl qaldırın,nurlu əllər oynasın!



# OLAR

Bir kişi ki,gedər oldu biyara,
Bu yolda çoxları ona yar olar!
Gecələr yuxusu çəkilər ərşə,
Yediyi-içdiyi zəhrimar olar!

Oğul-uşaq çıxar onun yadınnan,
Ləzzət ilə gəzər qıznan,qadınnan,
Bülbül kimi ötər subay adınnan,
Yad eldə yad kimi dildə car olar!

Ötər güllü yazı,qarşılar qışı,
Baxıb görərsən ki,dümağdır başı,
Yüz deyil bəlkə də əllidir yaşı,
Bu yaşda nəsibi ahu zar olar!

O daşdan – kəsəkdən  çıxarır pulu,
Dolanmaqdan ötrü yox başqa yolu,
Axır saqqat olur yazığın qolu,
Tay-tuşdan seçilib eldə xar olar!

Deyən yox, dördəlli  tutumusan pulu,
Cavansan fikirləş, ey dəli-dolu,
Tanrı kərəmlidir, göstərər yolu,
Yola gəlməyənin yolu dar olar!

Əbülfət üz tutar dağa-arana,
Hərdən bir düşərəm qara - borana.
Sözümü deyirəm qanan cavana,
Hər quş yuvasında bəxtiyar olar.

# QALIBDI

Ay ağalar gəlin sizə söyləyim,
Mənim sözüm Ağbabada qalıbdı.
Fələk salıb məni qəmnən kəməndə,
Gülən üzüm Ağbabada qalıbdı.

Yoxdu mənim hayım, halım, həlayım,
Səndən ayrı necə gülüm - aglayım.
Aç sinəni yaraların bağlayım,
Görən gözüm Ağbabada qalıbdı.

Düz qəddim əyilir, belim bükülür,
Gəldiyim yollara gözüm dikilir,
Mənim yurdum bünövrədən sökülür,
Səbr, dözüm Ağbabada qalıbdı.

Fələk mənə verdi qüssəni, qəmi,
Çəkirəm əzabı ağırdı dəmi.
Əbülfət, tapılmır bu işin çəmi,
Dağım, düzüm Ağbabada qalıbdı.



# GƏL

Gizli sirrim bəyan oldu, ay anam,
Çiçəkləri düzə, düzə, düzə gəl.
Kövrək könlü məyus etmə ay canım,
Asta yeri, ləçəkləri üzə, üzə, gəl.

Kövrək könlü bas sinənə bəstələ,
Güllərimi dəstə - dəstə dəstələ.
Mən yazığı gözəllərlə dost elə,
Bu yerləri gəzə - gəzə, bəzə gəl.

Nur yağışı qəlbdən yağır göllənir,
Qəlb evimin çiçəkləri tellənir.
Əbülfətin könül quşu dillənir,
İnsaf eylə, süzə - süzə, bizə gəl.

# QALMADI

Baharım tələsdi, yazım tələsdi,
Daha mən yazıqda dözüm qalmadı.
Üflədi üzümə şaxtalı, yellər,
Gəzdiyim yollarda izim qalmadı.

Başım açılmadı dumandan, çəndən,
Üzüldü əllərim doğma vətəndən.
Elə doymuşam ki, kədərdən, qəmdən,
Daha bu dünyada gözüm qalmadı.

Vuruldum gözəlin qələm qaşına,
Onun üçün girdim qəm savaşına.
Fələk məni çırpdı əhlət daşına,
Yandım külə döndüm, közüm qalmadı.

Qocalıq qəddimi kaman tək əydi,
Fələk mən yazığı dörd əllə döydü.
Halımı görənlər çox  mana söydü,
Dinib - danışmağa sözüm qalmadı.



**Agbaba aşıq sənətinin incisi Aşıq Nəsibin ruhuna ithaf edirəm.**

**AŞIQ NƏSİB SAYAĞI**

## ÖLDÜRDÜ MƏNİ

Bir gözəlin göz yaşının,
Yağışı öldürdü məni.
Bu zalımın balasının,
Baxışı öldürdü məni.

Düşdüm eşqin bəlasına,
Dustaq oldum qalasına.
Könül verdim xalasına,
Qarğışı öldürdü məni.

Qollarımı gözəl çatdı,
Əbülfət meydanda matdı.
Iqbal döndü, bəxtim yatdı,
Alqışı öldürdü məni.



**1970 – 1982 - ci illərdə Qərbi Azərbaycanın Ağbaba mahalının Düzkənd kənd orta məktəbinin direktoru olmuş, tanınmış pedaqoq, gözəl insan və görkəmli el ağsaqqalı Abuzər Ələsgərovun xatirəsinə İthaf edirəm**.

## NEYLƏYİM

Bacarmadım dayandıram karvanı,
Abuzərim son gedişdi, neyləyim.
Torpaq verib, torpaq alır insanı,
Bu fələkdən gələn işdi, neyləyim.

Tapılmadı dərdlərinin şəfaşı
Dərdin ağır, sağalmadı yarası,
Torpaq ana, biz torpağın balası,
Bu da belə bir gərdişdi, neyləyim.

Şirin xatirələr qara bağladı,
Dəniz ləpələndi, çaylar çağladı.
Şəlalə hıçqırdı, bulaq ağladı,
Əcəl sənlə çox döyüşdü, neyləyim!?

Qəzanın oxları ömrümə süzdü,
Dağ dözməz dərdlərə Əbülfət dözdü.
Bahar gəncliyimi dəryalar üzdü,
Bu ayrılıq bizə düşdü, neyləyim.



**Qərbi Azərbaycanın (indiki Ermənistan) Ağbaba mahalının Mağaracıq kəndində dünyaya göz açan, Amasiya rayon xəstəxanasında təcrübəli uşaq həkimi kimi fəaliyyət göstərən və Ağbabanın işğalından sonrakı dövrlərdə Bakı şəhərində minlərlə xəstə uşaqlara ikinci həyat verən Təhməz Həmzəyevin xatirəsinə həsr edirəm.**

## KÖNLÜMÜN

Təbibim, loğmanım köçdü dünyadan,
Parlayan ulduzu söndü könlümün.
Sevinc dedim qəm ələndi payıma,
Bağçası xəzana döndü könlümün.

Gördüm ki, titrəyir əsir əlləri,
Halını soruşdum, doldu gözləri.
Qaldı qulağımda şirin sözləri,
Dağıldı bərəsi, bəndi könlümün.

Körpə uşaqların dilin biləndi,
Xoşsifət adamdı, deyib- güləndi.
O getdi ürəyim qəmə bələndi,
Can evi dumandı, çəndi könlümün.

Qaldı ürəklərdə Təhməzin adı,
Zəhrimara döndü ağzımın dadı.
Yas tutdu həkimin qohumu- yadı,
Yıxıldı şəhəri, kəndi könlümün.

Getdi, qəfil getdi Novruz qabağı,
Getdi həkimlərin ürəkdən sağı.
Söndü Əbülfətin o nur çırağı,
Qəmi tuğyan etdi indi könlümün.



**1965 – 1969 - cu illərdə Qərbi Azərbaycanın (indiki Ermənistanın) Amasiya rayonunun icraiyyə komitəsinin sədri, 1974 – 1981- ci illər ərəfəsində Amasiya rayonunda partiya komitəsinin birinci katibi vəzivəsində çalışmış, öz xalqına və millətinə qarşı ləyaqətlə xidmət edən, görkəmli ziyalı, qəhrəman, cəsur, mərd və igid Türk oğlu Cahangir Həsənalı oğlu Əliyevin xatirəsinə həsr edirəm.**

## YAVAŞ, YAVAŞ

Bu gün Cahangirin dəfn günüdür,
Axışır hüzünə el, yavaş - yavaş.
Vətən övladına əlvida deyır,
Axır gözlərimdən sel yavaş - yavaş.

Heç bilmədən, gözümdən yaş süzüldü,
Damlaları karvan kimi düzüldü.
Bəd xəbərdən doğmaları üzüldü,
Təpidi ağzımda dil yavaş - yavaş.

Göydə qartal qanadını saxladı,
Pərvanə alışdı, bülbül ağladı.
Yazıq canım dərd içində çağladı,
Bir mərd kişi getdi, bil, yavaş - yavaş.

Yolların bağlansın, ay qara xəbər,
Üzmə Əbülfəti, üzmə bu qədər.
Sübh çağı üzümüzə açılan səhər,
Gedir ömrümüzdən il, yavaş - yavaş



# NƏ GÜNÜM VAR, NƏ AYIM VAR NƏ İLİM

Vətən dərdi mən yazığı tapdadı,
Nə yurdum var, nə yuvam var, nə elim.
Ağlamağa gözü hardan alım mən,
Nə sözüm var, nə gözüm var, nə dilim.

Soruşmayın mənim halım necədi,
Gündüzlərim zil-qaranlıq kecədi,
Mahudum bez, məxmərimsə keçədi,
Nə dağım var, nə dərəm var, nə yolum.

Bizim dağlar ayrılıqdan lal olub,
Bu ayrılıq ürəyimizdə xal olub.
Hicran qəmi dilimizdə bal olub,
Nə odum var, nə közüm var, nə külüm.

Zalım fələk çox amansız olubdu,
Hicran məni kəməndinə salıbdı.
Yurdum-yuvam yağılara qalıbdı,
Nə bağım var, nə bağçam var, nə gülüm.

Hicran qəmi pərdə çəkdi gözümə,
Bu  əllərim yağı oldu dizimə.
Əbülfətəm, inanmazlar sözümə,
Nə günüm var, nə ayım var, nə ilim.



# DÜŞDÜYÜM BU HALA GÜLMƏYİM GƏLİR

Günlərim ömürdən ged ha get oldu,
Dəyişdi zamanə, dövran bəd oldu.
Dost – tanışlar tamam məndən yad oldu,
Düşdüyüm bu hala gülməyim gəlir.

Ömrün bahar çağı keçdi dənizdə,
O keçmiş günləri yaşatdım sözdə.
Bir də oyandım ki, qalmışam düzdə,
Düşdüyüm bu hala gülməyim gəlir.

Səmaya baxıram səma göm – göydü,
Qızmar yay günəşi başıma döydü.
Halım görənlər çox mana söydü,
Düşdüyüm bu hala gülməyim gəlir.

Naşı oldum başım keçdi kəndirə,
Fələyin zərbindən düşdüm təndirə.
Bir kimsənəm yoxdu məni dindirə,
Düşdüyüm bu hala gülməyim gəlir.

Vay o gündən, qara da səndən ağ uma,
Yaxınların yaman günə göz yuma.
Batdım dost yolunda palçığa - quma,
Düşdüyüm bu hala gülməyim gəlir.

Yalan gəlməz Əbülfətin dilinə,
Yaxam keçdi naşı həkimin əlinə.
Karvan keçməz gözlərimin selinə,
Düşdüyüm bu hala gülməyim gəlir.



# KÖVRƏLMİŞƏM, ZAMAN MƏNİ QOCALDIB

Təpədən - dırnağa qubaram, qəməm,
Kövrəlmişəm, zaman məni qocaldıb.
Sinəsi hicrana tuş gələn mənəm,
Kövrəlmışəm, zaman məni qocaldıb.

Perik düşdüm öz yurdumdan, elımdən,
Danışanda nalə qopur dılimdən.
Göl yaranır gözlərimin selındən,
Kövrəlmişəm, zaman məni qocaldıb.

Biz bilmədik Ağbabanın qədrini,
Aradıq, axtardıq, tapdıq mərdini.
Ömrü boyu çəkə - çəkə dərdini,
Kövrəlmişəm, zaman məni qocaldıb.

Fələk məni daşa basdı budadı,
Hiçran qəmi canda tutar qoymadı,
Könlümün göylərə çıxdı fəryadı.
Kövrəlmişəm, zaman məni qocaldıb.

Kimsə yetməz harayıma, hayıma,
Qar ələndi baharıma, yayıma.
Əbülfətəm, qəm düşübdü payıma,
Kövrəlmişəm, zaman məni qocaldıb.

# TAPDIM SƏNİ

Yüz qırx il yol getdim, heç yorulmadım,
Ömrümün yazında, mən tapdım səni.
Dağları, daşları yıxıb dağıtdım,
Könlümün düzündə, mən tapdım səni.

Yarımçıq işləri ustadım gördü,
Yıxılmış daşları binəmə hördü.
Allaha yalvardım mənə güc verdı,
Atamın özündə, mən tapdım səni.

Hündür qayalara - dağlara qaxdım,
Gurlayan çağlayan sellərə baxdım.
Çaylara qarışdım, göllərə axdım,
Cənnətin gözündə, mən tapdım səni.



# QORUYA BİLMƏDİK VƏTƏNİMİZİ

Bağışla ustadım, bağışla bizi,
Qoruya bilmədik vətənəmizi.
Quranın xətrinə bağışla bizi,
Qoruya bilmədik vətənəmizi.

Kar olduq, kor olduq, gözdə yaş olduq,
Harda dərd oldusa, orda baş olduq.
Sizlərə oğul yox , qara daş olduq,
Qoruya bilmədik vətənimizi.

Unutduq keçmişi, unutduq dərdi,
Unutduq namərdi, unutduq mərdi.
Vətənsizlik yetimlikdən betərdi!
Qoruya bilmədik vətənimizi.

# AĞBABADAN XƏBƏR VERİN

Ağlağandan qalxan duman,
O yandan bir xəbər verin.
Sinəsinə dağ çəkilən,
El-obadan xəbər verin.
Qapıları bağlı qalan,
Malı-mülkü talan olan,
Qəbirləri yeksan olan,
Ağbabadan xəbər verin.

Qaraxaçdan əsən yellər,
Duman – çəni bəri gətir.
Dərələrdən gül-çiçəyi,
Dağlardan qarı gətir.
Liliparlı bulaqlardan,
Gözlərimə nuru gətir.
O dağların balasıyam,
Yurd-yuvadan xəbər verin.

Dümüşəm qəm dəryasına,
Gözlərimdə yaş gəlmişəm.
Başkeçiddən Yırğançağa,
Sanki, bağrı daş gəlmişəm.
And içirəm Əbülfətəm,
Dərdi – qəmə tuş gəlmişəm.
Ayaq altda taptalanan,
Ruhlardan xəbər verin.
Qəbirləri yeksan olan,
Ağbabadan xəbər verin.

---

Ağlağan - Ağbabada 2650 m hündürlüyündə dağ adıdır
Qaraxaç - Ağbabada 2800m hündürlüyündə dağ adıdır



# YERİNDƏDİR

Söz mülkükün xridarı,
Əhli hal yerindədir.
Ocağın çiçək açıb,
Cah - cəlal yerindədir.
Getdiyin yol haq yoludu,
Məndə onun quluyam,
Mövlam mənə kömək durub,
Xoş məlal yerindədir.

Mən bir urfan adamıyam,
Ağırdı yüküm mənim.
Sevinc nədi bilməmişəm,
Dağılıb mülküm mənim.
Bu dərd saçları agartdı,
Qalmadı tüküm mənim.
Dəli dərvişə bənzərəm,
Əql kamal yerindədir.

Ağac kök üstündə bitər,
Qınama Əbülfəti.
Bir zaman gələr, bilinər,
Onun qədri- qiyməti.
Aylar illəri qovduqca
Qalmır onun taqəti.
Məqamım həmin məqamdı,
Hal əhval yerindədir.



# NƏTİCƏ

**Azərbaycan Respublikasının elm - təhsil sahəsində böyük zəhməti olan, öz xalqına və millətinə qarşı ləyaqətlə xidmət edən, görkəmli ziyalı, gözəl alim, el ağsaqqalı, mənim əziz müəllimim və bundan sonra da yaradıcılığına ehtiyac duyduğum Qərbi Azərbaycanın Ağbaba mahalının mərd və cəsur ovladı**

**X U R Ş U D müəllimə!**

**Səmimi duyğularla Aşıq Heydərin nəticəsi, Əbülfət Heydərdən (Yusif oğlu Heydərovdan).**

**Görkəmli ziyalı, mehriban ata, Ağbabanın mərd və cəsur ovladı Xurşud müəllim, Aşıq Heydərin yaradıcılığına həsr olunmuş bu kitabının işıq üzü görməsi üçün sizin xeyir-duanızı istəyirəm.**

Aşıq Heydər təkcə bir nəslin qürur mənbəyi deyil, eyni zamanda Qərbi Azərbaycanın Ağbaba mahalının boya-başa çatdırdığı ustad sənətkarlardan biridir.

Aşıq Heydərin yaşadığı dövr (1867-1949) rus-erməni daşnaq hərbi birləşmələri tərəfindən ana vətən torpaqlarımızın işğalı dövrünə təsadüf edir. Buna görə də onun əsərlərində toplanmış materiallar Azərbaycan xalqının keçmişi ilə müasir həyatı arasında körpü rolunu oynayır.

1918-1920-ci illərdə Ağbaba Milli Şurasının Sədri Hacı Abbas oğlu Məhəmməd ağa, Aşıq Heydəri Ağbaba Süvari Alayının incisi adlandirmışdır.

Bu baxımdan Aşıq Heydərin ədəbi - bədii irsinə etnoqrafik mənbə kimi müraciət etməyiniz təsadüfi hadisə kimi deyil, tamamilə aktual və normal hal kimi qəbul edilməlidir.

Bəli, folklor mədəniyyətin təzahürü olub, xalqın elmi baxışlar sistemi və çoxsaylı elmi çarpazlaşmalar mənbəyidir.



Aşıq Heydərin yaradıcılığı zəngin bir xəzinədir.

Aşıq Heydər yaradıcılığında Sovet hökumətinə tariflər olmadığına görə, mətbuat aşığın üzünə bağlanmışdır.

Aşıq Heydər Qafqaz və iç Anadolu torpaqlarında erməni daşnaqlarının törətdikləri qanlı cinayətləri aydın ifşa etdiyindən, onun yaradıcılığı uzun illər açılmamışdır.

Aşıq Heydərin özü və yaxın qohumları erməni daşnaqları tərəfindən dəfələrlə hədə-qorxulara məruz qalmışdır. 1937-1940-cı illər Aşıq Heydər üçün ağrılı-acılı illər olmuş, özünün deriyi kimi erməni daşnaqları tərəfindən Amasiya rayonunda yaradılan üçlüklər vastəsilə 70 yaşlı aşığın Sibrə sürgün olunma məsələsinin ortaya atılması və yaxın qohumlarının isə öldürülməsi ilə (Məşədi Rəcəbin üç nəvəsi) nəticələnmişdir.

Aşıq Heydərin xatirəsinə ithaf olunmuş bu kitabın işıq üzü görməsi üçün, Xurşud müəllim Sizin və Tacır Səmiminin zəhməti çox böyükdür. "Azərbaycan Milləti" və "Böyük Türk" dünyası naminə Sızə bundan sonra da belə çətin və şərəfli işlərin davam etdirilməsində müvəffəqiyyətlər arzulayıram.

Yusif Rəhim oğlu Heydərovun səmimi qəlbdən olan salamını Sizə çatdırıram.

Ümid edirik ki, ictimayətin və geniş oxucu auditoriyasının mühakiməsinə verdiyimiz bu əsər Aşıq Heydərin irsini sevənlər və dəyərləndirənlər tərəfindən lazımınca qiymətləndiriləcək.

Böyük yaradanın insanlara bəxş etdiyi can sağlığı, sizin və ailənizin üstündən əksik olmasın. Amin!

Sizi sevən, sizinlə fəxr edən və sizinlə qürur hissi keçirən

Əbülfət Heydər.

01.01.2014- cü il



# SON SÖZ

Aşıq Heydər Qərbi Azərbaycanın (indiki Ermənistanın) Ağbaba mahalında çox böyük sənatkar, saz – söz ustası olan şəxsiyyət olub. Ömrünü indi əlimizdən çıxmış Ağbaba torpağında böyük faciə içərisində keçirmiş bu görkəmli el sənətkarı, qaxtağan ermənilərin, Azərbaycanın, Azəri türklərinin, qənimi olan şovinist rusların zülmünə dözməmiş, 1918 – 20 – ci illərdə və ondan sonra bu zülmə, haqsızlığa qarşı müqəddəs mübarizə aparmışdır. 25 ildən artıqdır ki, Ağbaba elinin bütün əhalisi əvvəllər olduğu kimi, indi də, 1988 – ci il deportasiyası və repressiyasına məruz qalmışlar. Bizim doğma ana vətən torpaqlarımız olan Ağbaba, İrəvan, Göyçə, Vedi, Dərəlyəz, Qafan, Sisyan, Mehri indiyə kimi gavur ermənilərin taptağı altındadır. Bu çox ağlasığmaz bir ədalətsizlikdir. O torpaqlarda qalan ata – babalarımızın, Aşıq Heydərlərin, Məşədi Rəcəblərin, Hacı Abbas oğlu Məhəmmədlərin və minlərlə, on minlərlə soydaşlarımızın qərib ruhları düşmən taptağı altında inləyir. İndi bütöv Dağlıq Qarabağ, həmçinin ona bitişik olan Laçın, Kəlbəcər, Qubadlı, Cəbrayıl, Fizuli, Zəngilan, Ağdam kimi bölgələrimiz, Azərbaycan torpaqlarının ¼ - i, yəni 26,6 min kvadrat kilometr ərazisi ermənilər tərəfdən işğal edilmişdir. Bu böyük tarixi faciədir ki, Azərbaycan xalqı yaşamaqdadır! Biz bütün dünyada olan və gələn gənc nəsillərimizlə bir yumruq kimi birləşib, rusların bilavasitə iştirakı ilə torpaqlarımızı işğal edən gavur murdar düşməni öz torpaqlarımızdan azad edib, qərib ruhlarımızı sevindirməliyik! Mən əminəm ki, sadiq müsəlman olan Azəri Türklərinin Qadir Allahı gavur düşmənin dərsini verib öz yurdlarını azad etmək fürsətini bizdən əsirgəməyəcəkdir! O zaman da Aşıq Heydər kimi müqəddəs şəxsiyyətlərimizin ruhuna dualar oxunub onları sevindirəcəyik!

Bu kitab onların xatirəsini əbədiləşdirmək üçün sənətkarın irsini itib – batmağa qoymayan ona yaxın olan insanların zəhmətinin məhsuludur.

**Pedoqogika üzrə fəlsəfə doktoru: Xurşud Məmmədli**



# İZAHLAR

1. Ağbaba bölgəsində eyni adlı (Beymuraz) iki dastan vardır. Bunlardan biri Aşıq Heydərin, ikincisi Aşıq Qənbərindir. Birinci dastanda təsvir edilən Beymuraz tarixi şəxs olub, əslən Güney Azərbaycanındandır. Onun qəbri Gümrü qəbiristanlığında Beşmüqəddəslər deyilən ərazidə yerləşirdi, Beymuz ziyarətgahı kimi tanınmışdı. Bu ziyarətgaha övladı olmayan qadınlar pənah gətiridilər (biz bu məlumatı 80 yaşlı Aşıq Qənbərdən (İlanlı kəndi) almışıq). Hazırda həmin qəbiristanlıq dağıdılmış, onun yerində binalar ucaldılmışdır.

2. Aşıq Qənbərin söylədiyi bir əhvalatı olduğu kimi verməyi məqbul hesab etdik: «Bir dəfə bizim kəndə bir aşıq gəlmişdi (biz nə qədər xahiş etsək də, aşıq onun adını demədi – T.S.), özünü çox öydü, hələ mənə lağ etməyi də unutmadı. Bu, mənə toxunsa da, qonaqdı deyə onun könlünə toxunmadım. Amma ona əməlli-başlı dərs verməyi qərara aldım. Odur ki, dedim:

– Sən ki, belə hünərlisən, onda mən səhər Güllübulaq kəndinə gedəcəm. Məndən sonra sən də o kəndə gedə bilərsənmi?

– Niyə getmirəm?

– Yaxşı, nə deyirəm.

Bəli, mən Güllübulağa getdim. Bir yaxşı məclis qurdum. Başladım «Abbas və Gülgəz»dən danışmağa. Nağılın ortasında özümnən bir əhvalat toxudum. Elə ustalıxnan çalıb-oxudum ki, camaat çox razı qaldı. Qayıdıb gəldim evə. Bəli, məndən sonra həmin aşıq gedir oraya. O saat camaat bunun üstünü kəsdirir ki, «Abbas və Gülgəz»də filan yer var, onu danış. Aşıq qalır mətəl. Kor-peşman qayıdır geri.

Gecənin bir vaxtı baxdım qapı döyülür. Açdım, budu. Bu məni görən kimi başladı acılamağa:

– Allah sənin evini yıxsın, Qənbər! Əyə, «Abbas və Gülgəz»də filan yer var? Yoxdu axı.

– Bəs sən özünü öyürdün, bir şey tapıb deyəydin. Amma mən istənilən dastanın bir yerində bir şey toxuya bilərəm. İndi özünə də bax, mənə də.

Aşıq qaldı udquna-udquna.

Mən onu deyim ki, bu ustalığı Aşıq Heydərdən götürmüşəm. Allah ona rəhmət eləsin, indi də işlədirəm».



# FAKTLAR, SƏNƏDLƏR VƏ XATİRƏLƏR HAQQINDA QEYDLƏR

Xaraba Ağbabanın abadlaşdırılması; Hazirlayanı, Türkiyənin Ankara şəhəri, **Səlahəddin Tozlu.**

Ağbaba kəndləri; Hazirlayanı, **Çətin Koşucu.**

Tarixi faktlar, həqiqətlər və şəxsiyyətlər haqqında; Aşıq Heydərin Məşədi Rəcəblə son görüşü; Aşıq Heydəri Kəlbəlayı Xəbər oğlu Rustam ağa haqqında xatirələri; Ağbaba və Şörəyelin mərd oğulları (General Məhəmmədəli); 1937-1941-ci illərdə erməni daşnaqları tərəfindən "Üçlüklər" vastəsilə qətlə yetirilmiş Ağbaba mahalının Düzkənd kəndinin siyasi məhbusları: Yazıya alınıb. 82 yaşlı **Yusif babadan** (Düzkənd kəndi)

Məşədi Rəcəbin Gümrü şəhəri ilə bağlı xatirələri, Gümrünün göz yaşları; Məşədi Rəcəbin Ağbaba uğrunda gedən döyüşlərdə Ağbaba süvari alayı ilə şərqi erməni dviziyasının Axırkələk polku arasında baş vermiş döyüşlərin xronolojiyası barəsində xatirələri 19 mart 1920-ci il; Unutsaq Unudularıq; Ağbaba uğrunda gedən döyüşlərdə şərqi erməni dviziyasının Axırkələk polkunun məğlubiyyətə uğraması. Ağbaba Qırğınları (avqust 1918-ci il);

Toplanılıb yazıya alınıb. **Məmmədov Məhəmməd Rəcəb oğlundan** (Düzkənd kəndi 1940 ci il)

Ağbaba mahalında şərqi erməni dviziyasının təşkil etdiyi "Ovçular planı". Çevik təyinatli Ağbaba süvari alayının komutanları, Yüzbaşı Qaşaq oğlu Hacıvəli və Yüzbaşı Həşim Murtuz oğlu Ağbabanın öldürülməsi; **Axundov Əhməd Əli oğlunun** (Göllü kəndi noyabr 1941-ci il) dedikləri əsasında yazılıb. Bunu Yusif babadan yazıya aldıq. O,Əhməd kişidən eşitdiklərini bizə danışdı.

---

## İstifadə olunan ədəbiyyat:

Македоно-одринското опълчение 1912—1913. Личен състав по документи на Дирекция **«Централен военен архив», София 2006, с. 521**, Михайлов, Иван. Карекин Нъждех, в. Македонска трибуна, г. 31, бр. 1601, 21 ноември 1957

Овсепян В. **Гарегин Нжде и КГБ — воспоминания разведчика**
2004. — 338 р. — ISBN 076580834X,ISBN 9780765808349

**Елисеев Ф. И. Казаки на Кавказском фронте 1914-1917: Записки полковника Кубан. казачьего войска в тринадцати брошюрах-тетрадях. — М.: Воениздат, 2001. — 308 с. (Редкая книга). Тираж 5000 экз.**
**Часть 1. Начало войны, первые операции в Турции, взятие Баязета**
**Часть 2. Занятие Вана. «Ванская резня». Эрзерумская операция**
**Часть 3. 1916 год. Взятие Мемахатуна**
**Часть 4. 1917 год. Последние победы на Кавказе**

**Документ № 144**

Приложение 2. **Составы троек НКВД—УНКВД 1937–1938 гг., созданных для рассмотрения дел арестованных в ходе массовой операции по приказу НКВД СССР № 00447 от 30 июля 1937 г.**
**Архив: ЦА ФСБ РФ. Ф. 3. Оп. 4. Д. 586. Л. 2-4. Подлинник**

# SÖYLƏYİCİLƏR HAQQINDA MƏLUMAT

Qaçaq Usubun oğlu Hacıvəlinin Qars məhkəməsi; Aşıq Heydər və qohumlarının İrana getməsi; Yazılmamaış tariximiz; Aşıq Heydərin son vəsiyyəti ;
Söyləyəni: 82 yaşlı **Yusif baba** (Düzkənd kəndi)

**Bayatılar**.
Söyləyəni: 82 yaşlı **Yusif baba** ( Düzkənd kəndi)

**Nəğmələr**.
Söyləyəni: 82 yaşlı **Yusif baba** (Düzkənd kəndi)

**Rəvayətlər:** Telli qarı. Söyləyəni: – 70 yaşlı **Mahmud baba** (Təzə İbiş kəndi)

Xəsis ağaynan Aşıq Heydər. Aşıq Heydərin məhkəməsi.
Söyləyəni: 77 yaşlı **Hümmət baba** (Təzə İbiş kəndi).

Oruc kişinin əhvalatı.
Söyləyəni: 70 yaşlı **Alı baba** (Göllü kəndi)

Mərd olan yerdə dərd olmaz.
Söyləyəni : 67 yaşlı **Qara Calal** (Güllücə kəndi).

Arpa məsələsi. İnək oğrusu. Məhəmmədin zarafatı.
Söyləyəni: 82 yaşlı **Yusif baba** (Düzkənd kəndi).

Dəli Məşədi, Vaxtsız gələn qonaq, Aşıq Heydərin Müqəddəs Məkkə ziyaratı.
Söyləyəni: 80 yaşlı **İsgəndər baba** (Göllü kəndi).

**Gəraylılar.**

Yaz havası, Vədəsidi, Mənə qara deyən gözəl, Kimə deyim.
Söyləyəni: 101 yaşlı **Cəlil baba** (Qaraçanta kəndi).

Ana, Gedirəm, Bilmirəm, Yaralama, Mərd sağ olsun, Olsa da,
Söyləyəni: 80 yaşlı **İsgəndər baba** (Göllü kəndi).

Kirvə, məni qonaq eylə.
Söyləyəni: 82 yaşlı **Yusif baba** (Düzkənd kəndi).

**Qoşmalar.**
Oynatmasın. Kəsdi. Gəl. Göstərim. Düşdü. Oy oda məni. Söylə hardasan. Bu gələn gözəl.Gəlib gedənlər. Ağlasın. Bu sevdaya düşən günü ölmüşəm..
Söyləyəni: 82 yaşlı **Yusif baba** (Düzkənd kəndi).

Getdi şan – şöhrətim daha nə deyim. Ağbaba dağı. Bax – bax. Oldu. Onda dedim La İlahə İlallah. Getdi şan şöhrətim daha nə deyim. Axı bu tutuşla hara gedirik.
Söyləyəni: 101 yaşlı **Seyid Həsən baba** (Qaraçanta kəndi).

Tək qalıb. Qaldım. Bax,İndi. Bu dünyada haqq ədalət görmədim. Üç yaşına çatıram. Eylər. Ay hayıf hayıf. Bacım. Ağlayır. Gələndə. Meydanıma. Xoflanma. Gəl eşit məni. Dolanır.
Söyləyəni: 80 yaşlı **İsgəndər baba** ( Göllü kəndi)

Dağların. Yaşıl baş sonalar göllərə gəlir. Qalmadı. Dolanır. Mənim. Mən bilmirəm kimə deyim dərdimi. Düşdü.

Söyləyəni: 80 yaşlı **Aşıq Qənbər** (İlanlı kəndi)
Sənəm gəl. Verdilər. Zamanənin ələyindən ələndim. Görən harda belə gözəl məkan var.
Söyləyəni: 70 yaşlı **Alı baba** ( Göllü kəndi).
**Ustadnamə.**
Söyləyəni: 80 yaşlı **İsgəndər baba** ( Göllü kəndı)
**Təcnis.**
Ay ağa.
Söyləyəni: 82 yaşlı **Yusif baba** (Düzkənd kəndi)
**Divani.**
Görüm. Sən. Var. Molla Qara.
Söyləyəni: 80 yaşlı **İsgəndər baba** (Göllü kəndi).
Gəlmişəm. Düşmüşəm. Olubdu.
Söyləyəni: 82 yaşlı **Yusif baba** (Düzkənd kəndi)
**Qıfılbənd.**
Kimdədi.
Söyləyəni: 80 yaşlı **İsgəndər baba** (Göllü kəndi).
**Bənzətmə.**
Gərək.
Söyləyəni: 82 yaşlı **Yusif baba** (Düzkənd kəndi)
**Deyişmələr.**
Aşıq Qənbərlə deyişmə.
Söyləyəni: 80 yaşlı **Aşıq Qənbər** (İlanlı kəndi).
Mərəndli Məşədi Muxtarla deyişmə. Şikəstə Pəri ilə deyişmə.
Söyləyəni: 82 yaşlı **Yusif baba** (Düzkənd kəndi).
Aşıq Nəsiblə deyişmələr. Çoban Əli ilə deyişmə.
Söyləyəni: 101 yaşında **Cəlil baba** ( Qaraçanta kəndi).
**Gümrü qızı dastanı,**
Söyləyəni: 82 yaşında **Yusif baba** (Düzkənd kəndi)
**Aşıq rəvayətləri.**
Aşıq Heydərin Akalkələk səfəri.
Söyləyəni:70 yaşlı **Mahmud baba** (Təzə İbiş kəndi).
Yetim Ləvəndin Aşıq Heydərlə görüşməsi. Aşıq Heydərin pəhləvan Heydərlə görüşməyi.
Söyləyəni; 80 yaşlı **İsgəndər baba** (Göllü kəndi).
Hacabbas oğlu Mahmud ağanın Xasfiya səfəri.
Söyləyəni: 70 yaşlı **Alı baba** (Göllü kəndi)
Aşıq Heydərlə Öksüzlü Aşıq Məhəmməd.
Söyləyəni: 82 yaşlı **Yusif baba** (Düzkənd kəndi)

# S Ö Z L Ü K

## A
Ajal.......................................................................................................Əcəl
Akuşka..............................................................................................Pəncərə
Aloy..........................................................................................................Alov
Axir...........................................................................................................Son
Andır......................................................................................................Uğursuz
Ayam.........................................................................................Hava, iqlim
Azar.........................................................................................................Dərd
Anarı...................................................................................O tərəfə, o yana

## B
Bab...........................................................................................................Qapı
Bac............................................................................................................Vergi
Bala...........................................................................................................Övlad
Başbord.................................................................................................Pasport
Beyqafıl......................................................................................................Ani
Bihuş......................................................................................................Sərxoş
Bıldır.....................................................................................................Keçən il
Bulax......................................................................................................Çeşmə

## C
Cahal........................................................................................................Gənc
Cındır...............................................................................Köhnəlmiş, yararsız
Cil.....................................................................Həsr toxumaq üçün uzun ot
Cudam.......................................................................................................Rəzil
Cimcimə...................................................................Yağışda tam islanmaq

## Ç
Çuğul......................................................................................................Satqın
Çolax....................................................................................................Axsayan
Çəkil....................................................................................O tərəfə dur

## D
Damağı çağ.........................................................................................Kefi kök
Dazalax ..................................................................................................Keçəl
Dad........................................................................................................Şikayət
Damcı......................................................................................................Damla
Derder.........................................................................Xristiyanlarda din xadimi
Dirəy..........................................................................................................Stün

**Ə**

Ədət.....................................................................................................Adət
Əmə....................................................................................................Amma
Əzim....................................................................................................Böyük
Əcəli mağallax...........................................................Amansız gələn ölüm
Ər.........................................................................................................Kişi
Əyin, baş....................................................................................Geyimi, vidi
Ənkür.........................................................................................Sual mələyi

**F**

Faraş.............................................................................................Sağlam
Fırıllax..........................................................................................Yalançı
Furkan...............................................................................................Ouran

**Q**

Qımı.......................................................................................Yabanı bitki
Qav, qacax.......................................................................Qab, yemək dəst
Qarğış...........................................................................................Bəd dua
Qarğın.......................................................................................Sel,daşqın
Qansız.......................................................................................Kafir,zalım
Qaxtağan..............................................................................Gəlmə ermənilər
Qırıx.............................................................................................Sınmış
Qırax................................................................................................Kənar
Qıvla................................................................................................Qiblə
Qurvan............................................................................................Qurban
Qonax..............................................................................................Qonaq
Qələt..........................................................................................Xata, suç
Qürrələnmə........................................................................Özünə güvənmə

**G**

Gədə......................................................................................Oğlan uşağı
Gic.....................................................................................................Axılsız
Gor.....................................................................................................Məzar
Gödək.........................................................................................Qısa, kiçik
Göyçək..............................................................................................Gözəl
Güzar.......................................................................................Gəzmə, gəzinti

**H**

Haylar.......................................................................................Ermənilər
Havax.......................................................................................Nə vaxt
Havar..............................................................................................Xəbər
Havadar.......................................................................Müdafiəçi, qoruyucu

Hayıf.......................................................................................................Yazık
Hərzə...................................................................................Boş,boş, yalan
Həşəri.....................................................................................................Azğın

**L**

Lağ etmə.................................................................................................Gülmə
Lərz.......................................................................................................Titrətyiş
Lağım.........................................................................................................Çala

**İ**

İrast..................................................................................................Rastlaşmaq
İrəng..........................................................................................................Rəng
İrəbb..........................................................................................................Rəbb
İstol.............................................................................................................Stol

**M**

Macal......................................................................................................İmkan
Malakan.................................................................Sürgün olunan ağ rus
Məzənni..................................................................................................Azğın
Mitil...................................................................Üzü olmayan yataq dəsti
Mütrüf...................................................................................................Dilənçi
Münkür............................................................................................Sual mələyi
Mürtət.......................................................................................Dinindən dönmüş
Müşrik.......................................................Allaha ağ olan, Allahı danan

**N**

Naxır...............................................................................Heyvan sürüsü
Nadan..............................................................................Tərbiyəsiz, qaba
Nanəcif.......................................................................................Soysuz
Nasrani.....................................................................................Xristiyan

**P**

Paxıl..............................................................................................Xəbis
Peşə...............................................................................................Sənət
Pəjmur...............................................................geyimi pis olan insan
Poşa.................................................................................Gəzəyən dilənçi
Put..............................................................................Ölçü vahidi 16 kq
Pəyə...............................................................................................Tövlə

**S**

Savax.............................................................................................Sabah
Salaxana.........................................................................................Azqın
Sərgəndər.............................................................................Çaşqın, pərişan
Səfey.............................................................................................Axmaq

Sufat...............................................................................................Üz
Süysün............................................................................................Boyun

**Ş**

Şil...................................................................................................Şıkəst
Şişşək.........................................................................................Gənc qoyun
Şuğu.................................................................................................İrəli atıl
Şələ............................................................................... Ağır yük qaldırmaq
Şoş....................................................................................................Yol

**Y**

Yad.................................................................Unudulmaq, Xatırlamaq və s
Yağı.............................................................................................Düşmən
Yal ..........................................................................................Köpək yemi
Yarğan.......................................................................................Dərin arx
Yekə..............................................................................................Böyük
Yasar.............................................................................................Çirkin
Yığval..................................................................................Azuqə, qədər
Yolux.............................................................................................Tüksüz

**Z**

Zad.........................................................................................Ara söz, şey
Zakon............................................................................................Qanun
Zağar....................................................................................Kiçik cins köpək
Zimistan gülü...............................................................................Qış gülü

**X**

Xırxız..............................................................................................Oğru
Xonaxa........................................................................Həyasız, abırsız və.s